

**PROFFESSOR, ORUC İBRAHİM OĞLU MUSAYEV**

Musayev Oruc İbrahim oğlu 1929-cu ildə Azərbaycan Respublikasının Şəmkir rayonunda anadan olmuş, 1948-ci ildə orta məktəbi bitirmiş, 1949-cu ildə Azərbaycan Dövlət Pedaqoji Xarici Dillər İnstitutunun İngilis dili fakültəsinə daxil olmuş və 1953-cü ildə həmin institutu fərqlənmə diplomu ilə bitirmişdir.

1957-ci ildə o, Azərbaycan Dövlət Universitetinin (indi M.Ə.Rəsulzadə adına Bakı Universiteti) filologiya fakültəsinin qiyabi şöbəsinə daxil olmuş və 1964-cü ildə həmin universiteti bitirərək ikinci ali təhsil almışdır.

1961-ci ildə namizədlik dissertasiyası müdafiə etmiş və filologiya elmləri namizədi alimlik dərəcəsinə layiq görülmüşdür. 1985-ci ildə professor rütbəsi almışdır.

40 ildən artıqdır ki, prof. O.Musayev ingilis dilini tədris edir, ingilis və Azərbaycan dillərinin qrammatik quruluşunu və leksik tərkibini kontrastiv şəkildə tədqiq etməklə məşğuldur. Bu müddət ərzində o, bir sıra məqalə, monoqrafiya yazmış, orta və ali məktəblər üçün ingilis dili üzrə seriya dərsliklər və dərs vəsaiti tərtib etmişdir.

60-cı illərin əvvəlindən prof. O.Musayev Azərbaycanca-İngiliscə lüğət tərtib etməyə başlamış, sonralar bu işə bir neçə ingilis dili mütəxəssisi cəlb etmişdir. 20 ildən artıq bir müddətdə o, lüğətin tərtibi işinin rəhbəri, onun baş redaktoru, həm də tərtibçilərdən biri kimi fəaliyyət göstərmişdir. Uzunmüddətli və ağır zəhmət tələb edən bu işin nəticəsində Azərbaycan leksikoqrafiya tarixində ilk dəfə olaraq belə bir irihəcmli və fundamental lüğət ərsəyə gəlmişdir.

**PROFFESSOR, ORUJ IBRAHIM OGLU MUSAYEV**

Musayev Oruj Ibrahim oglu was born in 1929, in the Shamkir region of the Azerbaijan Republic, finished high school in 1948, entered the English department of the Azerbaijan State Pedagogical Institute of Foreign Languages in 1949 and graduated from the said institute in 1953 with honours diploma.

In 1957 he entered the philological department of the Azerbaijan State University (now Baki State University named after M.A.Rasulzadeh), graduated from this university in 1964 and received the second higher education.

In 1961 he defended his thesis and was conferred scientific degree Candidate of Philology. In 1985 he got the title of professor.

It is more than 40 years prof. O.Musayev has been teaching English and studying the grammatical structure and lexical system of English and Azerbaijani contrastively. During these years prof. O.Musayev has written some scientific articles, a monograph and compiled a series of text-books and training aids in English for high and higher schools.

In the sixties prof. O.Musayev started to compile an Azerbaijani-English dictionary. Lately he drew in some other specialists of English. As the result of many sleepless nights and an ocean of toil the Azerbaijani-English Dictionary was brought into the world, first and fundamental in the history of Azerbaijani lexicography.

**Bu lüğət Azərbaycanda, Bakı şəhərində**

**EKSON AZƏRBAYCAN LİMİTİD şirkətinin**

**vəsaiti hesabına çap olunmuşdur**







**Printing of this dictionary was made possible by a contribution from**

**EXXON AZERBAIJAN LIMITED**

**AZERBAIJAN, BAKU — 1998**

# AZERBAIJANI— ENGLISH DICTIONARY

About **45000** words and phrases
About **10000** sentence-examples

The dictionary was compiled under the guidance of **prof. O.I.Musayev**

Editor-in-chief: **prof. O.I.Musayev**

Editor: **dos. E.I.Hajiyev**

Assistant editor: **phil. cand. P.O.Musayev**



Proof reader: **head teacher G.Mammadov**

**REVISED AND EXPANDED SECOND EDITION**

The dictionary was first printed in Cyrillics in 1996. This is the second edition actually but the first edition in the Latin script. Both editions of this dictionary were made possible by a contribution from "Exxon Azerbaijan Ltd." company.

**Azerbaijan State Institute of Languages**

**BAKI - 1998**

# AZƏRBAYCANCA— İNGİLİSCƏ LÜĞƏT

Təxminən **45000** söz və ifadə
Təxminən **10000** cümlə

Lüğət **prof. O.İ.Musayevin** rəhbərliyi altında tərtib edilmişdir

Baş redaktor: **prof. O.İ.Musayev**

Redaktor: **dos. E.İ. Hajiyev**

Köməkçi redaktor: **f.e.n. P.O.Musayev**

Korrektor: **baş müəllim Q.Məmmədov**

**YENİDƏN İŞLƏNMİŞ VƏ ARTIRILMIŞ İKİNCİ NƏŞRİ**

Lüğət ilk dəfə 1996-cı ildə kiril əlifbasıda çap edilmişdir. Həmin nəşr ümumiyyətlə lüğətin ikinci, latın grafikasında isə birinci nəşridir. Hər iki nəşr ABŞ-in Bakıda fəaliyyət göstərən "Ekson Azərbaycan Limitid" şirkətinin maliyyə vəsaiti ilə çap olunmuşdur.

**Azərbaycan Dövlət Dillər İnstitutu**

**BAKI - 1998**

**Tərtibçilər :**

*Prof. O.İ.Musayev, prof. M.A.Pənahi, prof. A.H.Qarayev,*

*dos. E.İ.Hacıyev, dos. T.Ə.Abasquliyev, dos. İ.X.Rüstəmov,*

*İ.O.Musayev*

**Compilers:**

*Prof. O.I. Musayev , Prof. M.A. Panahi, Prof. N.A. Garayev*

*dos. E.I. Hajiyev, dos. T.A. Abasguliyev, dos. I.Kh. Rustamov,*

*I.O.Musayev..*



Azərbaycan Dövlət Dillər İnstitutu, 1998, səh...

"QİSMƏT" LTD tərəfindən çap edilmişdir.

Azərbaycanca-ingiliscə lüğət əsaslı nəşrdir. Lüğətə təxminən 45 000 söz və ifadə daxil edilmişdir. Bundan əlavə lüğətdə xeyli miqdarda frazeoloji birləşmələr və təxminən 10.000 cümlə-nümunə verilmişdir.

Lüğət ali məktəb tələbələri, müəllimlər, aspirantlar, tərcüməçilər və ingilis dilini öyrənmək istəyən geniş oxucu kütləsi üçün nəzərdə tutulmuşdur.

## TƏRTİBÇİLƏRDƏN

Həmin lüğətin tərtibinə 60-cı illərdə başlanmış və bu iş qısa fasilələrlə təxminən 20-il davam etdirilmişdir.

Lüğət tərtib etmək işinin nə dərəcədə məsuliyyətli, ağır zəhmət tələb edən, və bəzən də cansıxıcı olduğu ancaq bu işlə məşğul olanlara məlumdur. Lüğət tərtibi işi ilə ancaq səbirli, sözün yaxşı mənasında inadkar və cəfakeş filoloqlar məşğul ola bilirlər. Oxucuların istifadəsinə verilən həmin lüğətin tərtibi işi bir də ona görə ağır olmuşdur ki, bu sahədə indiyə kimi respublikamızda nəzərə çarpacaq elə bir praktik təcrübə qazanılmamışdır. Həmin lüğət istər tərtibinin orjinallığı, istərsə də həcmi baxımından leksikoqrafiya tariximizdə ilk təşəbbüsdür.

Tərtibçilər onu da qeyd etməyi özlərinə borc bilirlər ki, həmin lüğətin ərsəyə gəlməsi və işıq üzü görməsində prof. O.İ.Musayevin xüsusi əməyi olmuşdur. O, nəinki həmin lüğətin tərtibinin təşəbbüskarı olmuş, onun tərtibi prinsiplərini hazırlamış və nəzəri cəhətdən əsaslandırmış, həm də tərtibçilər tərəfindən hazırlanmış hissələri dəfələrlə oxumuş, bəzi məqalələri əsaslı surətdə yenidən işləmiş və belə bir irihəcmli işin redaktə məsələsini öz üzərinə götürmüşdür. Lüğətin nəşrinə lazım olan digər qayğıları da Oruc müəllimin öhdəsinə düşrmüşdür. O, uzun illər müxtəlif idarələrin, nəşriyyatların qapısını döyməli olmuş və çoxlarına bu lüğətin həqiqətən lazımlı olduğunu səbrlə sübut etməyə çalışmışdır. Oruc müəllimin inadkarlığı, cəfakeşliyi nəticədə öz bəhrəsini vermiş və həmin lüğət işıq üzü görmüşdür.

Lüğətin ərsəyə gəlməsində çəkdiyi böyük zəhmət və göstərdiyi cəfakeşlik üçün biz tərtibçilər Oruc müəllimə minnətdarlığımızı bildiririk və əminik ki, həmin lüğətdən istifadə edib bəhrələnən hər bir oxucu bizim minnətdarlığımıza qoşulacaq.

Həmin lüğətin işıq üzü görməsinə göstərdikləri qayğıkeşlik üçün tərtibçilər yazıçı-jurnalist, Azərnəşrin sabiq baş redaktoru Cəmil Əlibəyliyə və Azərnəşrin direktoru Azər Mustafazadəyə öz təşəkkürlərini bildirirlər.

Tərtibçilər lüğətin daha kamil olması üçün məsləhət vermiş həmkarlarına da təşəkkür edirlər.

## LÜĞƏTİN İKİNCİ NƏŞRİNƏ ÖN SÖZ

Həmin lüğət birinci dəfə kiril əlifbasında, Ekson Azərbaycan Limitid şirkətinin maliyyə yardımı ilə 1996-cı ildə "Azərnəşr" tərəfindən çap edilmişdir. Lüğətin latın qrafikasında nəşrinə olan böyük ehtiyacı nəzərə alaraq, adı yuxarıda qeyd edilən şirkətin bilavasitə sifarişi ilə dərhal o, latın əlifbasında çap edilmək üçün işlənmişdir. Beləliklə, lüğətin bu nəşri ümumiyyətlə ikinci, latın qrafikasında isə birincidir.

Lüğət ikinci nəşrə prof.O.İ.Musayev və f.e.n P.O.Musayev tərəfindən hazırlanmışdır. Prof.O.İ.Musayev lüğəti başdan-başa yenidən işləmiş, ona bir sıra söz və ifadələr əlavə etmiş və təkmilləşdirmişdir; f.e.n. P.O.Musayev lüğətə daxil edilmiş sözləri latın qrafikasında əlifba sırasına düzmüş və bir sıra faydalı məsləhəti ilə onun daha kamil olmasına köməklik göstərmişdir.

Lüğətin ikinci nəşri əhatə etdiyi sözlük baxımından onun birinci nəşrindən xeyli fərqlənir. Lüğətin birinci nəşri Sovet imperiyası dövrünə təsadüf etdiyindən bir sıra ümumtürk mənşəli sözlər orada özünə yer tapa bilməmişdir. Allaha min şükür ki, həmin lüğətin ikinci nəşri xalqımızın müstəqillik qazandığı bir dövrə təsadüf edir. İndi bizim imkanımız var ki, dilimizdə hələ qədim dövrlərdən işlənən, klassik ədəbiyyatımızda özünə geniş yer tapan və eləcə də son zamanlar, yəni Sovet imperiyasının süqutundan sonra, həyatımızda baş vermiş ictimai-siyasi dəyişiklərin, əldə etdiyimiz milli azadlıq və müstəqilliyin təbii nəticəsi olaraq dilimizə gəlmiş bir sıra ümumtürk mənşəli sözləri həmin lüğətə daxil edək və biz bu işi çox böyük məmnuniyyət hissi ilə görmüşük, yəni həmin lüğətin ikinci nəşrinə bir sıra ümumtürk mənşəli sözlər daxil etmişik. Bunlara misal olaraq **açıqlamaq, dəstəkləmək, bilgi, bölgə, tərəfdaş, önəmli, çağdaş, iyi, bağımsızlıq, ilişki, anlaşma, yayım, olay, özəl, özəlləşdirmək, öncə, öndər** və s. sözləri göstərmək olar.

Həmin lüğətin istər Kiril əlifbasıyla çap edilmiş birinci, istərsə də onun Latın qrafikasında çap edilmiş ikinci nəşrində **"Azerbaijan International"** jurnalının təsisçisi və redaktoru **Betti Bleyerin** çox böyük və təmənnasız köməyi olmuşdur. Məhz onun sayəsində lüğətin baş redaktoru prof. O.Musayev ABŞ-ın Azərbaycanda fəaliyyət göstərən **Exxon Azerbaijan Limited** şirkətinə yol tapmış və həmin şirkətin maddi vəsaiti hesabına bu lüğət işıq üzü görə bilmişdir. Bu təmənnasız köməyinə, xeyirhaq işinə görə lüğətin tərtibçiləri və xüsusən onun baş redaktoru prof. O. Musayev Betti xanıma, həmin jurnalın Bakı meneceri prof. Məzahir



Pənahova və **Exxon Azerbaijan Limited** şirkətinin rəhbərliyinə, onun bütün əməkdaşlarına və xüsusən həmin şirkətin Bakı ofisinin baş müdiri Jon Hoholikə dərin təşəkkürlərini bildirirlər.

Bu lüğətin nəşr edilməsinə göstərdikləri köməklik üçün biz ADDİ-nin rektoru prof. Q.Quliyev və həmin institutun tədris işləri üzrə prorektoru prof. S.Seyidov cənablarına da səmimi minnətdarlığımızı bildiririk.

Haqqında söz gedən lüğətin daha kamil çıxmasında öz köməkliyini əsirgəməyən institutumuzun əməkdaşlarına, xüsusən prof. F.Veysəlova və dos. E.Hacıyevə, dos. A.Hüseynova, baş müəllimlərdən Q.Məmmədova və C.Quliyevə təşəkkürümüzü bildiririk.

Lüğət latin qrafikasında Azərbaycan Dövlət Dillər İnstitutunun kompüter laboratoriyasında yığılmışdır. Bu prosesdə nümayiş etdirdikləri səbr və təmkinə görə həmin laboratoriyanın bütün işçilərinə və xüsusən onun müdiri A.Novruzova və əməkdaşlarindan P.Həsənovaya, S.Əsgərovaya, X.Əsgərovaya və S.Yusifovaya lüğətin baş redaktoru prof. O.Musayev öz minnətdarlığını bildirir.

Lüğətdə gözə çarpan qüsurlar barədə fikir söyləyəcək mütəxəssislərə, eləcə də hər bir oxucuya da tərtibçilər və onun baş redaktoru prof. O.İ.Musayev əvvəlcədən xoş arzularını bildirirlər.

# G İ R İ Ş

Dünyada ən geniş yayılmış dil olan ingilis dili xeyli vaxtdır ki, respublikamızda əsas fənlərdən biri kimi tədris edilməkdədir. Son dövrlərdə baş vermiş ictimai-siyasi dəyişiklərlə əlaqədar olaraq bu dilin öyrənilməsinə respublikamızda maraq qat-qat artmışdır.

Dil öyrənmək üçün vacib olan vasitələrdən biri də öyrənilən dildə müxtəlif dərsliklərin, dərs vəsaitlərinin, xüsusən də ikidilli lüğətlərin olmasıdır. Məsələnin bu cəhətini nəzərə alaraq biz hələ 60-cı illərdə həmin lüğətin tərtibinə başladıq və nəticədə leksikoqrafiya tariximizdə ilk dəfə olaraq belə bir irihəcmli Azərbaycanca-İngiliscə lüğət ərsəyə gətirdik.

Geniş oxucu kütləsinə təqdim edilən həmin lüğət, hər kəsdən öncə ADDİ-nin tələbələri və ingilis dili müəllimləri üçün tərtib edilmişdir. Lakin ondan ixtisası dil olmayan tələbələr, aspirantlar, tərcüməçilər, elmi işçilər və habelə ingilis dilini öyrənmək istəyən hər bir şəxs istifadə edib bəhrələnə bilər.

Həmin lüğət müxtəlif xarici ölkələrdə yaşayan həmvətənlərimiz və Azərbaycan dilini öyrənmək istəyən hər bir ingilisdilli fərd üçün də faydalı vəsait ola bilər.

Lüğət prof. O.İ.Musayevin rəhbərliyi altında adları aşağıda qeyd edilən mütəxəssislər tərəfindən tərtib edilmişdir.

1. prof.O.İ.Musayev (A, B, V, Q, D, E, İ, Y hərfləri)
2. prof. A.Qarayev (M, R, Ş hərfləri)
3. prof. M.A.Pənahi (P, Ü, Ç, X, H hərfləri)
4. dos. T.Ə.Abasquliyev (Ə, J, Z, K, F hərfləri)
5. dos. E.İ.Hacıyev (O, Ö, G, N hərfləri və coğrafi adlar)
6. dos. İ.X. Rüstəmov (L, U, C hərfləri)
7. İngilis dili müəllimi İ.O.Musayev (S,T hərfləri)

Lüğətə təxminən 45 000 baş söz daxil edilmişdir. Bundan əlavə, lüğətdə xeyli miqdar sərbəst söz birləşməsi, frazeoloji birləşmələr, zərbi-məsəllər, atalar sözləri, cümlə-nümunələr də verilmişdir.

Lüğətin sözlüyü **Azərbaycan dilinin orfoqrafiya lüğəti** (redaktoru Azərb. EA müxbir üzvü Ə.Ə.Orucov), **Azərbaycan dilinin izahlı lüğəti** (4 cilddə: I cildin tərtibçisi fil. elmləri doktoru, prof.Ə.Ə.Orucov; II,III,IV cildlərin redaktoru Azərb. EA müxbir üzvü , prof. Ə.Ə.Orucov), M.F.Axundov adına Azərbaycan Pedaqoji Rus dili və Ədəbiyyatı İnstitutunun əməkdaşları tərəfindən tərtib edilmiş **Azərbaycanca-Rusca lüğət** (redaktoru prof. M.T.Tağıyev: I cild, Bakı-1986, II cild, Bakı-1989, III cild, "Ergün" nəşriyyatı, Bakı-1997 ), X.Ə. Əzizbəyovun tərtib etdiyi **Azərbaycanca-Rusca lüğət** (Bakı-1965) və tərtibçilərin özlərinin hazırladığı sözlük əsasında formalaşdırılmışdır.

İstər həcmi, istər məzmunu və istərsə də tərtibi prinsipləri baxımından həmin lüğət bu sahədə atılan ilk addımdır. Buna görə də, etimal ki, qüsurlardan xali olmayacaq. Lüğətdə gözə çarpan qüsurlar barədə fikir söyləyəcək mütəxəssislərə, eləcə də hər bir oxucuya tərtibçilər və onun baş redaktoru prof. O.İ.Musayev əvvəlcədən xoş arzularını bildirirlər.



## LÜĞƏTİN QURULUŞU HAQQINDA QISA MƏLUMAT

Hər bir lüğətin quruluşu onu səciyyələndirən başlıca xüsusiyyətlərdən biri olmaqla, həm də onun sirlərinin açarıdır. Buna görə də hər hansı bir lüğətdən səmərəli istifadə etmək üçün onun quruluşu haqqında minimum məlumata malik olmaq zəruridir. Məsələnin bu cəhətini nəzərə alaraq, bu lüğətdən istifadə edənlərə kömək məqsədi ilə onun quruluşu haqqında aşağıdakıları qeyd etməyi vacib bilirik:

1. Morfoloji quruluşundan (sadə, düzəltmə, mürəkkəb) asılı olmadan dilimizdə işlənən hər bir söz lüğətə baş söz kimi daxil edilmiş və hər bir sözün qarşısında hansı nitq hissəsi olduğu göstərilmişdir. Bu o deməkdir ki, bir kökdən ibarət olan **baş, daş, gün** və s. sözlər kimi, müxtəlif sözdüzəldici şəkilçilər vasitəsi ilə həmin sözlərdən düzəldilmiş **başçı, başçılıq, başlıq, başlamaq; daşlı, daşlıq, daşsız; gündə, gündəlik** və s. düzəltmə sözlər, habelə bu sözlərin iştirakı ilə düzəldilmiş **başağrısı, daşarmudu, günəbaxan** və s. kimi mürəkkəb sözlər də həmin lüğətə baş söz kimi daxil edilmişdir.

2. Lüğətdə baş söz kimi verilmiş vahidlərlə əlaqədar olaraq dilimizdə işlənən söz birləşmələri və frazeoloji birləşmələr həmin sözlə birlikdə izah edilir. Məsələn, **baş** sözü ilə əlaqədar olaraq **dağın başı, mismarın başı** və s. sərbəst söz birləşmələri, habelə **baş vermək, baş aparmaq, baş çıxarmaq, baş açmaq, baş aldatmaq** və s. frazeoloji birləşmələr; **başçı** sözü ilə əlaqədar **başçı olmaq; başçılıq** sözü ilə əlaqədar olaraq isə **başçılıq etmək** kimi söz birləşmələri verilir və onların ingilis dilində qarşılığı müəyyənləşdirilir. Bu halda söz birləşmələrində baş söz buraxılır, onun əvəzində tilda işarəsi (~) qoyulur. Məsələn:

**baş açmaq = ~ açmaq**
**başçılıq etmək = ~ etmək**

Dilimizin morfoloji quruluşundan asılı olaraq çox vaxt söz birləşmələrində işlənən bu və ya digər baş söz öz morfoloji şəklini, formasını dəyişir. Belə hallarda baş sözün əsas hissəsi əvəzinə də tilda işarəsi işlədilir, ondan sonra baş sözün morfoloji formasını bildirən şəkilçi yazılır. Məsələn:

**başdan çıxarmaq = ~ dan çıxarmaq**
**başa gəlmək = ~ a gəlmək** və s.

3. Azərbaycan dilində işlənən omonim sözlərdən hər biri lüğətə baş söz olaraq daxil edilmiş və onlardan sonra rum rəqəmi qoyulmuşdur. Məsələn:

**çay** *i* I river

**çay** *i* II tea

Belə omonim sözlərlə əlaqədar olaraq dilimizdə işlənən söz birləşmələri onlarla birlikdə verilir və izah edilir. Birinci **çay** sözü ilə əlaqədar olaraq **dərin çay, uzun çay** və s. söz birləşmələri, ikinci **çay** sözü ilə əlaqədar olaraq isə **tünd çay, açıq çay** kimi söz birləşmələri verilir və onların ingilis dilindəki qarşılıqları müəyyənləşdirilir. Məsələn:

**çay** *i* I river; **uzun ~ long river; dərin ~ deep river**

**çay** *i* II tea; **tünd ~ strong tea; açıq ~ weak tea**

4. Müasir Azərbaycan dilində sözlərin bir qismi eyni morfoloji formada müxtəlif nitq hissəsi funksiyasında işlənə bilir (konversiya hadisəsi). Bu halda həmin söz lüğətə nitq hissəsinin distribusiyası baxımından daxil edilir; üstündə onun sırasını göstərən rəqəm yazılır və qarşısında hansı nitq hissəsi kimi işləndiyi göstərilir. Məsələn, dilimizdə bu tərzdə işlənən sözlərdən biri **gözəl** sözüdür. Bu söz morfoloji formasını saxlayaraq həm isim **(yeddi gözəl)**, həm sifət **(gözəl bina)**, həm də zərf **(gözəl oxumaq)** kimi işlənir. Bununla əlaqədar olaraq həmin söz, yəni **gözəl** sözü, lüğətə ayrı-ayrılıqda üç baş söz kimi daxil edilmişdir: **gözəl**[1] *i* , **gözəl**[2] *s* , **gözəl**[3] *z* . Bu nitq hissələri ilə işlənən söz birləşmələri isə onların hər birinin öz yuvasına daxil edilmişdir.

**gözəl**[1] *i* **beauty; yeddi ~ seven beauties**

**gözəl**[2] *s* **beautiful; ~ qadın a beautiful woman**

**gözəl**[3] *z* **beautifully; ~ oxumaq to sing* beautifully**

Dilimizdəki sözlərin lüğətə bu şəkildə daxil edilməsi leksikoqrafiya tariximizdə ilk təşəbbüsdür. Bu, həmin lüğətin tərtibində başlıca prinsiplərdən biridir. Həmin prinsip prof. O.İ.Musayev tərəfindən irəli sürülmüş və əsaslandırılmışdır.

5. Azərbaycan dilində olan bəzi sözlərin ingilis dilində bir neçə qarşılığı olur, lakin onlar işlənmə yerlərinə görə bir-birindən fərqlənir. Belə hallarda ingilis dili sözlərinə xas olan fərqlər mümkün qədər onların qarşısında və ya sonunda mötərizədə göstərilir. Məsələn, dilimizdə işlənən **balalamaq** felinin müasir ingilis dilində bir neçə qarşılığı var; **to kitten, to breed, to farrow, to hatch.** Bunlar dilimizə xas olan bir sözün *(balalamaq)* qarşılığı olmasına baxmayaraq, işlənmə məqamlarına görə bir-birindən fərqlənir. Buna görə lüğətdə onların hər biri haqqında mötərizədə əlavə məlumat verilir. Məsələn, **balalamaq** *f (ümumiyyətlə)* **to breed** ; *(pişik)* **to kitten**; *(donuz)* **to farrow** ; *(quş)* **to hatch.**

6. Konkret dildən asılı olmayaraq təsirli felin başlıca xüsusiyyətlərindən biri də özündən sonra vasitəsiz tamamlıq tələb etməsidir. İngilis dilində feldən sonra vasitəsiz tamamlığın işlənməli olması belə işarə edilir: *(d.)*. Məsələn; **to write** *(d.)*, **to send** *(d.)*.



7. İngilis dilində elə fellər var ki, onlardan sonra, bir qayda olaraq, müəyyən sözönü işlədilir. Bu qəbildən olan fellərdən sonra işlədilməli olan sözönləri onlardan sonra mötərizədə verilir. Məsələn:

**to look** *(at)*, **to take care** *(of)*, **to be famous** *(for)*, **to deal** *(with)* və s.

8. Müasir ingilis dilində bir qisim fellərdən sonra , bir qayda olaraq, cerund adlanan şəxssiz fel forması işlənir. Bu hal lüğətdə belə işarə edilir: *(+ger.)* . Məsələn, **to stop** *(+ger.)*, **to continue** *(+ger.)*, **to go on** *(+ger.)* , *etc.*

Bəzən cerunddan əvvəl sözönü də işlənir. Belə halda mötərizədə həmin sözönü də verilir. Məsələn: to prevent *(from+ger.)*

9.Müasir dilimizdə olduğu kimi , ingilis dilində də iki fel yan-yana işlənə bilir, məsələn, **to want to go, to wish to see; can speak, may take** və s. Bu halda iki vəziyyət mümkündür; şəxsli feldən sonra gələn məsdər ya **to** hissəciyi ilə, ya da onsuz işlənir. Belə halda şəxsli feldən sonra gələn məsdər **to** hissəciyi ilə işlənirsə *(to+inf)* , onsuz işlənirsə *(+inf)* şəkildə işarə edilir. Məsələn:

**to want***(to+inf)*, **to wish** *(to+inf)*; **ought** *(to+inf.)*, **can***(+inf)* , **may***(+inf) və s.*

10. Lüğətə daxil edilmiş söz və ifadələrin fakultativ hissəsi, bir qayda olaraq, mötərizədə verilir . Məsələn, *(tele)***phone, all** *(the)* **day,** *(news)* **paper** və s. Bu o deməkdir ki, mötərizədə verilmiş hissəni buraxmaq olar: **telephone** əvəzinə **phone; newspaper** əvəzinə **paper; all the day** əvəzinə **all day** işlətmək mümkündür.

11. Kontekstdən asılı olaraq dəyişməli olan sözlər lüğətdə kursivlə verilmişdir. Məsələn, **to tell** *smb.* **of** *one's* **decision, to stop** *a* **wound** və s.Bu o deməkdir ki, **to tell** *smb.* **of** *one's* **decision** ifadəsi birinci şəxs tərəfindən işlədilərsə, o, öz qərarı haqqında üçüncü şəxsə danışırsa, o zaman həmin ifadə bu şəkildə işlənməlidir: **I always tell him of my decision,** yəni *smb.* sözü əvəzinə III şəxs əvəzliyinin obyekt hal formasını **(him),** *one's* sözü yerinə isə I şəxs yiyəlik əvəzliyini **(my)** işlətmək lazımdır. Yaxud, əgər söhbət ümumiyyətlə yaranın qanını kəsməkdən gedirsə, **to stop** *a* **wound,** müəyyən bir yaranın qanını kəsməkdən gedirsə, **to stop** *the* **wound** işlədilməlidir.

12. Azərbaycan dilində elə sölərə təsadüf etmək olur ki, onlar əsasən, söz birləşməsi tərkibində işlənir. Belə sözlər lüğətə baş söz kimi daxil edilir, onlardan sonra iki nöqtə qoyulur və həmin sözlər söz birləşməsi tərkibində verilir. Məsələn:

**aylı** *s*: ~ gecə moonlight night

**anac** *s*: ~ qoyun ewe [ju:]; ~ donuz sow [sau]

13. Dilimizdə olan sinonim sözlərdən daha işlək olanı lüğətdə izah edilir, qismən az işlək olanın mənası bilavasitə verilmir, oxucuya məsləhət görülür ki, izah edilmiş sinonim sözə baxsın. Məsələn, **adətdənkənar** və **adətdənxaric** sözləri dilimizdə sinonim sözlərdir.

Bunlardan birincisi *(adətdənkənar)* daha işləkdir. Buna görə də lüğətdə həmin söz izah edilir, ikincisi *(adətdənxaric)* bilavasitə izah edilmir, onun qarşısında *bax* **adətdənkənar** yazılır.

Dilimizdə elə sözlər də var ki, onlar ayrılıqda, yəni ayrıca leksem kimi götürüldükdə, sinonim sözlər hesab edilə bilər, lakin söz birləşmələrində işlənmə baxımından bir-birindən fərqlənir. Məsələn, dilimizdə olan **dəlil** və **sübut** belə sözlərdəndir. Təcrid edilmiş halda onlar sinonim hesab edilir, lakın söz birləşməsi baxımından onlar arasında fərq var: dilimizdə **sübut etmək** demək mümkün olduğu halda, **dəlil etmək** demək əsla mümkün deyil. Deməli, bu sözlər söz birləşmələrində işlənmə baxımından fərqlənir. Bu qəbildən olan sözlərlə işlənə bilən söz birləşmələrini bir yuvada vermək mümkün olmadığına görə onlardan hər biri lüğətə ayrıca baş söz kimi daxil edilmiş və izah olunmuşdur.

14. Lüğətdə baş sözlər qara hərflərlə çap edilmişdir. Baş sözün ingilis dilindəki qarşılığı ilə onun söz birləşməsində işlənməsi halı (yaxud halları) və eləcə də sonrakı söz birləşmələri arasında nöqtəli vergül (;) işarəsi qoyulur. Məsələn :

**akademiya** *i* academy; Elmlər ~sı Academy of Sciences; Kənd Təsərrüfatı ~sı Academy of Agricultural Sciences

15. Çoxmənalı sözlərin yaxın mənalarını bildirən sözlər arasında vergül, qismən uzaq mənasını (yaxud mənalarını) bildirən sözlər arasında isə nöqtəli vergül işarəsi qoyulur. Məsələn:

**açıqürəkli** *s* open-hearted, kind-hearted ; candid, frank

16. Müasir ingilis dilində orfoqrafiya tarixi-ənənvi prinsipə əsaslanır. Buna görə də, əksərən sözlərin hərf tərkibi ilə səs tərkibi arasında ciddi uyğunsuzluq olur. Digər tərəfdən də, ingilis dilində olan sait hərflər söz tərkibindəki vəziyyətindən, vurğudan və s. asılı olaraq müxtəlif cür oxunur. İngilis dilinə xas olan bu və bu kimi xüsusiyyətlər sözlərin oxunuşunu xeyli çətinləşdirir. Buna görə də ingilis dili lüğətlərində (ingilis dilindən başqa dillərə isticamətində tərtib edilmiş lüğətlərdə), bir qayda olaraq, hər bir baş sözün qarşısında onun transkripsiyası, yəni oxunuşu verilir. Başqa dillərdən ingilis dili istiqamətində tərtib edilmiş lüğətkərdə isə, hər bir sözün qarşısında onun transkripsiyası verilmir. Lakin ingilis dili sözlərinin oxunuşundakı çətinliyi nəzərə alaraq biz lüğətdə onlardan bəzisinin çətin oxunan hissəsinin transkripsiyasını verməyi məsləhət bildik. Sözlərin transkripsiyası orta mötərizədə [ ] verilir. Sözün transkripsiyası verilməyən hissəsi əvəzinə defis işarəsi (-) qoyulur: sözün əvvəli buraxılırsa, defis işarəsi əvvəldə, sonu buraxılırsa, sonda, sözün hissəsi hər iki tərəfdən buraxılırsa, defis işarəsi hər iki tərəfdən qoyulur. Məsələn:

throw [-ou], bearable [beə-], archaic [-k-]

Söz birləşməsi tərkibində transkripsiyası verilməmiş sözün əvəzinə üç nöqtə qoyulur. Məsələn:



ballet fan [ ` bælei ...]

17. Bir qayda olaraq, lüğətdə sözlərin üzərinə vurğu işarəsi qoyulmur. Lakin istər Azərbaycan və istərsə də ingilis dilində elə sözlərə təsadüf edilir ki, onların leksik-qrammatik mənası vurğunun yerindən asılı olur. Məsələn:

Azərbaycan dilində: **bar`ı** [1] *i* hasar, divar

**b`arı** [2] *əd* heç olmasa

İngilis dilində: **`present** - *i* hədiyyə,

**to pre`sent** - *f* hədiyyə vermək

Həmin lüğətdə hər iki dildə təsadüf edilən ancaq belə sözlərin üzərinə vurğu işarəsi qoyulur.

18. Azərbaycan dilində **etmək** və **eləmək** felləri, demək olar ki, tam sinonim sözlər kimi işlənir. Məsələn:

***yaxşılıq etmək* – *yaxşılıq eləmək, müəllimlik etmək* – *müəllimlik eləmək*** və s. Lüğətdə bu felin ancaq **etmək** variantı işlədilmişdir.

prof. O.İ.Musayev

## LÜĞƏTİN TƏRTİBİNDƏ İSTİFADƏ EDİLMİŞ MƏNBƏLƏR

1. Azərbaycan dilinin orfografiya lüğəti (artırılmış və təkmilləşdirilmiş üçüncü nəşri), "Elm" nəşriyyatı, Bakı-1975
2. Azərbaycan dilinin izahlı lüğəti, 4 cilddə,Az.SSR Elmər Akademiyası nəşriyyatı, Bakı, 1964-1987
3. Azərbaycanca-Rusca lüğət , prof. M.T.Tağıyevin redaktəsi ilə I ,II, III cildlər, "Elm" nəşriyyatı, 1-ci cild 1986, 2-ci cild 1989, 3 cild "Ergün" nəşriyyatı, Bakı 1997
4. Əzizbəyov X.Ə. Azərbaycanca-Rusca lüğət, Azərbaycan Dövlət nəşriyyatı, Bakı-1965
5. Англо-Русский словарь, составитель В.Л.Мюллер, Гос. из-во иностранных и национальных словарей, Москва-1963.
6. Англо-Русский политехнический словарь, издание 3-е, Москва , из-во "Русский словарь", 1976.
7. Англо-Русский сельскохозяйственный словарь, составители Б.Н.Усовский и Н.В.Геминова, Гос. из-во технико-теоретической литературы, Москва-1956
8. Большой Англо-Русский словарь, под общим руководством док. фил. наук, проф.И.И.Гальперина, изд. "Советская Энциклопедия", том 1, том 2, Москва-1972
9. Англо-Русский фразеологический словарь, составитель А.В.Кунин, Гос. из-во иностранных и национальных словарей, Москва-1955
10. Англо-Русский словарь глагольных словосочетаний, под общим руководством док. фил. наук, проф. Э.М.Медниковой, изд. "Русский язык" , Москва-1986
11. Русско-Английский словарь, составители А.М.Таубе, А.В.Литвинова, А.Д.Миллер, Р.К.Даглиш, под редакцией Р.К.Даглиша, магистра гуманитарных наук Кембриджского университета, из-во "Советская Энциклопедия", Москва-1965
12. Русско-Английский словарь, под общим руководством проф. А.И.Смирницкого, изд. 14-ое, стереотипное, под редакцией проф. О.С.Ахмановой, изд. "Русский язык", Москва-1987
13. Longman Dictionary of Contemporary English, printed in Great Britain at the Pitman Press, 1978
14. The New American Dictionary of Good English, printed in the United States of America , 1987



15. A Turkish-English Dictionary , by H.C.Hony with the advice of Fahir Iz , second edition, Oxford at the Clarendon Press, 1967
16. A.S.Hornby with the assistance of Christina Ruse , Oxford Student's Dictionary of Current English , Special edition for the USSR, Moscow , Oxford, Prosvesheniye Publishers , Oxford University Press, 1983
17. The New Method English Dictionary by Michael Philip West, M.A., D.Phil , &James Gareth Endicott, M.A., The third edition, Longmans, Green & Co., London, New York, Toronto.
18. Oxford-Russian Dictionary , Oxford University Press, Oxford, New York, 1995
19. Collins Cobuild Dictionary of phrasal verbs, The University of Birmingham, Great Britain, 1989
20. Tofiq Abasquliyev, İngilis atalar sözləri və onların azərbaycanca, rusca qarşılıqları, Bakı-1981
21. Azərbaycanca - Rusca Lüğət, Azərbaycan SSR Elmlər Akademiyasının nəşriyyatı, redaktoru Ə.Ə.Orucov, Bakı-1952
22. О.С.Ахманова, Словарь лингвистических терминов, изд. "Советская Энциклопедия" Москва-1966
23. Rusca - Azərbaycanca Lüğət, Azərb. SSR EA müxbir üzvü Ə.Ə.Orucovun redaktəsi ilə; üç cilddə: 1-ci cild (A-K), "Elm" nəşriyyatı, Bakı, 1971; 2-ci cild (Л-П), "Elm" nəşriyyatı, Bakı, 1975; 3-cü cild, (P-Я), "Elm" nəşriyyatı, Bakı - 1978.
24. Webster's Dictionary of the English Language, New Revised Edition for School, Home and office, 1991 by Thomas Nelson.

## LÜĞƏTDƏ İSTİFADƏ EDİLMİŞ ŞƏRTİ İŞARƏLƏR

Lüğətin tərtibində aşağıdakı şərti işarələrdən istifadə edilmişdir:

1. ~ (tilda) işarəsi. Bu işarə buraxılmış söz və ya sözün buraxılmış hissəsi əvəzinə işlədilmişdir. Məsələn:
   ***baş çəkmək = ~ çəkmək***
   ***başdan etmək = ~ dan etmək***

2. * (ulduz) işarəsi. Bu işarə morfoloji dəyişmə baxımından qaydaya tabe olmayan sözlərin üzərində qoyulmuşdur. Məsələn:
   **man* , tooth* , take* ,spend* ,child* , bad* və s.**

3. ◇ (romb) işarəsi. Bu işarə frazeoloji birləşmələrin qarşısında qoyulmuşdur. Məsələn:
   ◇ ***ağı qaradan seçmək*** *to separate the sheep from the goat*

4. ≅ təxminilik işarəsi. Bu işarə mənası təxmini verilən atalar sözləri, zərbi-məsəllər və ya digər frazeoloji birləşmələr arasında qoyulur. Məsələn:
   ***Yaxşı dost yaman gündə tanınar*** ≅ **A friend in need is a friend indeed**

5. / (çəpəki) xətt işarəsi. Bu işarə dörd halda işlədilir:
   1) Hər iki dildə mənaca bir-birinə yaxıjn olan, bir-birini əvəz edə biləcək sözlərin arasında. Məsələn:
      azərbaycanca: ***ötən / keçən (ötən il, keçən il)***
      ingiliscə: **to ask / to inquire** ***(I asked him where he lived, I inquired (of him) where he lived)***

   2) Hər iki dildə eyni bir fellə işlənə biləcək isimlərin arasında. Məsələn:
      ***roman / şer / hekayə və s. oxumaq*** *to read a novel / a poem / a story , etc.*

   3) Hər iki dildə eyni bir ismə aid işlənə bilən təyinlərin arasında. Məsələn:
      azərbaycanca: ***mütərəqqi / elmi / dini / mürtəce / fəlsəfi baxışlar***
      ingiliscə: ***progressive / scientific / religious /reactionary / philosophical views***

   4) İngilis dilində üçüncü şəxsdə şəxs və yiyəlik əvəzlikləri cinsə görə fərqlənir: kişi cinsində üçüncü şəxs tək əvəzliyi ***he***, qadın cinsində ***she***, kişi cinsində üçüncü şəxs yiyəlik əvəzliyi ***his***, qadın cinsində ***her***. Məlum olduğu kimi, dilimizdə belə hal yoxdur. Buna görə də, dilimizdəki üçüncü şəxs tək əvəzliyi ***(o)***, ingilis dilinə həm ***he***, həm də ***she*** əvəzliyi, dilimizdəki üçüncü şəxs tək əvəzliyinin yiyəlik hal forması **(onun)** ingilis dilinə cinsdən asılı olmayaraq həm ***his*** , həm də ***her*** yiyəlik əvəzliyi ilə tərcümə edilir. Bununla əlaqədar olaraq, lüğətdə ***he, she*** şəxs əvəzlikləri və ***his, her*** yiyəlik əvəzlikləri qoşa işlədilmiş və onların arasında çəpəki xətt ( / ) qoyulmuşdur. Məsələn,
      ***O kitabı çantasına qoydu*** cümləsi ingilis dilinə belə tərcümə edilməiidir:
      ***He/She put his/her book into his/her bag.***



## PREFACE
### TO THE SECOND EDITION

Compiling a dictionary above all is a highly skilled, painstaking and professional task. The task becomes still more complicated and difficult when there is no national tradition in compiling a dictionary of the kind.

When we started to compile this **Azerbaijani-English Dictionary**, there was no national tradition in this field . We are the first who made an attempt to create a dictionary of such kind. It is the first major bilingual Azerbaijani-English Dictionary in the history of Azerbaijani lexicography . The project is the result of more than 20 years of dedicated research by a group of linguists under the guidance and general editorship of prof. O.I.Musayev .

Other compilers are prof. M.Panahi, prof. A.Garayev, doc. E.Hajiyev, doc. T.Abasguliyev, doc. I.Rustamov and English teacher I.O.Musayev.

The dictionary includes approximately 45.000 words, a lot of expressions from everyday life, classical Azerbaijani literature, and also different scientific terms, Azerbaijani proverbs and sayings.

After the collapse of the Soviet - Communist regime English has become a major means of international communication in Azerbaijan. So to learn and to master English, Azerbaijanis need different text-books, bilingual dictionaries and other training aids. This dictionary has been compiled to meet the great demand of Azerbaijani learners of English, translators and interpreters from Azerbaijani into English, etc.

Undoubtedly, the dictionary will have a profound effect on learning English in the Republic as Azerbaijanis have always had to learn English as a third language after mastering Russian. This dictionary will have material to support English language acquisition by Azerbaijanis directly from their mother tongue . The dictionary can be a reliable and important source for foreigners who wish to learn Azerbaijani, too.

The said dictionary first appeared in the Cyrillic script in 1996, though the Latin script had already been adopted as an official alphabet in Azerbaijan some years before. It was extremely difficult then to print the dictionary in the Latin script due to some economic and printing reasons. Secondly, the dictionary had been presented to the publishing house long before the Latin script was adopted as an official alphabet.

Taking into consideration that this dictionary is in great demand in the Latin script, we immediately started to prepare it to be published in it.

The Latin script edition of the Azerbaijani-English Dictionary has been prepared for publication wholly and completely by prof. O.I.Musayev with the help of candidate of philology P.O.Musayev. So it is the second edition of the said dictionary in general, but the first in the Latin script.

Printing this dictionary in the Cyrillic as well as in the Latin symbols was made possible by a contribution from Exxon Azerbaijan Ltd. The compilers and Editor-in-Chief prof. O.I.Musayev express their heartfelt thanks to Exxon Corporation Senior VP Harry Longwell, Terry Koonce, President of Exxon Azerbaijan Ltd., John Hoholick , managing director of Exxon Azerbaijan Ltd. We would like to thank also Leyla Karimova , accountant of Exxon Azerbaijan Ltd., and Turan Jafarova , translator of Exxon Azerbaijan Ltd. for their assistance in the printing of this dictionary.

The compilers and Editor-in-Chief of the Azerbaijani-English Dictionary express their deep and heartfelt thanks to Betty Blair, executive editor of "Azerbaijan International" for her tremendous and disinterested assistance in the printing of this project. " I think God himself sent her to help me", always says prof. O.I.Musayev, when he speaks of the printing of the said dictionary.

Our thanks are also due to prof. M.Panahov, Baku Manager of the "Azerbaijan International".

We would like to thank also prof. G.Guliyev, rector of the Azerbaijan State Institute of Languages, prof. S.Seyidov, vice rector of the mentioned institute for their help and moral support to publish the dictionary.

For unfailing linguistic assistance our thanks are also extended to fellow teachers, especially to prof. F.Veysalov, dos. E.Hajiyev, dos. A.Huseynov and to head teachers G.Mammadov and J.Guliyev who helped us to improve the dictionary in the second edition.



# GUIDE TO THE USE OF THE DICTIONARY

This dictionary tells you a lot about Azerbaijani words, word combinations, their meaning, spelling and usage in speech. It also tells you about the combinability of words in phrases and sentences. The dictionary includes a lot of Azerbaijani proverbs and sayings. It tells you about their equivalents in Contemporary English, too.

To use this dictionary properly you need to know how to find all the information in it. It is easy to do this once you understand how the dictionary works. Taking this into account, we consider it necessary to note the following:

1. Headwords are printed in bold type and in alphabetical order.

2. Each Azerbaijani word is given as a headword irrespective of its morphological structure, whether the word is simple, derivative or compound. For example, the simple words like **baş, daş, gün**, the derivative words like **başçı, başçılıq, başlamaq; daşlıq, daşlı, daşsız; gündəlik** and the compound words like **başağrısı, daşarmudu, günəbaxan** are given in the dictionary as headwords.

3. The phrases formed with each headword are treated and explained in its nest. For example, phrases like **baş vermək, baş aparmaq, baş çıxarmaq, baş açmaq, baş aldatmaq**, etc.are given and explained in the nest of the headword **baş**; phrases like **başçı olmaq** - in the nest of the headword **başçı**, phrases like **başçılıq etmək** - in the nest of the headword **başçılıq**. To economize space the headword is omitted and instead of it the swung dash is used. For example:

**baş açmaq = ~ açmaq**
**başçılıq etmək = ~ etmək, etc.**

4. In Azerbaijani the headwords within the phrase oftentimes change their morphological form, taking this or that affix or affixes. In this case instead of the main part of the headword the swung dash is used, then the required affix is added . For example:

**başdan çıxarmaq = ~dan çıxarmaq**
**başa gəlmək = ~a gəlmək**

5. The Azerbaijani words used as homonyms are entered in the dictionary as separate headwords and marked with Rome numbers, such as:

**çay *i* I - river**
**çay *i* II - tea**

The phrases with such words - homonyms have been given in the nest of each of the homonyms separately. For example:

**çay *i* I - river ; dərin çay deep river; uzun çay long river;**
**çay *i* II - tea ; tünd çay strong tea; açıq çay weak tea,** etc.

6. Most of the Azerbaijani words are used as different parts of speech without changing their morphological form. Such words are entered in the dictionary according to their distribution, for instance the word **gözəl**. It can be used as a noun, as an adjective and as an adverb.Such

Azerbaijani words have been entered in the dictionary as separate entries with superscript numbers. For example:

**gözəl** [1] *i* **beauty**
**gözəl** [2] *s* **beautiful**
**gözəl** [3] *z* **beautifully**

The phrases used with these words have been given and explained in their nest. For example:

**gözəl** [1] *i* **beauty ; yeddi gözəl seven beauties**
**gözəl** [2] *s* **beautiful; gözəl qadın a beautiful woman; ~ kişi a handsome man**
**gözəl** [3] *z* **beautifully; gözəl piano çalmaq to play the piano beautifully**

7. Separate meanings of a word are indicated by means of Arabic numbers and are separated by a semi-colon . For example:

**dəyərli** *s* **1. valuable; 2.sensible**

8. Shades of meaning, represented by translation not considered strictly synonymous, are indicated by means of a semi-colon and translations considered synonymous - by a comma. For example:

**dəyərsiz** *s* **useless; good for nothing**
**səfeh** *s* **silly, foolish, stupid.**

9. Very often some additional explanation is required to limit the meaning of the word or define its meaning exactly, with complete correctness. And it happens in translating Azerbaijani words and expressions into English. All such explanations are given in brackets in italics which usually precede the word they refer to. For example,:

**qabıq** *i* **1.** (*çörəyin və s.*) **crust; 2.**(*soğanın, bananın*) **skin; 3.** (*yemişin, lumunun və s.*) **rind; 4.**(*portağalın, kartofun və s.*) **peel; 5.** (*yumurtanın, fındığın və s.*) **shell.**

10. Some English verbs require a definite preposition after themselves. Such verbs are followed by the necessary preposition indicated in brackets in italics. Thus:

**to look** *(at)*, **to send** *(to)*, **to graduate** *(from)*, **to wink** *(at)*, **to stare** *(at)*, **to deal** *(with)*, **to treat** *(of)*, *etc.*

11. The main characteristic feature of a transitive verb is that it requires a direct object after itself to complete its meaning. It is shown by (*d.*) in brackets in italics. Thus:

**to write** (*d.*), **to read** (*d.*), **to send** (*d.*), **to comb** (*d.*), **to brush** (*d.*), **to peel** (*d.*), **to pack** (*d.*), **to divide** (*d.*), **to reap** (*d.*), etc.

12. Like Azerbaijani , in English after some finite verbs the infinitive is used. Here two cases are possible; either the infinitive is used with the particle to, or without it. If the finite verb is followed by the infinitive with the particle **to**, it is indicated by *(to+inf.)* , but if the finite verb is followed by the infinitive without the particle **to**, it is marked by *(+inf.)* in italics. Thus:

**to want** *(to + inf.)* , **to wish** *(to + inf.)*; **ought** *(to + inf.)* , **can** *( + inf.)* , **may** *(+ inf.)* , *etc.*

13. In modern English after certain verbs usually the gerund is used. It is indicated in this way: *(+ger.)*. Thus:

**to stop** *(+ger.)*, **to go on** *(+ger.)*, **to continue** *(+ger.)*, *etc.*

14. The optional part of words and expressions is given in brackets in italics. Thus:

*(tele)* **phone,** *(black)* **board,** *(news)* **paper, all** *(the)* **day,** *etc.*



15. The words which must be changed in person and number, etc. in coherent speech have been given in italics. Thus:

**to tell** *smb.* **of** *one's* **decision , to stop** *a* **wound,** *etc.*

16. Out of synonyms the one in common use is explained, but the other one that is not in common use is not explained. In this case the user is asked to see the one which is in common use . Thus:

**əski** *s bax* **köhnə; siyah** *s bax* **qara; bikef** *s bax* **kefsiz; dəhan** *i bax* **ağız; orman** *i bax* **meşə,** *etc.*

17. Not all the headwords are supplied with stress. Stress is used in both languages only in cases when the place of the stress changes the lexical and grammatical meanings of the words identical in spelling. Thus:

In Azerbaijani: **akad`emik** *(noun)* - academician
**akadem`ik** *(adjective)* - academic

In English: **`present** *(noun)* - hədiyyə
**to pre`sent** *(verb)* - hədiyyə etmək

18. Although English spelling is very inconsistent, in certain cases rules of reading of letters and combinations of letters in English words can be established. Any person with some knowledge of English can read such words as **pen, ten , tin , pin, hot, pot, not, take, make, hate,** etc. even if he doesn't know the words. Therefore there is no need to indicate the pronunciation of every English word. Pronunciation is given where there is deviation from the general rules. The pronunciation is shown by means of phonetic transcription in the accepted manner, but quite frequently in the abbreviated form, that is, by transcribing only the part of the word where the rules of reading do not apply. Instead of the omitted part of the word a hyphen is used. Thus:

**throw [ - ou], bearable [ beə -], archaic [ -k- ]**

In the phrases instead of the missing part three dots are used. Thus:

**ballet fan [`bælei ... ]**

19. Since the words in this dictionary are listed in alphabetical order, this means that words beginning with **a** are listed at the front of the dictionary, words beginning with **z** are listed at the back, and words beginning with **k** are listed around the middle of the dictionary. So if you want to find the word **kitchen** you can turn straight to the middle of the dictionary. You don't have to start at the front and look through all the pages.

20. To help you find words quickly, in the top corner of each page you can see the first or the last word on that page; the first word of the page is given in the left-hand corner, the last one in the right-hand corner. So you can work through the dictionary quickly just looking at these words until you find the one which begins with the same letters as the word you are looking for. You can then read down the page to find the word you want.

Prof. O.I.Musayev.

## NOTES FOR USERS

1. ~ (swung dash) is used instead of the omitted word or part of it. Thus:
**baş çəkmək = ~ çəkmək**
**başdan etmək = ~ dan etmək**

2. * (star) is used on the words which change their form not according to the usual grammatical rules .Thus:
**to take *, to spend *, to put *; man *, mouse *, tooth* , good*, bad*** , *etc.*

3. ◇ (rhombus) is used before phraseological units. Thus:
◇ ***Ağı qaradan seçmək*** *to separate the sheep from the goat*

4. ≅ (the sign of approximateness) is used before proverbs and sayings and shows the approximateness of the variants of proverbs or their translation into English. Thus:
***Yaxşı dost yaman gündə tanınar*** ≅ *A friend in need is a friend indeed.*
***Dama-dama göl olar*** ≅ *Many a little makes a mickle.*

5. / (the diagonal stroke) is used in the following cases:

1) between the words that are close in meaning and can substitute for each other in both languages. Thus:
In Azerbaijani: **ötən / keçən (*ötən il, keçən il*)**
In English: **to ask/to inquire (*I asked him where he lived, I inquired (of him) where he lived*).**

2) between the nouns that can be used with the same verb in both languages. Thus:
In Azerbaijani: **hekayə / şer / roman / povest** və s. **oxumaq**
In English: **to read a novel / a poem / a story**, *etc.*

3) between the attributes that can be used with the same noun in both languages. Thus:
In Azerbiajani : **mütərəqqi / elmi / dini / mürtəce / fəlsəfi baxışlar**
In English: **progressive/scientific/religious/reactionary/philosophical views**



## Lüğətdə istifadə edilmiş ixtisarlar

## Abbreviations used in this dictionary

### 1.Azərbaycanca - Azerbaijani

*amer.* - amerikan variantı- American variant
*anat.* - anatomiya termini- anatomical term
*antr.* - antropologiya termini - anthropological term
*ara.s.* - ara söz- parenthesis
*arx.* - arxaik söz- archaism
*arxeol.*- arxeologiya termini- archaeological term
*astr.* - astronomiya termini- astronomical term
*aşp.* - aşpazlıq termini- cooking term
*at. söz.* - atalar sözü- proverb
*av.* - aviasiya termini-aeronautics term
*bağ.* - bağlayıcı- conjunction
*bakt.* - bakteriologiya termini-bacteriological term
*bayt.* - baytarlıq termini- veterinary term
*bf.* - bağlayıcı fel- link verb
*biol.* - biologiya termini-biological term
*bot.* - botanika termini-botanical term
*coğ.*- coğrafiya termini- geographical term
*d.d.* - danışıq dili- spoken language
*dəft.* - dəftərxana termini- office term
*dən.* - dənizçilik termini- nautical term
*dilç.* - dilçilik termini- linguistic term
*din.* - dini termin- term of religion
*dip.* - diplomatiya termini- diplomatic term
*d.y.* - dəmiryol termini- railway term
*el.* - elektrotexnika termini- electrical engineering term
*elm.* - elmi termin- scientific term
*emf. var.* - emfatik variant- emphatic variant
*etnoqr.* - etnoqrafiya termini- ethnographic term
*əcz.* - əczaçılıq termini- pharmacological term
*əd.* - ədat- particle
*ədəb.* - ədəbiyyatşünaslıq termini- term of literature
*əs.* - əsatir - mythology
*əv.* - əvəzlik - pronoun
*f.* - fel - verb
*fəls.* - fəlsəfə termini - philosophical term
*fi.* - feli isim - verbal noun
*fiz.* - fizika termini - term of physics
*fiziol.* - fiziologiya termini - physiological term
*folk.* - folklor termini - folklore
*fot.* - fotoqrafiya termini - term of photography
*fr.* - fransız mənşəli söz - French
*fs.* - feli sifət - participle
*geod.* - geodeziya termini - term of geodesy
*geol.* - geologiya termini - geological term
*gir. s.* - giriş sözü - parenthetical word
*hərb.* - hərbi termin - military term
*hənd*- həndəsə - geometrical term
*hüq.* - hüquqşünaslıq termini - term of law
*xüs.* - xüsusən - especially
*i.* - isim - noun

*id.* - idman termini - sport term
*idiom.* - idiomatik ifadə - idiomatic expression
*iqt.* - iqtisadiyyat termini - term of economy
*in.* - incəsənət termini - art term
*inş.* - inşaat termini - building term
*kim.* - kimya termini - term of chemistry
*kob.* - kobud söz - rude word
*k.t.* - kəndtəsərrüfat termini - agricultural term
*qoş.* - qoşma - postposition
*qram.* - qrammatika termini - grammatical term
*mal.*- maliyyə termini - term of finance
*mem.* - memarlıq termini - term of architecture
*mətb.*- mətbuat termini - term of press
*məc.* - məcazi məna - figurative meaning
*miner.* - mineralogiya termini - term of mineorology
*mod. s.* - modal söz - modal word
*mus.* - musiqi termini - term of music
*müh.* - mühasibat termini - book-keeping term
*müst.* - müstəqim məna - literal meaning
*nid.* - nida - interjection
*ön qoş.* - ön qoşma - prefix
*poliqr.* - poliqrafiya termini - printing term
*pred.* - predikativ - predicative
*psix.* - psixologiya termini - term of psychology
*rad.* - radiotexnika termini -term of radio
*r.d.* - rəsmi dil - official language
*riyaz.* - riyaziyyat termini - term of mathematics
*s* - sifət - adjective
*s. bil. isimlərlə-* sayıla bilən isimlərlə - with countable nouns
*s. bilm. isimlərlə* - sayıla bilməyən isimlərlə - with uncountable nouns
*sənətş.* -sənətşünaslıq termini - art term
*siya.* - siyasi termin - political term
*siya. iq.* - siyasi-iqtisad termini - term of political economy
*stat.* - statistika termini - term of statistics
*sy.* - say - numeral
*şahm.* - şahmat termini - chess term
*şair.* - şairana söz - poetic word
*tab. s.* - tabu söz *(ictimai yerdə işlənməsi yasaq edilən söz)*- taboo
*tar.* - tarixi termin - term of history
*teatr.* - teatrşünaslıq termini - theatrical term
*tex.* - texnika termini - technical term
*tib.* - tibb termini - medical term
*tic.* - ticarət termini - term of commerce
*tik.* - tikinti termini - term of building
*tipoqr.* - tipoqrafiya termini - typographical term
*toxuc.* - toxuculuq termini - textile term
*top. i* - toplu isim - collective noun
*uş.d.* - uşaq dili - baby language
*vulq.* - vulqar söz - vulgar word
*yun.* -yunanca- Greek
*z* - zərf - adverb
*zaraf.*- zarafatyana - jocular
*zərb. məs.* - zərbi-məsəl - saying
*zool.* - zoologiya termini - zoological term

**2. İngiliscə - English**

*adj.* - adjective - sifət
*adv.* - adverb - zərf
*(attr.)* - attribute - təyin
*compar.* - comparative degree - müqayisə dərəcəsi
*conj* - conjunction - bağlayıcı
*(d.)* - direct object - vasitəsiz tamamlıq
*(f.)* - feminine gender - qadın cinsi
*ger* - gerund - cerund
*(i.)* - indirect object - vasitəli tamamlıq
*inf.* - infinitive - məsdər
*(m.)* - masculine gender - kişi cinsi
*(n.)* - neuter (gender) - orta cins
*pl.* - plural - cəm forması
*pred.* - predicative - predikativ
*prep.* - preposition - sözönü
*pr.p.* - present participle - indiki zaman feli sifəti
*pron.* - pronoun - əvəzlik
*p.p.* - past participle - keçmiş zaman feli sifəti
*sing.* - singular - tək forma
*smb.* - somebody - bir kəs, kimsə
*smth.* - something - bir şey, nəsə
*s.o.* - someone - bir kəs, kimsə



## LATIN QRAFİKALI AZƏRBAYCAN ƏLİFBASI

## AZERBAIJANI LATIN ALPHABET

| A | B | C | Ç | D | E | Ə | F |
|---|---|---|---|---|---|---|---|
| *a* | *be* | *ce* | *çe* | *de* | *e* | *ə* | *fe* |
| G | Ğ | H | X | I | İ | J | K |
| *ge* | *ğe* | *he* | *xe* | *ı* | *i* | *je* | *ke, ka* |
| Q | L | M | N | O | Ö | P | R |
| *qe* | *el* | *em* | *en* | *o* | *ö* | *pe* | *er* |
| S | Ş | T | U | Ü | V | Y | Z |
| *se* | *şe* | *te* | *u* | *ü* | *ve* | *ye* | *ze* |

# A, a

**A, a** [ a ] *the 1st letter of the Azerbaijani alphabet*

**a** *nid (Cümlənin əvvəlində işlənərək müraciət bildirir) Hey! Hı!* ; *A yoldaş! Hey! Comrade!*

**aa** *nid. (Cümlənin əvvəlində işlənərək heyrət, təəccüb bildirir)* now, now then; now, now; *Aa, gəlin! Come now! Aa, ağlamayın! Now,now, stop crying! Aa, nə olub? Now, then, what's all this?*

**aa** *əd. (Cümlənin sonunda işlənərək təkid, hədə bildirir)* do; *Gəlin aa! Do come!*

**ab** *i arx.* water *(generally used in classical poetry)*

**aba** *i arx.* aba *(a kind of clothing like raincoat worn by clergy in Moslem countries)*

**abad** *s* prosperous, flourishing; inhabited *(by)*, populated *(with)*, well organized/ equipped, having all / proper amenities; ~ yer a flourishing place; ~ şəhər a town / a city with good amenities ~ etmək *bax* **abadlaşdırmaq**; ~ edilmək *bax* **abadlaşdırılmaq**; ~ olmaq *bax* **abadlaşmaq**; *Abad olsun! Let it flourish! Eviniz abad olsun! I wish you every happiness!*

**abadan** *s bax* **abad**

**abadanlaşdırmaq** *f bax* **abadlaşdırmaq**

**abadanlaşmaq** *f bax* **abadlaşmaq**

**abadanlıq** *i* a flourishing / populated / well-equipped place

**abadlanmaq** *f bax* **abadlaşmaq**

**abadlaşdırılmaq** *f* to be* well built / organized, to be* made comfortable for living; to be* equipped with all amenities

**abadlaşdırmaq** *f* to renovate *(d.)*; to build* *(d.)*, to construct *(d.)*, to populate *(d.)*, to make* a place comfortable for living, to equip *(d.)* with modern amenities

**abadlaşmaq** *f* to become* flourishing / populated / inhabited

**abadlıq** *i* renovation, improvement, provision of amenities

**abadlıq** *s* construction, building; ~ işləri construction work

**abajur** *i* lampshade, shade

**abajurlu** *s (i.s.)* with a lampshade; *(i.s.)* having a lampshade

**abalı** *s (i.s.)* with an aba on, *(i.s.)* wearing an aba

**abasbəyi** *i* abasbayi *(a kind of juicy pear)*

**abasız** *s* abaless, *(i.s.)* without an aba on

**abbası** *i* twenty-copeck piece *(money unit generally used in spoken language)*

**abbasılıq** *i* 1. unit of money worth twenty copecks; 2. *smth.* worth twenty copecks; *Bir abbasılıq qiyməti yoxdur. It is not worth twenty copecks / a pence*

**abbat** *i* 1. *(katolik monastırının başçısı)* abbot; 2. *(Fransada katolik keşiş) (Roman Catholic)* priest

**abbatlıq** *i* abbey

**abdal** *i* vagrant, vagabond, silly, fool, wanderer; ~ olmaq to be* a vagrant / fool / wanderer

**abdalcasına** *z* stupidly, foolishly; ~ danışmaq to speak* stupidly / foolishly

**abdallaşma** *i* growing stupid / foolish stupid

**abdallaşmaq** *f* to grow * stupid / foolish, to get*/ to become* stupid / foolish

**abdallıq** *i* stupidity, foolishness, folly

**abgərdən** *i* scoop, ladle, dipper

**ab-hava** *i* climate; yumşaq ~ mild climate; sağlam ~ healthy climate

**ab-havalı** *s (i.s.)* having a favourable / nice climate; ~ yerlər places having a nice / favourable climate

**abxaz**[1] *i* Abkhazian

**abxaz**[2] *s* Abkhazian; ~ dili Abkhazian, the Abkhazian language

**abxazca** *z* Abkhazian; in Abkhazian; ~ danışmaq to speak Abkhazian; ~ yazmaq to write in Abkhazian

**abı** *s* blue; ~ don blue dress

**abılıq** *i* blueness

**abır** *i* 1. decency, decorum, proprieties; 2. dignity; 3. shame; 4. honour; ~ vermək/ ~ını almaq to bring* *smb.* to a sense of shame, to reproch *smb.*; ~ qoymamaq to disgrace *(d.)*, to dishonour *(d.)*.; ~dan düşmək to lose honour / dignity; ~dan salmaq 1) to bother *(d.)*, to pester *(d.)*; 2) to disgrace *(d.)*, to dishonour *(d.)*; *O hamını abırdan salıb Everyone is sick of him / her*; ~a qısılmaq to hold* *one's* tongue, not to lose *one's* honour / dignity; ~ı getmək to be* dishonoured, to disgrace oneself; abrını almaq to put* to shame *(d.)*, abrını gözləmək to observe the proprieties; abrını gözləməmək to behave with insolence

**abır-həya** *i bax* **abır**; ~ etmək *bax* **utanmaq**; ~nı gözləməmək to offend the proprieties

**abırlamaq** *f* to reproach *(d. for, with)*, to put* to shame *(d.)*

**abırlanmaq** *f* to get*/ to become* decorous / decent

**abırlatdırmaq** *f bax* **abırlatmaq**

**abırlatmaq** *f* to ask / to cause *smb.* to reproach *(d.)*; to force *smb.* to to put to shame *(d.)*

**abırlı** *s* decent, decorous, moral; ~ olmaq to be* decent / moral / decorous; ~ paltar decent clothing

**abırlılıq** *i* morality, decorum

**abırsız**[1] *s* shameless, indecent, barefaced, impudent; bold; ~ qız a bold girl; ~ qadın shameless woman*

**abırsız**[2] *z* shamelessly, barefacedly, impudently, indecently, boldly

**abırsızcasına** *s bax* **abırsız**[2]

**abırsız-abırsız** *z bax* **abırsız**

**abırsızlıq** *i* 1. boldness, impudence, shamelessness, barefacedness, cynicism; 2. shallowness, small-mindedness; 3. dishonour, disgrace

**abıtəhər** *s* pale / light blue, bluish

**abıyaçalan** *s* bluish
**abı-yaşıl** *s* bluish green
**abid**[1] *i* worshipper, devotee; pilgrim; ~ **olmaq** to be* a worshipper / a devotee; ~**lər** the devout
**abid**[2] *s* pious, devout; ~ **adam** a devout man*
**abidanə** *z bax* **abidcəsinə**
**abidcəsinə** *z* piously, like a worshipper / devotee
**abidə** *i* 1. monument; memorial; *(qəbiristanlıqda)* tombstone, tomb; 2. *(qədim mədəniyyət)* monument; **ədəbi** ~ literary monument; **yazılı** ~ written monument
**abidləşmək** *f* to become* a worshipper / devotee
**abidlik** *i* devoutness, piousness; ~ **etmək** to be* a worshipper / devotee
**abqora** *i* abgora *(unripe grape juice used as relish)*
**abonement** *i* 1. subscription *(to, for)*; 2. *(teatra, futbola və s. mövsüm bileti)* season ticket
**abonent** *i* subscriber; *(telefona)* telephone subscriber
**aborigen**[1] *i* aboriginal
**aborigen**[2] *s* aboriginal; native
**abort** *i* abortion; miscarriage; ~ **etmək** to have* an abortion
**abreviatura** *i dilç.* abbreviation
**absolyut** *i fəls.* absolute
**absolyutizm** *i fəls.* absolutism
**absolyutluq** *i bax* **absolyutizm**
**abstraksiya** *i fəls.* abstraction
**abstrakt** *s* abstract; ~ **isimlər** abstract nouns
**abstraktlaşdırılmaq** *f* to be* abstracted
**abstraktlaşdırmaq** *f* to abstract *(d)*
**abstraktlaşmaq** *f* to get* / to become* abstract
**abunə** *i* subscription *(to, for)*; ~ **olmaq** to subscribe *(to, for)*, to be* a subscriber *(to, for)*
**abunəçi** *i* subscriber; ~ **olmaq** to be* a subscriber *(to, for)*
**abzas** *i* 1. indention, indentation; **yeni abzas** ~ **dan başlamaq** to indent a line, to begin* a new line / paragraph; 2. *(mətnin bir hissəsi)* paragraph
**ac**[1] *i* hungry man*; ~**lar** the hungry, the poor
**ac**[2] *s* hungry; starving; ~ **qarın**, hungry stomach; ~ **uşaqlar** hungry children
**ac**[3] *z* hungrily; ~ **olmaq** to be* hungry; ~ **gəzmək/dolaşmaq** to go* about hungry; ~**ından ölmək** 1) to starve to death, to die of starvation; 2) *d.d.* to be* very hungry; ◊ **canavar kimi** ~ **olmaq** ≅ to be* as hungry as a hunter / as a wolf
**ac-acına** *z* 1. hungrily; half starving; ~ **yaşamaq** to starve, to live in want, to live from hand to mouth; 2. on an empty stomach
**acar**[1] *i* Adzhar ['a:dʒa:], Adzharian ['a:dʒa:riən]
**acar**[2] *s* Adzharian [a:dʒa:riən]; ~ **dili** Adzharian, the Adzharian language
**acarca** *z:* ~ **danışmaq** to speak* Adzhar
**acdırmaq** *f* to whet the appetite [wet…], to cause / to provoke hunger; **Dəniz havası adamı acdırır.** *Sea air whets one's appetite*
**acgödən**[1] *i* glutton, gormandizer
**acgödən**[2] *s* gluttonous; *(həm də məc.)* grasping
**acgödənlik** *i* gluttony, gormandize
**acgöz**[1] *i* glutton; a greedy man
**acgöz**[2] *s* gluttonous; *məc.* grasping, insatiable
**acgözcəsinə** *z bax* **acgözlüklə**
**acgözlü** *s bax* **acgöz**[2]
**acgözlük** *i* gluttony, greediness, avidity
**acgözlüklə** *z* gluttonously, hungrily, greedily, avidly; ~ **yemək** to devour *(d.)*, to eat* greedily *(d.)*, to gobble *(d.)*; ~ **içmək** to gulp *(d.)*; ~ **qulaq asmaq** to be* all ears; ~ **baxmaq** to devour with *one's* eyes
**acgözlülük** *i bax* **acgözlük**
**acı**[1] *i* bitter taste; bitter stuff; *məc.* bitterness; ◊ **gözünün** ~**sını almaq** *(bir azca yatmaq) d.d.* to take* a nap, to sleep* a bit
**acı**[2] *s (həm müst. həm də məc.)* bitter; ~ **dad** bitter taste; ~ **külək / soyuq** bitter wind / cold; ~ **xatirələr** bitter memories; ~ **tale** bitter fate; ◊ ~ **göz yaşları** bitter tears; ◊ ~ **həqiqət** the bitter truth; ◊ ~ **dil** wicked / spiteful tongue
**acı**[3] *z* bitterly; ~ **danışmaq** to speak* bitterly
**acı-acı** *z* bitterly; ~ **ağlamaq** to cry bitterly, to shed* bitter tears
**acıbadam** *i* bitter almond
**acıca** *s bax* **acıtəhər**
**acıdil**[1] *i* backbiter, slanderer
**acıdil**[2] *s* bitter / wicked tongued, slanderous; ~ **adam** slanderous person / man*
**acıdilli** *s bax* **acıdil**[2]
**acıdillilik** *i* slander, backbiting, malicious talk / words
**acıxasiyyət** *s* hot / quick tempered; ~ **adam** hot tempered man*
**acıxasiyyətlilik** *i the state or quality of being hot tempered*
**acıistiot** *i* bitter pepper
**acıq** *i* 1. anger, spite; **bir kəsin acığına** to spite *smb.*; ~**la** out of / for / from spite; ~**dan yanmaq** to burn with anger; **bir şeydən acığı tutmaq** to be* angered by *smth.*; 2. vexation; **Mənim acığımı təsəvvür edin!** *Imagine my vexation*; ~**çıxmaq/almaq** to take* vengeance *(on, for)*; ~ **vermək** to tease *(d.)*, to excite *(d.)*, to stir up anger; **acığa düşmək** to persist *(in)*, to be* stubborn / obstinate; **acığı soyumaq** to calm / to quiet / to settle down; **bir kəsə acığı tutmaq** to be* vexed / angry / cross with *smb.*; **Mənə acığın tutmasın** *Don't be angry / cross with me*; **acığa salmaq** to irritate; **acığı gəlmək** to vex *(at)*, can't stand *(d.)*; **Onun hərəkətindən mənim acığım gəlir** *His / Her conduct vexes me*; **özündən acığı gəlmək** to be * vexed with oneself; **Vaxtında gəlmədiyi üçün onun özünə acığı tutmuşdu** *He / She was vexed with himself / herself for not coming in time*; ◊ ~**dan zəncir çeynəmək** to blaze with indignation / fury, to fly* / to get* into a rage; ◊ ~**dan gözü heç nə görməmək** to be* blind with rage; ◊ ~**dan partlamaq** to flush with anger; ◊ ~**dan yanmaq** to burn* with anger; ~**dan özünə yer tapmamaq** to spite and to spurn; ◊ ~**dan dəli olmaq** to get* mad with rage
**acıqca** *z* spiting to, out of spite; **bir kəsin acığına bir şey etmək** to do* *smth.* to spite *smb.*
**acıqdırmaq** *f bax* **acdırmaq**
**acıqla** *z* 1. angrily, spitefully; bitterly; ~ **demək** to say* angrily; 2. to spite *(smb.)*, purposely, on purpose; ~ **etmək** to do* to spite *(smb.)*, to do* *smth.* on purpose



**acıqlandırmaq** *f* 1.to anger *(d.)*, to make* angry *(d.)*; **bir kəsi** ~ to anger *smb.*; 2. *(cırnatmaq)* to tease *(d.)*, to irritate *(d.)*
**acıqlanmaq** *f* 1.to get* angry *(with)*, to be* cross *(with)*; **Ona acıqlanmayın.** *Don't be angry / cross with him / her*; 2. to be* in bad temper; 3. *(qışqırmaq)* to shout at
**acıqlı**[1] *s* 1. angry, cross; **bir kəsə** ~ **olmaq** to be* angry / cross with *smb.*; **bir şeyə** ~ **olmaq** to be* angry at / about *smth.*; 2. spiteful, malicious; ~ **adam** malicious person; ~ **təbəssüm** malicious smile
**acıqlı**[2] *z* angrily, spitefully, maliciously
**acıqlı-acıqlı** *z bax* **acıqlı**[2]
**acıqlılıq** *i* spitefulness; *the state of being angry / cross*
**acıqmaq** *f bax* **acmaq**
**acılamaq** *f* to sting* *(d.)*, to wound *(d.)*, to taunt *(d. with)*
**acılandırmaq** *f bax* **acılatmaq**
**acılaşdırılmaq** *f* to be* made bitter
**acılaşdırmaq** *f* to make* bitter *(d.)*
**acılaşmaq** *f* to become* bitter, to turn bitter, to have* bitter taste
**acılı** *s bax* **acı**[2]
**acılıq** *i* bitter taste; bitter stuff; *məc.* bitterness
**acımadan** *z* pitilessly, mercilessly, without pity / mercy
**acımaq** *f* **I** 1.to turn / to become* bitter; 2. *(yağ)* to turn / to become* rancid; 3. *(xəmir)* to become* leavened
**acımaq** *f* **II** to sympathize *(with)*, to feel* *(for)*, to feel* sorry *(for)*; to be* sorry *(for)*; to regret
**acımsov** *s bax* **acımtıl**
**acımsovluq** *i bax* **acımtıllıq**
**acımtıl** *s* bitterish
**acımtıllıq** *i the quality or state of being bitterish*
**acımtraq** *s bax* **acımtıl**
**acımtraqlıq** *i bax* **acımtıllıq**
**acınacaq** *s bax* **acınacaqlı**
**acınacaqlı** *s* sorrowful, miserable, mournful; **bir kəsin həyatını** ~ **etmək** to make* *smb.'s* life miserable; ~ **həyat** miserable life; ~ **hadisə** sorrowful accident; ~ **vəziyyətdə olmaq** to be* in sad situation, to be* under a bad condition; ~ **görkəm** mournful air
**acınmaq** *f bax* **acımaq**[2]
**acışdırıcı** *s* irritating, annoying, irksome; ~ **qaz** irritating gas
**acışdırmaq** *f* 1. to irritate *(d.)*, to annoy *(d.)*; 2. to anger *(d.)*, to vex *(d.)*; 3. *(cırnatmaq)* to tease *(d.)*, to get *smb.'s* dander up *idiom*
**acışmaq** *f* to get* irritated / annoyed, to become* nervous
**acıtəhər** *s* bitterish; ~ **dad** bitterish taste
**acıtərə** *i bot.* watercress, (garden-) cress
**acıtma** *i* 1. droshky; 2. ferment; 3. *(xəmir)* leaven
**acıtmaq** *f* 1. to ferment *(d.)*; 2. *(xəmir)* to leaven *(d.)*; 3. to make* *(d.)* bitter
**acıtmalı** *s* 1. fermented; 2. *(xəmir)* leavened
**acıtmasız** *s* unleavened; ~ **çörək** unleavened bread
**aciz**[1] *s* 1. helpless, humble; ~ **uşaq** a helpless child; ~ **olmaq** to be* helpless; 2. *(gücsüz, küt)* feeble, impotent, effete; 3. *(yazıq)* pitiful
**aciz**[2] *z* helplessly; pitifully; impotently
**aciz-aciz** *z bax* **acizanə**
**acizanə** *z* humbly; obediently; submissively; ~ **xahiş etmək** to ask / to beg humbly
**aciz-avara** *i d.d.* loafer, idler; *(tənbəl)* lazybones; good-for-nothing
**acizcəsinə** *z* very / quite humbly, quite obediently
**acizlənmək** *f bax* **acizləşmək**
**acizləşdirmək** *f* to make* helpless *(d.)* /feeble *(d.)*
**acizləşmək** *f* to become* / to get* humble
**acizlik** *i* 1. helplessness; 2. *(zəiflik)* feebleness, weakness; 3. *(bacarıqsızlıq)* inability, incapability; 4. *(qətiyyətsizlik)* undecidedness; ~ **göstərmək** to display / to show helplessness, to act / to behave indecisively
**acqarına** *z* on an empty stomach, without having breakfast; ~ **dərman qəbul etmək / içmək** to take* medicine on an empty stomach; ~ **olmaq** not to have breakfast, to be* hungry from the morning
**ac-lələyün** *s* 1. very hungry; *(i.s.)* dying of hunger/starvation; 2. very / too poor
**aclıq**[1] *i* hunger; *(uzun müddətli)* starvation; ~ **hiss etmək** to feel* / to be* hungry, to want to eat; ~ **elan etmək** *(narazılıq əlaməti olaraq)* to go* on hunger-strike; to go* fasting; ~ **elan edən** *(adam)* hunger-striker; ~**dan ölmək** to famish; to die of famine / starvation / hunger; ~ **çəkmək** to starve, to go* hungry, to famish
**aclıq**[2] *s* famine ['fæmin]; ~ **illəri** the years of famine; ~ **qiyamı** revolt of the hungry, starvelings revolt
**acmaq** *f* to feel* / to grow* hungry; *d.d.* to feel* / to be* peckish
**ac-susuz**[1] *s bax* **ac**[2]
**ac-susuz**[2] *z bax* **ac**[3]
**ac-yalavac**[1] *s* hungry; very poor; ~ **olmaq** to be* hungry/very poor
**ac-yalavac**[2] *z* hungrily, poorly, halfstarved; ~ **yaşamaq** to live poorly / half - starved; ~ **qoymaq** to make* poor / miserable, to take* away everything one has
**açar**[1] *i* 1. *(həm müst. həm də məc.)* key [ki:]; 2. *məc.* clue [klu:]; **tapmacanın** ~**ı** clue to a puzzle; **qapının** ~**ı** the key of the door; **seyf** ~**ı** safe key; **saatın** ~**ı** key of clock; **sirrin** ~**ı** key to a mistery; **siyasi vəziyyətin** ~**ı** key to a political situation **qayka** ~**ı**; *amer.* wrench 1) **ucu açıq** ~ open-ended spanner; 2) **yaylı** ~ *(yəni həcmi dəyişdirilə bilən)* adjustable spanner; 3) **sonu girdə** ~ ring spanner; ~ **salmaq** to try a key to open a door with another key; **problemin həlli üçün** ~ a key to the problem
**açar**[2] *s* key; ~ **yeri** keyhole; ~ **qabı** key-case; key-ring
**açarqayıran** *i* key-maker
**açarlı** *s* *(i.s.)* with a key, *(i.s.)* having a key
**açarsız** *s* keyless; *(i.s.)* having no key
**açdırmaq** *f* to ask / to cause smb. to open *(d.)*, to have *smth.* opened; **sandığı** ~ to have* the trunk opened, to ask *smb.* to open the trunk

**açıq**[1] *s* 1. open; ~ qapı open door; ~ bazar open market; ~ iclas open meeting; ~ məktub 1) *(zərfsiz)* postcard; 2) *(mətbuatda dərc edilən)* open letter; ~ heca *dilç.* open syllable; ~ məsələ open question; ~ hava open air; ~ havada in the open air; out of doors; ~ ürəkli open hearted; ~ yara open wound; ~ dəniz open sea; ~ səsvermə open ballot, voting by show of hands; ~ liman open port; 2. overt; ~ düşmənçilik overt hostility; ◊ ~ çay weak tea; 3. *(aydın)* serene, clear; ~ səma clear / serene sky

**açıq**[2] *z* openly, open, frankly, publicly; ~ danışmaq to speak* openly / frankly; ~ hərəkət etmək to act openly; qapını ~ qoymaq to leave* the door open; bir kəslə ~ olmaq to be* open with smb.; ◊ ağzı ~ qalmaq to be* amazed *(at smth.)* / charmed / taken *(with)*; to be* taken back

**açıq-abı** *s* light-blue

**açıq-açığına** *z bax* **açıq**[2]

**açıq-aşkar**[1] *s bax* **açıq-aydın**[1]

**açıq-aşkar**[2] *z bax* **açıq-aydın**[2]

**açıq-aydın**[1] *s* 1. quite clear, completely clear; 2. evident, overt, obvious; ~ narazılıq evident / obvious displeasure; 3. downright, barefaced; ~ yalan barefaced / downright lie

**açıq-aydın**[2] *z* evidently, obviously, quite evident / obvious, manifestly, overtly

**açıq-bənövşəyi** *s* light-violet

**açıq-boz** *s* light-grey

**açıqca**[1] *s* open, overt, frank, undisguised; 2. evident, obvious

**açıqca**[2] *z* 1. quite openly / plainly, overtly; ~ hərəkət etmək to act quite openly; ~ danışmaq to speak* quite openly / evidently; 2. quite clearly / manifestly

**açıqcasına** *z bax* **açıqca**[2]

**açıq-çəhrayı** *s* light-rose

**açıqdan-açığa** *z bax* **açıq-aydın**[2]

**açıqfikirli** *s* 1. clear thinking, sensible, judicious; ~ adam sensible person, a man of good sense; 2. free-thinking; progressive-minded, progressive; ~ adamlar progressive-minded people

**açıqfikirlilik** *i* 1. judiciousness, good sense; 2. free-thinking

**açıq-firuzəyi** *s* light-turquoise

**açıq-göy** *s* light-blue

**açıqgöz** *s bax* **açıqgözlü**

**açıqgözlü** *s* open-eyed; watchful, sharp, keen-witted, quick on the uptake

**açıqgözlülük** *i* sharpness, keen-wittedness, gumption

**açıq-qəhvəyi** *s* light-brown

**açıq-qırmızı** *s* light-red

**açıqlama** *fi* explanation

**açıqlamaq** *f* to explain *(d. to)*, to elucidate *(d.)*, to go into detail(s)

**açıqlıq** *i* 1. *(meşədə, çöldə və s.)* glade, clearing, vacant lot; açıqlığa çıxmaq to go* out into a glade; 2. *(aydınlıq)* clearness, lucidity; fikir açıqlığı lucidity of mind; 3. *məc.* frankness, candour

**açıqrəng** *s* light-coloured

**açıqrəngli** *s bax* **açıqrəng**

**açıq-saçıq**[1] *s* 1. free-and-easy; overfree; ~ həyat free-and-easy life; 2. licentious; ~ yaşayış licentious living

**açıq-saçıq**[2] *z* 1. openly, plainly; ~ danışmaq to speak* openly; 2. boldly, shamelessly, licentiously; özünü ~ aparmaq to be* unduly familiar, to be* free and easy; ~ həyat sürmək to lead* a free-and-easy life

**açıq-saçıqlıq** *i* 1. openness, 2. disoluteness, licentiousness; 3. boldness, undue familiarity

**açıq-sarı** *s* light-yellow

**açıq-sürməyi** *s* light-blue

**açıq-şabalıdı** *s* light-brown

**açıqürək** *s bax* **açıqürəkli**

**açıqürəkli** *s* open-hearted, kind-hearted; candid; frank; ~ olmaq to be* open-hearted; ~ adam an open-hearted man*

**açıqürəklilik** *i* open-heartedness, frankness, candour, sincerity

**açıq-yaşıl** *s* light-green

**açılış**[1] *i* 1. opening; 2. inauguration, unveiling; təntənəli ~ inauguration *(of)*, grand opening *(of)*; abidənin ~ı unveiling / inauguration of a memorial

**açılış**[2] *s* opening; ~ günü opening day

**açılışmaq** *f* 1. to get* used *(to)*, to accustom *(to)*, to habituate oneself *(to)*; 2. to become* free and more independent, to make* oneself familiar *(with)*; 3. to feel* easy / comfortable

**açılmaq** *f* 1. to open, to be* open; *Qapı açıldı. The door opened; The door was opened; Dükan saat 10-da açılır. The shop opens at ten; Otaqlar bir-birinə açılır. The rooms open into each other*; 2. to be* declared open; *İclas açıldı. The meeting was declared open*; 3. *(aşkar olmaq)* to come* out, to come* to light, to be* revealed; *Onun sirri açıldı. His / Her secret came out*; 4. *(yara)* to open; *Yara açıldı The wound opened*; 5. *(gül, çiçək)* to open, to blossom out; *Tumurcuqlar / Qönçələr açılır The buds are opening*; 6. *(düymə)*, to come* undone / unfastened / unclasped; *(qarmaq)* to come* unhooked; 7. *(dəmir yolu)* to come* uncoupled; 8. *(hava)* to clear; *Hava açılır The weather is clearing*; 9. *(düyün)* to untwist, to come* untwisted; *Düyün açıldı The knot untwisted / came untwisted*; 10. *(süjet)* to unwind, to uncoil; *Süjet yavaş-yavaş açılır The narrative unwinds slowly*; 11. *(saç)* to come* unplaited; 12. *(qayka)* to come* unscrewed; 13. *(sinəsi, döşü)* to become* naked / uncovered; 14. *(səhər, yaz və s.)* to come*; *Səhər açıldı Morning came*; 15. *(pəncərə, qapı)* to open *(on)*, to look out *(on)*; *Pəncərə dənizə açılır The window opens on the sea*; 16. *(bomba)* to burst*; *Bomba açılmadı The bomb didn't burst*; 17. *(tüfəng)* to fire; *Tüfəng açıldı The rifle fired. A rifle shot was heard*; gözü ~ 1) to recover *one's* sight; 2) *məc.* to begin* to see clearly, to be* enlightened; *Beləliklə, onun gözü açıldı So he / she was enlightened*; ürəyi / qəlbi ~ to be* glad / happy, to rejoice; *Mən sizi görəndə ürəyim açılır I am glad to see you*; ◊ *Adamın ürəyi açılır One's heart fills with joy*

**açma** *fs* folding; ~ çarpayı folding-bed; ~ qayıq folding-boat; ~ qapı folding-door; ~ pərdə folding-screen; ~ stol folding-table



**açmaq** *f* I 1. to open; məktəb ~ to open a school; qapını ~ to open the door; çətirini ~ to open *one's* umbrella; gözünü ~ to open *one's* eyes; mö'tərizə ~ to open brackets; yeni dövr / səhifə ~ to open a new era / page; iclas ~ to open a sitting / meeting; to declare a meeting / sitting open; mübahisə ~ to open a debate; ataş ~ to open a fire; hesab ~ 1) *müh.* to open an account; 2) *id.* to open the score; bir kəsin gözünü ~ *məc.* to open *smb.'s* eyes; bir kəsə ürəyini ~ to open *one's* heart to *smb.*; 2. *(kranı)* to turn on; kranı ~ to turn on the tap; 3. *(yol)* to clear *(d.)*; yol ~ to clear the way; 4. to bare *(d.)*, to uncover (d.); sinəsini/döşünü ~ to bare *one's* chest/breast, to lay* *one's* chest/breast bare; ◊ ürəyini ~ 1) to cheer up, to make* glad, to cause joy *(to)*; 2) to reveal *one's* secret *(to)*, to bare *one's* heart/soul, to lay* bare *one's* heart; *Siz ürəyinizi mənə açmalısınız, axı mən sizin bacınızam You ought to lay bare your heart to me. I'm your sister, you know*; 5. to inaugurate *(d.)*, to unveil *(d.)*; abidəni ~ to inaugurate / to unveil the monument; 6. *(sirri)* to find* out *(d.)*, to reveal *(d.)*, to lay* bare *(d.)*; to discover *(d.)*; qəsdin üstünü ~ to reveal / to discover a plot; 7. *(bağdan)* to untie *O, atı bağdan açdı He / She untied the horse*; kəndiri ~ to unbind the rope; bir kəsin əllərini ~ to untie *smb.'s* hands; *məc.* to leave* *smb.* free to act; 8. *(paltarı)* to unfasten *(d.)*; paltonun qabağını ~ to unfasten the coat; 9. *(düyməni)* to unbutton *(d.)*; *Onun paltosunun düyməsini aç(ın) Unbutton his / her coat*; 10. *(qarmağı)* to unhook *(d.)*; 11. *(kəməri)* to unbuckle *(d.)*; kəməri ~ to unbuckle the belt; 12. *(bağlamanı)* to unpack *(d.)*; 13. *(düyünü, yumağı)* to untwist *(d.)*; düyünü ~ to untwist a knot; 14. *(xəmiri)* to roll out *(d.)*; xəmiri ~ to roll out the dough / paste; 15. *(süfrə)* to lay* *(d.)*; süfrə ~ to lay the table; ◊ əl ~ to ask for alms, to go* begging; dil ~ to begin* / to start to speak; *məc.* to loosen tongue; ◊ ayaq ~ 1) to begin* / to start to walk; 2) to begin* / to start to visit; ◊ könül ~ 1) to cheer up, to make* glad, to brighten up; 2) to declare *one's* love; açıb-ağartmaq to make* known *(d.)*, to give publicity *(d.)*; açıb göstərmək to disclose *(d.)*, to lay* bare *(d.)*; açıb tökmək *məc.* to tell* everything that one knows; qazanın ağzını ~ to take* the lid off a saucepan; ◊ Amerika açmaq ≅ to retail stale news

**açmaq** *f* II 1. to like, to satisfy; to be* convenient; *Belə hava məni açır I like such weather. Such weather satisfies me*; 2. *(sevindirmək)* to make* glad, to cause joy *(to)*; *Bu xəbər məni açdı This news made me glad*

**ad** *i* 1. name; ~ vermək / qoymaq to name *(d.)*; *Uşağın adını Cavid qoydular They named the baby Javid*; ~ çıxarmaq to leave* a name of oneself; yaxşı ~ çıxarmaq to leave* a good name of oneself; to become* famous / well - known; pis ~ çıxarmaq to leave* a bad name of oneself; to fall* into dispute; ~ı anılmaq to be* mentioned / remembered; ~ı batmaq 1) to lose* prestige / fame; 2) *(unudulmaq)* to be* forgotten; *d.d. (ölmək)* to die; *(qeyb olmaq)* to disappear; ~ı qalmaq 1) to leave* name; 2) *(ölmək)* to die; ~ı pisə çıxmaq to fall* into dispute, to be* disgraced, to gain a bad name; ~ı çəkilmək / tutulmaq to be* mentioned / remembered; ~ı çıxmaq 1) *(müsbət mənada)* to become* famous / well - known; *(mənfi mənada)* to fall* into dispute; ~ını ləkələmək; to stain *one's (good)* name ~ından on behalf *(of)*; bir kəsin ~ından on behalf of *someone*, on *someone's* behalf; fəhlələrin ~ından on behalf of the workers, on workers' behalf; 2. *(kitab, məqalə və s. adı, titul)* title; rank; kitabın ~ı the title of the book; markiz ~ı the rank of marquis; 3. *(təxəllüs)* nickname; 4, *(elmi, hərbi rütbə)* degree; rank; elmi ~ academic rank; ~ almaq *(elmi)* to get* a degree; 5. *qram.* 1) *(isim)* noun; 2) *(sifət)* adjective; 3) *(əvəzlik)* pronoun 4) *(say)* numeral

**ada** *i* island; *şair.* isle

**adacıq** *i* islet [aılıt]

**adaçayı** *i bot.* sage

**adadovşanı** *i zool.* rabbit

**adax** *i* engagement, betrothal; ~ etmək to engage, to betroth; bir kəsə ~ edilmək to be engaged / betrothed to *smb*

**adaxlama** *fi* betrothal [bı-]

**adaxlamaq** *f* to betroth [bı'trouð] *(to)*; *Onu kiçik yaşında mənim bacıma adaxladılar He was betrothed to my sister at an early age*

**adaxlandırmaq** *f bax* **adaxlamaq**

**adaxlanmaq** *f* to be* betrothed *(to)*; bir kəsə ~ to betroth *oneself* to *smb.*; *O, kiçik yaşında adaxlandı He / She was betrothed at an early age*

**adaxlı**[1] *i* betrothed' *O, (qız) öz adaxlısı ilə gəlib She has come with her betrothed*; *(oğlan)* fiance; *(qız)* fiancee; *Sara Cavidin adaxlısıdır Sara is Javid's fiancee*; *Faiq Sonanın adaxlısıdır Faig is Sona's fiance*; ~lar the betrothed; the betrothed pair; *Adaxlılar otaqdadırlar The betrothed are in the room*

**adaxlı**[2] *s* betrothed; ~ olmaq to be* betrothed; bir kəsə ~ olmaq to be* betrothed to *smb.*; ~ qız a betrothed girl; ~ oğlan a betrothed fellow / boy

**adaxlıbazlıq** *i a secret meeting of the betrothed pair*; adaxlıbazlığa getmək to go* to see *one's* fiancee secretly

**adaxlılıq** *i the state of being betrothed*

**adajio** *i mus.* adagio

**adaq** *i* I *first steps of a child*

**adaq** *i* II *bax* **adax**

**adaq-adaq** *z* slowly, gradually; ~ getmək to go* step by step / slowly

**adalı** *i* 1. *(adada yaşayan)* islander; 2. *(çoxlu ada olan yer)* *(i.s.)* with islands

**adam** *i* man* ; person; adi ~ an ordinary / average man; dahi ~ an eminent person; alim ~ an erudite person; işgüzar ~ a businessman; a practical / business-like person; ağıllı ~ a clever man; beş ~ five persons; ~ etmək 1) to make* a man; *Mən sizi adam edəcəm I'll make a man out of you*; 2) to bring* up *(d.)*; to support *(d.)*; ◊ ~ oynatmaq to play a practical joke *(on)*, to pull *smb.'s* leg; təcrübəli ~ a man of experience; an experienced man*

**adamaldadan** *i* swindler, cheat, trickster

**adamaoxşamaz** *i* an ugly person, ugly duckling

**adamaoxşamazlıq** *i* ugliness, being very ugly

**adamaoxşar** s bax **insanabənzər**
**adamayovuşan** s sociable,amiable; ~ adam a sociable man*
**adamayovuşmaz** s unsociable; ~ adam unsociable person; ~ olmaq to keep* oneself to oneself
**adamayovuşmazlıq** i unsociability
**adambaşı** z per capita, per head, per man; ~ beş manat five manats per head / per man; *Adambaşına nə qədər? How much per head?* ~ süd istehsalı production of milk per capita
**adambaşına** z bax **adambaşı**
**adamboyu** s as tall / high as a man
**adamcasına**[1] s humane; ~ rəftar humane treatment
**adamcasına**[2] z humanely, as a man, like a man, in a manlike manner / way
**adamcığaz** i bax **adamcıq**
**adamcıq** i little fellow *(one who has no authority / power at all)*
**adamcıl** s bax **adamyeyən**
**adamcıllıq** i bax **adamyeyənlik**
**adamdanqaçan** s misanthrope; unsociable, self-contained
**adamgüldürən**[1] i fool, jester, man of motley, a jocular person
**adamgüldürən**[2] s witty, playful, jocular
**adamkökü** s bot. mandrake, mandragora
**adamlıq** i humaneness, humanity; ~ etmək to act humanely
**adamoynadan** i mocker, scoffer
**adamsatan** i (kişi) traitor, betrayer; (qadın) traitress
**adamsatanlıq** i treachery, betrayal, perfidy, perfidiousness
**adamsevən** s humanist, benevolent; kind
**adamsevməz** i man-hater, misanthrope
**adamsevməzlik** i misanthropy, hatred of mankind
**adamsız** s 1. (arxasız, qohum-qardaşsız) unprotected, *(i.s.)* having no supporter, *(i.s.)* having no relation/relative; 2. (məskunsuz) uninhabited, *(i.s.)* without population
**adamsızlıq** i loneliness; defencelessness, *the state of being without support*
**adamtanıyan** i physionomist *(one who can realize one's character)*
**adamyana** z manly, humanely, like a man
**adamyeyən**[1] i cannibal; man-eater
**adamyeyən**[2] s cannibalistic; man-eating; ~ qəbilə cannibalistic tribe
**adamyeyənlik** i cannibalism, cannibality
**adapter** i adaptor, adapter; mus. pick-up
**adaş** i namesake; ~ olmaq to be* namesake, to have* the same name; *O, mənim adaşımdır He / She is my namesake*
**adaşlıq** i *the state of having the same name, the state of being namesake*
**adbaad** z name by name; ~ çağırmaq to roll call *(d.)*
**adda-budda**[1] s not regular, seldom
**adda-budda**[2] z now here, now there; not regularly
**addamaq** f to step over *(d.)*, to overstep *(d.)*; to cross *(d.)*; sərhədi ~ to cross the frontier; məc. to overstep the limits, to pass all bounds; düşmən tərəfə ~ to desert to the enemy, to be* turncoat

**addatmaq** f to carry *(d.)*, to transfer *(d.)*; bir şeyi bir yerdən başqa yerə ~ to carry / to transfer *smth.* from one place to another
**addım** i step; inamlı ~ resolute / firm step; inamlı ~la with resolute step; ~ atmaq 1) to step; 2) to walk; (iri ~larla) to stride; (yavaş ~larla) to pace; gümrahcasına ~ atmaq to walk with vigorous strides; eyni ~ atmaq to march in step *(with)*; ~ını yeyinlətmək to mend/to quicken *one's* pace; sakit ~ larla getmək to walk slowly, to walk with a slow [slou] step; cəld ~larla getmək to walk quickly, to walk with a rapid step; to walk with hurried steps; iri ~larla with long strides; bir ~ da geri çəkilməmək not to retreat a step; iki ~lıqda a few steps away; near by; hər ~da at every step / turn; often; ilk ~ atmaq to take* the first step; qəti ~ atmaq to take* a decisive step; səhv ~ false [f ɔ:ls] steps; ilk ~ the first step *Bu, irəliyə doğru bir addımdır It is an advance (over)*
**addım-addım** z step by step, gradually
**addımbaaddım** z step by step, in the tracks, bir kəsin dalınca ~ getmək to follow *smb.* in the tracks
**addımbaşı** z often, frequently, at every step
**addımlamaq** f 1. to begin* to walk; 2. to stride, to march; 3. (ölçmək) to measure by steps
**addımlatdırmaq** f bax **addımlatmaq**
**addımlatmaq** f to ask / to cause *smb.* to step
**addımlayan** s tex. walking, dragline; ~ ekskavator walking excavator, dragline excavator
**addımlıq** i *(used after numerals to show distance)* beş ~ məsafə five steps away; beş ~da at five steps
**addımölçən** i pedometer
**Adəm** i Adam *(the first man on the Earth)*
**adət** i 1.habit; ~in gücü force of habit; bir şeyi ~ üzrə etmək to do* *smth.* from mere habit; ~ etmək to grow*/ to get* into habit; ~i tərk etmək / tərgitmək to break off a habit, to give* up a habit; 2. custom; 3. ritual, rite; qonaqpərəstlik ~ləri the rites of hospitality; qəbilə ~ləri tribal customs; dəfn ~ləri funeral rites; milli ~lər national customs *Bu bizdə adətdir It is a custom with us*
**adətcə** z bax **adətən**
**adətdənkənar** s not customary, not habitual; unusual, uncommon; *Burada adətdənkənar bir şey yoxdur There is nothing unusual in that*
**adətən** z (adət üzrə) habitually, as a habit; customarily, according to custom; usually, as usual
**adətkərdə** s accustomed *(to)*; ~ olmaq to become* accustomed *(to)*, to get* into a strong habit
**adətsiz** s *(i.s.)* without habit / custom; *(i.s.)* without tradition / rite
**adıbatmış** s lost, forgotten
**adıbədnam** s dishonest, disgraced
**adıbilinməz** s unknown, not known / popular
**adına** i Thursday
**adi** s 1. ordinary, usual, 2. common, commonplace, plain; ~ adam(lar) ordinary people; ~ ərzaq plain food; ~ ölüm ordinary mortal; ~ gözlə with the naked eye; ~ kəsr simple / vulgar fraction; ~ ifadələr commonplace expressions
**adicə** z simply; ~ yaşamaq to live simply; ~ danışmaq to speak* simply



**adil** s 1. just, fair; ~ hakim a just judge; ~ adam a just man; ~ qanun a just law; ~ olmaq to be* just; ~ qərar fair decision
**adillik** i justice, fairness
**adqoydu** i bax **adqoyma**
**adqoyma** i 1. name-day; 2. naming
**adlandırılmaq** f to be* named / called / termed
**adlandırmaq** f to name *(d.)*, to call *(d.)*, to give* the name *(to d.)*
**adlanmaq** f to be* called/named; *Bu necə adlanır? What is it called?*
**adlı** s 1. famous, celebrated, notable; 2. by name; *Əli adlı bir kişi vardı There was a man by name Ali*
**adlıq** s qram. nominative; ~ hal nominative case
**adlı-sanlı** s famous, celebrated, well-known; ~ alim a well-known / famous scientist; ~ nəsildən olmaq to come* of good kin
**admiral**[1] i admiral
**admiral**[2] s admiral's; ~ gəmisi admiral's flagship
**admirallıq** i the admiralty
**ad-san** i glory, fame, reputation; ~ qazanmaq / çıxarmaq to become* famous / well-known / popular; bir kəsə ~ qazandırmaq to bring* fame to *smb*; pis ~ çıxarmaq to have* a bad reputation, to be* in bad repute
**adsız** s 1. nameless, *(i.s.)* without name; 2. (imzasız) anonymous; ~ məktub anonymous letter; 3. bax **adsız-sansız**; ~ barmaq fourth finger, (sol əldə) ring-finger; ~ ədəd abstract number
**adsız-sansız** s not well-known, obscure, unpopular ~ adam obscure man; ~ nəsildən olmaq to come* of bad / unpopular kin
**advokat** i bax **vəkil**
**advokatlıq** i bax **vəkillik**
**adyutant** i aide-de-camp [eiddə'ka:ŋ] *(fr.)* *(pl.* aides-de-camp), adjutant; amer. aide
**aerobomba** i aerobomb
**aerodrom** i aerodrome
**aerometr** i aerometer
**aeronaviqasiya** i aeronavigation
**aeronavt** i aeronaut
**aeronavtika** i aeronautics
**aeroport** i aeroport, airport
**aerostansiya** i aerostation
**aerostat** i aerostat
**afərin** nid bravo! well done!
**afət** i 1. misfortune, natural calamity; 2. a beauty
**affiks** i dilç. affix
**afişa** i bill, placard, poster; teatr ~sı playbill
**afiyət** i health; *Afiyət olsun! Bon appetit!* [b ɔ ŋ a p e' t i]
**aforizm** i aphorism
**Afrika** s African; ~ dilləri African languages
**afrikalı** i African
**aftab** i bax **günəş**
**aftafa** i aftafa *(a jug with a long spout used for ablutions)*
**aftafa-ləyən** i *washing set, consisting of a jug and wash-basin*
**agah** s; ~ olmaq to be* known, to become* clear, to come* into being; ~ etmək to inform *(d. of)*, to give* knowledge to; to tell *(d.)*

**agent** i 1. agent; ~ olmaq to be* an agent, to work as an agent; 2. (xəfiyyə) spy
**agentlik** i agency; teleqraf agentliyi news / telegraph agency; ticarət agentliyi agency; nəqliyyat agentliyi transport agency
**agentura** i 1. (kəşfiyyat xidməti) secret / intelligence service; 2. top. i agents pl.; düşmən ~sı enemy / hostile agents pl.
**ağ**[1] i white *(stuff)*; ◊ ~ etmək to go* too far; ~ına-bozuna baxmamaq to act freely, to do* what and how one wants
**ağ**[2] s white; ~ çörək white bread; ~ şərab white wine; ~ ət (quşda) white meat; ~ neft paraffin, amer. kerosene; ~ tut white mulberry; ~ turp turnip; ~ ayı Polar bear; ◊ ~ yalan down-right/barefaced lie; ~ yalan danışmaq to tell* a barefaced lie, to lie in *one's* throat
**ağa** i master; özü-özünün ~sı olmaq to be* one's own master; evin ~sı (kişi) host/head of the house; (qadın) landlady; ~ kimi yaşamaq to live in easy circumstances, to live a well-to-do life
**ağac**[1] i 1. tree; 2. (tikinti materialı) wood, timber; 3. (əl-ağacı) stick, walking-stick, staff; 4.(dəyənək) cudgel, club; məc. blockhead, dunderhead; ~a dönmək to become* stiff / numb, to harden
**ağac**[2] s wooden; ~ qaşıq wooden spoon; ~ spirti wood alcohol; ~ kömür charcoal; ~ sənayesi timber industry
**ağac-ağac** i *a kind of game played with sticks*; ~a çıxmaq bax **dalaşmaq**
**ağaccilalayan** i wood polisher
**ağacdələn** i zool. woodpecker
**ağaclaşmaq** f I to fight with sticks
**ağaclaşmaq** f II to become*/ to grow* stiff, to become*/ to grow* numb; to stiffen
**ağaclı** s *(i. s.)* with trees, *(i.s.)* having trees
**ağaclıq** i grove
**ağacqıran** i woodcutter
**ağacqurbağası** i zool. tree-frog
**ağalanmaq** f to behave / to act as a master; to pose a master; to give* oneself airs *idiom*
**ağalıq** i supremacy, domination, rule; ~ etmək to dominate *(over)*, to rule (over); to command *(d.)*; ~ edən ruling; ~ edən sinif ruling class, the class in power; başqaları üzərində ~ etmək to have* supremacy over others; to gain supremacy over others; dünya ağalığı world domination
**ağappaq** s snow-white, snowy; pure white, lily white; ~ süfrə snowy *(white)* table-cloth; ~ saç snowy hair
**ağardılmaq** f to be* covered with whitewash; to become* whitewashed
**ağarışmaq** f to show* white; *Yelkənlər dənizdə ağarışır The sails show white in the sea*
**ağarmaq** f 1. to show* white; to turn white; 2. to brighten up, to get brighter; *Dan yeri ağarır Day is breaking*
**ağartdırmaq** f to ask / to cause *smb.* to whitewash *(d.)*, to have* *(d.)* whitewashed
**ağartı** i 1. dairy / milk product; 2. hardly noticed whiteness
**ağartma** fi 1. whitewashing; 2. (yazı) fair copy

xoşbəxtlik ~ to dream of happiness, to dream that one will be happy
**arzulanmaq** *f* 1. to be* wished / desired; 2. to be* dreamed
**arzulu** *s* 1. *(i.s.)* having wish / desire; 2. dreamy, *(i.s.)* having dreams
**arzuolunmaz** *s* 1. undesirable, undesired; 2. objectionable; ~ hərəkətlər undesirable manners; ~ iy objectionable smell
**arzusuz** *s* desireless, wishless; *(i.s.)* without wish / desire
**arzusuzluq** *i* *the state of being desireless / wishless*
**asan**[1] *s* easy, simple, light; ~ iş easy / simple / light work; ~ üslub easy / simple style; ~ dərs easy lesson; ~ həyat easy life; *Bu asan iş deyil It's not an easy task/job*
**asan**[2] *z* easily; ~ etmək to do* easily; *Mən bunu asan edə bilərəm I can do it easily; Demək asandır It's easy to say*
**asanca**[1] *s* very / too easy, quite simple
**asanca**[2] *z* too / quite easily
**asancasına** *z bax* **asan**[2]
**asanlaşdırıcı** *s* simplifying; vulgarising
**asanlaşdırma** *fi* simplification, making easier / lighter
**asanlaşdırmaq** *f* to simplify *(d.)*, to facilitate *(d.)*; to make* easier *(d.)*; problemi ~ to simplify a problem; orfoqrafiyanı ~ to simplify spelling; mətni ~ to simplify a text; tapşırığın yerinə yetirilməsini ~ to facilitate the execution of a task
**asanlaşma** *fi* easying, facilitation, simplification
**asanlaşmaq** *f* to become* easier / lighter, to become* simpler, to get* simplified; *İşimiz asanlaşdı Our work became easier / simpler*
**asanlıq** *i* easiness, lightness; simplicity
**asanlıqla** *z* easily; bir işi ~ etmək to do* some work easily; ~ danışmaq to speak* easily; *O, ingiliscə asanlıqla danışır He / She speaks English easily*
**asayiş** *i* 1. tranquility, quiet; ictimai ~ public tranquility / quiet; ictimai ~i qorumaq to preserve law and order; 2. order; ~i bərpa etmək to restore order; ~ yaratmaq to establish order
**asbest**[1] *i* asbestos
**asbest**[2] *s* asbestine
**asbestli** *s bax* **azbest**[2]
**asdırılmaq** *f* to be* hanged
**asdırmaq** *f* 1. to make *smb.* hang up *(d.)*; 2. *(öldürmək)* to order / to ask to hang up *(d.)*; *Buna görə adamı asdırarlar One may be hanged for it*
**asetilen**[1] *i kim* acetylene
**asetilen**[2] *s kim.* acetylene; ~ lampa acetylene lamp
**aseton**[1] *i kim.* acetone
**aseton**[2] *s kim.* acetone
**asfalt**[1] *i* asphalt; ~ çəkmək *bax* **asfaltlamaq**; ~ çəkdirmək / döşətmək *bax* **asfaltlatmaq**
**asfalt**[2] *s* asphalt; ~ yol an asphalt road
**asfaltbasan** *i* asphalt paver
**asfaltçı** *i* asphalt paver
**asfaltlamaq** *f* to asphalt *(d.)*; yolu ~ to asphalt a road
**asfaltlanmaq** *f* to be* asphalted / covered with asphalt
**asfaltlaşdırmaq** *f bax* **asfaltlamaq**
**asfaltlatdırmaq** *f bax* **asfaltlatmaq**
**asfaltlatmaq** *f* to ask / to force *smb.* to asphalt *(d.)*, to cause *smb.* to cover with asphalt *(d.)*; to have* *(d.)* asphalted
**asfaltlı** *s* asphalted, *(i.s.)* covered with asphalt; ~ olmaq to be* asphalted, to be* covered with asphalt; ~ yollar asphalted roads
**asfaltsız** *s* asphaltless, not asphalted, *(i.s.)* without asphalt
**asılı** *s* dependent; ~ olmaq to be* dependent *(on, upon)*; ~ ölkələr dependent countries
**asılılıq** *i* dependence; bir kəsin asılılığında yaşamaq to live in dependence on *smb.*
**asılqan** *i* peg, rack; stand; *(girəcəkdə qoyulan)* hall-stand
**asılmaq** *f* 1. to hang*; to be* hanging, to be* suspended; *(başı üstə)* to overhung*; havadan ~ to be* in the air; tükdən ~ to hang* by a thread; telefondan ~ *d.d.* to hang* on the phone; 2. to be* hanged out; *(elan)* to be* posted up, to be* put up; 3. *(öldürülmək)* to be* hanged; 4. *(qazan və s.)* to be* put on the stove/fire
**asırqal** *i* hellobore
**asırqallıq** *i* hellobore grove
**asiman** *i bax* **səma**
**asimmetrik** *s* asymmetric(al)
**asimmetriya** *i* asymmetry
**Asiya** *s* Asian ['eɪʃən]; *d.d.* Asiatic
**asiyalı** *i* Asiatic
**asket** *i* ascetic
**asketik** *s* ascetic
**asketizm** *i* asceticism
**askorbin** *s*: ~ turşusu ascorbic acid
**asqı** *i* 1. *(üst paltarı üçün)* hat-and-coat stand; 2. *(baş geyimləri üçün)* hanger, *(qarmaq)* peg
**asqırdıcı** *s* sneezing; *elm.* sternutative, sternutatory; ~ qaz *hərb. kim.* sneezing gas
**asqırıq** *i* sneezing; *elm.* sternutation
**asqıraqotu** *i bot.* milfoil
**asqırmaq** *f* to sneeze
**asqırtı** *i bax* **asqırıq**
**asqırtmaq** *f* to make *smb.* sneeze, to cause *smb.* to sneeze; *Toz onu asqırtdı The dust made him / her sneeze*
**aslan**[1] *i* *(erkək)* lion; *(dişi)* lioness; dəniz ~ı sea lion
**aslan**[2] *s* lion, lion's; ~ balası lion cub; ~ dərisi lion's skin
**asma** *s* hanging, pendent; ~ qıfıl padlock; ~ körpü suspension bridge; ~ lampa pendent lamp; overhead lamp; ~ soğan plait of onions
**asmaq** *f* 1. *(bir şeyi asmaq)* to hang* *(d.)*; papağı / paltonu və s. asılqandan ~ to hang* *one's* hat / coat etc. on a peg; şəkli divardan ~ to hang* a portrait / picture on the wall; 2. *(öldürmək)* to hang* *(d.)*; bir kəsi cani olduğuna görə ~ to hang* *smb.* for murder; özünü ~ to hang* oneself; 3. *(qazan asmaq)* to put* the saucepan on the fire
**asmalıq** *s* *(fruit or vegetable)* suitable for keeping by hanging; ~ soğan onion suitable for keeping by hanging; ~ nar pomegranate suitable for keeping by hanging



**aspekt** *i* aspect; view, viewpoint
**aspirant** *i* *(post-)* graduate *(student)*
**aspirantlıq**[1] *i* *the state of being a post-graduate student*
**aspirantlıq**[2] *s*: ~ illəri time / years one spends being a post-graduate student
**aspirantura** *i* *(post-)* graduate course, post-graduate study; bir kəsi ~da saxlamaq to grant / to offer *smb.* *(post)* graduate course / post - graduate study
**aspirin** *i əcz.* aspirin; iki ~ həbi qəbul etmək to take* two aspirins / aspirin tablets
**asral** *i* flax; yabanı ~ toadflax; uzunlifli ~ long-fibred flax
**asrallıq** *i* flax grove, the place where flax grows
**assimilyasiya** *i* assimilation; səslərin ~sı *dilç.* assimilation of sounds; tam ~ wholly assimilation; yarımçıq ~ partially assimilation
**assistent** *i* assistant; *(imtahanda)* assistant examiner; *(ali məktəbdə)* (assistant) lecturer
**assistentlik** *i the job of an assistant;* ~ etmək to assist
**assortiment** *i* assortment
**assosiasiya** *i* *(müxtəlif mənalarda)* assosiation; Beynəlxalq Fonetika Assosiyası International Phonetic Assosiation
**asta**[1] *s* 1. slow; low; ~ addımlar slow steps; ~ yeriş slow walk; ~ zarıltı/inilti low/faint moan; ~ səs low voice; ~ sürət slow speed; ~ adam slowcoach, sluggard; ~ hərəkət slow movement; 2. sluggish; ~ axın a sluggish stream
**asta**[2] *z* 1. slowly; gently *İşlər asta gedir Things are moving slowly;* ~ danışmaq to speak* in a low voice, to speak* in low/hushed tones; qapını ~ döymək to knock gently at the door; 2. sluggishly; ~ hərəkət etmək to move sluggishly; *Asta ol! Be careful!*
**asta-asta** *z* slowly; gently; softly; quietly; ~ yerimək to walk slowly; ~ danışmaq to speak* slowly
**astaca** *z* slowly; softly, gently, quietly; ~ yerimək to walk slowly; ~ danışmaq to speak* quietly / softly; to speak* in a low voice
**astadan** *z* in a low voice, in a hushed tone; gently, softly
**astagəl** *s* sluggish, slow; ~ adam slowcoach, sluggard
**astana** *i* threshold, doorsteps; ~nı keçmək to cross the threshold; ~da dayanmaq to stop on the threshold; həyatın ~sında on the threshold of life; ◊ bir kəsin ~sını döyənək etmək to haunt *smb.'s* threshold; ~dan içəri buraxmamaq not to allow *smb.* into *one's* house
**astar** *i* 1. lining; paltoya ~ qoymaq / çəkmək to line a coat; paltoya ~ qoydurmaq to have* a coat lined; ipək ~ silk lining; 2. *tik.* *(birinci suvaq, rəng)* ground, prime, dab; ~ vurmaq/ çəkmək to prime, to make* a dab; ~ı çıxmaq to be* worn out, to be* used up
**astarçəkmə** *fi tik.* priming, prime coating
**astarlamaq** *f* 1. to sew* underneath *(d.)*; *(ayaqqabını)* to sole *(d.)*; *(paltarı)* to line *(d.)*; 2. *tik.* to ground *(d.)*, to prime *(d.)*, to make* a dab
**astarlatmaq** *f* 1. to have *(d.)* lined; to ask / to cause *s.o.* to line *(d.)*; 2. *tik.* to have* *(d.)* primed; to ask / to cause *smb.* to prime *(d.)*; paltonu ~ to have* a coat lined
**astarlı** *s* lined; *(i.s.)* with lining; ipək ~ silk-lined, *(i.s.)* with a silk lining
**astarlıq** *i* fabric suitable for lining
**astarsız** *s* *(i.s.)* without lining, *(i.s.)* having no lining
**asteroid** *i astr* asteroid
**astma** *i tib.* asthma; bronxial ~ bronchial asthma; ürək ~sı cardiac asthma
**astmalı** *s* *(i.s.)* suffering from asthma
**astmatik** *s tib.* asthmatic
**astrobiologiya** *i* astrobiology
**astrofizik** *s* astrophysical
**astrofizika** *i* astrophysics
**astrologiya** *i* astrology
**astroloq** *i* astrologer
**astronavt** *i* astronaut
**astronavtika** *i* astronautics
**astronom** *i* astronomer
**astronomik** *s* astronomic(al); ~ rəqəmlər astronomical numbers
**astronomiya** *i* astronomy
**astronomluq** *i the profession of an astronomer*
**asudə**[1] *s* free, easy; leasure; ~ xalq free people; ~ olmaq to be* free, to be* at leasure; ~ vaxt free time; ~ saatlar free / leasure hours; ~ vaxtlarda in *one's* spare time
**asudə**[2] *z* freely, easily; ~ yaşamaq to live freely; ~ nəfəs almaq to breathe freely; bir kəsi ~ buraxmaq to leave* *smb.* alone / in peace
**asudəcə** *z* light-heartedly, carelessly
**asudələnmək** *f* 1. to become* free, to free oneself; 2. to calm / to quiet / to settle down
**asudələşmək** *f* to become* free; to free oneself; to become* carefree
**asudəlik**[1] *i* 1. leisure, ['leʒə] leisure-time, spare time; 2. rest, calmness
**asudəlik**[2] *s* leisure;['leʒə] ~ saatları leisure hours
**asudəlikdə** *z* at leisure; ~ olmaq to be* at leisure
**aş** *i* I 1. pilau, pilaw, pilaff; 2. porridge; südlü ~ milk porridge; ◊ ~ını bişirmək 1) to give* it *smb.* hot; 2) *d.d.* to have sex *(with)*; to commit adultery, to fornicate ◊ ~ına su qatmaq to put* a spoke in *smb.'s* wheel, to prevent *smb.* from doing *smth.*; ◊ ~ının suyunu vermək to beat* *(d.)* mercilessly, to punish *(d.)* mercilessly; ◊ Əli ~ndan da olmaq, Vəli ~ından da ≅ to have*/ to gain nothing, to get* nothing for *one's* pains, to have* neither this nor that; *harada aş orada baş zərb. məs.* ≅ *You can meet him anywhere you go*
**aş** *i* II tannic acid, tannin; ~a qoymaq to tan *(d.)*
**aşağı**[1] *i* bottom (part); səhifənin ~sında at the bottom of the page
**aşağı**[2] *s* 1. lower; low; ~ mərtəbə ground floor; ~ palata Lower Chamber / House; *(İngiltərədə)* House of Commons; ~ notlar *mus.* low tones; ~ temperatura low temperature; ~ təzyiq low pressure; əməyin ~ məhsuldarlığı low productivity of labour; 2. bottom; ~ rəf bottom shelf; 3. poor, junior; ~ keyfiyyət poor quality; ~ siniflər junior forms

**aşağı³** *z* down; ~ baxmaq to look down; ~ düşmək to come* down, to descend; ~ əyilmək to bend* down; ~ oturmaq to sit* down; ~ getmək to go* down; *Lift aşağı gedir? Is the elevator going down?* ◊ əli ~ olmaq to be* poor, to have* no means of subsistence; ◊ əli ~ düşmək to become* to grow* poorer; başını aşağı etmək to disgrace *(d.)*, to defame *(d.)*; başını ~ əymək to bend* down, to incline *one's* head

**aşağı⁴** *qoş.* below; sıfırdan ~ below zero; ortadan ~ below average; kənddən ~ below the village; dördüncü mərtəbədən ~ below the third floor

**aşağıda** *z* below, underneath, at the foot *(of)*, at the bottom *(of)*; ~ xatırladılmış stated / mentioned below; ~ adı çəkilən named below; ~ qol çəkənlər the undersigned; səhifənin aşağısında at the foot of the page

**aşağıdakı** *s* the following; ~ adlar the following names; ~ sənədlər lazımdır the following documents are necessary

**aşağıdan** *z* from below; from *(the)* bottom; ~ baxmaq to look below; ~ görünüş view from below; ~ beşinci sətir the fifth line from *(the)* bottom; ~ tənqid criticism from below; ~ yuxarıya qədər / kimi from bottom to top

**aşağılatmaq** *f* to reduce *(d.)*, to lower *(d.)*, to bring* down *(d.)*

**aşağı-yuxarı** *z* 1. down and up; 2: ~ danışmaq to beat* about the bush; *amer.* to beat* around the bush

**aşbaz** *i* 1. *bax* **aşpaz**; 2. pilau eater, pilau lover

**aşbazbaşı** *i bax* **aşpazbaşı**

**aşbazxana** *i bax* **aşpazxana**

**aşbazlıq** *i bax* **aşpazlıq**

**A-şəkilli** *s* A-shaped

**aşxana** *i* dining-room, eating-house

**aşxanaçılıq¹** *i* culinary; ~ sənəti art of cookery / cooking

**aşxanaçılıq²** *s* ~ sənəti art of cookery / cooking

**aşı** *i bax* **aş II**

**aşıb-coşmaq** *f* to seethe *(with)*, to boil up; to buzz with excitement

**aşıb-daşmaq** *f* 1. to have* a lot, to have* plentiful; 2. to boil up, to seethe *(with)*; *Kütlənin nifrəti aşıb-daşırdı The hatred of the mass is seething / boiling up*

**aşıx** *i muz. bax* **aşıq I**

**aşıq** *i* **I** *(simli musiqi alətlərində)* tuning peg

**aşıq** *i* **II** ashug *(Caucasian folk poet and singer)*

**aşıq** *i* **III** knuckle-bone; ◊ aşığı alçı durmaq ~ to be* very lucky, to have* great success in life

**aşıq-aşıq** *i*: ~ oynamaq to play knuckle-bones

**aşıqlıq** *i* **I** *the profession of ashug*; ~ etmək to be* an ashug

**aşıqlıq** *i* **II** *anat.* ankle

**aşıqsayağı** *z* like / as an ashug; ~ oxumaq to sing like an ashug

**aşılamaq** *f* to tan *(d.)*

**aşılanmaq** *f* to be* tanned

**aşılanmış** *fs* tanned; ~ dəri / gön tanned leather

**aşılatdırmaq** *f* to have* *(d.)* tanned, to cause / to ask *smb.* to tan *(d.)*

**aşılatmaq** *f bax* **aşılatdırmaq**

**aşılayıcı¹** *i* tanning agent, tanning

**aşılayıcı²** *s* tanning; ~ maddə tanning agent

**aşılayıcılıq** *i the profession of a tanner*

**aşılı** *s* tanned; ~ dəri / gön tanned leather

**aşılmaz** *s* insuperable, insurmountable; ~ hündürlük insuperable height; ~ maneə insurmountable barrier / obstacle

**aşındırıcı** *s* caustic; ~ soda caustic soda

**aşındırıcılıq** *i* causticity

**aşındırılmaq** *f geol.* 1. to be* weathered; to be* eaten away; 2. *(turşu ilə)* to be* corroded

**aşındırmaq** *f* 1. *geol.* to weather *(d.)*; 2. *(turşu ilə)* to corrode *(d.)* *Turşu metalı aşındırır Acid causes metal to corrode*

**aşınma** *fi* 1. *tex.* etching; 2. *geol.* weathering; 3. erosion; torpaq ~sı soil erosion

**aşınmaq** *f* 1. *tex.* to become*/ to get* etched; 2. *geol.* to weather; to be weathered; 3. *(paslanmaq)* to be* eaten away, to become*/ to get* corroded

**aşıntı** *i tex.* wear and tear

**-aşırı** *part of compound words having the meaning every other, such as* günaşırı every other day, həftəaşırı every other week; sətiraşırı yazmaq to write* on every other line; *(yazı makinasında)* to use double-spacing

**aşırılmaq** *f* 1. to be*thrown over; 2. to overturn, to tip over; *(gəmi)* to capsize; *Qayıq aşırıldı The boat overturned/tipped over / capsized*; *Stol aşırıldı The table tipped over*

**aşırım** *i* 1. *(dağ keçidi)* pass; 2. *me'mar.* bay; *(körpüdə)* span, bridge span

**aşırımlı** *s* 1. *(i.s.)* with passes; 2. *(i.s.)* with bays; *(körpüdə) (i.s.)* with spans

**aşırma** *i* braces, *amer.* suspenders

**aşırmaq** *f* 1. to throw over *(d.)*; çiynindən ~ to fling over *one's* shoulder *(d.)*; qıçını qıçının üstünə ~ to cross *one's* legs; 2. to turn over *(d.)*; çəlləyi ~ to turn the barrel over; səhifəni ~ to turn over a page; 3. *(gəmini, qayığı və s.)* to overturn *(d.)*, to tip over *(d.)*, to capsize *(d.)*; *Onlar qayığı aşırdılar They overturned the boat; Dalğa qayığı aşırdı The wave capsized the boat*; 4. *(acgözlüklə yemək) d.d.* to gorge on *(d.)*, to guzzle *(d.)*, to gobble *(up) (d.)*; *O, dondurmanı aşırdı He / She gobbled up the ice-cream*

**aşırmalı** *s*: 1) ~ körpü foot-bridge; ~ təqvim loose-leaf calendar; 2) ~ şalvar trousers with braces / suspenders

**aşırtmaq** *f bax* **aşırmaq**

**aşısız** *s* not tanned; ~ dəri not tanned skin

**aşısızlıq** *i the state or quality of being not tanned*

**aşikar** *s bax* **aşkar¹**

**aşiq¹** *i* lover; ~ olmaq to be* in love *(with)*, to fall* in love *(with)*; həqiqi ~ true lover; zavallı ~ unfortunate lover; ~ində olmaq to be* eager *(for)*; şöhrət ~i olmaq to be* eager for fame; ~lər loving couple, pair of lovers, sweet-hearts

**aşiq²** *s* 1. in love *(with)*, enamoured *(of, with)*; ~ kişi man* in love; 2. charmed, delighted, taken *(with)*

**aşiqanə¹** *s* love, amorous; loving; ~ məktub love-letter; ~ baxış loving glance, amorous glance; ~ lirika love lyrics



**aşiqanə²** *z* lovingly, amorously; ~ baxmaq to eye *smb.* amorously, to look with eyes full of love *(at smb.)*

**aşiqanəlik** *i bax* **aşiqlik**

**aşiqcəsinə** *z* lovingly, amorously

**aşiqlik** *i the state of being in love*

**aşiq-məşuq¹** *i* lovers, loving couple

**aşiq-məşuq²** *s* love, amorous

**aşiq-məşuqluq** *i the state of being in love with each other*; ~ etmək to love each other

**aşina** *i bax* **aşna**

**aşinalıq** *i bax* **aşnalıq**

**aşkar¹** *s* 1. clear, distinct; ~ yaxşılaşma distinct improvement; 2. evident, obvious; ~ narazılıq evident obvious displeasure; ~ dəlil / fakt obvious fact, bare fact; 3. barefaced, downright; ~ yalan barefaced / downright lie

**aşkar²** *z* obviously, distinctly, evidently; ~ görmək to see* distinctly; ~ etmək to lay* bare *(d.)*; to bring* to light *(d.)* to make* known *(d)*, to discover *(d.)*; ~ olmaq to be* revealed / discovered / found; ~a çıxmaq to come* to light, to come out, to appear; ~a çıxartmaq to make* known *(d.)*, to discover *(d.)*, to bring* to light *(d.)*; *Aşkardır ki,... It's obvious that...*

**aşkarca** *z* quite clearly / evidently / obviously / distinctly; ~ görmək to see* quite distinctly / clearly

**aşkarcasına** *z bax* **aşkarca**

**aşkarda** *z* in full view; ~ olmaq to be* in the public eye / public view; ~ görmək to see* with *one's* own eyes

**aşkarlıq** *i* 1. glasnost, publicity; 2. clarity, clearness, obviousness, evidence; *(məqsəd aydınlığı)* clarity of aim; ~ hasil etmək to make* things clear, to put* things clear, to put* things right

**aşqar** *i* admixture; *(maye)* dash

**aşqarsız** *s (i.s.)* without admixture; pure

**aşlamaq** *f bax* **aşılamaq**

**aşlanmaq** *f bax* **aşılanmaq**

**aşlı** *s bax* **aşılı**

**aşmaq** *f* 1. to get* across; *(maneəni)* to get* over, to cross *(d.)*; 2. to climb over *(d.)*, to get* over *(d.)*; hasarı ~ to climb / to get* over the fence; 3. *(maneələri) id.* to clear *(d.)*; maneələri ~ to clear obstacles; 4. to turn over, to tip over; *(gəmi, qayıq və s.)* to capsize; o yan - bu yana ~ turn from side to side; *Qayıq aşdı The boat turned over / capsized; Stol aşdı The table tipped over*; ◊ işi başdan ~ to have* much work to do, to be* too busy

**aşna** *i* 1. friend; *amer.* buddy; *(qadın) (lady-)* friend, *(qız) (girl-)* friend; 2. lover; *(qadın)* mistress; ~ olmaq to be* friends *(with)*

**aşnabaz** *i* ladies' man, lady-killer

**aşnabazlıq** *i* 1. terms of intimacy; 2. love affair; ~ etmək to pay* *one's* addresses *(to)*, to pay*/ to make* court *(to)*

**aşnalıq** *i* 1. acquaintance; 2. friendship; ~ etmək 1) to be* friends, to be* on good terms; 2) to make* court *(to)*, to pay* *one's* addresses *(to)*, to make* love *(to)*

**aşpaz** *i* cook, culinary / cookery expert; ~ olmaq to be* a cook; ~ işləmək to work as a cook; baş ~ head-cook

**aşpazbaşı** *i* head-cook, cook general

**aşpazxana** *i* 1. cook-house, kitchen; 2. dining-room

**aşpazlıq¹** *i* 1. *the profession of a cook*; 2. cookery, the cookery art; ~ etmək to be* a cook, to work as a cook

**aşpazlıq²** *s* culinary; ~ sənəti *(art of)* cookery, the art of cooking; ~ kitabı cookery-book

**aşsüzən** *i* colander, cullender

**at¹** *i* 1. horse; minik ~ı riding / saddle horse; qoşqu ~ı outrunner; ~ minmək to mount a horse; qanadlı ~ əs. the flying/winged horse; Troya ~ı *yun. əs.* the Trojan Horse; dəmir ~ *(traktor və s. haq.)* iron horse; ~a minmək to take* a horse; ~ı qoşmaq to horse, to harness a horse; ~ı faytona qoşmaq to horse a carriage; ~ oynatmaq 1) to demonstrate *one's* skill in riding a horse; 2) *məc.* to act as freely as one wants; 2. *(şahmatda)* knight

**at²** *s* horse; ~ dırnağı horse hoof; ~ nalı horseshoe; ~ oğrusu horse stealer; ~ nallayan horseshoer; ~ zavodu horse ranch; ~ gözlüyü horse blinder; ~ arabası horse vehicle; ~ milçəyi horse bee; ~ yemişanı horse-chanter; ~ şabalıdı horse-chestnut; ~ alverçisi horse-dealer; ~ həkimi horse-doctor; ~ bazarı horse-fair; ~ əti horsemeat, horseflesh; ~ qılı horsehair; ~ dəyirmanı horse-mill; ~ gücü *fiz.* horse power

**ata¹** *i* father; ~sına çəkmək/oxşamaq to take* after *one's* father, to favour *one's* father; ~sı kimi like his/her father; ~ kimi fatherly, like / as a father; *O, qızı ata kimi öpdü He gave the girl a fatherly kiss* ◊ ~sına od vurmaq / ~sını yandırmaq to punish without mercy / ruthlessly

**ata²** *s* paternal; father's; ~ məhəbbəti paternal love; ~ baba paternal grandfather; ~lar sözü proverb; ~lar misalı saying

**ata-ana** *i* father and mother, parents; ~nı itirmək to lose* *one's* father and mother/ parents, to become* an orphan; ~dan yetim olmaq to have* neither father nor mother

**ata-analı** *s bax* **atalı-analı**

**ata-anasız** *s bax* **atasız-anasız**

**ata-baba¹** *i* ancestor, forefathers

**ata-baba²** *s* ancestral; ~ evi *one's* ancestral home; ~ mülkü ancestral property; ~ adəti ancestral custom

**ata-babadan** *z* for a long time, from time immemorial; *şair.* since olden time

**atabaxan** *i* groom, stableman

**ata-bala** *i* father and son, father and daughter, father and child

**atabir** *s* consanguineous; ~ qardaş half-brother; ~ bacı half-sister

**atacan** *i uş. d.* daddy

**atacıq** *i uş. d.* daddy

**atadanbir** *s bax* **atabir**

**atalı** *s (i.s.)* having father; ~ uşaq a child having a father / who has a father

**atalı-analı** *s* *(i.s.)* having a father and a mother; ~ olmaq to have* a father and mother

**atalıq**[1] *i* 1. stepfather; 2. paternity; fatherhood, father's duty; ~ etmək to look after *one's* family, to take* care of *one's* family; bir kəsə ~ etmək to take* care of *smb.*, to support *smb.* as a real father, to help *smb.* as a real father; atalığın məsuliyyəti the responsibility of fatherhood

**atalıq**[2] *s* paternal; ~ qayğısı paternal care; ~ məhəbbəti / sevgisi paternal love

**atamalı** *i* anything inherited from *one's* father

**ataman** *i* 1. ataman *(Cossack chieftan)*; 2) *(quldurbaşı)* chieftan, *(robber)* chief

**atamanlıq** *i the state of being an ataman*; ~ etmək to be* an ataman, to act as / like an ataman

**ata-oğul** *i* father and son

**atasız**[1] *s* fatherless, *(i.s.)* without a father; ~ uşaq fatherless child, a child without a father; ~ olmaq to be* fatherless

**atasız**[2] *z* without father; ~ böyümək to grow* up without father

**atasız-anasız**[1] *s* fatherless and motherless, without parents

**atasız-anasız**[2] *z* without father and mother, without parents; ~ böyümək to grow* up without mother and mother

**at-at** *i a kind of children's play*; ~ oynamaq to play at horses

**atayana** *z* like a father, as a father, paternally; fatherly; ~ öpmək to kiss fatherly

**atbaz** *i* horse-lover; *(at alverçisi)* horsedealer

**atbazlıq** *i the character of horse-lover*

**atcıl** *s bax* **atbaz**

**atçapan** *i* jockey

**atçapdı** *i* horse-race, race-meeting, the races *pl.* maneəsiz ~ flat race(s) *pl.*; maneəli ~ obstacle-race

**atçı** *i* 1. horse-holder, horse-breeder; 2. jockey

**atçılıq**[1] *i* horse-breeding

**atçılıq**[2] *s*: ~ zavodu stud(-farm); ~ idmanı equestrian sport

**atçibini** *i bax* **atmilçəyi**

**atdandırmaq** *f bax* **atlandırmaq**

**atdırılmaq** *f* to cause / to ask *smb.* to throw out / away *(d.)*

**atdırmaq** *f* 1. to ask / to cause *smb.* to throw out *(d.)*; 2. *(yunu, pambığı)* to ask/to force *smb.* to comb *(d.)*; 3. *vulq.* to be* gone, to be* off, to fuck off

**ateist**[1] *i* atheism ['eɪθɪ-]

**ateist**[2] *s* atheistic ['eɪθɪ-]

**ateistcəsinə** *z* atheistically

**ateistlik** *i bax* **ateizm**

**ateizm** *i* atheism ['eɪθɪ-], godlessness

**atelye** *i* 1. atelier [ə'teliei]; workshop; 2. *(paltar tikilən yer)* dress-making and tailoring establishment; modalar ~si fashion house

**ateroskleroz** *i tib.* atherosclerosis

**atəş**[1] *i* 1. *(od)* fire; ~də yanmaq to be* burnt in the fire; *(alov)* flame; ~ püskürmək to shoot out flames; 2. *məc.* heat, ardour, passion; ~i söndürmək *(sakitləşmək)* to cool *one's* heat; məhəbbət ~i a passion of love; nifrət ~i a passion of hate; 3. *(odlu silahla)* fire; ~ açmaq to fire *(at)*, to shoot* *(at)*, to open fire *(at)*; tüfəngdən ~ açmaq to fire a rifle; tapançadan ~ açmaq to fire a pistol; ~i dayandırmaq to stop/to cease fire; top ~i gunfire; tüfəng ~i small-arms fire; ~ə tutmaq to fire *(at, upon)*, to centre fire *(on)*; topla ~ə tutmaq to shell *(d.)*; pulemyotla ~ə tutmaq to machine-gun *(d.)*; ~ altında under fire; ◊ ~lə oynamaq to play with fire; *Atəş! Fire!*

**atəş**[2] *s* fire; ~ əmri fire command / order; ~ nöqtəsi fire nest; ~ xətti line of a fire

**atəşböcəyi** *i zool.* fire-fly

**atəşfəşan** *i* firework(s) *(pl)*

**atəşfəşanlıq** *i* illumination, fireworks *pl.*

**atəşgah** *i* temple of fire

**atəşgədə** *i* temple of fire - worshippers

**atəşxana** *i* 1. brazier; 2. *the place where fire burns*

**atəşin**[1] *s* passionate, hearty, cordial, flaming, ardent; ~ məhəbbət ardent / passionate love; ~ nitq ardent speech; ~ təbiət passionate nature; ~ gözlər ardent eyes; ~ təşəkkür cordial thanks; ~ qəbul *(qonaq qəbulu)* cordial / hearty welcome; ~ vətənpərvərlik flaming patriotism

**atəşin**[2] *z* passionately, in a passionate way, heartily, cordially, ardently; ~ danışmaq to speak* passionately / heartily

**atəşqurdu** *i zool.* glow-worm

**atəşli**[1] *s bax* **atəşin**[1]

**atəşli**[2] *z bax* **atəşin**[2]

**atəşlilik** *i* ardour, hot-headed nature, passionate nature

**atəşpərəst** *i* fire-worshipper

**atəşpərəstlik** *i* fire-worship

**atıb-tutmaq** *f* 1. to lift up *(d.)*, to chair *(d.)* *(as mark of esteem or congratulation)*; 2. *(maşın)* jolt, shake; *Maşın bizi bərk atıb-tutdu The car jolted us violently*; 3. *(topu)* to toss; topu ~ to toss a ball *(up)* into the air

**atıcı**[1] *i* 1. shot; 2. *(əsgər)* rifleman*; əla ~ expert shot / rifleman*; 3. *bax* **həllac**

**atıcı**[2] *s* infantry; shooting; ~ alayı infantry / rifle regiment

**atıcılıq**[1] *i* I 1. shooting; firing; 2. *the profession of a rifleman / gunner*

**atıcılıq**[2] *s* shooting; ~ meydanı shooting-ground, shooting-range; ~ dərnəyi shooting circle; ~ idmanı shooting

**atıcılıq** *i* II *bax* **həllaclıq**

**atıla-atıla** *z* skipping, hopping, jumping; ~ gəlmək 1) to skip alone; to come* skipping; 2) to come* with nothing / without carrying out the task; to come* without any present

**atılıb-düşmək** *f* 1. to jump up and down; *(sevincdən)* to jump *(for, with)*, to leap* *(with)*; 2. *(sevinmək)* to frisk / to caper *(about)*; *Quzular çöldə atılıb-düşürdülər The lambs were capering in the field*

**atılmaq** *f* I 1. to throw* *(at)*; bir-birinin üstünə ~ to throw* oneself at each other; *Dalaşanlar bir-birinin üstünə atıldılar The fighters threw themselves at each other*; 2. to throw* oneself *(on, upon)*; bir kəsin ağuşuna ~ to throw* oneself / to fall* into



*smb.'s* arms; bir kəsin boynuna ~ to throw* *one's* arms around *smb.'s* neck; 3. to jump, to leap*, to spring*; bir kəsin / şeyin üstünə ~ to jump over *smb.* / *smth.*; pəncərədən ~ to jump out of the window, to leap* through a window; yəhərə ~ to leap* into the saddle; atın belinə ~ to jump on horseback; hasardan ~ to leap* over a fence; divardan ~ to spring* over the wall; taksiyə / tramvaya / avtobusa və s. ~ to jump into a taxi / tram / bus, etc.; düşmən üzərinə ~ to leap* upon a foe; meydana ~ to leap* / to spring* / to jump into arena; yerindən ~ to leap* / to jump / to spring* to *one's* feet; sevincdən ~ to leap* with joy; *Mən hərəkət edən qatardan atıldım I jumped from a moving train*; 4. *(suya)* to jump, to plunge; suya ~ to plunge / to jump into the water; 5. *(can atmaq)* to rush; hücuma ~ to rush to the attack; köməyə ~ to rush to help / to aid; *It mənim üstümə atıldı The dog rushed at me*; 6. *(gərəksiz hesab edilmək)* to be* thrown / abandoned; *Kitab atıldı The book was thrown away*; 7. *(odlu silah haq.)*; *Tüfəng atıldı The rifle fired; A shot was heard*

**atılmaq** *f* II *(yun, pambıq)* to be* carded/combed

**atım** *i bax* **atımlıq**

**atım-atım** *z*: ~ etmək 1) to throw* about *(d.)*; 2) *(axtarmaq)* to search *(through, into)*, to conduct a search *(of)*, to look through carefully and thoroughly to try to find *smth.*

**atimlıq** *i* 1. charge, supply; bir ~ barıt gunpowder enough for one shot; bir atımlıq çay ~ tea enough for one brew; bir ~ duz enough salt for one use; *Bircə atımlıq çay qalıb There is just enough tea for one brew*; bir ~ barıtı olmaq 1) to have* an amount of gunpowder for one shot; 2) *məc.* lack the energy / strength to do *smth.*; 2. dose; bir ~ dərman a dose of medicine

**atışma** *fi* 1. exchange of fire, skirmishing; ~ düşmək / başlamaq to start skirmish; ~ salmaq to provoke / to rouse a skirmish; 2. *məc.* wrangle, squabble, high words *pl.*

**atışmaq** *f* 1. to exchange fire, to fire at each other; 2. *məc.* to abuse each other / one another; to swear* at each other; *Onlar həmişə atışırlar (sözləşirlər) They are always abusing each other*

**atlama** *i* atlama *(a soft drink made of water and sour clotted milk)*

**atlamaq** *f* to shake* up *(d.)*

**atlandırmaq** *f* to mount *(d.)*, to set into a saddle *(d.)*

**atlanmaq** *f* I to mount a horse; to go* on horseback

**atlanmaq** *f* II 1. *(yerindən)* to jump up, to give* a jump; 2. *(bir şeyin üstündən)* to jump over; çayın üstündən ~ to jump over the river

**Atlantik** *s* Atlantic; ~ paktı the Atlantic pact; ~ okeanı the Atlantic Ocean

**atlas** *i coğ.* atlas, a book of maps

**atlaz**[1] *i* satin, atlas

**atlaz**[2] *s* satiny, satin; ~ paltar satiny / satin dress; ~ kağız satin / satiny paper

**atlet** *i* athlete; *d.d.* Hercules

**atletik** *s* athletic; ~ bədən athletic built / body

**atletika** *i* athletics; yüngül ~ track and field athletics; ağır ~ weight-lifting

**atletikaçı** *i bax* **atlet**

**atlı**[1] *i* rider, horseman*; *(qadın)* horse woman*

**atlı**[2] *s* mounted; ~ ordu Cavalry; ~ polis mounted police; ~ alay mounted detachment

**atlıqarışqa** *i* a kind of big ant

**atlılobya** *i* haricot / French / kidney bean

**atma** *fi* throwing; casting; püşk ~ casting lots; nizə ~ javelin throwing; disk ~ discus throwing

**atmaca** *i* 1. remark; *(etiraz əlaməti)* retort, rejoinder; 2. *(eyham)* hint, allusion; ~ atmaq to drop a hint; ~nı anlamaq to take* the hint

**atmaq** *f* I 1. to throw* *(d.)*, to cast* *(d.)* to hurl *(d.)*, to fling* *(d.)*; *d.d.* to chuck *(d.)*; daş ~ to throw / to hurl / to fling* stones; bir kəsə daş ~ to cast* a stone at *smb.*; lövbər ~ to cast* / to drop anchor; həbsə ~ to fling* / to throw* / to cast* into prison / jail; tor ~ to cast* a net; *Balıqçı torunu suya atdı The fisherman cast his net into the water*; 2. to give* up, to drop, to leave* off; papirosu ~ to give* up / to leave* off smoking; işi ~ to give*/ to throw* up *one's* work; təhsili ~ to drop / to give* up *one's* studies; *d.d.* to chuck *one's* studies; silahı ~ to lay* down *(one's)* arms; 3. *(tərk etmək)* to abandon *(d.)*, to desert *(d.)*; ailəni ~ to abandon / to desert *one's* family; *O, arvadını atdı He abandoned his wife*; 4. *bot.* to sprout, to put out, to put forth; kök ~ to root, to take* root; zoğ ~ to put* out shoots, to sprout; 5. kif ~ to grow* musty / mouldy; söz ~ to put* out feelers; şər ~ to calumniate, to slander; can ~ to long for *(smth)*; to crave *(for)*, to have* a very strong desire for *(smth.)*; günahını / təqsirini boynundan ~ not to acknowledge *one's* fault, to deny *one's* guilt; 6. *(odlu silah)* to shoot* *(at)*, to fire *(at)*; to fire a shot *(at)*; tüfəng / tapança və s. ~ to fire a rifle / pistol, *etc.*

**atmaq** *f* II *(yunu)* card *(d.)*; yun ~ card wool

**atmilçəyi** *i zool.* horsefly, breeze-fly

**atmosfer**[1] *i* 1. *(müx. mənada)* atmosphere; 2. air

**atmosfer**[2] *s* atmospheric; ~ təzyiqi atmospheric pressure; ~ çöküntü atmospheric precipitation; rainfall

**atom**[1] *i* atom; nişanlı ~ *fiz.* tagged atom; ~un quruluşu atomic structure

**atom**[2] *s* atomic, atomical; nuclear; ~ çəkisi *kim.* atomic weight; ~ gəmisi an atomic ship; ~ bombası atomic bomb; ~ istiliyi atomic heat; ~ silahı atomic weapon; ~ enerjisi atomic / nuclear energy; ~ elektrik stansiyası nuclear power station; ~ qazanı atomic pile; ~ fizikası atomic physics; ~ müharibəsi atomic warfare; ~ partlayışı atomic explosion

**atomçu** *i* atomist, atomic scientist

**atomist** *i fəls.* atomist

**atomistika** *i* atomism

**atomizm** *i fəls.* atomism

**atotaran** *i* horse-grazer

**atöyrədən** *i* horse-breaker

**atribut** *i qram., fəls.* attribute

**atributiv** *s qram.* attributive; ~ əlaqə attributive link / connection; ismin ~ işlənməsi the attributive use of the noun

**atrofiya** *i tib.* atrophy

**atropin** *i əcz.* atropine

**atsız** *s* horseless; ~ kəndli horseless peasant

**atsifət** *s* horse-faced; ~ qadın / kişi a horse-faced man* / woman*

**attaşe** *i* attache *(fr)*

**attaşelik** *i the post of attache*

**attestasiya**[1] *i* attestation; ~dan keçirmək to attest *(d.)*

**attestasiya**[2] *s* attestation; ~ komissiyası attestation commission

**attestat** *i* certificate; kamal ~ı school-leaving certificate

**attraksion** *i* 1. attraction; 2. *(parkda)* side-show

**atüstü** *z* hastily, in haste, hurriedly, in *one's* hurry; ~ başçəkmək to visit hurriedly / hastily; to drop in

**auditoriya** *i* lecture-hall, lecture-room

**auksion** *i* auction; ~ vasitəsilə satmaq to sell* *(d.)* by auction

**aul** *i* aul [a:u:l] *(village in the Caucasus and Central Asia)*

**avadanlıq** *i* 1. equipment, plant inventory; 2. furniture

**avam**[1] *i* simpleton, nitwit, ignoramus; simpleton, uneducated man*; ~ olmaq to be* ignorant / uneducated

**avam**[2] *s* ignorant, uneducated, illiterate; ~ adam ignorant / uneducated man*; ~ olmaq to be* ignorant

**avamcasına** *z* ignorantly; ~ pərəstiş etmək to worship ignorantly

**avamlıq** *i* ignorance, intellectual darkness; ~ etmək to act / to behave ignorantly

**avand** *s* 1. successful, favourable; 2. right side *(of)*; *İşiniz avand olsun! Success attend you!*

**avandlaşdırılmaq** *f* to be* improved / made better

**avandlaşdırmaq** *f* to improve *(d.)*, to make* better *(d.)*, to ameliorate *(d)*; *(düzəltmək)* to amend *(d.)*

**avandlaşmaq** *f* to improve, to ameliorate, to take* a turn for the better

**avanqard**[1] *i* van, vanguard; ~ olmaq to be* in the van *(of)*/ vanguard *(of)*, to be* in the forefront

**avanqard**[2] *s* vanguard, leading; ~ rol leading role

**avanqardlıq** *i the state of being advance guard*

**avans** *i* advance; ~ vermək to make* an advance *(to)*; ~ almaq to get* advance money; fabrikaya ~ vermək to make* an advance to a factory

**avantüra** *i* hazardous activity, gamble, venture, adventure; hərbi ~ military adventure

**avantüraçı**[1] *i* adventurer, *(qız,qadın)* adventuress

**avantüraçı**[2] *s* adventurous, venturesome; risky

**avantüraçılıq** *i* disposition to engage in ventures

**avantürist** *i bax* **avantüraçı**

**avantüristcəsinə** *z* adventurously

**avar** *i* I oar; *(qoşa)* scull; *(kiçik)* paddle; ~ çəkmək to row, to scull, to paddle

**avar**[1] *i* II Avar [a:va:] *(nationality living in the southern Caucasus)*

**avar**[2] *s* Avarian; ~ dili Avar [a:va:] the Avarian language

**avara** *s* 1. loafer, waster; idler, slacker; 2. tramp, vagrant; *amer.* hobo; ~ qalmaq to be* under indefinite situation in difficult condition; bir kəsi ~ qoymaq to leave* *smb.* under an indefinite condition / under an indefinite situation; bir kəsi ~ etmək to prevent *smb.* from doing *smth.*

**avara-avara** *z* idly; ~ gəzmək to walk idly

**avaraçılıq** *i bax* **avaralıq**

**avaralanmaq** *f* to idle, to loaf; to do nothing

**avaralaşmaq** *f* to become*/ to get* idler, to become* loafer / vagrant

**avaralıq** *i* idleness; ~ etmək *bax* **avaralanmaq**

**avara-sərgərdan** *z bax* **avara-avara**

**avarca** *z* Avar, in Avar; ~ danışmaq to speak* Avar; ~ yazmaq to write* in Avar

**avarçəkən** *i* oarsman, rower, sculler

**avarçəkmə**[1] *i* rowing

**avarçəkmə**[2] *s* rowing; ~ idmanı rowing

**avarçı** *i bax* **avarçəkən**

**avariya** *i (maşının əzilməsi)* break-down; *(bədbəxt hədisə)* accident; *(avtomobil, təyyarə)* crash; *(gəmi)* shipwreck; ~ya düşmək to meet* with an accident; *(gəmi)* to be* wrecked; *(xarab olmaq)* to be* damaged

**avariyasız** *s* accident-free; *(i.s.)* having had no accident; maşınların ~ işi running work(ing) of machines without breakdown

**avarlamaq** *f* to row *(d.)*; qayığı ~ to row a boat

**avarlatdırmaq** *f bax* **avarlatmaq**

**avarlatmaq** *f* to ask / to cause *smb.* to row *(d.)*

**avarlı** *s (i.s.)* with oars, *(i.s.)* having oars

**avarsız** *s (i.s.)* without oars, *(i.s.)* having no oars

**avaz** *i* voice; xoş ~ sweet / pleasant voice

**avazımaq** *f* to turn pale, to grow* pale

**avazımış** *s* turned pale, grown pale

**avazlı** *s* loud-voiced, full throated, rich voiced; xoş ~ *(i.s.)* having sweet / pleasant voice

**avazsız** *s* voiceless, feeble-voiced; *(i.s.)* weak of voice

**aviabaza** *i* air-base

**aviabilet** *i* aeroplane ticket

**aviabomba** *i* aircraft bomb

**aviadesant** *i* airborne *(assault)* landing

**aviakonstruktor** *i* aircraft designer

**aviamarşrut** *i* air-route

**aviamayak** *i* air beacon

**aviamodel** *i* aircraft model

**aviamodelist** *i* aircraft model constructor

**aviapoçt** *i* air mail

**aviasiya**[1] *i* aviation, aircraft; *hərb.* air force; mülki ~ civil aviation; nəqliyyat ~sı transport aircraft; kənd təsərrüfat ~sı agricultural aviation; bombardmançı ~ *amer.* bombardment aviation; bombing aircraft; qırıcı ~ fighting aircraft; *amer.* pursuit aviation; kəşfiyyat ~sı reconnaissance aircraft; *amer.* reconnaissance aviation; hücum ~sı low-flying attack aircraft; *amer.* attack aviation

**aviasiya**[2] *s* aviation, aircraft; ~ motoru aviation engine; ~ sənayesi aircraft industry; ~ zavodu aircraft factory / works; ~ məktəbi flying school

**aviasiyaçı** *i bax* **aviator**

**aviator** *i* aviator, airman*, pilot; *(qadın, qız)* airwoman*, woman pilot

**aviatransport** *i* air transport

**avitaminoz** *i tib.* avitaminosis

**avqust** *i* August



**Avropa** *s* European; ~ millətləri European nations

**avropalaşdırma** *fi* Europeanization

**avropalaşdırmaq** *f* to Europeanize *(d.)*

**avropalaşmaq** *f* to become* / to be* Europeanized

**avropalı** *s* European

**Avstraliya** *s* Australian

**avstraliyalı** *i* Australian

**Avstriya** *s* Austrian

**avstriyalı** *i* Austrian

**avtobaza** *i* motor depot [...de'pou]

**avtobioqrafik** *s* autobiographic(al)

**avtobioqrafiya** *i bax* **tərcümeyi-hal**

**avtobus** *i* bus, omnibus, motor bus; *amer.* autobus

**avtodükan** *i* mobile shop

**avtogen** *s* autogenous; ~ qaynaq autogenous welding; ~ kəsmə autogenous cutting

**avtokolon** *i* motor transport column

**avtokran** *i* truck crane

**avtoqaraj** *i* garage, motor-garage

**avtoqatar** *i* articulated lorry, lorry and trailor(s)

**avtoqələm** *i* fountain-pen

**avtoqraf** *i* autograph

**avtol** *i tex.* automotive engine oil

**avtomaqistral** *i* motor road, high-way

**avtomaşın** *i* motor vehicle, *(yük) (motor-)* lorry; *amer.* truck

**avtomat**[1] *i* automatic machine; *(dəmir pulla işləyən)* slot-machine; *(silah)* submachine gun; *amer.* machine carbine; *d.d.* tommy gun

**avtomat**[2] *s* automatic, self-acting; ~ telefon automatic telephone, public telephone; ~ telefon stansiyası automatic telephone exchange; ~ tüfəng automatic rifle; ~ qələm fountain pen

**avtomatçı** *i* sub-machine gunner

**avtomatik**[1] *s* automatic, self-acting

**avtomatik**[2] *z* automatically

**avtomatika** *i* 1. *elm.* automation; 2. *(mexanizm)* automated mechanism

**avtomatiklik** *i bax* **avtomatizm**

**avtomatizm** *i* automatism

**avtomatlaşdırılmaq** *f* to be* automated / automatized

**avtomatlaşdırılmış** *s* automated, automatized

**avtomatlaşdırma** *i* automation

**avtomatlaşdırmaq** *f* 1. to automatize *(d.)*; 2. *(istehsalatı)* to introduce automation *(into)*, to automate *(d.)*

**avtomobil**[1] *i* 1. *(minik) (motor-)* car, autocar; *amer.* automobile; 2. *(yük)* lorry; *amer.* truck; sanitar ~i ambulance; texniki yardım ~i breakdown van; *amer.* service truck; ~lə getmək to go* by car; ~ sürmək to drive* a car; ~i dayanacağa qoymaq to park a car

**avtomobil**[2] *s* automobile; ~ zavodu motor / automobile plant, motor / automobile works; ~ sənayesi motor car industry; ~ şini automobile tire, tire; ~ nəqliyyat motor transport; ~ dayanacağı car park; *(şəhərdə)* bus stop

**avtomobilçi** *i* motorist

**avtomobilqayırma** *i* motor-car construction

**avtomüfəttiş** *i* traffic inspector / policeman*

**avtomüfəttişlik** *i (idarə)* motor licencing and inspection department; *(nəzarət)* roadworthiness inspection

**avtonəqliyyat** *i* motor transport

**avtoportret** *i* self-portrait

**avtor** *i* author; *(qadın)* authoress; *(ədəbi əsərin avtoru)* writer; *(musiqi əsərinin avtoru)* composer; *(təklifin, fikrin avtoru)* mover ['mu:-]

**avtoreferat** *i* synopsis of thesis

**avtoritet** *i* authority; prestige; ~i olmaq to have* authority, to enjoy authority, to have* prestige; ~ qazanmaq to gain / to win* authority / prestige

**avtoritetli** *s* authoritative

**avtoritetsiz** *s (i.s.)* without authority, *(i.s.)* having no authority

**avtoritetsizlik** *i the state of having no authority*

**avtosistern** *i* tank-lorry, tank-truck

**avtoturist** *i* motor-car tourist, tourist travelling by car / coach

**avtoturizm** *i* touring by car/coach, motor-touring

**avtovaqzal** *i* bus / coach station

**avtozavod** *i* motor / automobile works, motor / automobile plant

**ay**[1] *i* I *(fəza cismi)* the moon; bədirlənmiş *(on dörd gecəlik)* ~ full moon; ◊ ~ın doğması / çıxması moonrise; ~ın batması moonset; təzə ~ new moon; ~ın tutulması lunar eclipse; *Ay yarımçıq tutulub The moon is partly eclipsed*; ~ kimi /~a oxşar moony; ◊ ~a hürmək to bark at the moon

**ay**[2] *s astr.* lunar; ~ daşı *miner.* moonstone; ~ tozu lunar dust; dust from the Moon; ~ işığı moonlight; ◊ ~ parçası very beautiful; ~ın səthi the Moon's surface

**ay** II *i (təqvimi)* month; yanvar/fevral və s. ~ı the month of January / February, *etc.*, cari ~ the current month; keçən ~ last month; gələn ~ next month; ~ın başı the head / beginning of the month; ~ın sonunda at the end of the month; *Ayın neçəsidir? What date is it? What is the date?*; ◊ bal ~ı *(evlənməyin birinci ayı)* honey moon

**ay**[3] *nid* oh! what! *Ay dad! Oh! help; Ay dad-bidad! What a pity!*

**ayağıaçıq** *s* open legged

**ayağıağır** *s* 1. *bax* **hamilə**; 2. bad, harmful, ill; ~ adam an ill / bad man*

**ayağıağırlıq** *i* 1. *bax* **hamiləlik**; 2. badness, illness

**ayağıbağlı** *s* 1. *bax* **qəbiz**; 2. tied legged

**ayağıbağlılıq** *i tib.* constipation; ~dan əziyyət çəkmək to suffer from constipation

**ayağıçarıqlı**[1] *i* 1. one who wears bast sandal, one who wears hind shoes; 2. *məc.* the poor, humble people

**ayağıçarıqlı**[2] *s* 1. *(i.s.)* wearing bast sandal; 2. *məc.* poor, humble

**ayağısürüşkən**[1] *i d.d.* strumpet, loose woman, trollop

**ayağısürüşkən**[2] *s* loose; lascivious [lə'sıvıəs]; lecherous; ~ qadın / arvad loose woman*

**ayağısürüşkənlik** *i* looseness, lasciviousness

**ayağıyüngül** *s* lucky; *Onun ayağı yüngüldür* ≅ *He / She brings luck*

**ayağıyüngüllük** *i* luckiness

**ayaq**[1] *i* 1. foot; sol ~ left foot; sağ ~ right foot; ~ saxlamaq to pause, to halt; ~dan tutmaq / yapışmaq to

**bağışlamaq** *f* 1. to present *(d.)*, to make* / to give* a present *(i.)*; 2. to forgive* [-giv] *(d.)*, to pardon *(d.)*; *(günahı)* to absolve *(d. from)*; 3. *(borcu)* to remit *(d.)*; *Məni bağışlayın Excuse me! Pardon me! I beg your pardon!*

**bağışlanılmaz** *s bax* **bağışlanmaz**

**bağışlanılmazlıq** *i the state or quality of being unforgivable / unpardonable*

**bağışlanmaq** *f* to be* excused / pardoned; to obtain mercy

**bağışlanmaz** *s* unpardonable, unforgivable, inexcusable; ~ günah unpardonable sin; ~ əməl inexcusable deed

**bağışlatmaq** *f* 1. to ask / to cause *smb.* to present *(d.)*; 2. to ask / to cause *smb.* to excuse *(d.)* / to pardon *(d.)*

**bağlama** *i* I parcel, bundle, package; bir ~ kitab a package of books; bir ~ paltar a parcel of clothes

**bağlama** *i* II *a kind of riddle in the form of poem, created by ashugs (Azerbaijani folk singers) and used during contests*

**bağlamaq** *f* 1. to tie *(d. to)*, to fasten *(d. to)*, to hitch; atı ağaca ~ to tie a horse to a tree; düyün ~ to knot *(d.)*, to make* a knot; dəstə ~ 1) to tie *(d.)* in a bundle; 2) to act together, to fight* for *smth.* together; başına dəsmal ~ to tie a kerchief round *one's* head; qalstuk ~ to tie *one's (neck-)* tie; 2. to shut* *(d.)*, to close *(d.)*; *(açarla)* to lock *(d.)*; *(qarmaqla)* to hook *(d.)*. *(qazı, suyu və s. bağlamaq)* to shut* off *(d.)*, to turn off *(d.)*; iclası ~ to close/to break* up the meeting; qapaqla ~ to put* the lid on; 3. *(qadağan etmək)* to shut* down *(d.)*, to close down *(d.)*; *(qəzeti, jurnalı bağlamaq)* to suppress *(d.)*; müəssisəni, məktəbi və s. ~ to shut* down / to close down the enterprise/school, *etc.*; sərhədi ~ to close the frontier; mö'tərizələri ~ to close the brackets; hesabı ~ to close the account; mağazanı ~ to close the shop; *Təhlükəsizlik kəmərini bağlayın Fasten safety belts*

**bağlanılmaq** *f* 1. to be* tied *(together)* / bound; 2. to be* shut, to be* closed, to be turned off

**bağlanmaq** *f* 1. to close, to shut*; to be* closed / shut; *Pəncərə bağlandı The window (was) shut / closed; Mağazalar saat 6-da bağlanır The shops close at six; Yara bağlandı The wound closed;* 2.*(fəaliyyəti dayandırmaq)* to be* closed / over; *Sərgi bağlandı The exhibition was closed; Mövsüm bağlandı The season was over;* 3. *(qəzet, jurnal və s.)* to be* suppressed / prohibited; *Qəzet bağlandı The newspaper was suppressed;* 4. to be* packed up, to be* made into a knot; 5. *məc.* to get* /to become*/ to be* attached *(to)*; *O sizə bağlanıb He got attached to you*

**bağlaşmaq** *f* to come* to an arrangement / understanding *(about)*, to arrange matter *(about)*, to make* arrangements *(about, for)*

**bağlatdırmaq** *f bax* **bağlatmaq**

**bağlatmaq** *f* to ask / to cause *smb.* to tie *(d.)*; to ask / to cause *s.o.* to close *(d.)* / to shut *(d.)* / *(qəzeti və s.)* to suppress *(d.)*

**bağlayıcı** *i dilç.* conjunction; tabelilik ~ ları subordinating conjunctions; tabesizlik ~ ları coordinating conjunctions

**bağlayıcısız** *s qram.* asyndetic; ~ əlaqə asyndetic connection

**bağlı** *s* closed, shut; private; secret; ~ iclas closed meeting *(for members only)*; secret session; *hüq.* meeting in camera; ~ iclas keçirmək to meet* in closed / private session; ~ partiya iclası closed party meeting; ~ tamaşa closed / private performance; ~ qapı arxasında behind closed doors

**bağlıq** *i bax* **bağ**[1]

**bağrıbadaş** *s* bosom, inseparable; ~ dostlar bosom/inseparable friends

**bağrıbadaşlıq** *i* inseparability, cordiality

**bah** *nid (interjection expressing surprise)* oh!.. Is that so! Really!

**baha**[1] *s* dear, expensive; high; costly; ~ kitablar expensive books; ~ daş-qaş costly jewels; ~ qiymət high price; ~ şəkillər dear pictures

**baha**[2] *z* dear; *məc.* dearly; ~ başa gəlmək to cost* dear; ~ satmaq to sell* dear; ◊ ~ oturmaq / başa gəlmək 1) to cost dear; 2) *məc.* to pay* dearly *(for)*; *Bu ona baha başa gələcək / oturacaq It'll cost* him dear; Əgər pul qazanmaq istəyirsənsə, ucuz alıb baha satmalısan If you want to make money, you must buy cheap and sell dear*

**bahacıl** *i bax* **bahaçı**

**bahaçı** *i one who sells things expensively / dear*

**bahaçılıq** *i bax* **bahalıq**

**bahadır** *i bax* **qəhrəman**

**bahadırlıq** *i bax* **qəhrəmanlıq**

**bahalandırılmaq** *f* to be* made dear / expensive; *Ərzaq malları bahalandırılıb Foodstuffs were made more expensive*

**bahalandırmaq** *f* to raise the price *(of)*; malları ~ to raise the price of goods

**bahalanma** *fi* rise* in price*(s)*, increase in cost; tikintinin ~ sı rise in the cost of construction / building

**bahalanmaq** *f* to rise in price, to go* up; to become* more expensive; *Yaşayış günbəgün bahalanır The cost of living is rising day after day*

**bahalaşdırılmaq** *f bax* **bahalandırılmaq**

**bahalaşdırmaq** *f* to raise the price *(of)*, to increase the cost *(of)*

**bahalaşma** *fi bax* **bahalanma**

**bahalaşmaq** *f bax* **bahalanmaq**

**bahalatmaq** *f bax* **bahalaşdırmaq**

**bahalı** *s* expensive , costly, dear, valuable; ~ hədiyyə a valuable present; ~ paltar expensive clothes; ~ mebel costly furniture; ~ şəkillər dear pictures

**bahalıq** *i* expensiveness; high cost of living; high prices *pl.*; ~ salmaq to rise cost of living, to create high prices

**bahar**[1] *i* spring; erkən ~ early spring; ◊ ömrün ~ ı the spring of life; ~ ın gözəlliyi beauty of spring

**bahar**[2] *s* spring; ~ səpini *k.t.* spring sowing / ...sou-/; ~ vaxtı / zamanı springtime; ~ çiçəkləri spring flowers



**baharda** *z* in spring; *Baharda köçəri quşlar gəlir Migratory birds come in spring*

**bahatəhər** *s* a bit expensive / dear

**bah-bah** *nid. bax* **bəh-bəh**

**bahəm** *z* together, together*(with)*; ~ işləmək to work together; ~ getmək to go* together

**baho** *nid* oh!

**bax** *nid* 1. *Look! Look out! Take* care! Bax sabah qayıdın! Look! Return tomorrow! Bax o sizi aldadacaq! Take care, he / she'll deceive you!*; 2. here, there; *Bax poçtalyon gəlir! Here comes the postman!; Bax bu da mən! Here I am! emf.var. Here am I! Bax elə edin ki, bundan betər olmasın! Mind smth. worse doesn't happen, Beware lest worse befall!*

**baxa-baxa** *z* 1. looking, watching; 2. before *one's* eyes

**baxar** *z* it depends; ~ harada It depends where; ~ nə vaxt It depends when; *Vəziyyətə baxar It depends on the situation / circumstance*

**baxdıqca** *z*: *Baxdıqca xoşuma gəlir The more I look, the more I like; Baxdıqca yazığım gəlir The more I look, the more I pity*

**baxdırmaq** *f* 1. to ask / to beg *smb.* to examine *(d.)*; uşağı həkimə ~ to ask / to beg the doctor to examine the child; 2. to consider *(d.)*, to examine *(d.)*; ərizəyə ~ to ask *smb.* to consider / to examine an application; 3. *(fala)* to ask *smb.* to tell fortunes

**baxıcı** *i bax* **falçı**

**baxılış** *i* survey; *(sənədlərə və s.)* examination; *(filmə və s.)* review; ilkin ~ preview; gizli ~ private view; ümumi ~ public review

**baxılmaq** *f* 1. to be* examined / considered / looked into; *Məsələyə sabah baxılacaq The question will be considered/looked into tomorrow;* 2. *(qeydinə qalınmaq)* to be* looked after; *Uşağa baxılır The child is looked after;* 3. to be* looked at / watched

**baxılmalı** *s* worth seeing; ~ film a film worth seeing

**baxım** *i* 1. care *(of, for)*; 2. control, supervision

**baxımdan** *qoş.* bu ~ from this view point, from this point of view, from this standpoint; *Gəlin məsələyə tarixilik baxımından yanaşaq Let's approach the question from a historical standpoint/from the standpoint of the history*

**baxımlı** *s* well-groomed; ~ at a well-groomed horse

**baxımsız** *s* neglected; ~ bağ neglected / weed-grown / overgrown garden; ~ uşaq neglected child

**baxımsızlıq** *i* neglect, desolation

**baxınmaq** *f bax* **boylanmaq**

**baxış** *i* 1. look; *(davamlı)* gaze, stare; fixed / intent look; *(anı)* glance; *(düşməncəsinə)* glare; ~ ını yönəltmək to direct *one's* eyes *(to)*, to turn *one's* eyes *(on)*; *hamının baxışları onlara yönəlmişdi Everyone was staring at them;* 2. *(nöqteyi-nəzər)* view; opinion, way of thinking; mütərəqqi / elmi / dini / mürtəce / mühafizəkar / fəlsəfi ~ lar progressive / scientific / religious / reactionary / conservative / philosophical views; bir kəsin ~ ına şərik olmaq to share *smb.'s* views; təbiətə materialist ~ materialist view of nature; 3. *(filmə, pyesə və s.)* review; ilk ~ preview; qapalı ~ private review; ümumi ~ public preview; ◊ ilk ~ də at the first glance; ilk ~ dən at first sight; ilk ~ dən sevmək to love at first sight; bir~ də at a glance

**baxışmaq** *f* to look at one another, to exchange glances *(with)*; *Onlar baxışdılar They looked at each other / one another, They exchanged glances*

**baxma** *fi* 1. *(uşağa, xəstəyə)* nursing, tending; 2. looking; glancing, having a glance

**baxmaq** *f* 1. *(tamamlıqsız)* to look ; *(tamamlıqla)* to look *(at)*; diqqətlə ~ to look fixedly / intently; to stare *(at)*, to gaze *(at)*; pəncərədən ~ *(içəridən bayıra)* to look out of the window, *(bayırdan içəri)* to look through the window; gözünü zilləyib ~ to peer *(at, into, through)*, to fasten *one's* eyes / gaze *(on, upon)*; gözünü bərəldib ~ to stare with open-eyes *(at)*, to stare wide -eyed *(at)*; dalınca ~ to follow with *one's* eyes *(d.)*; saata ~ to look at the watch / *(stol, divar)* clock; uzaqlara ~ to gaze / stare into the distance; acıqlı ~ to look frowning; ◊ bir kəsin gözünün içinə ~ to look *smb.* in the eyes; ayağının altına ~ to look where *one* is going; ◊ irəliyə ~ to look ahead, to look forward; 2. *(məzmunu ilə tanış olmaq)* to look through *(d.)*; əlyazmasına ~ to look through a manuscript; 3. *(pyesə, filmə və s.)* to see* *(d.)*; yeni filmə ~ to see* a new film; 4. *(idman yarışına, televiziyaya və s.)* to watch *(d.)*; televiziyaya ~ to watch a TV programme; 5. *(xəstəyə baxmaq)* to examine *(d.)*; xəstəyə ~ to examine a patient; 6. (qeydinə qalmaq) to look after *(d.)*, to take care *(of d.)*; uşağa ~ to look after a child, to take* care of the child; evə ~ to look after the house; to provide *one's* family with all necessary things; 7. *(optik cihazla)* to look through; teleskopla ~ to look through a telescope; 8. *(diqqət yetirmək)* to take* notice of; 9. *(bir şeylə tanış olmaq)* to have* a look *(at)*; təzə mənzilə ~ to have* a look at a new flat;/ *amer.* apartment 10. *(məhkəmədə işə baxmaq)* to hear* *(d.) Məhkəmə işə dünən baxdı The judge heard the case yesterday; Siz bu məsələyə necə baxırsınız? What is your opinion on this matter? What do you think of this matter?*

**baxmadan** *z* without looking back; ◊ arxasına ~ qaçmaq to run* as fast as one can, to run* as fast as *one's* legs can carry *one*

**baxmalı** *s* worth seeing; ~ film a film worth seeing; *Bu film baxmalı deyil This film is not worth seeing*

**baxmayaraq**[1] *qoş.* in spite of, despite; buna ~ in spite of, despite, notwithstanding; heç nəyə ~ in spite of despite everything, in spite of all; *Xəstə olmağına baxmayaraq o, iclasa gəldi He came to the meeting despite his illness*

**baxmayaraq**[2] *bağ* though, although; *Gec olmağına baxmayaraq, o, işini davam etdirdi Though it was late, he went on working; Yaz olmağına baxmayaraq, hava soyuq idi Although it was spring, the weather was cold*

**baxmayaraq ki...** *bağ.* notwithstanding, though, although; *Baxmayaraq ki, o çoxdan orada yaşayırdı, çox adam onu tanımırdı He was unknown to most people, notwithstanding he had lived there a long time*

**baxt** *i d.d. bax* **bəxt**

**baxtabaxt** *z d.d. bax* **bəxtəbəxt**

**baxtavar** *s d.d. bax* **bəxtəvər**

**baxtavarlıq** *i d.d. bax* **bəxtəvərlik**

**bais** *i* 1. instigator, culprit; 2. reason, cause; motive; ~ olmaq to be* reason / cause

**baiskar**[1] *i bax* **günahkar**[1]

**baiskar**[2] *s bax* **günahkar**[2]

**baiskarlıq** *i bax* **günahkarlıq**

**baislik** *i bax* **günahkarlıq**

**bak** *i* tank; cistern; *(paltar qaynatmaq üçün)* boiler, clothes-boiler

**bakal** *i* glass, goblet; ◊ ~ qaldırmaq to raise *one's* glass *(to)*; bir ~ çaxır / şərab a glass of wine

**bakalavr**[1] *i* bachelor

**bakalavr**[2] *s* : ~ dərəcəsi bachelor's degree; baccalaureate; ~ dərəcəsi almaq to receive baccalaureate / bachelor's degree

**bakan** *i* minister; baş ~ premier, prime minister

**bakenbard** *i* whiskers, sidewhiskers

**bakenbardlı** *s (i.s.)* with / having sidewhiskers; whiskered

**bakir** *s bax* **bakirə**

**bakirə** *s* virgin; ~ qız virgin girl

**bakirəlik**[1] *i* virginity

**bakirəlik**[2] *s*: ~ pərdəsi *anat.* hymen ['haimən]

**bakirlik** *i bax* **bakirəlik**

**bakterial** *s* bacterial; ~ kübrələr bacterial fertilizers *pl.*

**bakteriologiya** *i* bacteriology

**bakterioloji** *s* bacteriological, germ; ~ müharibə bacteriological / germ warfare

**bakterioloq** *i* bacteriologist

**bakterisid** *s biol.* bactericidal [-tə-]

**bakteriya** *i* bacterium *(pl.-ia)*

**bakteriyalı** *s* bacterial; ~ kübrələr bacterial fertilizers *pl.*

**baqaj**[1] *i* luggage; baggage; əl ~ ı hand / personal / small luggage; ~ vermək to register *one's* luggage, to have* *one's* luggage registered

**baqaj**[2] *s* luggage *(attr.)*, baggage *(attr.)*; ~ qəbzi luggage receipt; ~ vaqonu luggage van; *amer.* baggage car

**baqajlıq** *i* luggage rack; *(avtomobildə)* boot; *amer.* trunk

**baqqal**[1] *i* grocer

**baqqal**[2] *s* grocery, grocer's; ~ dükanı grocery *(store)*, grocer's *(shop)*; ~ malları groceries

**baqqaliyə**[1] *i* grocer's shop; groceries

**baqqaliyə**[2] *s* grocery; ~ dükanı grocer's shop

**baqqallıq** *i the job of a grocer*; ~ etmək to be* a grocer

**bal**[1] *i* I honey; ~ kimi şirin honey-sweet, as sweet as honey

**bal**[2] *s*: ~ arısı honey-bee; ~ pətəyi bee (-hive)

**bal** *i* II ball, dancing party; ~ maskarad masquerade; *(xüsusi libas geyilən)* fancy-dress ball

**bal** *i* III 1. *(qiymət)* mark; keçid ~ *(imtahanda)* pass mark; 2. *i.d.* point; *O 10 bal topladı He / She got 10 points*

**bala** *i* baby, child, infant; young one; cub; calf; ayı ~ sı bear-cub; canavar ~ sı wolf-cub; pələng ~ sı tiger-cub; fil ~ sı elephant-calf; baby elephant; balina ~ sı whale-calf; quş ~ sı nesting; fledgeling (fledgling); ~ çıxartmaq to hatch *(d.)*; ~ salmaq to slip

**bala-bala** *z* little by little, slowly; so so; ~ vurmaq *(içmək) d.d.* to drink* little by little / slowly

**balaban** *i* balaban *(a kind of wind instrument)*

**balabançalan** *i* balaban player

**balabançı** *i* balaban player

**balabançılıq** *i the profession of a balaban player*; ~ etmək to be* a balaban player

**balaca**[1] *i* baby, child; *Balaca fincanı sındırıb The baby has broken the cup*

**balaca**[2] *s* 1. little, small; ~ qız a little / a small girl; 2. slight; ~ fərq a slight difference; ~ ağrı a slight pain

**balaca-balaca**[1] *s* tiny; ~ uşaqlar tiny children

**balaca-balaca**[2] *z bax* **bala-bala**

**balacaboy** *s* undersized, shortish, not tall

**balacaboylu** *s bax* **balacaboy**

**balacaboyluluk** *i the state of being shortish/not tall*

**balacalandırmaq** *f* to diminish *(d.)* to make* shorter *(d.)*, to decrease *(d.)*, to shorten *(d.)*

**balacalanmaq** *f* to get* diminished, to be* made shorter

**balacalaşdırılmaq** *f* to be* diminished / shortened

**balacalaşdırmaq** *f bax* **balacalatmaq**

**balacalaşmaq** *f bax* **balacalanmaq**

**balacalatdırmaq** *f bax* **balacalatmaq**

**balacalatmaq** *f* to ask / to cause *smb.* to diminish *(d.)* / to shorten *(d.)*

**balacalıq** *i* 1. smallness; 2. *bax* **uşaqlıq**

**balacanlı** *s (i.s.)* loving *one's* child

**balacanlılıq** *i the quality of loving one's child*

**balacığaz** *i bax* **balacıq**

**balacıq** *i* baby, young one, little one; *(müraciət)* dear, my little one

**balaxon** *i* loose overall

**balaq** *i* hem; skirt; yubkanın balağı the hem of the skirt; yubkanın balağını qaldırmaq to raise the hem of the skirt

**balalayka** *i* balalaika

**balalaykaçalan** *i* balalaika player

**balalaykaçı** *i bax* **balalaykaçalan**

**balalama** *fi* childbirth; *(donuz)* farrow; *(qoyun)* lambing; *(pişik)* having kittens; *(inək)* calving [ka:v-]; *(at)* foaling; *(it, donuz)* littering

**balalamaq** *f (ümumiyyətlə)* to give* birth *(to)*; to breed; *(qoyun)* to lamb; *(donuz)* to farrow; *(pişik)* to kitten; *(quş)* to hatch, *(it, donuz)* to litter

**balalı** *s (i.s.)* having a cub / a baby; *(quş) (i.s.)* having a nestling

**balalıq** *i anat.* uterus; womb [wu:m]

**balans**[1] *i* balance; ~ vurmaq to strike* a balance

**balans**[2] *s*: ~ cədvəli balance-sheet; ~ hesabı *müh.* balance sheet

**balansir** *i* 1. *tex.* beam; 2. *(saatda)* balance-wheel

**balasalma** *i* miscarriage; slip

**balatı** *i* ferment; *(xəmir üçün)* leaven

**balaverən** *s bax* **doğan**



**balavermə** *i* fruitfulness, fertility, fecundity

**balçı** *i* bee-keeper; apiarist

**balçılıq**[1] *i bax* **arıçılıq**[1]

**balçılıq**[2] *s bax* **arıçılıq**[2]

**baldır** *i* 1. *(adamlarda)* shin; 2. *(heyvanda)* shank

**baldırıaçıq**[1] *i məc.* ragamuffin, vagabond, ragged fellow

**baldırıaçıq**[2] *s (i.s.)* with naked shin; ~ uşaq a child with naked shin

**baldırıaçıqlıq** *i the state of being naked shin*

**baldırıyoğun**[1] *i* thick-legged woman* / girl

**baldırıyoğun**[2] *s* thick-legged; *(i.s.)* having / with thick legs

**baldırıyoğunluq** *i the quality of having thick legs*

**baldırlamaq** *f* to grasp / to seize *smb.'s* shin

**baldırlanmaq** *f* to be* seized by the shin

**baldız** *i* sister-in-law (*pl.*: sisters-in-law)

**baldızlıq** *i the state of being a sister-in-law*

**balerina** *i* ballet-dancer ['bæleı...], ballerina [ˌbæliə'ri:nə]

**balet**[1] *i* ballet [-leı]

**balet**[2] *s* ballet; ~ musiqisi ballet music

**baletbaz** *i* ballet lover, ballet-goer

**baletbazlıq** *i* balletomane

**baletçi** *i bax* **balerina**

**baletmeyster** *i* ballet-master ['bæleı...], choreographer [k-]

**balıq**[1] *i* fish; təzə ~ fresh fish; duzlu ~ salt fish; quru ~ dried fish; qızardılmış ~ fried fish; soyutma *(suda bişmiş)* ~ boiled fish; çay balığı fresh-water fish; dəniz balığı salt-water fish; ~ tutmaq to fish; *(qarmaqla)* to angle *(d.)*; ~ tutmağa getmək to go* fishing; *(qarmaqla)* to go* angling; ◊ sudan çıxmış ~ kimi like a fish out of water

**balıq**[2] *s* fish, fishing; ~ şorbası fish soup; ~ bazarı fish-market; ~ təsərrüfatı fish farm; ~ ticarəti fish trade; ~ sənayesi fishing industry; ~ vətəgəsi fishery; ~ konservi tinned / canned fish; ~ yağı codliver oil; ~ hovuzu fish-pond; ~ xörəkləri fish dishes; ~ zavodu fish-processing plant / factory

**balıqcıl** *i zool.* halcyon, kingfisher

**balıqçı**[1] *i* fisher, fisherman*, *(qarmaqla balıq tutan)* angler

**balıqçı**[2] *s* fishing; fisherman's; ~ qayığı fishing-boat; ~ arvadı fisherman's wife

**balıqçılıq**[1] *i* fishing, fishery

**balıqçılıq**[2] *s* fishing, fishery; ~ müqaviləsi fishing agreement; ~ ləvazimatı fishing-tackle; ~ rayonu fishing / fishery district; ~ təsərrüfatı fish farm

**balıqqulağı** *i* cockleshell

**balıqlı** *s (i.s.)* having fish; ~ çay a good river for fishing, river teeming with fish

**balıqsatan** *i (kişi)* fishmonger; *(qadın)* fishwife

**balıqşünas** *i* ichthyologist

**balıqşünaslıq**[1] *i* ichthyology

**balıqşünaslıq**[2] *s* ichthyological

**balıqtəmizləmə** *s* fish-processing; ~ kombinatı fish-processing plant / factory

**balıqtutan** *i bax* **balıqçı**[1]

**balıqudan** *i zool.* heron [he-]

**balıqyetişdirən**[1] *i* fish-breeder; *elm.* pisciculturist

**balıqyetişdirən**[2] *s* : ~ təsərrüfat fish-farm

**balıqyetişdirmə** *i* fish-farming; *elm.* pisciculture

**balınc** *i bax* **balış**

**balıncüzü** *i bax* **balışüzü**

**balış** *i* pillow; ~ a baş qoymaq to lay* / to rest the head on a pillow; hava ~ ı air-cushion; ◊ başının altına ~ qoymaq *idiom.* ~ to swindle *smb.*, to blunt *smb.'s* watchfulness, to relax *one's* vigilance

**balışüzü** *i* pillow-case, pillow-slip

**balışüzülük** *i fabric fit for pillow-case / pillow slip*

**balina**[1] *i* whale

**balina**[2] *s* whale; ~ yağı whale oil; blubber, sperm oil; ~ sümüyü whale bone; ~ balası whale-calf; ~ ovu whale -fisher; ~ sənayesi whale-fishery, whale-fishing

**balka** *i* beam, girder

**Balkan** *s* Balkan

**balkar**[1] *i* Balkar, Balkar (woman*)

**balkar**[2] *s* Balkar; ~ dili Balkar, the Balkar language

**balkarca** *z* Balkar; ~ danışmaq to speak* Balkar

**balkon** *i* balcony

**balkonlu** *s (i.s.)* having / with balcony; ~ ev a house with balcony

**balkonsuz** *s* balconiless; *(i.s.)* without balcony; ~ ev a house without balcony

**balqabaq**[1] *i* 1. pumpkin; 2. *məc.* an obtuse / stupid / stow-witted person, blockhead, neither fish nor flesh

**balqabaq**[2] *s* 1. pumpkin; ~ toxumu pumpkin seed; 2. *məc.* slow-witted, narrow minded, thick head

**ball** *i* 1. *(məktəbdə şagirdlərin biliyinə və əxlaqına verilən qiymət)* mark; 2. *(küləyin, zəlzələnin və s. gücünü göstərmək üçün istifadə edilən ölçü vahidi)* force; magnitude; 20 ~ gücündə külək force-twenty wind; 8 ~ gücündə zəlzələ earthquake of magnitude eight

**ballada** *i* ballad; *(musiqidə)* ballade

**ballı** *s* honeyed; melliferous, nectariferous; ~ otlar melliferous herbs; ~ pryanik honey-cake; ~ bitkilər nectariferous plants

**ballıca** *i bot.* lungwort

**ballistik** *s* ballistic; qitələrarası ~ raket intercontinental ballistic missile

**ballistika** *i* ballistics

**bal-maskarad** *i* masquerade; *(xüsusi paltarda)* fancy-dress ball

**balon** *i* baloon, tank; qaz ~ nu gas-bag; oksigen ~ nu oxygen cylinder

**balta**[1] *i* 1. axe *(dülgər ~ sı)* bench axe; *(balaca)* hatchet; ◊ ~ nı dibindən vurmaq *məc.* to ruin / to destroy *smth.*, to set* the axe to *smth.*; 2. *(qazma baltası)* chisel

**balta**[2] *s* axe; ~ sapı axe-handle

**baltacıq** *i* hatchet

**baltaçı** *i* 1. *bax* **baltaqayıran**; 2. *bax.* **odunçu**

**baltaçılıq** *i* 1. *the profession of an axe-maker*; 2. *the job of a wood-cutter*

**baltadiş** *s bax* **baltadişli**

**baltadişli** *s (i.s.)* with big teeth; ~ adam a man* with big teeth

**baltaqayıran** *i* axe-maker

**baltalamaq** *f* 1. *(ağacı)* to fell *(d.)*. *(odunu)* to hew *(d.)*, to hack *(d.)*, to chop *(d.)*; 2. *(əti və s.)* to mince *(d.)*, to chop *(up) (d.)*; 3. *(kobud danışmaq, hərəkət etmək)* to give* it to *smb.* straight from the shoulder *idiom.*, to raze *smth.* to the ground
**baltalanmaq** *f* to be* chopped / hewed / felled
**baltalatdırmaq** *f bax* **baltalatmaq**
**baltalatmaq** *f* 1. *(ağacı)* to ask/to cause s.o. to fell *(d.)*. 2. *(odunu)* to ask / to cause *smb.* to hew *(d.)* 3. *(əti və s.)* to ask / to cause *smb.* to chop *(d.)* up
**baltalı** *s (i.s.)* having / with an axe
**balu-pər** *i arx. bax* **qanad**
**balzam**[1] *i* balsam [bɔ:l-]; *məc.* balm [ba:m]
**balzam**[2] *s* balsamic [bɔ:l-]
**balzamin** *i bot.* balsam
**balzamlama** *fi* embalming [-a:m-]
**balzamlamaq** *f* to embalm *(d.)*
**balzamlanmaq** *f* to be* embalmed
**balzamlatdırmaq** *f bax* **balzamlatmaq**
**balzamlatmaq** *f* to ask / to cause *smb.* to embalm *(d.)*
**bambalaca** *s d.d.* very little, tiny, diminutive, wee
**bambaşqa** *s* quite another, different; *Bu, bambaşqa məsələdir It's quite another matter*
**bambılı** *s* shallow, light-minded, light-headed, flippant
**bambılılıq** *i the quality of being flippant*
**bambuq**[1] *i bot.* bamboo
**bambuq**[2] *s* bamboo
**baməzə**[1] *i* wag, joker, funny / comical fellow, amusing chap
**baməzə**[2] *s* amusing, funny; ~ olmaq to be* amusing / funny
**ban**[1] *i* crow
**ban**[2] *s*: cock-a-doodle-doo; xoruz ~ ı cockcrow [...krou]
**banan**[1] *i* banana
**banan**[2] *s* banana; ~ yarpağı banana leaf
**banda** *i* band, gang; oğru / quldur ~ sı band / gang of thieves, robbers
**bandaj** *i* 1. bandage; 2. *(qrija üçün)* truss; 3. *id.* athletic supporter; 4. *tex.* tyre, band
**bandajçı** *i* bandage-maker
**banderol** *i* 1. *(postal)* wrapper; 2. printed matter
**bandit** *i* gunman*, bandit, gangster, armed robber
**banditcəsinə** *z* as / like a bandit
**banditizm** *i* banditry, gangsterism; *amer.* thuggery
**banditlik** *i* banditry, gangsterism; ~ etmək to be* a bandit / gunman, to act like a bandit / a gunman
**bandur (a)** *i* bandura *( a Ukrainian stringed folk musical instrument)*
**bandurçalan** *i bax* **bandurist**
**bandurçu** *i bax* **bandurist**
**bandurist** *i* bandura player
**bani** *i (kişi)* founder, initiator; *(qadın)* foundress
**bank**[1] *i* 1. bank; dövlən ~ ı the State Bank; ~ a pul qoymaq to deposit money at a bank; səhm ~ ı joint-stock bank; 2. *(kartda)* bank; ~ qoymaq to be* banker, to keep* the bank
**bank**[2] *s*: ~ işi banking; ~ hesabı / kitabı bank-book; ~ kapitalı bank*(ing)* capital
**banka** *i* 1. jar, pot; *(dəmirdən)* tin; mürəbbə ~ sı jam jar, jam pot; 2. *tib.* cupping-glass; ~ qoymaq to apply cupping-glass *(to)*
**banket** *i* banquet; ~ vermək to give* a banquet; bir kəsin şərəfinə ~ vermək to give* a banquet in *smb.'s* honour
**bankir** *i* banker
**banknot** *i* bank-note
**bankrot** *i* bankrupt; ~ elan etmək to declare bankrupt *(d.)*
**bankrotluq** *i* bankruptcy
**banlamaq** *f* to crow* [-ou]
**banlaşmaq** *f* 1. to crow together; 2. *məc.* to speak* / to shout together
**bant** *i* bow; ~ bağlamaq to tie in a bow *(d.)*
**bantlı** *s (i.s.)* with bow; ~ qız a girl with a bow
**banu** *i arx.* lady
**bapbalaca** *s d.d.* very little, tiny, wee
**baptist** *i* baptist
**baptizm** *i* baptism
**bar** *i* I *(həm müst. həm də məc.)* fruit [fru:t]; ~ vermək to bear* / to yield fruit; *məc.* to bear* fruit; zəhmətinin ~ ını görmək / dərmək to reap the fruit of *one's* labour
**bar** *i* II *(yeməkxana)* bar; snack-bar
**bar** *i* III *bax* **kif**
**baraban** *i* drum; ~ çalmaq to drum, to beat* the drum
**barabançalan** *i* drummer
**barabançı** *i bax* **barabançalan**
**barabançılıq** *i the profession of a drummer*
**barabarlaşdırmaq** *f bax* **bərabərləşdirmək**
**barabarlaşmaq** *f bax* **bərabərləşmək**
**barabarlıq** *i bax* **bərabərlik**
**barak** *i* barracks; *hərb.* hut
**barakallah** *nid Well done! Bravo! That's a boy! Good lad!*
**barama** *i* cocoon
**baramaayıran** *i* cocoon sorter
**baramaçı** *i* silkworm breeder, *elm.* sericulturist
**baramaçılıq**[1] *i* silkworm breeding; *elm.* sericulture
**baramaçılıq**[2] *s* silkworm breeding; *elm.* seri(ci)-culture; ~ təsərrüfatı silkworm breeding farm
**baramaqurdu** *i zool.* silkworm, bombyx
**barat** *i* money order; ~ göndərmək to remit *(d.)*, to send* through the bank *(d.)*
**baratalan** *i mal.* drawer
**barbar**[1] *i* barbarian
**barbar**[2] *s* barbarian, barbaric, barbarous; ~ qəbilələr barbarian tribes; ~ xalqlar barbaric people; ~ müharibə barbarous warfare; ~ adətlər barbaric customs
**bar-bar** *z* : ~ bağırmaq to yell / to shout at the top of *one's* voice
**barbarcasına** *z* barbarically, as / like a barbar
**barbaris**[1] *i* barberry, barberries
**barbaris**[2] *s*: ~ kolu barberry
**barbarizm** *i* barbarism
**barbarlıq** *i* barbarism; vandalism; *(qəddarlıq)* barbarity
**bardaq** *i* jug *(made of clay)*
**bardan** *i* large sack



**bardaş** *i*: ~ qurmaq to sit* on the carpet / ground *one's* legs folded
**barelyef** *i* bas-relief
**barə** *qoş* about, of, on; bir kəs / şey ~ də fikirləşmək to think* about / of *smb.* / *smth*; *Bu barədə danışmayın Don't speak about it*
**barxana** *i* home utensils *pl.*; mats and blankets
**bar'ı**[1] *i* fence *(made of clay)*; ~ çəkmək to fence with clay
**b'arı**[2] *əd* I wish; *Barı o tez gələydi I wish he would come soon*
**barınmaq** *f* to grow* / to become* / to get* richer, to make* a fortune,
**barınıb-batmaq** *f* to grow* / to become* very rich; to make* a large fortune
**barış** *i bax* **barışıq**
**barışdırıcı**[1] *i* compromiser, peace-maker, reconciler, conciliator
**barışdırıcı**[2] *s* conciliatory, pacificatory, compromising; ~ münasibət compromising attitude / approach *(to)*
**barışdırıcılıq**[1] *i* compromise, conciliatoriness; pacification
**barışdırıcılıq**[2] *s* conciliatory, pacificatory; compromise; ~ siyasəti aparmaq to carry on the policy of compromise; ~ tədbirləri conciliatory measures
**barışdırılmaq** *f* to be* reconciled *(with smb.)*
**barışdırma** *fi* reconciliation; *(baxışları, fikirləri)* conciliation
**barışdırmaq** *f* to reconcile *(d., with, to)*; zidd baxışları / fikirləri ~ to reconcile contradictory views
**barışıq** *i* armistice, truce; ~ əldə etmək to conclude a truce, to conclude / to sign an armistice
**barışıqlıq** *i* reconciliation, concilaition
**barışma** *fi* reconcilation; understanding; coming to an agreement
**barışmaq** *f* 1. *(bir kəslə)* to be* reconciled *(with smb.)*, to make* it up *(with smb.)*; *(bir şeylə)* to reconcile *oneself (to smth.)*, to resign *oneself (to smth.)*; öz vəziyyəti ilə ~ to reconcile *oneself* to *one's* situation, to accept the situation; *Bununla barışmaq olmaz This cannot be tolerated. That is too much;* 2. to come* to an agreement / understanding *(about)*
**barışmaz** *s* irreconcilable, implacable, uncompromising; ~ düşmən irreconcilable / implacable enemy; ~ ziddiyyətlər *fəls.* irreconcilable contradictions
**barışmazlıq** *i* irreconcilability, implacability
**barıt**[1] *i* powder; qara ~ gunpowder; tüstüsüz ~ smokeless powder; ◊ bir atımlıq ~ ı olmaq to have* one supply of gunpowder
**barıt**[2] *s (gun)* powder; ~ zavodu gunpowder works; powder-mill; ~ anbarı powder-magazine, powder-room
**barıtxana** *i* powder-room
**barıtqabı** *i* powder-flask
**bariton**[1] *i mus.* baritone
**bariton**[2] *s mus.* baritonal
**barium**[1] *i kim.* barium
**barium**[2] *s* baric
**bariumlu** *s bax* **barium**[2]
**bariz**[1] *s* graphic, obvious, clear, distinct; ~ nümunə obvious case, graphic example
**bariz**[2] *z* obviously, distinctly, clearly
**barizlik** *i* clarity, obviousness, distinctness
**barj** *i* barge
**barka** *i* wooden barge
**barkas** *i* 1. *(hərbi-dəniz donanmasında)* launch; *(yelkənli donanmada)* long boat, pinnace
**barlanmaq** *f* I to yeild [ji:ld] fruit, to bear fruit
**barlanmaq** *f* II *bax* **kiflənmək**
**barlı** *s* I fruitful, fertile, fecund; ~ meyvə ağacı a fecund fruit tree; ~ torpaq fertile soil
**barlı** *s* II *bax* **kifli**
**barlılıq** *i* I fruitfulness, fertility, fecundity
**barlılıq** II *the state of being mouldy*
**barmaq**[1] *i* 1. *(əldə)* finger; 2. *(ayaqda)* toe; baş ~ *(əldə)* thumb; *(ayaqda)* big toe; şəhadət barmağı forefinger, index *(finger)*; orta ~ middle finger, third finger; adsız ~ fourth finger, *(sol əldə)* ring finger; çeçələ ~ little finger; barmağının ucunda gəzmək to tiptoe; ~ silkələmək to shake* *one's* finger *(at)*; to wag *one's* finger *(at)*; özgənin işinə ~ soxmaq to meddle with / in other people's business; ~ qaldırmaq to raise *one's* finger; *məc.* to vote by raising *one's* finger; barmağına dolamaq to wind *s.o.* round *one's* finger; *d.d.* to cheat *(d.)*, to dupe *(d.)*; to deceive *(d.)*, to take* in *(d.)*; bir şeyi beş barmağı kimi bilmək to have* *smth.* at *one's* finger-tips / finger-ends, to know* *smth.* like the back of *one's* hand *idiom.*
**barmaq**[2] *s* finger; ~ yeri / izi finger-print; ~ ləkəsi finger-mark; ~ ucu finger end
**barmaqarası** *z* through fingers; ◊ bir şeyə ~ baxmaq to look through *one's* fingers at *smth.*; to pay* no attention *(to)*, to pay* no heed *(to)*, to take* no heed of
**barmaqhesabı** *z* on fingers; ~ saymaq to count on *one's* fingers
**barmaqlama** *fi* fingering
**barmaqlamaq** *f* to finger *(d.)*; bir şeyi ~ to finger *smth.*
**barmaqlanma** *fi* being fingered
**barmaqlanmaq** *f* to be* fingered
**barmaqlatdırmaq** *f bax* **barmaqlatmaq**
**barmaqlatmaq** *f* to ask / to cause *smb.* to finger *(d.)*
**barmaqlı** *s (i.s.)* with / having fingers
**barmaqlıq** *i* grill, railing
**barmaqsız** *s* fingerless; *(i.s.)* missing one or more fingers
**barmaqsızlıq** *i the state of being fingerless*
**barmaqşəkilli** *s bax* **barmaqvarı**
**barmaqvarı** *s* finger-shaped
**barometr** *i* barometer
**barometrik** *s* barometric*(al)*
**baron** *i* baron
**baronessa** *i* baroness
**baronluq** *i* barony
**barrikada**[1] *i* barricade; ~ qurmaq to barricade *(d.)*
**barrikada**[2] *s* barricade; ~ döyüşü barricade fighting
**barsız** *s* barren, sterile; *məc.* fruitless; vain; ~ torpaq barren soil; ~ zəhmət fruitless labour / work

**barsızlanmaq** *f bax* **barsızlaşmaq**

**barsızlaşmaq** *f* to become* / to get* fruitless; to become* / to get* barren

**barsızlıq** *i* fruitlessness; futility; barrenness

**barverici** *s* fruitful, fertile, fecund; ~ ağac fruitful tree; ~ zəhmət fruitful labour

**barvermə** *i* fruiting

**baryer** *i* *(həm mus. həm məc.)* barrier; bar; *(cıdırda)* hurdle; ~ i dəf etmək to clear a hurdle; ~ləri aradan qaldırmaq *məc.* to eliminate / to remove barriers

**bas**[1] *i* bass [beis]; bass singer

**bas**[2] *s* bass [beis], deep-voiced; ~ alətlər bass instruments

**basabas** *i* crush, crowd, jam, squash; *Orada bir basabas var ki It's such a crush there. There is such a crowd there*; ~ salmaq to crowd out

**basa-basa** *z* tight; kisəni ~ doldurmaq to pack a sack tight, to cram a sack full

**basdalamaq** *f* to tread [tred] *(on, upon)*, to trample down *(d.)*; *(çirkləndirmək)* to make* dirty *(with one's feet) (d.)*; bir kəsin ayağını ~ to tread / to step on *smb.'s* foot; *məc.* to tread on *smb.'s* toes / corns

**basdalanmaq** *f* to be* trodden / trampled on / over

**basdalatdırmaq** *f bax* **basdalatmaq**

**basdalatmaq** *f* to ask / to cause *smb.* to tread *(d.)* / to trample down *(d.)*

**basdı-kəsdi** *i d.d.* bragging, boasting

**basdırılmaq** *f* 1. *(ağac və s.)* to be* planted; 2. *(meyit)* to be* buried; 3. *(örtülmək)* to be* covered *(with)*

**basdırma** *fi* 1. *(ağac və s.)* planting; 2. *(ölü)* burial, interment

**basdırmaq** *f* 1. to bury *(d.)*, to inter *(d.)*; ölmüş adamı ~ to bury / to inter a dead person; 2. *(ağac və s.)* to plant *(d.)*; ağac / gül və s. ~ to plant a tree / a flower, etc; 3. *(örtmək)* to cover *(d.)*; uşağın üstünü yorğanla ~ to cover the child with a blanket; 4. *(maşınla və s.)* to run* over *(d.)*, to knock down *(d.)*; uşaq ~ to run* over a child; 5. *(toyuğu)* to set* on; toyuğu ~ to set* a hen on eggs; 6. *(evin damını)* to roof *(d.)*; *(küləşlə)* to thatch *(d.)*

**basdırtmaq** *f* 1. *(ölünü, sümüyü və s.)* to ask / to cause *smb.* to bury *(d.)* / to inter *(d.)*; 2. *(ağacı, gülü, toxumu və s.)* to ask / to cause *smb.* to plant *(d.)*; 3. *(maşınla, araba ilə və s.)* to ask / to cause *smb.* to run over(d.) / to knock down *(d.)*; 4. *(evin üstünü)* to ask / to cause *smb.* to roof *(d.)*;*(küləşlə)* to thatch *(d.)*; 5. *(bir kəsin/bir şeyin üstünü)* to ask / to cause *smb.* to cover *(d. with)*

**basıb-bağlamaq** *f məc.* to brag *(of, about)*, to boast *(of)*; *Basıb-bağlama! Without boasting / bragging!*

**basıb-əzmək** *f* to trample down *(d.)*, to trample under foot *(d.)*; to crush *(d.)*, *(miniklə)* to run* over *(d.)*, to knock down *(d.)*

**basıb-kəsən**[1] *i* boaster, braggart, show-off

**basıb-kəsən**[2] *s* boastful, vainglorious

**basıb-kəsmək** *f məc.* 1. *(hədələmək)* to threaten *(d.)*; 2. *bax*, **basıb-bağlamaq**

**basıq**[1] *i* hollow, cavity

**basıq**[2] *s* concave; ~ güzgü a concave mirror

**basıqlıq** *i* concavity

**basılma** *fi* 1. defeat; tam ~ utter defeat; 2. *topoqr.* printing

**basılmaq** *f* 1. *(məğlub olmaq)* to be* defeated; 2. *(çap olunmaq)* to be* printed; 3. *(yerləşdirilmək)* to be* stuffed / crammed *(with)*, to be* packed *(with)*; 4. *(bir şeyin altında qalmaq)* to be* run over

**basılmaz** *s* unconquerable, invincible, impregnable; ~ qala / düşərgə impregnable fortress / camp; ~ ordu invincible army

**basılmazlıq** *i* invincibility, invincibleness, impregnability

**basım** *i* : *dən* su ~ı displacement; su ~ı 5000 ton olan gəmi ship of 5000 tons displacement

**basım-basım** *z* chock-full, cram-full; ~ olmaq to be* chock-full *(with)*;*Qatar basım-basım idi The train was chock-full*

**basırıq**[1] *i* 1. tightness, closeness; 2. cram, crush; *Necə də basırıqdır! What a cram! How crowded it is!*; 3. populousness

**basırıq**[2] *s* cram-full, chock-full, crowded; populous; ~ şəhər populous city / town

**basırıqlıq** *i bax* **basırıq**[1]

**basketbol**[1] *i id.* basketball

**basketbol**[2] *s* basketball; ~ komandası basketball team

**basketbolçu** *i* basketball player

**basqın** *i* 1. attack, assault; aggression; silahlı ~ armed attack; qəfil ~ surprise attack; ~ı dəf etmək to repulse an attack; ~ etmək to attack *(d.)*, to assault *(d.)*; to make* an attack; qəfildən ~ etmək to make* a surprise attack *(on)*; 2. *(oğurluq)* robbery; günün günortaçağı ~ daylight robbery; 3. raid; hava ~ı air raid; düşmən düşərgəsinə ~ etmək to make* a raid into the enemy camp

**basqınçı** *i* robber; bandit, brigand; aggressor

**basqınçılıq** *i* robbery, brigandage; aggression

**basqıntı** *i bax* **basqın**

**basma** *i* I *(suçəkən kağız)* blotting paper; *(ləvazimat)* blotter

**basma** *i* II *(saç rəngləmək üçün boya)* basma

**basmaç** *i* basmatch *(a member of a revolutionary band in Central Asia)*

**basmaxana** *i arx.* printing house, printing-works,

**basmaq** *f* 1. *(itələmək)* to push *(d.)*; 2. *(əzmək)* to crush *(d.)*, to press *(d.)*; düyməni ~ to press / to push the button; 3. *(qalib gəlmək)* to defeat *(d.)*, to come* over *(d.)*, to fight* down *(d.)*; 4. *(alaq basmaq)* to be* overgrown *(with)*; 5. *(nəqliyyat vasitəsilə)* to run* over *(d.)*, to knock down *(d.)*; 6. *(acgözlüklə yemək)* to guzzle *(d.)*, to gorge [gɔ:dʒ] *(d.)*; 7. *(su basmaq)*; to flood; *Şaxtanı su basdı The shaft was flooded*; 8. *(qar)* to cover *(d.)*; *Yeri qar basmışdı Snow covered the ground*; 9. tər ~ to break* into a sweat; 10. *(çap etmək)* to print *(d.)*; ◊ ayaq ~ to go* *(to)*, to visit *(d.)*; 11. *(suya)* to dip *(d.)*; bir kəsi suya ~ to give* *smb.* a dip; 12. *(papağı)* to pull; papağı gözünün üstünə ~ to pull *one's* cap over *one's* eyes

**basmalamaq** *f bax* **basmarlamaq**

**basmarlamaq** *f* to fall* *(upon)*, to swoop down *(upon)*; to rush *(at; upon)*; to catch* *(d.)* suddenly

**basmarlanmaq** *f* to be* caught suddenly, to be* rushed at



**basməmmədi** *z d.d.* hastily, slapdash, in a hurry; carelessly, in a slapdash manner; işi ~ görmək to do* things hastily / carelessly / in a slapdash way

**baş**[1] *i* head; top; brain; stolun ~ı the head of the table; mismarın ~ı the head of the nail; çəkicin ~ı the head of the hammer; dağın ~ı the top of the mountain; səhifənin ~ı the top of the page; butulkanın ~ı the top of the bottle; ~a gəlmək 1) to come* to a head; 2) to be* finished / completed; ~ını dik tutmaq *(lovğalanmaq)* to have* a swollen head; *amer.* to have* a swelled head; müvəffəqiyyətdən ~ı gicəllənmək to have* *one's* head in the clouds; ~ saxlamaq / girləmək to keep* *one's* head above water; ~ına salmaq to put* *smth.* into *one's* head; ~la işləmək to use *one's* brains; ~ı yaxşı işləmək to have* *one's* head screwed on (right); *Onun başı yaxşı işləyir His head is screwed on the right way. He / She has a good head on his shoulders*; ~ vermək to take* place, to happen; *Nə baş verib? What has happened? Böyük dəyişikliklər baş verib Great changes have taken place*; ~ vurmaq 1) *(suya)* to dive *(into)*, to plunge *(into)*; 2) *(qırxmaq)* to cut* *one's* hair; 3) *(öldürmək)* to execute *(d.)*; ~ çəkmək to visit *(d.)*, to go* to see *(d.)*; ~ını qaldırmaq to raise *one's* head; ~ qaldırmaq to rise* *(against)*, to protest *(against)*, to make* a protest *(against)*; ~ qoymaq *(özünü qurban vermək)* to sacrifice *oneself*, to lay* down *one's* life; bir yastığa ~ qoymaq to sleep in the same bed, to live together, to be* wife and husband; to have* sex *(with)*; ~ qoşmaq to pay* attention *(to)*; to have* dealings *(with)*; *Ona baş qoşma Don't pay attention to him*; ~ əymək 1) *(hörmət mənasında)* to bow *(to, before)*; 2) *(təslim olmaq)* to cringe *(before)*, to humiliate *oneself (before)*, to beg humbly *(d.)*; ~ını əymək to droop / to bend *one's* head; ~ına dəymək *(peşman olmaq)* to be* sorry *(that)*; to come* to *(see)* reason, to come* to *one's* sense, to sober down; ~ını aşağı etmək to disgrace *(d.)*, to defame *(d.)*, to put* to shame *(d.)*, to abase *oneself*; ~ işlətmək to use *one's* brains / wits; ~ını bulamaq / yırğalamaq to shake* *one's* head; ~ alıb getmək to go* aimlessly, to go* where one likes / wants; ~ götürüb getmək to leave* some place forever; ~ götürüb qaçmaq to run* away quickly, to run* away as quickly as possible; ~ tapmaq to realize *(d.)*, to comprehend *(d.)*; ~a düşmək to understand *(d.)*, to realize *(d.)*, to comprehend *(d.)*; ~ çıxarmaq to be* able to realize what is what; to live *(among)*; ~a keçirmək to put* *smb.* at the head *(of the table)*; ~a salmaq to explain *(d.)*, to elucidate *(d.)*, to make* clear *(d.)*, *(qanunu, qaydanı və s.)* to interpret *(d.)*; ~a çıxmaq *məc.* 1) to come* to an end, to finish; 2) to become* impudent/insolent; ~ aparmaq 1) to speak* nonsense, to talk much; 2) *məc.* to overstep the limits, to pass all bounds; 3) to become* impudent; 4) *(at)* to bolt; ~dan / beyindən olmaq to hear* a long and nonsense talk / voice / knock / dull music, etc.; ~dan ayağa qədər / kimi from head to foot, from beginning to end, from top to bottom; ~dan ayağa kimi qara geyinmək to be* dressed in black from top to toe; ~dan aşmaq *məc.* to have* too much/many; ~dan etmək 1) to get* rid *(of)*; to have* finished / done hastily (with) 2) to do* some work hurriedly / carelessly; ~dan çıxarmaq 1) to bewilder/to confuse *smb.*; 2) to deceive [-si:v] *(d.)*; *(fırıldaq gəlmək)* to swindle *(d.)*; ~ı ayılmaq / ayazımaq / açılmaq to get* / to become* free, to make* *oneself* free; to finish / to complete *one's* work; ~ı aşağı 1) with hanging head; 2) humble, peaceful; ~ı aşağı olmaq 1) to be shamefaced / disgraced; 2) to be* humble / peaceful; ~ı qarışmaq to be* very / too busy; to be* interested in *smth.* greatly; ~ı hərlənmək / fırlanmaq / gicəlmək to feel* giddy; *Onun başı fırlanır/ gicıəlir He feels giddy. His head is swimming*; ~ı yuxarı upwards; ~ı uca olmaq to put* on haughty airs, to look haughty; ~ı çıxmaq to be* able to reason / to understand *(d.)*; ~ına ağıl qoymaq to put* sense *(into)*, to set* *smb.* in the right way; ~ına buraxmaq 1) to give* vent; 2) to leave without control / supervision; ~ına qalmaq to be* abandoned / neglected; ~ına dən düşmək to go* / to grow* / to turn grey, to be* touched with grey; ~ına iş gəlmək to happen with *smb.* an accident; ~ına yeritmək to make* *smb.* understand, to din / to ram *smth.* into *smb.*; *d.d.* to try to make *smb.* to realize smth.; ~ına oyun açmaq to play a trick on *smb.*; to mock *(at)*; to taunt *(d.)*; ~ına hava gəlmək to go* mad , to go* off *one's* head, to be* out of *one's* wit(s); ~ına çəkmək to toss off *(d.)*, to drink* off *(d.)*; ~dan rədd olmaq to be* off! to get* away! *Başımdan rədd olun! Away with you! Be off! Get away!* ~ını aşağı salmaq 1) to hang down *one's* head; 2) to mind *one's* own business; ~ını bağlamaq 1) to cover *one's* head with a kerchief; 2) *hüq.* to distain *(d.)* ~ını batırmaq to kill *smb.* and to conceal traces; ~ını qarışdırmaq 1) to entertain *(d.)*, 2) to divert *(d.)*, to attract *smb.* away from *smth*; ~ını dolandırmaq to live somehow, to make* both ends meet; ~ını doldurmaq 1) to pour some more *(d.)*; 2) *məc.* to hammer into *smb.'s* head, to stuff *one's* head; ~ını yemək to outlive *(d.)*, to outlast *(d.)*; to kill *(d.)*; ~ını yerə qoymaq 1) *d.d.* to sleep*; 2) *məc.* to die; ~ını tovlamaq / piyləmək to deceive *(d.)*; to fool *(d.)*; to pull *smb.'s* leg; ~ını uca etmək to enhance *smb.'s* importance *(of)*, to raise *smb.'s* authority in the eyes of people; ◊ ~ının altına yastıq qoymaq to lull / to blunt *smb.'s* vigilance / watchfulness, to relax *one's* vigilance; ~ının üstünü almaq to come* / to appear unexpectedly, to take* by surprise; ~ının üstünü kəsdirmək to stand* over *smb.*; to breathe down *smb.'s* neck; ◊ *Ağacın iki başı var zər. məs.* ≅ *It cuts both ways*; beş ~ inək five head of cows

**baş**[2] *s* head, chief, main, principal; ~ həkim head physician; *hər.* chief medical officer, head surgeon; ~ mühəndis chief engineer, engineer-in-chief; ~ redaktor editor-in-chief; ~ mühasib chief accountant, accountant general; ~ komandan Commander-in-Chief; Alı ~ Komandan Supreme Commander-in-Chief; ~ qərargah General headquarters pl.; ~ katib general secretary, secretary-general; ~ cümlə *qram.*

main / principal clause; ~ **kələm** cabbage-head; ~ **hərf** capital letter; ~ **barmaq** thumb; ~ **aşpaz** the head cook; ~ **küçə** main street; ~ **yol** main road; ~ **idarə** central board / administration; ~ **şəhər** chief / principal town, *(mərkəz)* capital; ~ **geyimi** headgear, headdress

**başabaş** *z* on equal terms; ~ **dəyişmək** to swap, to make* a straight swap

**başabatan** *s* reasonable, sensible, judicious; ~ **tələb** a reasonable claim

**başabəla** *s* fidgety, restless, unmanageable; ~ **uşaq** fidgety child, unmanageable child, wilful child*

**başaçıq**[1] *s* bareheaded; ~ **adam** bareheaded man*

**başaçıq**[2] *z* bareheaded; ~ **gəzmək** to walk bareheaded

**başaçılmaz** *s* 1. knotty, *(en)* tangled, involved, chaotic; *(həm də məc.)* intricated; ~ **məsələ** knotty / intricated question; ~ **dəlil** entangled / involved argument; ~ **vəziyyət** difficult situation / position; 2. inexplicable, unaccountable; ~ **sirr** inexplicable mystery; ~ **səbəb** unaccountable reason; ~**adam** an unaccountable person

**başagəlməz** *s* 1. unrealizable, intangible; ~ **arzular** unrealizable wishes / desires; ◊ castles in the air; ~ **ümidlər** intangible hopes; 2. fanciful, chimeric *(al)* [kaımerik-(əl)]; ~ **planlar** fanciful / chimeric schemes; ~ **ideyalar** chimerical ideas

**başağacı** *i* wooden stake on the head of the grave

**başağrıdan** *s* 1. *smth.* that causes headache; 2. *məc.* troublesome, tiresome; bothersome; ~ **məsələ** troublesome matter; ~ **problem** troublesome problem; ~ **uşaq** a troublesome / tiresome child; 3. *(adam)* fussy; ~ adam a fussy person / man*

**başağrıdıcı** *s* agonizing, hard, difficult, arduous; ~ **iş** arduous work; ~ **problem** arduous / difficult problem; ~ **tapşırıq** arduous / difficult task

**başağrısı** *i* headache; ~ **ndan əziyyət çəkmək** to suffer from headache*(s)*; **əziyyət verici** ~ splitting / racking headache; ◊ ~ **vermək** to give* / to cause a headache, to trouble *(d.)*, to give* trouble *(to. d.)*

**başaq** *s bax* **sünbül**

**başaqlamaq** *f bax* **sünbülləmək**

**başaltı** *i* 1. *bax.* **balış**; 2. anything used as a pillow

**başaparan** *s* unruly, unbridled; ~ **uşaq** unruly child

**başaparma** *i* unruliness

**baş-ayaq**[1] *i dish made of head and feet of a sheep*

**baş-ayaq**[2] *z* 1. tops to tails; ~ **yatmaq** to sleep* tops to tails; 2. *(tərsinə)* topsy-turvy, upside-down; **işi** ~ **etmək / görmək** to do* things topsy-turvy, to turn *(d.)* topsy-turvy; to put* the cart before the horse *idiom.*

**baş-başa** *z* 1. together, alone with *smb.*; ~ **vermək** to act together / shoulder to shoulder; 2. head to head; ~ **qoymaq** to put* head to head

**baş-beyin** *i d.d.* head; ◊ **baş-beynini aparmaq** to pester *(d. with)*, to bother *(d. with)*, to bore *(d. with)*; to worry *(d.with)*, to plague [pleig] *(d. with)*; *O mənim lap baş-beynimi aparır I'm bored to death with him*; **baş-beyni getmək** to experience unbearable noise / nonsense / talk / dull music

**başbilən**[1] *i* expert *(on)*, connoisseur [ˌkonə'sə:]; **incəsənətin** ~ **i** art connoisseur; **bizim** ~ **imiz** our expert

**başbilən**[2] *s* sensible, sober-minded, judicious; ~ **adam** a sensible person, a man* of sense

**başçı** *i* 1. head; chief; **hökumət** ~ **sı** head of the government; **ailənin** ~ **sı** head of the family; **polis idarəsinin** ~ **sı** the chief of *(the)* police *(department)*; 2. *(bələdçi)* guide; 3. *(quş və heyvan dəstəsində)* leader; ~ **olmaq** *(hökumətdə, ailədə)* to be* head; **dövlət** ~ **sı olmaq** to be* head of the state

**başçılıq** *i* headship, leadership, command; **başçılığı altında** under the leadership *(of)*, under the command *(of)*; ~ **etmək** to head *(d.)*, to be* at the head *(of)*; to lead *(d.)*; **müəssisəyə** ~ **etmək** to be* at the head of the enterprise; **nümayişə** ~ **etmək** to lead the demonstration

**başda** *z* 1. at the beginning, in the beginning; 2. at the head; headed, led by; **sədr** ~ **olmaqla** headed / led by the chairman

**başdan** *z* from the beginning; all over again; afresh; ~ **başlamaq** to start afresh; ~ **sona qədər** from *(the)* beginning to *(the)* end; ◊ **bu** ~ beforehand, in good time, in advance; **bu** ~ **haqqını ödəmək** to pay* in advance; **bu** ~ **hazırlıq görmək** to make* preparation beforehand

**başdan-ayağa** *z* 1. from head to foot, from top to toe; ~ **qədər süzmək** to eye from head to foot *(d.)*, to eye all over *(d.)*; 2. from cover to cover; **kitabı** ~ *(qədər)* **oxumaq** to read* a book from cover to cover

**başdan-başa** *z* 1. completely, entirely *(as)* a whole; **özünü** ~ **elmə həsr etmək** to devote oneself entirely to science; *O özünü başdan-başa elmə həsr etdi He / She devoted himself / herself entirely to science* 2. everywhere; nothing but; ~ **daşlıqdır / güllükdür** stones / flowers everywhere, a mass of stones / flowers, nothing but stones / flowers

**başdansovdu**[1] *s* superficial, shallow, perfunctory; ~ **oxu** superficial reading; ~ **iş** perfunctory piece of work

**başdansovdu**[2] *z* superficially, perfunctorily, in a perfunctory manner

**başdansovma**[1] *s bax* **başdansovdu**

**başdansovma**[2] *z bax* **başdansovdu**

**başdaşı** *i* tombstone, gravestone

**başgicəldici** *s* giddy [gi-], dizzy; ~ **yüksəklik / hündürlük** giddy / dizzy height; ~ **müvəffəqiyyət** dizzy / giddy success

**başgicəlləndirən** *s bax* **başgicəlləndirici**

**başgicəlləndirici** *s bax* **başgicəldici**

**başgicəllənmə** *i* giddiness [gi-], dizziness; *elm.* vertigo; ~ **hiss etmək** to feel* giddy; **müvəffəqiyyətdən** ~ having *one's* head turned with success

**baş-göz** *i* appearance; physiognomy; ~ **ünü düzəltmək / qaydaya salmaq** *d.d.* to tidy *oneself* up, to set* *oneself* to rights

**başıaçıq**[1] *s bax* **başaçıq**[1]

**başıaçıq**[2] *z bax* **başaçıq**[2]

**başıaçıqlıq** *i the state of being bareheaded*



**başıalovlu** *z* with emotion, with agitation; ~ **danışmaq** to speak* in an agitated tone / in agitated tones, to speak * with emotion / with deep feeling

**başıalovluyluq** *i* anxiety, great emotion

**başıaşağı**[1] *s (sakit, təvazökar)* modest, humble, quiet, silent; ~ **adam** a humble / quiet man*

**başıaşağı**[2] *z* downwards; upside-down, topsy-turvy; *O, stakanı başıaşağı çevirdi He turned the glass upside-down*

**başıaşağılıq** *i* modesty; **onun başıaşağılığı** her / his modesty

**başıayaqlılar** *i zool.* cephalopoda

**başıbağlı** *s* 1. closed; sealed up; 2. *(heyvan və s.)* tied up; 3. *(satılmış)* sold up

**başıbağlılıq** *i* 1. *the state of a married man*; 2. *the state of being sold up*

**başıbatmış**[1] *(isim mənasında)* damn

**başıbatmış**[2] *s* cursed, damned

**başıbəlalı**[1] *i* an unlucky / luckless person, an unlucky man*, poor wretch, poor soul, poor devil

**başıbəlalı**[2] *s* unfortunate, ill-fated, ill-starred, luckless; ~ **adam** unfortunate person

**başıbəlalılıq** *i the state of being unhappy / unlucky*

**başıbərk** *s (at)* hard-mouthed

**başıboş**[1] *(isim mənasında)* fool, blockhead, empty-headed person

**başıboş**[2] *s* empty-headed, rattle-brained, feather-brained

**başıboşluq** *i* foolishness, stupidity; ~ **etmək** to act / to behave foolishly, to take* a false step

**başıbütöv** *s* untouched, whole

**başıbütövlük** *i the state of being untouched*

**başıbütün** *s bax* **başıbütöv**

**başıbütünlük** *i bax* **başıbütövlük**

**başıdaşlı**[1] *i bax* **başıbəlalı**[1]

**başıdaşlı**[2] *s bax* **başıbəlalı**[2]

**başıdaşlılıq** *i bax* **başıbəlalılıq**

**başıküllü**[1] *i bax* **bədbəxt**[1]

**başıküllü**[2] *s bax* **bədbəxt**[2]

**başıküllülük** *i bax* **bədbəxtlik**

**başıqapazlı**[1] *i* unfortunate wretch

**başıqapazlı**[2] *s* wretched, unhappy

**başıqapazlılıq** *i* humility; defencelessness

**başıqarlı** *s* snowy; *(i.s.)* covered with snow; ~ **dağlar** mountains with snowy tops, snow-capped mountains

**başıqırxıq** *s* crop headed; ~ **uşaq** a crop headed child

**başılovlu** *z d.d.bax* **başıalovlu**

**başına** *z*; ~ **qalmaq** 1) to be* ownerless, to be* under nobody's care; 2) to be* in great / large quantity *(amount, number)*; ~ **qoymaq / buraxmaq** to leave* *(d.)*, to abandon *(d.)*, to leave* to the mercy of fate *(d.)*

**başıodlu** *i* excited, alarmed

**başıörtülü**[1] *s (i.s.)* covered with kerchief / headgear

**başıörtülü**[2] *z*: *məc*: ~ **danışmaq** to speak hintingly / allusively

**başıpapaqlı** *i d.d.* man*, lad, chap

**başıpozuq** *s* unbridled, ungovernable, uncontrollable, unrestrained

**başıpozuqluq** *i* ungovernability, uncontrollability; lack of restraint

**başısoyuq** *s* indifferent, happy-go-lucky, shiftless, careless; ~ **adam** an indifferent / a careless man*

**başısoyuqluq** *i* carelessness, negligence; **öz işinə / vəzifəsinə** ~ **göstərmək** to neglect *one's* work / duties

**başıuca** *s məc.* proud, proud-spirited; ~ **adam** a proud man*

**başıucalıq** *i* 1. pride; 2. honesty, uprightness

**başıyekə** *s bax* **yekəbaş**

**başıyekəlik** *i bax* **yekəbaşlıq**

**başkəsən**[1] *i (quldur)* cut-throat, bandit, thug; *d.d.* desperado

**başkəsən**[2] *s* cruel [kruəl], unscrupulous, ruthless [ru:-], merciless, savage

**başqa**[1] *i* another person, the other; ~ **ları** other people, others; ~ **ları haqqında fikirləşmək** to think of others; *Qoy başqaları danışsın Let others talk*; **və** ~ **ları** and others; *O, başqalarından ağıllıdır He is cleverer than (any of) the others*; **bu, o və** ~ **ları** this, that and others

**başqa**[2] *s* other; *(başqa bir)* another; *Mənə başqa bir karandaş ver Give me another pencil*

**başqa**[3] *əv* other, *(əlavə bir)* another; ~ **gün** some other day, another day; ~ **vaxt** another time, some other time; **daha bir neçə** ~ **misal** a few other examples; ~ **sözlə** in other words; ~ **tərəfdən** on the other hand; *Bu başqa məsələdir This is another matter*

**başqa**[4] *z*: 1. ~ **cür / sayaq** other than; *Mən başqa cür / sayaq edə bilmədim I could not do other than I did*; 2. otherwise; ~ **cür / sayaq danışmaq** to speak* otherwise; *Mən başqa cür / sayaq edə bilmərəm I can't do otherwise*

**başqa**[5] *qoş* besides; except; **ondan** ~ besides *(that)*; **bundan** ~ besides this; *Bundan başqa mən heç nə istəmirəm I want nothing besides this*; **məndən** ~ except me; *Məndən başqa hamı hazırdır Everyone is ready except me*

**başqa-başqa** *s* different, various; ~ **adamlar** different / various people; ~ **səbəblər** various reasons; *Biz sadəcə olaraq başqa-başqa adamlarıq We are simply different people*

**başqalaşdırmaq** *f bax* **dəyişdirmək**

**başqalaşmaq** *f bax* **dəyişmək**

**başqalıq** *i* change; *Mən hər yerdə başqalıq gördüm I saw changes everywhere*

**başqası**[1] *(isim mə'nasında)* someone, some person, another person

**başqası**[2] *s somebody* else, another; ~ **ının hesabına** at *somebody* else's expense, at the expense of another, on account of *smb.*; ~ **ının kitabı** *somebody* else's book; ◊ ~ **ının işinə burnunu / başını soxmaq** to poke *one's* nose into other people's business / affairs

**başqırd**[1] *i* Bashkir

**başqırd**[2] *s* Bashkir; ~ **dili** Bashkir, the Bashkir language

**başqırdca** *z*: ~ **danışmaq** to speak* Bashkir / the Bashkir language

**baş-qulaq** *i d.d.*, air, appearance; physiognomy; ◊ ~ **aparmaq** 1) to bother *smb.* with long and nonsense talk or playing dull music for a long time; 2) to start shouting, to raise a cry; ◊ **baş-qulağı getmək** to experience / to feel* *smb.'s* long and nonsense talk playing dull music

**başlamaq** *f* to begin * *(d., ger./to inf)*, to start *(d.,ger./to inf)*; to commence *(d., ger./to inf.)*: işə ~ to begin* / to start working / to work; hər şeyi yenidən ~ to begin* all over again, to start afresh / anew; başdan / əvvəldən ~ to begin* at / from the beginning; söhbət ~ to begin* / to start a conversation; vəzifəyə ~ to take* up the duties; vəzifəsini yerinə yetirməyə ~ to enter upon *one's* duties; *Dostum bu kitabı oxumağa başladı My friend began to read/reading this book*; *Qar yağmağa başladı It began / started to snow*

**başlanğıc**[1] *i* 1. beginning; lap ~ dan from the very outset, right from the start; bir şeyin ~ ını qoymaq to start *smth.*, to begin* *smth.*, to commence *smth.*, to initiate *smth.*, to mark the beginning of *smth.*; *Yaxşı başlanğıc işin yarısı deməkdir zərb. məs. A good beginning makes a good ending. A good beginning is half the battle*; 2. *(kitab və s.)* introduction; *(musiqi)* prelude; *(nitq)* preamble; opening / introductory remarks *pl.*

**başlanğıc**[2] *s* introductory; opening ~ fəsil introductory chapter; poemanın ~ sətirləri the opening lines of a poem

**başlanmaq** *f* to begin*, to start; to begin* *(with)*, to start *(with)*; *Mühazirə saat doqquzda başlandı The lecture began at nine*; *Söz A hərfi ilə başlanır The word begins with the letter A*

**başlar-başlamaz** *z* ... had hardly / scarcely begun when ..., ... had no sooner than ...; *(emf. var.)* Hardly / Scarcely had ... begun when .... No sooner had ... begun than...; *Tamaşa başlar-başlamaz biz teatra çatdıq The performance had hardly / scarcely begun when we reached the theatre*; *(emf. var.) Hardly / Scarcely had the performance begun when we reached the theatre; No sooner had the performance begun than we reached the theatre*

**başlatdırmaq** *f bax* **başlatmaq**

**başlatmaq** *f* to ask / to cause *smb.* to begin *(d.)*, to ask / to cause *smb.* to start *(d.)*

**başlı** *s məc.* 1. clever, sensible, brainy; ~ adam clever man*, man* of sense; 2. *(i.s.)* with / having head; ~ mismar nail with head

**başlı-başına** *z* 1. without control; without care; ~ buraxmaq to leave* to the mercy of fate *(d.)*, to take* no care *(of)*, to pay no attention / heed *(to)*; işləri ~ buraxmaq to let* things drift, to leave* things to themselves; 2. without permission, independently, by oneself; ~ hərəkət etmək to act independently

**başlı-başınalıq** *i* anarchy [-ki], tyranny

**başlı-bütünlü** *z* completely, entirely

**başlıca** *s* basic, chief, main, principal, fundamental, primary; ~ qanun basic law; ~ səbəb main reason; ~ problem chief problem; ~ məna primary / main meaning məhsulun ~ növləri principal items of production; sənayenin ~ sahələri main branches of industry; ~ olaraq mainly, chiefly; *Onlar başlıca olaraq balıq yeyirlər They eat chiefly fish*

**başlıq** *i* I 1. *(geyim)* hood [hud], bashlyk; 2. *(kitabda)* title, heading; ~ altında under the title / heading; 3. *(qəzetdə)* headline

**başlıq** *i* II *(qızı ərə verərkən alınan pul)* bride-money

**başlıqlı** *s* 1. *(i.s.)* with hood; 2. titled, headed

**başmaq** *i* I shoe; ağac ~ clog; ◊ iki ayağını bir maşmağa dirəmək *(qoymaq)* to persist *(in)*; *(tamamlıqsız)* to be* stubborn / obstinate; ◊ ~ ları da razı olmaq to agree *(with)* completely / entirely

**başmaq** *i* II *tex.* shoe

**başmaqçı** *i* shoe-maker, cobbler

**başmaqçılıq** *i the profession of a shoe-maker / cobbler*; ~ etmək to be* a shoe maker / cobbler, to work as a shoe-maker / cobbler

**başmaqlı** *i (i.s.)* with / having shoes

**başmaqseyri** *i* stroll, walk, airing; ~ nə çıxmaq to go* for a walk / stroll / airing

**başsağlığı** *i* condolence; ~ vermək to condole with *smb.*, to present *one's* condolences to *smb.*, to offer *smb. one's* condolence, to express *one's* condolences

**başsındıran** *s* puzzling; ~ məsələ puzzling matter / question

**başsız**[1] *s* 1. headless [hed-]; *(rəhbərsiz)* headless; 2. *məc.* brainless, stupid, foolish, silly; ~ adam a brainless / foolish / stupid man*; ~ olmaq to be* headless; *mac.* to be* brainless / harebrained

**başsız**[2] *z* without control / supervision; ~ qoymaq to leave* without control / supervision; ailəni ~ qoymaq to kill / to arrest the head of a family; ~ qalmaq to be* left without control / supervision; *(ailə)* to have* no head of the family

**başsızlıq** *i* 1. headlessness; 2. foolishness, folly, stupidity, muddle-headedness; 3. *məc.* anarchy, the absence of a leader; *(i.s.)* without a leader

**baştutmaz** *s bax* **başagəlməz**

**başüstə** *nid.* O.K, all right

**bataq** *i* swamp, bog, quagmire, marsh

**bataqlamaq** *f* to do* up *(d.)* with clay / mud

**bataqlatdırmaq** *f* to swamp *(d.)*

**bataqlaşma** *fi* swamping, turning into marsh

**bataqlaşmaq** *f* to become* / to get* bogged up, to turn into swamp

**bataqlaşmış** *fs* swamped; ~ göl a swamped lake

**bataqlatmaq** *f* to ask / to cause *smb.* to do up *(d.)* with clay / mud

**bataqlı** *s* swampy, boggy, marshy, muddy; ~ yol muddy road

**bataqlıq**[1] *i* bog, morass, swamp, marsh, quagmire; *mac.* mire, slough; torf bataqlığı peat-bog

**bataqlıq**[2] *s* 1. boggy, marshy, swampy; ~ torpaq swampy soil; ~ yer fen, marshland; 2. marsh; ~ qazı marsh gas; ~ quşu wader, wading bird; ~ qızdırması marsh fever

**bataqlıqlanmaq** *f bax* **bataqlıqlaşmaq**

**bataqlıqlaşmaq** *f* to turn into swamp / mud

**batalyon**[1] *i* battalion; atıcı ~ u infant battalion; rabitə ~ u signal battalion; istehkamçı ~ field engineer battalion

**batalyon**[2] *s* battalion; ~ komandiri battalion commander

**batareya** *i* 1. *hərb.* battery; 2. *el.* battery; quru dry battery; 3. *(istilik)* radiator



**batdaq** *i d.d.* 1. dirt, mud; filth; ~ sıçratmaq to splash with mud; 2. clay; 3. *tik.* grout; *(building)* mortar; clay mortar

**batıq**[1] *i* 1. hollow, cavity; *(yerdə)* depression; 2. *(yanaqda və s.)* dimple

**batıq**[2] *s* 1. sunken; ~ göz sunken eyes; concave; ~ güzgü a concave mirror; 2. hoarse; ~ səs hoarse voice; ~ səslə danışmaq to speak* in a hoarse voice, to speak* hoarsely

**batıqlıq** *i* 1. *the state of being sunken / concave*; 2. hoarseness, harshness

**batırılmaq** *f* 1. *(gəmi)* to cause to be* sunk; 2. *(çirkləndirilmək)* to be* stained / dirtied; 3. *(boğulmaq)* to be drowned; 4. *(məhv edilmək)* to be* destroyed / ruined; 5. *(korlanmaq)* to be* spoiled; 6. *(adam və s.)* to cause to be drowned

**batırmaq** *f* 1. *(gəmini)* to sink *(d.)*; gəmi ~ to sink* a ship; 2. to dip *(d. in, into)*; qələmi mürəkkəbə ~ to dip a pen in / into the ink; 3. *(çirkləndirmək)* to dirty *(d.)*, to soil *(d.)*; əlini ~ to dirty *one's* hand; paltarını ~ to soil *one's* clothes; 4. *(heyvanı, insanı və s.)* to drown *(d.)*; uşağı ~ to drown a child; 5. *(xəncəri, bıçağı və s.)* to thrust* *(d. into)*; xəncəri bir kəsin kürəyinə ~ to thrust* a dagger into *smb.'s.* back, to stab *smb.*; 6. *(məhv etmək)* to ruin *(d.)*, to destroy *(d.)*; *məc.* to crush *(d.)*; *Yanğın hər şeyi batırdı The fire has destroyed everything*; 7. *(nəcis ifraz etmək) tab.* to shit, to have* a shit: to defecate; to foul, to make* foul

**batırtmaq** *f* to ask / to cause *smb.* to drown *(d.)* / *(gəmini)* to sink *(d.)*

**batist**[1] *i* cambric [keim-]

**batist**[2] cambric; ~ kofta cambric blouse

**batma** *fi* 1. *(göy cisimləri)* setting; *(günəş)* sunset; *(ay)* moonset; 2. *məc.* decline; 3. *(gəmi)* sinking, settling *(down)*; *(sualtı qayıq)* dive, diving; 4. *(adam, heyvan və s.)* drowning

**batmaq** *f* 1. *(adam və heyvan)* to drown; *məc.* to be* lost; 2. *(gəmi və s.)* to sink*, to go* down; qara ~ to sink* in the snow; işin içində ~ to be* up to *one's* ears in work, to be* lost in *one's* work, to be* over head and ears in work; 3. *(günəş)* to set; *Günəş batır The sun is setting*; 4. *(ölmək, məhv olmaq)* to die, to be lost, to be killed; to perish; *Mən batdım! I'm lost! I'm done for! I'm a lost man. It's all over with me!* 5. *(havayı getmək/keçmək)* to be* wasted, to come* to nothing; to go* to waste; *Mənim bütün günüm batdı; I've wasted the whole day*; *Bizim cəhdimiz batmaz Our efforts won't be wasted*; *Onun bütün cəhdi batdı All his efforts went for nothing*; 6. *(palçığa)* to stick*, to sink*; palçığa ~ to stick*/ to sink* in the mud; 7. *(səs)* to become* hoarse; 8. *(gücü çatmaq)* to overpower *(d.)*, to overcome* *(d.)*; düşmənə bata bilmək to overcome* the enemy; 9. *(üst-başı)* to soil *oneself*, to make* *oneself* dirty; 10. adı ~ to be* defamed; to die; 11. qulağı ~ to go* / to grow* / to become* deaf; *Siz harada batmısınız?! Where (on earth) have you been?!*

**batman** *i* batman *(a measure of weight equal to 5 kgs.)* ◊ *Ağır otur, batman gəl zərb məs.* ≅ *Act / Behave seriously, Behave tactfully*

**batmaz** *s* unsinkable

**batmış** *I* I *d.d.* accursed, damned

**batmış** *s* II sunken, hollow; ~ gözlər sunken / hollow eyes

**bay** *nid* o!; oh! [ou]; bay-bay! oh, dear!

**bayağı**[1] *s* 1. shallow, petty; ~ adam shallow person; ~ hərəkətlər petty acts; 2. banal [-na:l]; ~ irad banal remark; 3. cheap; ~ ədəbiyyat cheap literature

**bayağı**[2] *z*: ~ danışmaq to utter banalities, to talk commonplace

**bayağılaşdırılmaq** *f* to be* / to get* vulgar, to become* banal

**bayağılaşdırılmış** *fs* perverted, unnatural, vulgarized; ~ təsəvvürlər perverted notions; ~ nəzəriyyə perverted theory

**bayağılaşdırmaq** *f* 1. to simplify *(d.)*; 2. to vulgarize *(d.)*, to debase *(d.)*, to banalize *(d.)*

**bayağılaşmaq** *f* to become* vulgar/ banal

**bayağılıq** *i* banality, commonplaceness; *Bu nə bayağılıqdır! How petty!*

**bayaq** *z* a minute ago, not long ago, some minutes before

**bayaqdan** *z* long ago, for a long time; *Mən bayaqdan gəlmişəm I came long ago*; *Bayaqdan belə de də It's high time to say so*; *Mən sizi bayaqdan gözləyirəm I've been waiting for you for a long time*

**bayaqkı** *s* recent; ~ söhbət recent talk

**bayan** *i* bayan *(a kind of accordion)*

**bayançalan** *i* bayan-player

**bayançılıq** *i the profession of a bayan-player*

**bayanist** *i bax* **bayançalan**

**bayat** *s* stale, not fresh; ~ çörək stale bread

**bayatı** *i* bayati *(a kind of Azerbaijani poem created by common people)*; ~ demək to tell bayaties

**bayatımaq** *f* to become* / to get* stale

**bayatlaşmaq** *f bax* **bayatımaq**

**bayatlıq** *i* staleness

**bayaz** *s bax* **bəyaz**

**baybak** *i zool.* steppe marmot

**bay-bay** *nid (an interjection expressing sorrow, grief)* oh, dear!

**baydarka** *i* kayak

**bayğın** *s* faint, unconscious; *tib.* syncope

**bayğın-bayğın** *z* faintly, unconsciously

**bayğınlıq** *i* faintness, unconsciousness, fit, faint, swoon; *tib.* syncope

**bayıl** *i* enclosure; *(balacası)* pen; *(davar üçün)* sheep-pen, sheep-fold

**bayıldıcı** *s* intoxicating; heady; *məc.* fascinating, charming

**bayılma** *fi* fainting, fit, swoon; syncope/-pi/

**bayılmaq** *f* to faint; to swoon; to fall* down in a faint; istidən ~ to faint from the heat; acından ~ to faint with hunger; *0, bayıldı She fell down in a faint*; qorxudan ~ to be* struck with fear / horror

**bayıltmaq** *f* to cause *s.o* to faint / to fall* in a faint

**bayır**[1] *i* outside; outdoors; ~ a çıxmaq to go* out(side); ~ dan from outside; *Bayırda soyuqdur It's cold outdoors / outside*

**bayır²** *s* outside; ~ işi outside work; ~ diametri outside diameter; ~ örtük an outside covering / wrapping

**bayqu** *i arx. bax.* **bayquş**

**bayquş** *i* 1. *zool.* owl [aul]; qulaqlı ~ long-eared owl, horned owl; 2. *məc.* a person / a child* who is always crying / weeping; ~ kimi like / as an owl

**bayquşaoxşar** *s* like an owl, owl-like

**bayquşvarı** *s bax* **bayquşaoxşar**

**bayraq** *i* flag; *(böyük)* banner; *(rəsmi)* colours; *(mərasimlərdə istifadə edilən)* standard; ~ qaldırmaq to hoist / to raise banner / flag; qiyam bayrağı qaldırmaq to raise the standard of revolt; ~ altında under the banner; dövlət bayrağı State / National flag; ağ ~ qaldırmaq *məc.* to capitulate; *məc.* to give* in

**bayraqçı** *i bax* **bayraqdar**

**bayraqdar** *i (həm müst. həm də məc.)* standard-bearer

**bayraqdarlıq** *i* 1. duty of a standard-bearer; 2. leadership

**bayraqdaşıyan** *i bax* **bayraqdar**

**bayraqlı** *s (i.s.)* with a flag / a banner

**bayram¹** *i* 1. holiday; festival; milli ~ national holiday / festival; 2. *(şənlik)* celebration , entertainment, festivity; ailə ~ı family celebration; ◊ *Bizim də küçədə bayram olacaq at. söz.* ≅ *We shall have our day. Our day will come*; *Bayramınız mübarək (I wish you)* many happy returns of the day

**bayram²** *s* festival; ~ konserti festival concert; ~ paltarı festival dress / attire

**bayramağzı** *s bax* **bayramqabağı**

**bayramqabağı** *i* holiday eve; holiday; ~ əhval-ruhiyyə holiday mood; ~ ticarət holiday trade

**bayramlıq** *i* 1. *things for holiday*; 2. *present of the fiance for fiancee on the eve of holiday*

**bayramsayağı** *z* festively, holiday-like; ~ bəzənmək 1) to be* decorated festively; 2) *(geyinmək)* to dress up, to smarten *(oneself)* up, to array *oneself (as)*

**bayronizm** *i ədəb.* Byronizm

**baytar¹** *i* 1. veterinary, veterinarian, *(qısa forması)* vet; 2. *(pis həkim)* quack *(doctor)*

**baytar²** *s* veterinary; ~ məntəqəsi veterinary station; ~ müalicəxanası veterinary surgery / clinic; ~ həkimi veterinary surgeon

**baytarlıq¹** *i* 1. *the profession of veterinary*; 2. veterinary science / medicine

**baytarlıq²** *s* veterinary; ~ məntəqəsi veterinary station; ~ institutu veterinary college

**baz** - *a word-building suffix added to the end of words meaning that the person spoken about is found of smth.*, such as **gülbaz** rose-fancier, **quşbaz** bird-fancier

**baza** *i* base; basis *(pl.-es)*; source; hərbi ~ military base; iqtisadi ~ economic basis; xammal ~ sı source of raw materials; raw material base; yem ~ sı forage reserve; enerji ~ sı source of power *(supply)*; power base; hərbi hava qüvvələri ~ sı air base; hərbi dəniz qüvvələri ~ sı naval base; raket ~ sı rocket base; təminat ~ sı supply base; maddi ~ material resources; turist ~ sı tourist camp

**bazar¹** *i* I market; *(şərqdə)* bazaar; *məc.* bear-garden; örtülü ~ covered market; daxili ~ home market; xarici ~ foreign market; ümumi ~ common market; ~ a gəlmək 1) to come* to (the) market; 2) *mal.* ~ to come* into the market; ~ açmaq 1) to start / to begin* to sell *smth.*; 2) *məc.* to make* / to create an uproar; *Buranı bazara döndərməyin. Don't turn the place into a bear-garden*

**bazar²** *s* market; ~ günü market day *(həftənin günü)* Sunday; ~ meydanı market square; ~ qiyməti market price; ~ qiymətinə at the market price; ~ qiymətindən yuxarı / aşağı above / low market price; ticarəti marketing

**bazar¹** *i* II *(həftənin axırıncı günü)* Sunday

**bazar²** *s* Sunday; ~ ertəsi Monday; ~ axşamı Sunday night

**bazarı** *s* 1. common, plain, cheap; 2. *(i.s.)* made for sale

**bazarlıq** *i* 1. *(hərəkət)* buying, purchasing; 2. *(alınmış şeylər)* purchase; bazarlığa getmək to go* shopping; ~ etmək to do* shopping, to make* some purchases

**bazburud** *i* stately / imposing / impressive appearance

**bazburudlanmaq** *f* to become* / to grow* handsome / good-looking

**bazburudlu** *s* handsome, good-looking; *(i.s.)* of an attractive appearance; *(qadın)* strong-looking; ~ kişi a man* of handsome presence, an impressive man, a man of imposing appearance

**bazburudluluq** *i the state of being handsome / good-looking*

**bazı** *i* 1. embankment; 2. watershed

**bazirqan** *i bax* **tacir**

**bazırqanbaşı** *i arx. bax* **tacirbaşı**

**bazis** *i* basis *(pl.-es)* ~ və üstqurum material basis and the ideological superstructure

**bazu¹** *i anat.* upper arm, humerus

**bazu²** *s anat.* humeral; ~ sümüyü humerus *(pl.-ri)*

**bazubənd** *i* bracelet, bangle

**becərilmə** *fi* 1. working, cultivation, tilling; torpağın ~ si working/cultivation / tilling of the land; *(bağı)* garden-making; *(bitkini)* growing; 2. *(heyvanı)* breeding, rearing

**becərilmək** *f* 1. *(torpaq)* to be* cultivated / tilled; 2. (heyvan) to be* bred / reared

**becərmə** *fi* cultivation, tilling; birinci, ikinci və s. ~ the first, the second, etc. cultivation / tilling

**becərmək** *f* 1) *(torpağı)* to cultivate *(d.)*, to till *(d.)*; 2. *(bitkini)* to grow *(d.)*; 3. *(heyvanı)* to breed *(d.)*

**becərtmək** *f* 1. *(torpağı)* to ask / to cause *smb.* to cultivate *(d.)*, to ask / to cause *smb.* to till *(d.)*; 2. (bitkini) to ask / to cause *smb.* to grow *(d.)*; *(heyvanı)* to ask / to cause *s.o.* to breed *(d.)*

**becid** *z bax* **tez**

**beçə** *i* 1. cockerel, young cock; 2. *(arı)* young swarm of bees; 3. *bot.* shoot, sprout [spraut]; ~ vermək 1) *(arı)* to swarm [swɔ:m]; 2) *bot.* to sprout [spraut], to shoot*, to put* out shoots;

**beçələmək** *f* 1. *(arı)* to swarm [swɔ:m]; 2. *bot.* to sprout [spraut], to shoot*, to put* out shoots

**beçəvermə** *i* 1. *zool.* *(arı)* swarming; ~ dövrü the period of swarming; 2. *bot.* sprouting, shooting



**begemot** *i zool.* hippopotamus

**beh** *i* deposit , advance; earnest *(money)*; ~ vermək to deposit, to leave a deposit; ~ almaq to receive a deposit

**behbazar** *i bax* **dəyanət**

**behbud** *i* Finnish knife, sheathknife

**behbudlamaq** *f* to stab *(d.)* with a Finnish knife

**behbudlaşmaq** *f* to stab each other with a Finnish knife

**behişt** *i bax* **cənnət**

**behiştlik** *i* a man* / a person deserving to go to the paradise, a man* / a person worthy of going to the paradise

**behiştlik** *s* sinless; ~ adam a sinless man* / person

**behləmək** *f* to deposit *(d.)*, to leave* deposit

**behlənmək** *f* to be* deposited, to be* sold on part-payment

**behləşmək** *f* to strike* a bargain leaving a deposit

**behli** *s* sold on part-payment

**bekar** *i mus.* natural

**bekon** *i* bacon *(az duzlanmış və hisləndilmiş donuz budu)*

**bel¹** *i* I 1. waist; incə ~ slender waist; bir kəsin ~ ini qucmaq to put* *one's* arms round *smb.'s* waist; 2. *anat.* spine, backbone, vertebral column; 3. back; ~ ini əymək to bend* *one's* back; ~ ində on *one's* back; ~ ində daşımaq to carry *smth.* on *one's* back; ~ ini düzəltmədən işləmək to put* *one's* back into *one's* work, to work hard and continually; ~ ini sındırmaq / qırmaq 1) to break* *one's* backbone; 2) *məc.* to cause heavy damage to *smb.*, to give* a great trouble to *smb.*, to make* *smb.* unhappy / unfortunate; ~ bağlamaq to rely *(on)*, to believe *(d.)*; bir kəsə ~ bağlamaq to rely on *smb.*, to trust *smb.*, to pin / to set *one's* hopes on *smb.* ~ i bükülmək to grow* old; ~ ini çəkmək to gird* *oneself* more tightly, to tighten *one's* belt

**bel ²** *s* spinal, dorsal; ~ üzgəci *(balıqda)* dorsal fin; ~ sütunu spinal column, backbone spine; ~ sümüyü backbone

**bel** *i* II *(alət)* spade

**belbağı** *i* sash; girdle

**belçika** *s* Belgian

**belçikalı** *i* Belgian

**beletaj** *i* 1. *(ikinci mərtəbə)* first floor; 2. *(teatrda)*dress circle

**belə¹** *əv* such; *(sifətdən əvvəl)* so; ~ adam such a man*, *d.d.* a man* such as that; a man* like that; ~ kitablar such books, books such as these; ~ maraqlı film so interesting a film, such an interesting film; ~ dərin fikirlər such profound thoughts, thoughts so profound; ~ çiçəklər / güllər that sort of flowers, flowers like these; *Siz həmişə beləsiniz You are always the same; You haven't changed*; ~ halda in that case, if that is so

**belə²** *z* so; thus, like this/that; *Bütün həftə belə keçdi The whole week passed thus / like that*; *Qoy belə qalsın Let it remain as it is*; *Çölə belə çıxmaq olmaz You can't go out this way*; *O belə cavab verdi He answered like this / as following. This is the answer he gave*; *Məgər belədirmi? Is that so? Is that (really) the case?*; *Bundan belə from today; From this time on*

**belə³** *əd* even; hətta ~ even if; *O, qulaq asmaq belə istəmirdi He didn't want even to listen*; *Sən məni dəvət etsən belə mən gəlməzdim Even if you invited me, I shouldn't come*

**belə-belə¹** *s* such, like this; ~ adamlar such people, people like these; such kind of people; *Belə-belə işlər Such are the things*

**belə-belə²** *z* so, like this; in this way; ~ olmuş so-and-so; *Biz hamımız bilirik o belə-belə olmuş nə deyəcək We all know what so-and-so will say*

**beləcə** *z* so, thus, in this way, likewise; *Beləcə dayan Stand just so*; bax ~ as thus; *İllər beləcə keçdi Years passed in this way*

**belədən-belə** *z d.d.* hither and thither, from here to there

**beləliklə** *ara s.* in such a way, so, thus; *Beləliklə, məsələ həll olundu So the question was settled*

**beləsi** *əv* the like; *Mən beləsini görməmişəm I haven't seen the like*

**beliboş** *s* impotent; ~ kişi an impotent man*

**beliboşluq** *i* impotence

**belibükük** *s* bent-shouldered

**belibükülük** *i the state of being hunched / bent - shouldered*

**beliəyri** *s* hunched, bent, crooked

**beliəyrilik** *i the state of being hunched*

**belil** *i (boya)* white-wash, whiting

**belletrist** *i* fiction writer, novelist

**belletristik** *s* fictional; aya səyahət haqqında ~ hekayə a fictional account of a journey to the moon

**belletristika** *i* fiction

**belləmək** *f* to spade *(d.)*; bağ ~ to spade a garden

**bellənmək** *f* to be* spaded

**belletdirmək** *f bax* **belletmək**

**belletmək** *f* to ask / to cause *smb.* to spade *(d.)*; bağı ~ to ask / to cause *smb.* to spade the garden, to have* the garden spaded

**belorus¹** *i* Byelorussian

**belorus²** *s* Byelorussian; ~ dili Byelorussian, the Byelorussian language

**belorusca** *z* Byelorussian; ~ danışmaq to speak* Byelorussian

**benefis** *i teatr.* benefit performance

**benuar** *i teat.* lower boxes *pl.*

**benzin¹** *i* benzine [-'zi:n]; *(avtomobil üçün)* petrol; *amer.* gasoline, gasolene, gas

**benzin²** *s* petrol, gasoline; ~ bakı petrol tank; *amer.* gasoline tank; ~ mühərriki gasoline engine , gas-motor; ~ doldurulan məntəqə petrol / filling station; *amer.* gasoline station

**benzindaşıyan** *i (avtomobil)* gasoline tanker, tank truck

**benzinölçən** *i* petrol gauge; *amer.* gasoline-gauge

**benzintökən** *i* 1. *(xüsusi avtomobil)* petrol tanker, fuelling lorry; 2. refueller

**benzol** *i kim.* benzol

**berdanka** *i (tüfəng növü)* Berdan rifle

**beret** *i* beret ['bereı]

**beretli** *s (i.s.)* with a beret on, *(i.s.)* wearing a beret

**berkut** *i zool.* golden eagle
**beş** *sy.* five; ~ kitab five books; ~ uşaq five children; ~ yaşlı uşaq a child of five, five - year - old child; ~ ay müddətində within / during five months *(time)*
**beşadamlıq** *s (i.s.)* for five persons
**beşaçılan** *i* rifle having five charges
**beşatan** *i bax* **beşaçılan**
**beşatılan** *i bax* **beşaçılan**
**beşaylıq** *s* 1. *(müddət)* of five months; lasting five months; five-month; ~ müddətdə in five months *(time)*; within five months *(time)*; 2. *(yaş)* five-month -old; ~ uşaq a five month-old-child
**beşballı** *s*: ~ sistem *(təhsildə)* five-mark grading system
**beşbarmaq** *i* knuckle-duster; *amer.* brass knuckles
**beşbarmaqlı** *s* five fingered; *(i.s.)* having five fingers
**beşbaşlı** *s* five-domed; five-headed
**beş-beş** *z* in fives; *İçəri beş-beş gəlin Come in in fives*
**beşbetər** *s* much, far, much/far worse; *Sən məndən beşbetərsən You are much/far worse than me*
**beşbir** *z* in fives; ~ gəzmək to walk in fives
**beşbölgülü** *s (şer)* pentameter
**beşbucaq** *i riyaz.* pentagon
**beşbucaqlı** *s* five-cornered, pentagonal; five-pointed; ~ ulduz five-pointed star
**beşcə** *əd* only five, just five
**beşcərgəli** *s* five-row
**beşcildli** *s* five-volume
**beşcildlik** *i* edition in five volumes; five-volume edition
**beşdəqiqəlik** *s (i.s.)* of five minutes; five-minute; ~ tənəffüs a break / an interval of five minutes, five-minute break / interval
**beşəlli** *z*: ~ tutmaq / yapışmaq to grasp greedily *(d.)*
**beşfaizli** *s* five-per cent
**beşgöz** *s bax* **beşgözlü**
**beşgözlü** *s*: ~ mənzil five-room flat
**beşguşə** *i bax* **beşkünc**[1]
**beşguşəli** *s bax* **beşkünc**[2]
**beşgünlük**[1] *i* five-day week
**beşgünlük**[2] *s (i.s.)* of five days; five-day; ~ istirahət a rest of five days; five-day rest; ~ müddətdə in / within five days
**beşhecalı** *s dilç.* pentasyllabic; ~ söz pentasyllable
**beşhəftəlik** *s* five-week; five-week old
**beşik**[1] *i* cradle [kreidl]; ◊ ~ dən qəbrə qədər from the cradle to the grave; *Yunanıstan qərb mədəniyyətinin beşiyi olmuşdur Greece was the cradle of western civilization*
**beşik**[2] *s* cradle; ~ mahnısı *(layla)* lullaby
**beşillik**[1] *i* 1. fifth anniversary; 2. *(plan)* five-year plan; beşilliyi dörd ildə yerinə yetirmək to complete / to filfil a five-year plan in four years; zavodun beşilliyi the fifth anniversary of the plant
**beşillik**[2] *s* 1. *(müddət) (i.s.)* of five years; five-year; ~ plan five-year plan; 2. *(yaş)(i.s)* of five; five-year-old; ~ at five-year-old horse
**beşinci** *sy* (the) fifth; ~ cərgə the fifth row; ~ dəfə the fifth time; ~ səhifə / fəsil page / chapter five; ~ otaq room five; ~ dərs the fifth lesson, lesson five
**beşkiloqramlıq** *s* five-kilogramme; *(i.s.)* of five kilogrammes; ~ qarpız five-kilogramme water-melon, a watermelon of five kilogrammes
**beşkünc**[1] pentagonal
**beşkünc**[2] *s* pentagonal, five-pointed; ~ ulduz five-pointed star
**beşkünclü** *s bax* **beşkunc**[2]
**beşqat** *s* fivefold; quantuple
**beşqatlı** *s bax* **beşqat**
**beşqəpiklik**[1] *i* five-copeck coin
**beşqəpiklik**[2] *s (i.s.)* worth five copecks / kopecks; worth nothing; ~ marka a stamp worth five copecks; *O, beşqəpiklik adam deyil He is a man worth nothing*
**beşlampalı** *s* five-lamp; ~ çılçıraq five-lamp chandelier
**beşlik** *i* 1. *(pul)* five-manat note; 2. *(qumarda)* five; ~ kozır five of trumps; xaç ~ the five of cross
**beşmanatlıq** *i* five-manat note
**beşmetrlik** *s* five-metre; *(i.s.)* of five metres
**beşmərtəbə**[1] *i* five-storey house / building
**beşmərtəbə**[2] *s bax* **beşmərtəbəli**
**beşmərtəbəli** *s* five-storey; ~ bina five-storey building
**beşmininci** *sy* five thousandth
**beşnövçü** *i id.* pentathlonist, pentathlete
**beşnövçülük** *i id.* pentathion; müasir ~ modern pentathion
**beşotaqlı** *s* five-room; ~ mənzil five-room flat
**beşpərdəli** *s* five-act; ~ dram five-act play
**beşrəqəmli** *s* five-digit number
**beşsaatlıq** *s* five-hour; *(i.s.)* of five hours
**beşsimli** *s* five-stringed
**beşsinifli** *s* five-class; ~ məktəb five-class school
**beşsütunlu** *s* five-column, five-pillar; ~ zal five-column hall
**beştərəfli** *s* five-side
**beştonluq** *s* five-ton; ~ yük maşını five-ton lorry/truck
**beşulduzlu** *s* five-star, *(i.s.)* having five stars, *(i.s.)* with five stars
**beşüzlü** *s riyaz.* pentahedral; ~ cisim pentahedron
**beşverstlik** *i* five-verst, of five versts; ~ məsafə five-verst distance, a distance of five versts
**beşyaşar** *s* five-year-old; ~ at five-year-old horse
**beşyaşlı** *s* five-year-old; *(i.s.)* of five years; ~ uşaq five-year-old child, a child of five
**beşyerli** *s* five-seater; ~ avtomobil ~ five seater
**beşyüzlük** *i* five-hundred-manat
**beşyüzüncü** *sy* five-hundredth; ~ səhifə page five hundred; ~ ildönümü five-hundredth anniversary
**beta** *i (yunan əlifbasının ikinci hərfi)* beta
**beta-hissəcik** *i fiz.* beta particle
**beta-şüalar** *i fiz.*beta rays
**betər**[1] *s* more than, worse than; bundan ~ *(çox)* more than this; worse than this; ölümdən ~ worse than death; hər şeydən ~ worst of all; *O, qardaşından betərdir (pisdir) He's worse than his brother; Bundan betər ola bilməz Worse cannot be/happen*
**betər**[2] *z* worse; more; ~ incitmək* to hurt more / worse; daha ~ olmaq to go* from bad to worse; *İşlər*



*daha betər ola bilər Things may go from bad to worse*
**betərləşmək** *f* to become*/to grow* worse
**beton**[1] *i* concrete; ~ tökmək to concrete
**beton**[2] *s* concrete; ~ divar concrete wall
**betonçu** *i* concrete worker
**betonçuluq** *i the job of a concrete worker*
**betondaşıyan** *s*: ~ maşın concrete-delivery truck
**betonqarışdıran** *i* concrete mixer
**betonlamaq** *f* to concrete *(d.)*
**betonlanmaq** *f* to be* concreted
**betonlaşdırmaq** *f* to concrete *(d.)*
**betonlaşmaq** *f* to become*/ to get* concreted; to become* solid / firm
**betonlatdırmaq** *f bax* **betonlatmaq**
**betonlatmaq** *f* to ask / to cause *smb.* to concrete *(d.)*
**betonlu** *s* concrete; ~ istehkam *(hərbi)* concrete blockhouse
**beybut** *i d.d. bax* **behbud**
**beyət** *i* obedience, belief, trust; ~ etmək to obey, to believe, to trust
**beyin**[1] *i* 1. brain; baş ~ brain; onurğa ~ i spinal cord; *elm.* cerebrum; beyninə qan sızma haemorrhage of the brain; uzunsov ~ medulla *(oblongata)*; beyninə iz buraxmaq to make* / to produce a great impression *(on, upon)*; ◊ beyni qanlı ≅ hot-tempered, hothead; young; beynində qalmaq to remember once and for all; qan beyninə vurmaq to get very angry, to fly* into a rage; *Qan beynimə vurdu Blood rushed to my head*; ◊ beyninə düşmək to have* *smth.* on the brain; beyninə yeritmək to din / to ram *smth.* into *smb.'s* brain / ears / head; beyninə batmaq to become* clear, to realize *(d.)*, to believe *(d.)*; beynini yemək *(yoldan çıxarmaq)* to lead astray *(d.)*; beynini tökmək / aparmaq to speak* loudly and nonsense, to bother *smb.* by *one's* chattering, to disturb / to annoy *smb.*constantly; 2. *(xörək)* brains
**beyin**[2] *s anat.* cerebral; brain; ~ xəstəliyi disease of the brain, cerebral disease; ~ şişi brain growth; ~ qırışıqları brain convolution
**beyincik** *i anat.* cerebellum *(pl. -lums/-la)*
**beyinəbənzər** *s* brain-shaped; brain-like
**beyinli** *s* 1. *(i.s.)* having brain; 2. *məc.* brainy, clever, sensible
**beyinsiz** *s* brainless, stupid, foolish, silly, muddle-headed
**beyinsizlik** *i* brainlessness, foolishness, stupidity
**beyqafıl** *z d.d.* suddenly, all of a sudden; unexpectedly
**beynəlxalq** *s* international; ~ Qadınlar günü International Women's Day; ~ hüquq international law; ~ Gənclər günü International Youth Day; ~ əlaqələr / münasibətlər international relations; ~ vəziyyət international situation
**beynəlmiləl**[1] *i* 1. International; 2.*(himn)* the Internationale
**beynəlmiləl**[2] *s* international; ~ hüquq international law
**beynəlmiləlçi**[1] *i* internationalist
**beynəlmiləlçi**[2] *s* internationalist
**beynəlmiləlçilik** *i* internationalism
**beynəlmiləlləşdirmə** *fi* internationalization
**beynəlmiləlləşdirilmək** *f* to be* internationalized
**beynəlmiləlləşdirmək** *f* to internationalize *(d.)*
**beyniboş** *s d.d.* empty-headed, rattle-brained, feather-brained
**beyniboşluq** *f* muddle-headedness, stupidity
**beysbol** *i id.* baseball
**beysbolçu** *i* baseball player
**beyt** *i ədəb.* couplet [ˈkʌplit], distich [ˈdistik]
**beytləşmək** *f* to compete in couplets
**bez** *i toxuc.* coarse calico; ◊ bir ~ in qırağı olmaq ≅ to be alike completely, to have* the same similarities
**bezar** *s* very / too tired, completely exhausted, tired out; ~ etmək to tire out *(d.)*, to exhaust completely *(d.)*, to bore to death *(d.)*; *Siz məni bezara gətirmisiniz You have completely exhausted me, You have bored me to death*; ~ olmaq to get* / to become* completely exhausted, to be* tired out / exhausted
**bezarlamaq** *f* to feel* *smth.* as a burden, to feel* boredom/tedium
**bezarlanmaq** *f* to be* tired out, to be exhausted; to be* worried to death
**bezarlaşmaq** *f bax* **bezarlanmaq**
**bezarlıq** *i the state of a man who is in dire straits*
**bezdirici** *s* bothersome, tiresome, boring, bothering; ~ adamlar bothersome people; ~ uşaq a tiresome child; ~ adam a bore; *Sən nə bezdirici adamsan! What a bore you are!*
**bezdiricilik** *i* tedium, tediousness, importunity
**bezdirmək** *s* to pester *(d. with)*, to bother *(d. with)*, to bore *(d. with)*, to plague *(d. with)*; *O məni lap bezdirib I'm bored to death with him/her; Belə axmaq suallarla siz bütün günü məni bezdirmisiniz You've been plaguing me with such silly questions all day long*
**bezikdirici** *s bax* **bezdirici**
**bezikdiricilik** *i bax* **bezdiricilik**
**bezikdirmək** *f bax* **bezdirmək**
**bezikmək** *f bax* **bezmək**
**bezmək** *f* to feel* *smth.* as burden, to be* oppressed *(by)*; to become* loathsome / repulsive, to feel* aversion/ disgust; təklikdən ~ to be* oppressed by *one's* loneliness; bir kəsdən / şeydən ~ to be* sick of *smb./smth*; *Mən ondan bezmişəm I'm bored with him/her, I'm sick of him/her*
**bezmiş** *s* sated, satiated
**bəbə** *i* suckling, baby
**bəbək** *i* apple *(of the eye)*; ◊ göz bəbəyi kimi qorumaq to cherish *(d.)* as the apple of *one's* eye
**bəbir**[1] *i zool.* leopard [lep-]. *(dişisi)* she-leopard, leopardess
**bəbir**[2] *s* leopard; ~ dərisi leopard skin; ~ balası leopard cub
**bəd**[1] *s* bad, nasty, evil; ~ əməl bad action; evil deeds; ~ adam evil man*; ~ əlamət evil sign; ~ fikirlər evil thought; ~ hava bad / nasty weather; ◊ ~ ayaqda if the worst comes to the worst, at *(the)* worst; ~ xasiyyət bad* temper; ~ xasiyyət adam a bad / wicked man*

**cəld**[1] *s* fast, quick, rapid; energetic; prompt; swift; brisk, lively, nimble, agile, speedy; expeditious; *(zirəng, zəkalı)* bright, smart; ~ **qaçan** a fast runner; ~ *(qaçan)* at a fast horse; ~ **fəhlə** a quick worker; ~ **adam** a quick / fast / nimble / prompt / brisk man* / person; ~ **olmaq** to be* prompt / fast / quick/ swift / brisk / rapid *(+ to inf.)*; **ayaqdan** ~ swift-footed, nimble *(-footed)*; **bir işdə** ~ **olmaq** to be* swift in *smth.*; *d.d.* to be* clever at *smth.*; ~ **qoca** *(kişi)* a brisk / rapid old man; ~ **cavab** quick reply, swift response; *Onun cəld cavab verməsi hamını təəccübləndirdi His / Her quick reply surprised everyone*; ~ **yeriş** *(dördayaq-at yerişi)* smart walk *(gallop)*; brisk walk; ~ **akrobat** *(canbaz)* an agile / brisk / nimble acrobat; ~ *(diribaş)* **uşaq** smart / bright child; **keçi kimi** ~ as nimble as a goat, very nimble; ~ **hərəkət(lər)** nimble / swift movements; Cəld ol! Be quick!; ~ **addımlar** quick steps

**cəld**[2] *z* fast, quick(ly); rapidly; promptly; swift(ly); speedily; nimble; ~ **qaçmaq / getmək** to run* / to go* fast; ~ **danışmaq** to speak* fast; *Belə cəld danışmayın! Don't speak so fast!* ~ **işləmək** to work quickly; ~ **cavab vermək** to give* a prompt / quick answer; *Siz çox cəld gedirsiniz You are going too fast*

**cəldlik** *i* quickness, promptness, swiftness; agility, dexterity; *amer.* vim, pep; nimbleness, briskness; *Xokkey cəldlik tələb edən oyundur Hockey is a fast game*

**cəldləşdirmək** *f* to quicken *(d.)*, to cause *(d.)* to become quick / agile

**cəldləşmək** *f* to become* agile / quick / prompt / swift / nimble

**cələ** *i (həm də məc.)* noose; ~ **ilə tutmaq** to noose *(d.)*

**cəllad**[1] *i* executioner, hangman*; *məc.* butcher; *məc.* despot; merciless person; *(vəhşi)* brute

**cəllad**[2] *s (rəhmsiz)* cruel; inhuman; *(vəhşi)* savage; *(sərt)* brutal; ~ **adam** a brute, brutal / cruel man*; ~ **kəməndi** hangman's noose

**cəlladcasına** *z*: ~ **öldürmək** to butcher *(d.)*, to execute *(d.)*, *(xüsusilə bıçaqla)* to kill violently *(d.)*

**cəlladlıq** *i* 1. *the job of hangman** 2. *məc.* brutality, cruelty, inhumanity, ruthlessness; ~ **etmək** to butcher *(d.)*, to kill violently *(d.)*

**cəm** *i* 1. totality, the aggregate; sum, the sum total; 2. collection, gathering 3. *qram.* plural *(number)*; ~ **etmək** to put* / to lay* *(together) (d.)*; to heap *(d.) (up together)*

**cəmdək** *i d.d.* carrion, dead flesh; *məc. d.d.* dead thing; *(böyük heyvan haq.)* carcass, dead body; **inək cəmdəyi** carcass of a cow

**cəmdəkyeyən** *i zool.* vulture; carrion-eagle

**cəmi** *z* in all, altogether, total; **ümumi** ~ grand total, sum total; *(ancaq)* only

**cəmi-cümlətanı** *əd.* all in all, in all; only; *Cəmi-cümlətanı (vur-tut) iki kitabım var I have two books in all, I have only two books*

**cəmisi** *z bax* **cəmi-cümlətanı**

**cəmiyyət** *i* society; league; order; corporation; company; **ibtidai** ~ primitive society; **sinifsiz** ~ classless society; **kommunizm** ~**i** communist society; **kapitalist** ~**i** capitalist society; *Qırmızı Xaç və Qırmızı Aypara ~i Red Cross and Crescent Society*; **dostluq** ~**i** Friendship Society; **səhmdar** ~**i** joint-stock company, *amer.* public utility corporation; **ədəbi / elmi** ~ literary / scientific society; **idman** ~ sports society, the league of sports; *tar.* **millətlər** ~**i** the league of Nations; **ticarət** ~**i** trading corporation; **marka toplayanlar** ~**i** a philatelic / philately society; ~**də özünə yer tutmaq** to make* *one's* way *(in life)*

**cəmiyyətdənqaçan** *s* unsociable, self -contained; ◊ ~ **olmaq** to keep* *oneself* to *oneself*; to be* a bad mixer

**cəmiyyətəzidd** *s* unsocial, anti-social

**cəmiyyətpərəst** *s* public-spirited person

**cəmləmək** *f* to sum up *(d.)*; to put* / to lay* (together) *(d.)*

**cəmləşdirmək** *f* to gather / to bring* together *(d.)*, to collect *(d.)*; to sum up *(d.)*; to concentrate *(d.)*; to fix *(d.)*, *(fikir haq.)* focus *(on) (d.)*; to attract and hold* the attention; *(əşya haq.)* to heap *(up, together) (d.)*; **diqqətini / var qüvvəsini** ~ to concentrate on / to keep* / to focus / to fix / to direct *one's* attention / efforts *(on d.)* **fikrini / qüvvəsini** ~ to collect *one's* thoughts / energies; **gücünü** ~ to summon *(up) one's* strength; **bütün cəsarətini** ~ to pluck up *one's* heart / courage / spirit, to muster up *one's* courage; **özünü** ~ to brace / to collect *oneself*, to screw up *oneself* enough courage; **kağız-kuğuzlarını** *(qəzet və kitablarını)* ~ to collect *one's* papers and books together; **əsgərləri şəhərdə** ~ to concentrate soldiers in town

**cəmləşmək** *f* 1. to gather together; 2. to collect, to assemble; *Şagirdlər məktəbin zalında cəmləşdilər The pupils assembled in the school hall*

**cəmlətdirmək** *f bax* **cəmlətmək**

**cəmlətmək** *f* to ask / to force *smb.* to gather *(d.)*; to ask / to force *smb.* to sum *(d.)* up / to add up

**cənab** *i* Mr ("Mister" sözünün ixtisarı; familiya, yaxud vəzifə bildirən adın qarşısında işlədilir); ~ Braun Mr Brown; ~ **prezident** Mr. President

**cənazə** *i* 1. *(əsasən insan haq.)* corpse; 2. dead human body; mortal remains; *Onun cənazəsi kilsənin həyətində basdırılıb His / Her mortal remains are buried in the churchyard*

**cəncəl**[1] *i* muddle, mess, tangle; *(dolaşıqlıq)* mishmash, jumble; cavil, slander; ~**ə salmaq** to be* tangled in lies; to entangle *(oneself)*; ~ **ə düşmək** to get* into a muddle; **bütün işi** ~**ə salmaq** *(korlamaq)* to muddle / to mess up the whole business, to tangle a knot; ~ **salmaq** *(şər atmaq)* to slander *smb.*; *Bizi bu cəncələ kim saldı? Who got us into this mess?*

**cəncəl**[2] *s* tangled, muddled up, difficult; captious, pettifogging; *(pırtlaşıq)* intricate; *(qarışıq)* involved; ~ **iş** captious case, intricate business, tangled knot; ~ **məsələ** an intricate problem

**cəncəlçi** *i d.d.* intriguer, caviller, pettifogger

**cəncəlli** *s bax* **cəncəl**[2]

**cəncəllik** *i (araqarışdırma)* cavilling, pettifogging; ~ **etmək / salmaq** to cavil *(at, about)*; to tangle; to mess about, to make* a mess / a muddle



**cəng**[1] *i* I war, battle, argument; ~**də qalib gəlmək** to win* a battle; ~**də uduzmaq** to lose* a battle

**cəng**[2] *s*: ~ **meydanı** battle-ground, battle-field

**cəng** *i* II *(kif)* mould; ~ **basmaq / atmaq** to mould, to become* covered with mould

**cəngavər**[1] *i* knight; fightingman*, fighter, pugilist

**cəngavər**[2] *s* fighter; martial; militant; bellicose; warlike; ~ **təyyarəçi** a fighter pilot; ~ **boksçu** a pugilist; ~ **əhval-ruhiyyəsində olmaq** to be* bellicose; ~ **görünüşü / ədası** warlike / bellicose air

**cəngəl** *i bax* **cəngəllik**

**cəngəllik** *i* jungle; *d.d. (qalın meşəlik)* thick / dense forest; *məc.* labyrinth; brushwood, thicket; **keçilməz** ~ impenetrable thickets

**cəngi**[1] *i* martial music

**cəngi**[2] *s*: ~ **mahnısı** battle song; ~ **musiqisi** martial music

**cəngli** *s (kifli)* mouldly, *(i.s.)* covered with mould

**cənnət**[1] *i* 1. paradise, the Garden of Eden, home of Adam and Eve, *şair.* Elysium; an early paradise; Heaven; 3. any place or condition of perfect happiness or beauty

**cənnət**[2] *s məc.* paradise; paradisiac, paradisiacal, paradisal; ~ **ləzzəti** the joys of paradise; ~ **alması** paradise apple; ~ **quşu** bird of paradise

**cənnətlik** *i din.* a sinless person worthy of paradise

**cənub**[1] *i* South; ~ a south; ~ **a getmək** to go* south; to go* to the South; ~ **da** in the South; ~ **dan** *(külək haq.)* southerly, from the south; ~ **istiqamətində** southerly, towards the south, southward(s)

**cənub**[2] *s* south, southern; ~ **qütbü coğ.** South Pole; ~ **küləyi** south wind, southern / southerly wind

**cənubi** *s* south, southern; ~ **Amerika** South America; ~ **Avropa** Southern Europe

**cənub-qərb**[1] *i* south-west; ~**dən** *(külək haq.)* southwest, south-westerly, from the south-west; ~**ə** south-westerly, towards the south-west

**cənub-qərb**[2] *s* south-west, south-westerly; ~ **küləyi** south-westerly wind; ~ **istiqaməti** south-westerly direction

**cənub-qərbi** *s* south-west, south-westerly

**cənublu** *i (cənubda yaşayan)* southerner

**cənub-şərq**[1] *i* south-east; ~ **ə** south-east; ~**dən** *(külək haq.)* south-east, south-easterly; ~ **istiqamətdə / istiqamətə** south-east / south-easterly

**cənub-şərq**[2] *s* south-east; south-easterly; ~ **küləyi** south-easter; *(cənub-şərqdən əsən külək)* south-easterly; ~ **istiqaməti** south-easterly direction

**cənub-şərqi** *s* south-east; south-easterly

**cərəyan** *i* 1. flow, movement; 2. *fiz.* current; **elektrik** ~**ı** electric current; **güclü** ~ strong current; **hava** ~**ı** air current; **daimi** ~ a steady flow; **elektron** ~ stream / flow of electrons; **iti** ~ rapid / swift current; ~ **etmək** to flow*; to pass; *(baş-vermək)* to occur, to happen; 3. trend; **ədəbi** ~ literary school, a literary trend

**cərgə** *i (xüsusilə teatrda)* row; line; *hərb.* file, rank; formation; ~**ni sıxlaşdırmaq** to close* a file; **arxa** ~ back row; **birinci** ~**də** in the first row; in the first rank; ~**yə düzülmək** to line up, to rank, to form a rank; to get* into a line, to form a line; ~**yə düzmək** to line *(d.)*, to rank *(d.)*, to form in column *(d.)*; ~**ilə hərəkət etmək** *(addımlamaq)* to file, to walk / to march / to move in a line; *Uşaqlar sinifdən cərgə ilə çıxdılar The children filed out of the classroom*

**cərgəarası**[1] *i k.t.* space between rows

**cərgəarası**[2] *s*: ~ **becərmə** inter-row cultivation

**cərgə-cərgə** *z* in ranks, in rows

**cərgələmək** *f* to rank *(d.)*, to line *(d.)*

**cərgələnmək** *f* to rank, to line *(up)*; *Əsgərlər cəld cərgələndilər The soldiers quickly lined up*; to be* lined up

**cərgəli** *s k.t.*: ~ **əkin / səpin** drill, drill seed

**cərgəvi** *s k.t.*: ~ **toxum səpən** *(maşın) (seed-)* drill, seeder; ~ **əkin / səpin** sowing in drills, drill sowing, drill

**cərimə**[1] *i (pul)* fine; penalty; ~**ni ödəmək** to pay* a fine; **ağır** ~ heavy fine; ~ **etmək** to fine, to set* / to impose a fine *(on)*; ~ **ilə cəzalandırmaq** to punish by fine; **qanunu pozmağa görə pul** ~**si** *amer.* a money penalty for a breach of law; **müqavilənin yerinə yetirilməməsinə görə** ~ penalty for non-performance of contract; ~ **vermək** to give* a penalty; ~ **təyin etmək** to make* / to declare penalty; *O, yüz manat cərimə verdi He / She paid hundred manats fine*; ~ **olunmaq** *bax* **cərimələmək**

**cərimə**[2] *s* penal, penalty; ~ **meydanı** *id.* penalty area; ~ **zərbəsi** *id.* penalty kick; ~ **vaxtının hesablayıcısı** penalty timekeeper; ~ **xalı** penalty; ~ **batalyonu** *hərb.* penal battalion

**cərimələmək** *f* to fine *(d.)*, to punish by fine *(d.)*, to penalize *(d.)*, to set* / to impose a fine *(on)*

**cərimələnmək** *f* to be* fined / penalized; *Biz 50 $ cərimələndik We were fined $s 50*

**cərrah**[1] *i tib.* surgeon

**cərrah**[2] *s* surgical; ~ **qayçısı** forceps; ~ **alətləri** surgical instruments; ~ **cəsarəti** surgical spirits; ~ **müalicəsi** surgical treatment; ~ **pambığı** surgical wool

**cərrahiyə**[1] *i* operation

**cərrahiyə**[2] *s amer.* operative, surgical; ~ **otağı** an operation room, surgery; ~ **stolu** operating-table; ~ **əməliyyatı** surgical operation; ~ **müalicəsi** operative treatment

**cərrahlıq**[1] *i* surgery; ~ **üzrə ixtisaslaşan həkim** a doctor who specializes in surgery; ~ **öyrənmək** to study surgery

**cərrahlıq**[2] *s* surgical; ~ **sənəti** surgical profession; ~ **təcrübəsi** surgical practice

**cəsarət** *i* boldness, courage, bravery, valour; ~ **etmək** to dare*, to venture *(d. + to inf.)*, to make* bold *(+ to inf.)*, to take* the liberty *(of)*; **sarsılmaz** *(möhkəm)* ~ unfaltering / unshaken courage; **bütün** ~ **ini toplamaq** to take* / to pluck up /to muster up *one's* courage; **bir işi görməyə** ~ **etməmək** not to dare *(to)* do anything; ~ **göstərmək** to show* / to display courage

**cəsarətlə** *z* courageously, boldly, defiantly, fearlessly, resolutely; decidedly; ~ **danışmaq** to speak* boldly / freely; *Mən cəsarətlə deyə bilərəm I can safely say, I'll be bold to say*; ~ **qarşılamaq** to brave; **düşməni / təhlükəni / ölümü** ~ **qarşılamaq** to brave *one's* enemy / danger / death

**cəsarətləndirmək** *f* to cheer up *(d.)*; to bolden *(d.)*, to encourage *(d.)*, to give* courage / confidence to, to inspire with courage / confidence
**cəsarətlənmək** *f* to dare *(+ to inf.)*, to have* courage; to be* bold; to be* *(so)* bold as, to make* *(so)* bold; to screw up *one's* courage *(+ to inf.)*; to face boldly; to pluck up, to muster up courage / heart / spirit *(+ to inf.)*, to overcome* *one's* fears, to pluck up *one's* spirits; to take* the risk of
**cəsarətli** *s* courageous, daring, audacious, bold, resolute, decided, plucky, brave, intrepid; ~ olmaq to be* brave / courageous; *Cəsarətli ol! Don't lose courage! (Pluck up your) Courage!* ~ adam a man* of decision / determined character / very decided character; ~ hücum determined attack; ~ mütəfəkkir a bold thinker; ~ tədqiqatçı daring / audacious explorer
**cəsarətlilik** *i* boldness, audaciousness, audacity; encouragement, venture
**cəsarətsiz**[1] *s* irresolute, indecisive, cowardly, faint-heart(ed), craven, poor -spirited; ~ davranış cowardly conduct; ~ adam coward, cowardly man*, faint-hearted / chicken-hearted fellow; ~ olmaq to be* coward / craven
**cəsarətsiz**[2] *z* cowardly, faint-heartedly, cravenly
**cəsarətsizləşmək** *f* to lose* courage, to lose* heart, to be* despondent; to become* faint-hearted / coward
**cəsarətsizlik** *i* indecision; timidity; faint-heartedness, cowardice, cravenness
**cəsəd** *i* dead body; corpse; *(böyük heyvan haq.)* carcass
**cəsur** *s bax* **cəsarətli**
**cəsurluq** *i bax* **cəsarət**
**cəvərən** *i* wicker, basket; *d.d.* bast-basket; bir ~ alma / üzüm a wicker basket of apples / grapes
**cəza**[1] *i* punishment; *(ciddi, ağır)* chastisement; *(töhmət mənasında)* penalty; *(bədən)* flogging; cismani ~ corporal punishment; ~ çəkmək to be* punished; ölüm ~ sı punishment by death, capital punishment, death penalty; ölüm ~ sını yerinə yetirmək to carry out punishment by death; yüngül ~ small penalty; cəzaya layiq adam punishable man* / person; ~ verən adam punisher, chastiser; *hərb.* intizama çəkən ~ summary punishment; ~ vermək to inflict a punishment (on *smb.*); etdiyi cinayətə görə ~ sına çatmaq to be* brought to punishment for *one's* crimes; ~nı əhv etmək to remit a punishment ; ~nın ləğv edilməsi *(götürülməsi)* abolishment of punishment; *Cani ölüm cəzası ilə cəzalandırılır Murderer is punished by death*
**cəza**[2] *s* punitive; ~ dəstəsi a punitive detachment; ~ ekspedisiyası a punitive expedition; ~ vergiləri punitive taxes
**cəzalandırılmaq** *f* to be* punished / chastised, to be* subjected to punishment
**cəzalandırmaq** *f* to punish *(d.)*, *(ciddi)* to chastise *(d.)*, to inflict a penalty *(upon, on d.)*; to penalize *(d.)*
**cəzalanmaq** *f bax.* **cəzalandırılmaq**
**cəzan** *i*: ~a gəlmək to be* reduced / driven to extremity; dərd / ağrı əlindən ~ a gəlmək to be* driven to an extremity of grief / pain

**cəzasız**[1] *s* unpunished
**cəzasız**[2] *z* with impunity; ~ qalmaq to go* unpunished
**cəzasızlıq** *i* impunity
**cəzb** *i* attraction; attractiveness, charm, fascination; *(aldadıcı)* seduction, delusion; ~ etmək to attract *(d.)*, to draw* *(d.)*; maqnit kimi ~ etmək to attract like a magnet *(d.)*; ~ olunmaq to be* carried away; to be* fascinated / captivated; *Maqnit dəmiri cəsb edir Magnet attracts iron*
**cəzbedici** *s* charming, fascinating, alluring, absorbing, captivating;~ qız a charming girl; ~ təbəssüm charming / fascinating / captivating smile
**cəzirə** *i bax* **ada, səhra**
**cıbrıq** *s* peeled; ~ qoz peeled nuts; ~ etmək to peel *(d.)*; ~ ğını çıxartmaq 1) *bax* **cıbrıqlamaq**; 2) to beat* unmercifully *(d.)*; *Cıbrığını çıxardacam! d.d. I'll give you what-for! I'll pay you!*
**cıbrıqlamaq** *f* to peel *(d.)*, to take* the skin off; dərisini ~ *(soymaq)* to strip the skin off, to skin *(d.)*; to flay *(d.)*; *Qoyunun dərisini 15 dəqiqədə cıbrıqladı He stripped the skin off / flayed / skinned the sheep for 15 minutes*; *Bu qozları cıbrıqla Peel these nuts*
**cıbrıqlanmaq** *f* to peel, to be* / to become* peeled
**cıdır**[1] *i d.d.* horse-race; racing; *d.d.* race-meeting, the races; manеəsiz ~ flat race(s); manеəli ~ obstacle-race; ~da iştirak etmək *(adam və at. haq.)* to race, to run *(in)* a race; ~da uduzmaq to race away; ~da qalib gəlmək to win the race
**cıdır**[2] *s* racing, race; ~ meydanı hippodrome, race-course; ~ yarışında iştirak etmək *(adam və at haq.)* to race, to run* *(in)* a race; ~ yarışında uduzmaq to race away; ~ proqramı race-card; ~ günü race-day; ~ atı racer, race-horse; ~ yolu race-track *(stadionda)*, race-course; ~ dairəsi racing-track; ~ yarışı keçirtmək, ~ yarışında iştirak etmək to run* a race / race off
**cıdırçı** *i id.* jockey, rider
**cığ** *i bot.* 1. *(alaq otu)* weed; rush; 2. sea-weed, grass-wrack
**cığal** *i One who likes to break the rules of sports and games and does not acknowledge them; a breaker of the game rules*
**cığallamaq** *f* 1. to break* the rules of the game intentionally / deliberately; 2. to retract *one's* words, to go* back on *one's* word
**cığallıq** *i* intentional breaking of the game rules; ~ etmək *bax* **cığallamaq**
**cığ-cığ**[1] *i (adam)* squeaker
**cığ-cığ**[2] *s* squeaky; ~ adam a squeaky man* / person
**cığıldamaq** *f* to squeak; to give* / to make* a squeak, to peep; *Uşağın oyuncağı cığıldayır The baby's toy peeps / squeaks*
**cığıldaşmaq** *f* to squeak *(all)* together, to chirp *(all)* together, to peep together
**cığıldatmaq** *f* to cause to squeak *(d.)*/ to chirp *(d.)*
**cığıltı** *i* squeak, squeaking, rattle; körpə ~sı a baby's rattle; ~ salmaq to make* / to give* a squeak, to make* a little cry
**cığıltılı** *s* squeaky; ~ səs a squeaky voice



**cığır** *i* 1. path; *(tarlada, meşədə)* footpath, track, pathway; trail; işlək / döyənək ~ *amer.* blazed trail, beaten track; ~la getmək to follow the path; ~ına düşmək to be*on *smb.'s* track, to be* tracking; ~ından çıxmaq *məc.* to overstep the limits *(of)*, to exceed the bounds *(of)*; *Bu cığırla gedin Keep the path!* *Meşədəki cığırı kol basıb The trail through the woods is overgrown with bushes*; 2. *məc.* direction, way; həyat ~ı walk of life; line of life; xoşbəxtlik ~ı line of happiness; ~ açmaq 1) to pave the way; 2) *məc.* to start a new method, to open the way to *smth.*; özünə ~ açmaq to work / to carve *one's* way; to force *one's* way *(to)*; to furrow up / out *one's* way; həyatda özünə ~ açmaq to make* / to fight* *one's* way in life; ~dan çıxmaq *məc.* to fall* into disorder / into evil ways, to get* off the trails, to overstep the limits, to pass all bounds, to go* over the line
**cığıraçan** *i* 1. *k.t.* (alət) ploughshare; trailer; trail spade; 2. *(adam haq.)* trail blazer; pathbreaker, trailer
**cığırdaş** *i* fellow-traveller
**cığ-vığ** *i* hubbub; noise; ~ salmaq to make* a noise; to kick up a row
**cıqqa** *i* 1. top-knot of hair, a lock of hair, *d.d.* tuft; *(alında)* forelock; shock, tuft of hair; 2. *(şlyapada)* plume
**cıqqalı** *s* 1. *d.d.* shaggy, tufted; mop-headed, shock-headed; ~ saç shaggy / bristling hair; 2. *(şlyapada)* plumed
**cıqqan** *s d.d.* tiny, bir ~ uşaq tiny little child; bir ~ tiny bit; *(bir)* ~ içmək to drink* a wee; bir ~ gözlə wait a wee
**cıqqılı** *s d.d.* 1. tiny, tiny little, wee, diminutive; ~ adam diminutive man*; ~ uşaq a wee child, tiny little child, tiny tot; ~ oğlan a wee lad; ~ it a diminutive dog; bir ~ tikə a tiny little piece; ~ əllər tiny hands; 2.: ~ uşaqlar tinies *pl.*; *Onlar lap çıqqılı olanda... When they were tinies...*
**cıqqır** *i*: ~ını çıxartmamaq never to utter a sound, never to produce sounds, to keep* silent / silence
**cılğı** *i (ağartı üçün) (stripped)* goatskin
**cılxa** *s* lean; *(çəki, gəlir)* net clear; pure; *amer.* straight *(saf, əlavəsiz)*; ~ gümüş / qızıl pure / clean silver / gold; ~ brilyant diamond of the first water, clean diamond; ~ spirt pure alcohol; *d.d.* neat spirits *pl.*; ~ süd *(qarışıqsız)* pure milk
**cılız** *s* emaciated, puny, wasted; haggard; *(bir dəri-bir sümük)* scraggy, *d.d.* skinny; gaunt lean; weak, feeble, sickly, undersized; ~ bədən emaciated / meagre / gaunt frame; ~ üz *(sifət)* a gaunt / lean / meagre / emaciated face; ~ uşaq weak / feeble child*; ~ oğlan skinny boy; ~ qarı a feeble / gaunt old woman*; *Necə də cılız balaca kişidir! What a puny little man!*
**cılızlanmaq** *f* to get* / to grow* / to become* emaciated / thin, to lose* flesh, to become* weaker; to pine
**cılızlaşdırmaq** *f* to emaciate *(d.)*, to make* thin *(d.)*, to weaken *(d.)*, to make* weaker *(d.)*; *Uzun sürən xəstəlik onu cılızlaşdırmışdı He / She was emaciated by long illness*

**cılızlaşmaq** *f bax* **cılızlanmaq**
**cılızlıq** *i* gauntness, skinniness, emaciation, puniness, weakness
**cında** *i bax* **cındır**
**cındır**[1] *i* rag, shred, scrap; maşını silmək / təmizləmək üçün ~ rag to polish the car with; döşəmə ~ ı house-flannel; ◊ *Cındırından cin hürkər* ≅ *He / She is dressed in shreds and tatters*
**cındır**[2] *s* ragged ['rægɪd], rag, scrappy; *d.d.* tattered, torn
**cındırçı** *i (kişi)* ragman*, *(qadın, kişi)* rag-picker; *(qadın)* rag woman*
**cındırlaşmaq** *f* to be* in tatters, to be* torn to tatters / to shreds
**cındırlı** *s (i.s.)* ragged; in rags
**cındır-mındır** *i* scraps, waste material; rags, old / worn clothing
**cınqıldamaq** *f* to ring*; *(sim)* to twang; to jangle, *(metal əşya)* to clank, to clang, *(qab)* to clatter; (pul) to rattle
**cınqıldatmaq** *f (zınqrov)* to peal *(d.)*, *(stəkan)* to clink *(d.)*; *(açar, pul)* to jingle *(d.)*; *d.d.* to tinkle *(d.)*, *(qab)* to clatter *(d.)*; *(pul)* to rattle; zəncirini ~ to clank *one's* chains; açarlarını ~ to jingle *one's* keys; *O, cibində pul cınqıldatdı He rattled the coins in his pocket*
**cınqılı** *s* tiny, wee, very small
**cınqıltı** *i (zınqrov)* peal, jangle, *(zəncir)* clank, *(açar)* clang *(-ing)*; *(zınqrov və s.)* tinkling, tinkle; *(pul)* rattle
**cınqır** *i*: ~ını çıxartmaq to utter a word; *O, cınqırını çəkməyə cürət etmir He / She does not dare to utter a word; Cınqırını çıxartma! Don't dare to utter a word! Cınqırını çəkincə... Before he / she knew where he / she was; Cınqırını çəkmə (çıxartma) Do not say a word, Never say a word*
**cın-cındır** *i bax* **cır-cındır**
**cır** *s* I *bot.* savage, *(meyvə)* wild; ~ ağac wild tree / wilding; ~ alma wild apple; *d.d.* wilding; *(turş)* crab-apple; (albalı) wild cherry; ~ bitki wild plants, wilding; ~ armud wild pear; ~ tut *(həm də ağacı)* wild mulberry; ~ adam degenerate, degenerate person; ~ heyvan degenerate, degenerate animal
**cır** *s* II *(səs haq.)*; ~ səs shrill voice, screamy voice; *Onun cır səsi var He / She has a shrill / screamy voice*
**cır-cındır** *i* rags *pl.*; shabby clothes; old clothes; ~ yığan, ~ alıb-satan rag-picker, rag-and-bone man*; scrap merchant, dealer in scrap; ~ alveri rag trade; ~ içində in rags; ~ içərisində olmaq to be* in rags; ~ geymiş dressed in rags; ~ torbası rag-bag; ~ alıb-satmaq to buy* and to sell* scrap; *O, cır-cındırın içərisindədir He / She is dressed in rags*
**cırcırama** *i zool.* dragonfly
**cırlıq** *i* wildness; *(səsdə)* shrillness
**cırıq**[1] *i (dəridə, ağac gövdəsində)*, scar; *(paltarda)* tear; *Köynəyində cırıq var There is a tear in your shirt*
**cırıq**[2] *s* ragged, tattered, torn; ~ ayaqqabı torn / broken shoes

**cırıq-cırıq** s d.d. tattered, torn to shreds, worn to rags; ~ olmaq to be* in shreds and tatters, to be* in rags; Onun üst-başı cırıq-cırıqdır His / Her dress is torn to shreds / worn to rags; Onun üz-gözü cırıq-cırıqdır Her / His face is covered with scratches; Her / His face is scratched all over

**cırıldamaq** f (qapı, təkər, qələm və s.) to squeak, to creak, to scratch; (cırcırama) to crick; to chirr; Bu təzə ayaqqabılar cırıldayır These new shoes squeak; Qapını açdıqda cırıldadı The door squeaked as I opened it

**cırıldaşmaq** f to squeak / to creak all together

**cırıldatmaq** f to cause to squeak / to creak (d.); to squeak (d.)

**cırılmaq** f to be* torn, to be* in shreds; (paltar və s.) to tear*; (çəkmə və s.) to burst* ; parça-parça ~ to tear* / to become* to pieces; Bəzi kağızlar asanlıqla cırılır Some papers tear easily

**cırıltı** i (qapı, araba) squeak; (pero) scratch; (çəkmə) creak; ~ salmaq / etmək to make* a squeak; qələmin kağız üzərində ~ sı the scratch of the pen on the paper

**cırıltılı** s squeaking, squeaky, creaking, creaky; ~ qapı / ayaqqabı squeaky door / shoes

**cırlamaq** f 1. (nəsli pozulmaq) to degenerate; 2. bot. (bitki) to run* wild; to become* / to grow* wild

**cırlanmaq** f bax **cırlamaq**

**cırlaşmaq** f bax **cırlamaq**

**cırmaq I** f to tear* (d.), to tear* asunder, to rend* (d.); məktubu tikə-tikə ~ to tear* a letter into pieces; üst-başını ~ to rend* one's garments (clothes); d.d. to break* off (with); Kağızı yarıdan (ortadan) cır Tear the paper in half

**cırmaq II** i scratch;

**cırmaq-cırmaq** z: ~ olmaq to be* covered with scratches; to be* scratched badly; ~ etmək to scratch badly (d.), to cover with scratches (d.)

**cırmaqlamaq** f to scratch (d.); İt qapını cırmaqlayırdı The dog scratched at the door

**cırmaqlanmaq** f to be* scratched

**cırmaqlaşmaq** f to scratch; Pişiklər cırmaqlaşırlar Cats scratch

**cırnamaq** f to be* irritated, to be* in bad temper; (hirslənmək) to be* angry (with)

**cırnatdırmaq** f bax **cırnatmaq**

**cırnatmaq** f to tease (d.); to irritate (d.); to make* angry (d.)

**cırtdan**[1] i dwarf, pygmy, lilliputian, d.d. little man*

**cırtdan**[2] s pygmean, pygmy, dwarfish, dwarfy; zool. ~ begemot (hippopotam) a pygmy hippopotamus; ~ alma ağacı a dwarf apple tree

**cırtqoz** s d.d. hot-tempered, quick-tempered; d.d. peppery; ~ adam hot-tempered person; d.d. spitfire

**cırtqozluq** i hot / quick temper; touchiness

**cız**[1] i line; ~ çəkmək to line; altdan ~ çəkmək to underline

**cız**[2] s hot, burning (in a child's speech)

**cız-bız** i roast(ed) offal; ~ bişirmək / qovurmaq to cook / to fry offal in hot fat, to roast offal

**cız-bızçı** i arx. a person who roasts and sells offal

**cız-bızxana** i roasted offal-room

**cızdaq** i aşp. cracklings

**cızıq** i (müxtəlif mən.) line; scratch; ~ çəkmək to draw* a line, to line off / out; kağızda ~ çəkmək to rule lines on paper; ~ dan çıxmaq məc. to go* over the line; to get* puffed up, to give* oneself airs; to think* no small beer of oneself ideom.; (ağ eləmək) to go* too far, to go* to extremes; üzdə (təzə rənglənmiş yerdə, gümüş məcməyidə) ~ a scratch on the face (on fresh paint, on a silver tray); Stolun baş tərəfində dərin bir cızıq vardı There was a deep scratch on the tabletop

**cızıq-cızıq** s 1. (pozulmuş) blotted out, crossed out; (korlanmış) spoiled; (xətt, yazı) scribbled; Onun əlləri tamam cızıq-cızıq idi Her / His hands were covered with scratches; 2. scratched all over; ~ etmək 1) to cross out (d.), to blot out (d.); 2) to scratch all over (d.); (cızmaqara etmək) to scribble; əlini tikanla ~ etmək to scratch one's hand on the thorns; rənglənmiş yeri ~ etmək to scratch the paint; Tikan onun əl-ayağını cızıq-cızıq elədi The thorns scratched his / her arms and legs

**cızıqlamaq** f to rule (d.), to make* (parallel) lines on, to mark with lines; to line (d.); kağızı ~ to rule a paper, to line a paper; sözü ~ (pozmaq) to scratch out a word; Biz küçələri parad üçün cızıqlamışdıq We lined the streets for the parade; Məktubda bir neçə sətir cızıqlanmışdı A few lines of the letter were scratched out

**cızıqlanmaq** f to be* ruled; to be* scratched out

**cızıqlanmış** fs ruled, lined; scratched; ~ (cızıqlı) dəftər lined / ruled note-book; ~ stol scratched table

**cızıldamaq** f (samovar və s.) to drone; to hoot

**cızılmaq** f 1. to be* drawn; to be* traced out; to be* lined; Kağız cızıqlanıb (xətlənib) The paper is lined; Təzə plan cızılıb A new plan is drawn / traced; 2. to get* / to be* scratched; Şəkil cızılıb The picture is scratched

**cızıltı** i buzzing; hooting, drone

**cızmaq** f 1. to draw* (d.); (ümumi şəkildə təsvir etmək) to trace (d.), to sketch (d.), to outline (d.), to draft (d.), to scratch (d.), to scribble (d.); plan ~ to outline / to draw* a plan; xəritə ~ to make* a map; 2. to scratch; əlini sancaqla / tikanla ~ to scratch one's hand with a pin / on the thorns; Qələmim cızır My pen scratches

**cızma-qara** i d.d. (qara-qura yazı) scrawl; ~ yazmaq / etmək to scrawl (d.), to scribble (d.); scratch (on) (d.); ~ kağızı scratch paper; ~ şəkil (çertyoj) scratchy drawing; ~ yazı scratchy writing; O cızma-qara edir (ilan-qurbağa yazır) ≅ His / Her writing is a scrawl; ~ qol çəkmək to scrawl one's signature; bütün divarı ~ etmək to scrawl all over the wall

**cızma-qaraçı** i d.d. scribbler; dauber

**cib**[1] i pocket; yan ~ side-pocket; döş ~ (i) breast pocket; saat ~i watch-pocket; arxa ~ (şalvarda) hip-pocket; ~ini doldurmaq d.d. to fill one's pocket; (varlanmaq) to line one's pockets; ~ə ziyan vurmaq to cost* a pretty penny; əlini ~inə qoymaq to put* one's hand into one's pocket; d.d. əlini ~inə salmaq (pul xərcləmək) to put* one's hand in one's pocket; boş ~ (pulsuz) empty pocket; ~ dolusu



pocketful; bir ~ pul a pocket of money; bir kəsin ~inə girmək to pick smb.'s pocket; ~inə qoymaq to pocket (up), to put into one's pocket; ◊ Onun cibində siçan oynayır ≅ He / She is a penniless person

**cib**[2] s pocket; ~ saatı (pocket) watch; ~ darağı pocket-comb; ~ güzgüsü pocket-glass; ~ lüğəti pocket dictionary; dəftəri pocket-book; ~ bıçağı pocket-knife; ~ dəsmalı a pocket-kerchief

**cibəgirən** i bax **cibkəsən**

**cibgir** i bax **cibkəsən**

**cibgirlik** i pocket-picking, pickpocketing; ~ etmək to pickpocket, to be* a pickpocket

**cibxərcliyi** i pocket money

**cibkəsən**[1] i a pickpocket

**cibkəsən**[2] s: ~ adam pickpocket

**cibli** s (i.s.) with a pocket (i.s.) having a pocket

**cici** i (nəvaziş) mother; d.d. grandmother; mum, mom, mummy

**cici-bacı** i d.d. friend, god-parents; ~ olmaq to be* friends

**cici-bacılıq** i friendship, favouritism, nepotism; familiar acquaintance; ~ etmək to be*friends; to support each other

**cida** i (silah) lance; tar. (piyada əsgər) pike; Cidanı çuvalda gizlətmək olmaz at. söz. ≅ Murder will out

**cidalaşmaq** f to lance each other / one another

**cidalı** s (i.s.) with / having a lance

**cidd-cəhd** i zeal, fervour, ardour; amer. ardor, diligence; assiduity; ~ lə işləmək to work with zeal / diligence; ~ etmək / göstərmek to endeavour, to be* zealous / diligent

**ciddi**[1] s serious, earnest; austere, strict; (sərt) severe; grave; ~ adam an austere / a serious person; (görünüşcə) a grave man* / person*; ~ məsələ a grave matter; ~ müəllim strict teacher; ~ baxış severe look; ~ xəstəlik a grave illness; ~ tənqidçi severe critic; ~ intizam strict discipline; ~ qayda strict order; ~ əmr strict orders pl; ~ pəhriz strict diet; ~ töhmət severe reprimand; ~ ölçü strong measures pl.; ölçü götürmək to take* strong measures; ~ olmaq to be* serious / strict / grave; ~ görünmək to look serious

**ciddi**[2] z strictly; (sərt) severely; seriously; earnestly, in earnest; bir şeyə ~ yanaşmaq to be* in earnest about smth.; məsələni çox ~ hesab etmək to take* a grave view of the matter; Ciddi desək… Strictly speaking…; ~ görünmək to look serious; işə ~ başlamaq / girişmək to take* the bull by the horns idiom. Ciddi deyirəm I am in earnest; Ciddi qadağandır It is strictly forbidden, It is completely banned

**ciddiyyət** i severity; stringency, intensity; diligence; müharibə dövrü qaydalarının / qanunlarının ~ i the stringency of wartime rules

**ciddiyyətlə** z seriously, earnestly, in earnest; diligently; unremittingly; gravely; ~ işləmək to work with zeal / diligence, to work in earnest / diligently

**ciddiləşdirmək** f to strengthen (d.), to intensify (d.); to attach importance (to), to make* smth. important; nəzarəti ~ to double the watch (for, ever); beynəlxalq gərginliyi ~ to heighten / to intensify international tension

**ciddiləşmək** f to become* / to grow* serious / strict; to take* a serious turn

**ciddilik** i strictness, seriousness, earnestness, graveness, stringency; tam ~ lə in all seriousness; onun üzünün ciddiliyi the intensity of his / her face; Həmişə ciddilik lazımdır One must always be serious

**cihad** id. sacred war(-fare), Holy war, a fight in any good cause; ~ elan etmək to declare holy war (on)

**cihaz** i apparatus, instrument; device; appliance; optik ~lər optical instruments; ölçü ~ı measuring instrument / device; naviqasiya ~ları navigation instruments; elektrik qızdırıcı ~ı electric heating apparatus

**cihazqayıran**[1] i instrument-maker

**cihazqayıran**[2] s instrument-making; ~ sənaye / zavod instrument-making industry / plant

**cik-cik** i chirp(ing), twittering; ~ etmək to give* a chirp, to chirp

**cikkildəşmək** f to chirp / to twitter together; bərkdən / ucadan ~ to give* a loud chirp

**cikkilti** i chirp, chirrup, twitter

**cil** i bax **cığ**

**cila** i 1. (ağacda, dəridə) polish; (həm də məc.) gloss, (kağızda, metalda) lustre; 2. (spirtli rəng) polish, varnish

**cilaçı** i polisher, grinder

**cilalama** i polish(ing); grinding, glossiness; (yeyə ilə) filing

**cilalamaq** f to grind* (d.); (həm də məc.) to polish (d.), to gross (d.), to make* (d.) glossy

**cilalanmaq** f to be* polished / glossed

**cilalanmış** s polished, glossed

**cilalı** s lustrous, glossy, shiny; ~ kağız glossy paper

**cild** i 1. (kitabın) binding, book-cover; 2. volume; 3. clothing; ~ini dəyişmək məc. to pretend to be; kitabın ~i the cover of a book

**cild-cild** i volume by volume; in volumes; ~ kitablar books in volumes

**cildçi** i binder, bookbinder

**cildxana** i bindery, bookbinder's shop; binder's

**cildləmək** f (kitab və s.) to bind* (d.), to put* into a cover; kitabı ~ to bind* the book, to have* the book bound; Kitab qəşəng cildlənib The book is nicely bound; Bu kitabı cildlət(dir)mişəm I have this book bound

**cildlətdirmək** f to ask / to force smb. to have (d.) bound; Kitabımı cildlətdirmək istəyirəm I want to have my book bound

**cildlətmək** f bax **cildlətdirmək**

**cildli** s 1. (kitab) bound; 2. in volumes; üç ~ kitab a book in three volumes

**cildsiz** s unbound, (i.s.) not having a binding; ~ kitab an unbound book

**cilik-cilik** s smashed; broken into pieces; ~ etmək to smash to smithereens (d.), to break* into pieces (d.); ~ olmaq to be* broken into pieces, to be* smashed

**cilikləmək** f to break* (d.) into pieces, to smash (d.); fincanı ~ to break* the cup into pieces

**ciliklənmək** *f* to break*; to be* broken *(into pieces). (sümük, qabırğa)* to fracture; *Fincan çiliklləndi The cup was broken into pieces*
**ciliklənmiş** *s* broken, smashed; fractured; ~ fincan the broken cup; ~ sümük a fractured bone
**cilov** *i (müst. və məc.)* bridle, curb; *(atın və s.)* rein(s), bridle; ~ vurmaq / salmaq to curb; ~un əlində saxlamaq *(itaətdə saxlamaq)* to keep* in check *(d.)*, to hold* in leash *(d.)*, to restrain *(d.)*; atın ~unu buraxmaq to uncurb a horse, to give* a horse the rein / reins / bridle; ~ vurmaq to halter; atı ~la idarə etmək to control a horse with a bridle / curb; ~unu boşaltmaq *məc.* to slacken the reins; ~ gəmirmək *məc.* to take* the bit between *one's* teeth; ~unu çəkmək / yığmaq to bridle *(d.)*; to halter *(d.)*; birisinin ~ unu çəkmək to put* a bridle on *smb.*, to halt *smb.*
**cilovlamaq** *f (həm də məc.)* to curb *(d.)*, to bridle *(d.)*, to halter *(d.)*, to put* a bridle on; *məc.* to restrain *(d.)*, to control *(d.)*, to keep* in check; atı ~ to bridle a horse, to put* / to bridle on a horse; bir kəsi ~ *məc.* to put* a bridle on *smb.*; to halter *(d.)*; müharibəni ~ to halter / to rein a war; nəfsini / hirsini ~ to curb / to bridle / to restrain *one's* temper / anger; dilini ~ to curb *one's* tongue; ehtirasını ~ to put* a curb on *one's* passion
**cilovlanmaq** *f* to be* bridled / curbed; to be* kept in check; to be* put on a curb
**cilovlatdırmaq** *f* to ask / to force *smb.* to bridle *(d.)* / to curb *(d.)*; *Atı cilovlatdırmışam I have the horse bridled / curbed*
**cilovlatmaq** *f bax* **çilovlatdırmaq**
**cilovlanmış** *s bax* **cilovlu**
**cilovlu** *s* bridled, curbed; restrained, kept in check; haltered
**cilovsuz** *s* 1. unbridled, uncurbed; 2. unbound, unrestrained; uncontrolled; *(i.s.)* without a bridle / curb
**cilovsuzluq** *i the state of being without bridle*
**cilvə** *i* coquetry, flirt, mincing manners *pl.* finicality
**cilvəkar** *s* 1. coquet *(tish)*, arch, mincing, finical; ~ qadın / qız flirtatious / coquettish woman* / girl, couquette. *d.d. (geyim, yaxud ədaları ilə kişilərin xoşuna gəlməyə çalışan qadın / qız)* affected creature; ~ təbəssüm winsome smile; 2. *(bəzəkli, səliqəli)* attractive, smart
**cilvəli** *s bax* **cilvəkar**
**cilvələnmək** *f* 1. to flirt *(with)*, to coquette *(with)*, *d.d.* to mince; 2. *(özünü bəyəndirməyə çalışmaq)* to pose, to show* off, to flaunt
**cimildəmək** *f* to tingle; *Bütün bədənim cimildəyir The whole body of mine is tingling*
**cimildəşmək** *f* to tingle, to have* a pricking / stinging feeling in the skin; soyuqdan / həyəcandan ~ to tingle with the cold / with excitement; *Soyuqdan onun barmaqları cimildəşirdi His / Her fingers tingled with the cold*
**cimilti** *i* tingling feeling / sensation, a prickly / stinging sensation; ~ hiss etmək to feel* slight prickly / stinging sensation; *Əllərimdə cimilti hiss edirəm I feel tingle in my hands*

**cin** *i din.* jinn, demon, evil spirit; ◊ ~ atına mindirmək to drive* *(d.)* mad, to throw* *(d.)* into a rage; to infuriate *(d.)*, to make* *smb.* furious; ~ atına minmək to become* furious, to fly into a rage, to fill with rage; ~ başına / təpəsinə vurmaq, ~i tutmaq to lose* *one's* temper, to fly* / to get* into a rage, to become* / to get* furious; to get* *one's* rag out *idiom. Cinim tutur I feel annoyed / vexed*; ~ini başına yığmaq to infuriate *(d.)*, to put* *smb.* beside *himself*, to drive* *smb.* out of his / her wits
**cinah**[1] *i* wing; flank; sağ ~ da on the right wing / flank; sol ~ da on the left wing / flank; ~ da yerləşmək *(olmaq)* to flank, to be* / to be*situated at *(on)* the flank *(of)*; atın ~ları the horse's flanks; evin cinahı *(tərəfi)* the flank of the house; bir kəsə ~dan hücum etmək to take* *smb.* on the flank; *Sol cinahım ağrıyır I have an ache in my left wing, My left wing aches*
**cinah**[2] *s* flank(ing); ~ hücumu, ~ dan hücum flank(ing) attack; ~ atəşi, ~ dan atəş flanking fire; ~ sazişi flank agreement
**cinayət**[1] *i* crime, crimes, offence; ağır ~ villainy; *hüq. (ağır)* felony; *d.d.* criminal case; dövlət ~ i treason; siyasi ~ political crime / offence; ~ törətmək / etmək to commit / to perpetrate a crime / offence / (ağır) felony; hərbi ~lər war crimes; ~ başında tutmaq, ~ yerində yaxalamaq to catch* in the act; to catch* red-handed; bəşəriyyətə qarşı ~ crimes against humanity; *Belə fürsəti əldən vermək cinayətdir Such waste of opportunities is a crime*
**cinayət**[2] *s* criminal; penal; felonious; ~ məhkəməsi criminal / penal court; ~ məcəlləsi (kodeksi) criminal / penal code; ~ prosesi / işi criminal action / case; ~ qanunları penal laws; ~ axtarışı idarəsi Criminal Investigation Department; ~ hüququ criminal law; ~ qəsdi *(niyyəti)* criminal intention; hərbi ~ kodeksi military code
**cinayətkar**[1] *i* criminal, offender; criminator; *hüq.* felon; ~ lar the felonry; *hüq. (qadın)* feloness; *(dəfələrlə cinayət edən adam)* old / second offender; dövlət ~i state criminal; hərbi ~ war criminal; birinci dəfə cinayət törətmiş ~ first offender; kiçikyaşlı / azyaşlı ~ juvenile offender
**cinayətkar**[2] *s* offending, criminal; felonious, penal; ~ hərəkət a criminal act; ~ adam criminal; *Cinayətkarı həbs etdilər The criminal was arrested*
**cinayətkarcasına** *z* criminally; ~ hərəkət etmək to act criminally
**cinayətkarlıq** *i* criminality, felony, criminal nature; penalty, crime, black deed; cinayətkarlığa qurşanmaq to *steep in crime; Bu həqiqətən cinayətkarlıqdır It is a crime, indeed; Qətl ağır cinayətkarlıqdır Murder is a felony*
**cinayətli** *s* criminal; *arx. (ağır)* felon; felonious
**cindar**[1] *i* shaman; witch-doctor, wizard; *(qadın)* witch
**cindar**[2] *s* shaman, magic(al); ~ qadın witch
**cindarlıq** *i* shamanism; witchcraft; witchery; ~ etmək to be* a shaman, to practise shamanism
**cingildəmək** *f* to ring*; *(bərk)* to clang, *d.d.* to tinkle, to clank, *(qab)* to clatter, to rattle; *(zınqırov, zəng)* to tingle; *(sim və s.)* to twangle; *Sim(lər)*



*cingildəyir The strings twangle; Zəncirlər cingildəyir The chains are jangling / clanking; Qulaqlarım cingildəyir My ears buzz, There is a ringing in my ears; Qızın cavabı qulaqlarımda cingildəyirdi The girl's reply tingled in my ears*
**cingildətmək** *f (stəkan və s.)* to clank *(d.) (with)*, *(bərkdən)* to clang *(with) (d.)*, to clink *(d.)*; *(pul, açar, balaca zınqrov, zəng)* to jingle *(d.)*, to clatter *(d.)*, to make* a clatter; *O, açarlarını cingildətdi He / She jingled his / her keys*
**cingilti** *i (uca)* peal, ringing, clang(ing), clank; *(zınqrov və s.)* tinkling; rattle; jingle; *(kilsədə zəng)* chime; qab ~si clatter of crockery / dishes; qulaqda ~ ringing in the ears; zınqrovların ~si tinkling of bells; ~ salmaq *bax* **cingildətmək**; at nalının ~si the clatter of horseshoes
**cingiltili** *s* 1. ringing, clear; ~ *(uca)* səs clear / ringing voice; rattling sound; ~ gülüş ringing laughter; 2. *dilç.* voiced; ~ samitlər voiced consonants
**cinləndirmək** *f* to enrage *(d.)*, to infurate *(d.)*, to madden *(d.)*, to drive* *(d.)* wild; to make* very angry *(d.)*, to stir to fury *(d.)*; to get* *smb.*'s goat *idiom.*; to send* into a rage; *Onun hərəkəti məni cinləndirdi His / Her behaviour enraged me*
**cinlənmək** *f məc.* to be* very angry, to be* / to become* / to get* frantic / furious; to be* in / to get* / to fly* into a rage, to become* enraged; to get* *one's* rag out; *(kiməsə)* ~ to get* angry *with smb.*; *(nəyəsə)* ~ to get* angry *with smth.*; *Onun axmaqlığına cinlənmişəm I am enraged at / by his / her stupidity*
**cinlətmək** *f bax* **cinləndirmək**
**cinli** *s* raging, raving, frenzied *(qəzəblənmiş, cinlənmiş)* enraged, infuriated ◊ devil-ridden; ~ olmaq to become* enraged, to be* vexed; ~ adam enraged person
**cinlilik** *i* enragement, frenzy, angriness
**cins**[1] *i biol.* 1. sex; qadın ~i female, female sex; kişi ~i male, male sex; the male kind; 2. *qram.* gender; qadın ~i feminine *(gender)*; kişi ~i masculine *(gender)*; orta ~ neuter *(gender)*; 3. race, breed, species *(ev heyvanları, bitkilər haq.)*; *məc.* sort, kind, variety; *(növ)* type; mal-qara ~i strains of cattle; eyni ~dən of the same race / breed / species; *məc.* of the same kind / sort / type; bu ~ adamlar this sort / kind of people; eyni ~ kartof potatoes of the same race; 4. family, kin; stock; *O yaxşı cinsdəndir Onun cinsi yaxşıdır He / She comes of good stock*
**cins**[2] *s biol.* 1. generic; 2. *qram.* gender; ~ sonluqları gender inflection / inflexions; 3. pure-blooded, thoroughbred; *(ev heyvanları və s.)* pure-strain, pedigree(d); *(it haq.)* pure-bred, true to race; ~ at thoroughbred / pure-blooded horse; ~ it a pure-bred dog, a dog true to race; ~ mal pedigreed cattle, bloodstock; ~ heyvandarlıq pure-strain stockbreeding; ~ kələ thoroughbred bull calf; ~ heyvan pedigreed cattle; ~ toxum *k.t.* pedigree seed
**cinsi** *s* sexual, sex; ~ orqanlar the sex organs, genitals; ~ instinkt sex instinct; ~ əlaqə sexual intercourse; ~ əlaqədə olmaq to have* sex *(with)*; bir kəslə ~ əlaqədə olmaq to have* sex with *s. o.*

**cinsiyyət** *i biol.* sex
**cinsləşdirilmək** *f (mal-qara,bitki və s.)* to be* improved / graded
**cinsləşdirmək** *f* 1. to ennoble *(d.)*; to improve *(d.)*, to make* *(d.)* better; 2. *(mal-qara cinsi haq.)* to grade up *(d.)*
**cinslik**[1] *i* race, breed
**cinslik**[2] *s* pedigreed; ~ heyvan pedigreed cattle
**cin-şeytan** *i din.* devil, evil spirit; *d.d.* dickens
**cip-cip** *i* chuck-chuck; chirp(ing), twittering; *Cip-cip, cücələrim Chuck-chuck, oh my chickens!*
**cirə** *i* 1. ration; rate; quota; standard, norm; ~yə düzmək / qoymaq to put* on rations; hər ərzaq ~si *(norması)* ration scale; ~ilə çörək paylamaq / vermək to ration *(out)* bread; gündəlik ~ *(iş)* daily work quota
**cirə**[1] *i* II *bot.* carraway, *(toxum)* carraway seed
**cirə**[2] *s* carraway; ~ yağı carraway oil; ~ toxumu carraway seeds
**cirəli** *s* carraway; ~ keks carraway cake
**cism** *i* 1. *(müxtəlif mənalarda)* body; *fəls.* substance; *fiz. (bərk)* solid; *(maye)* liquid; ◊ səma ~ ləri the heavenly bodies; *fiz.* mütləq qara ~ black body; *riyaz.* düzgün (həndəsi) ~ *(fiqur)* regular solid; 2. object; material, thing; fiziki ~lər material things; ~ adları bildirən isimlər *(ağac, dəmir, şüşə və s.) qram.* material nouns; kiçik ~ small thing; uzaq ~ distant object
**cismani** *s* corporal, corporeal, bodily, physical; ~ zədə physical / bodily injuries; ~ cəza corporal punishment; ~ çatışmazlıq *(şikəstlik)* corporal defects; ~ rahatlıq bodily comfort; ~ əzab bodily suffering; ~ ehtiyac corporal needs
**cismanilik** *i* corporality
**cismcik** *i* little body, small thing
**cismən** *z* corporeally; bodily
**civ-civ** *i*: ~ etmək to chirp, to twitter
**civə**[1] *i* mercury, quicksilver; ~ müalicəsi *(~ ilə müalicə) tib.* mercurialization, treatment with mercury; ~dən zəhərlənmə *tib.* mercurialism, mercury poisoning
**civə**[2] *s* mercury; ~ sütunu mercury *(column)*
**civəli** *s* mercurial; ~ maz *əc.* mercurial ointment; ~ barometer *fiz.* common / mercurial barometer
**civhaciv** *z*: ~ salmaq to chirp / cheep continuously
**civildəmək** *f* 1. to squeak; *(cücə haq.)* to cheep, to peep; to give* a squeak; *(balaca quş və cücə)* to twitter, to chirp; *Balaca quş bərkdən civildədi The small bird chirped noisily*; 2. *məc. (zəif səs)* to chirp; *Civildəmə! Don't chirp!*
**civildəşmək** *f* to twitter together, to cheep together; *(quş və bəzi cücülər)* to chirp together, to peep together; *Cücələr civildəşirdilər The baby chickens were cheeping / peeping*
**civilti** *i* twitter, cheep, chirp, peep; ~ salmaq to make* a chirp; to make* a peep; sərçələrin ~si the twitter of sparrows; cücələrin ~si the cheep of baby chickens
**civiltili** *s* squeaky, cheepy
**ciyə** *i* tow(*-ing*)-line, tow(*-ing*)-rope; *(nazik)* string, twine; pack-thread; ~ ilə bağlamaq to tie up *(d.)* with a string

**darısqallaşdırılmaq** *f* to be* made smaller / rather tight
**darısqallaşdırmaq** *f* to make* *(d.)* smaller; to make* *(d.)* rather tight
**darısqallaşmaq** *f* to become*/ to get* smaller; to become*/ to get* rather tight
**darısqallıq** *i* 1. narrowness, smallness; 2. *(yerin çatışmazlığı)* cram, crush; *Nə darısqallıqdır! What a crush! How crowded it is here!* ~da yaşamaq to live cooped / penned up together
**darışlıq** *i bax* **darısqallıq**
**darkeş** *s bax* **dar**
**darkeşlik** *i* narrowness; tightness
**darqın** *s* 1. offended *(with),* aggrieved, hurt; ~ olmaq to have a grudge *(against)*; 2. angry, cross
**darqınlıq** *i* 1. offence, injury, insult; 2. irritation
**darqursaq** *s bax* **hövsələsiz**
**darqursaqlı** *s bax* **hövsələsiz**
**darqursaqlıq** *i bax* **hövsələsizlik**
**darlaşdırmaq** *f* 1. to narrow*(d.)*, to restrict *(d.)*; 2. *(paltarı, ayaqqabını və s.)* to tighten *(d.)* to make* *(d.)* tighter
**darlaşmaq** *f* 1. to narrow, to become*/ to get* narrow; 2. *(paltar, ayaqqabı və s.)* to become*/ to get* tighter
**darlıq** *i* 1. narrowness; smallness; 2. *(paltar, ayaqqabı və s.)* tightness; 3. *məc.* difficulties *pl.* awkward / difficult situation
**darmacal** *s* hasty, hurried
**darmacalda** *z* hurriedly, hastily, in a haste; in *one's* hurry
**darmadağın** *s* rout, complete / utter destruction; ~ etmək to put* to rout; ~ dağıtmaq to smash up *(d.)*, to destroy completely / entirely; ~ olmaq to go* to ruin, to fall* to the ground; *məc.* to go*/ to fall* to pieces
**dartdırmaq** *f* to ask / to cause *smb.* to pull *(d.)*, to ask / to cause *smb.* to draw *(d.)*; *(yedəklə)* to ask / to cause *smb.* to tow [t o u] *(d.)*
**dartəhər** *s* narrowish, rather / somewhat narrow; *(paltar, ayaqqabı)* rather / somewhat tight; *(otaq və s.)* rather / somewhat small
**dartılı** *s* taut, tight drawn; ~ sim taut string; ~ əzələlər taut muscles
**dartılmaq** *f* to tauten, to be* tautened; to tighten, to be* tightened; *Kəndir dartıldı The rope tightened*
**dartılmış** *fs* taut, tautened; tightened, tight; nağara kimi ~ drum tight
**dartınmaq** *f* 1. to struggle to break loose; 2. to jerk / to draw back, to give* a jerk; 3. to stretch oneself; *(gimnastik alətdə)* to pull oneself up
**dartışdırılmaq** *f* to be* pulled / drawn
**dartışdırmaq** *f* to pull*, *(d., about)*, to stretch *(d.)*, to draw* *(d.)*; bir kəsin qolunu ~ to pull *smb.'s* sleeves; bir kəsin saçını ~ to pull *smb.'s* hair
**dartışmaq** *f* to pull each other / one another; to fall* out with each other, to quarrel with each other / one another
**dartma** *s tex.* tractive; ~ qüvvəsi tractive effort
**dartmaq** *f* to pull *(d. by)*, to stretch *(d.)*, to tug *(d.)*; *(yedəklə)* to tow [t o u]; bir kəsin qolundan ~ to pull *smb.'s* sleeve; rezini ~ to stretch an elastic; dartıb çıxarmaq to pull *(d.)* out; yüyəni ~ to jerk the reins; qapının dəstəyini ~ to tug at the door-knob; mıx ~ to pull out a nail; çiyinlərini ~ to shrug *one's* shoulders; ◊ bir kəsə şillə ~ to give* *smb.* a slap; ◊ özünü ~ to put* on airs, to give* oneself airs
**darülfünun** *i arx. bax* **universitet**
**darürəkli** *s* small-minded, petty; ~ adam petty creature / man*
**darürəklilik** *i the quality of being small-minded / petty*
**darvaza** *i* gate; ~nın ağzında gözləmək to wait at the gate; ~dan keçmək to go* through the gate
**darvazaçı** *i* door-keeper, gate-keeper
**darvazalı** *s (i.s.)* with a gate, *(i.s.)* having a gate
**darvinçi** *i bax* **darvinist**
**darvinist** *i* Darvinist
**darvinizm** *i* Darvinism
**dastan** *i* saga, epos, story, tale; ◊ ~ danışmaq to tell* tales / stories; dillərdə ~ olmaq to be* the general topic of conversation, to become* legendary *(hero)*
**dastançı** *i* narrator
**dastançılıq** *i the art of a narrator*
**daş**[1] *i* stone; *amer.* rock; qiymətli ~ precious stone, gem, jewel; bülöv ~ı oilstone, whetstone; sualtı ~ reef; rock; yonulmuş ~ ashlar; diş ~ı tartar; öd kisəsinin ~ı *tib.* gall-stone; məhək ~ı cornerstone, keystone [ki:-], foundation-stone; ◊ ~ kimi düşmək to drop like a stone; ~ı ~ üstə qoymamaq *(dağıtmaq)* to raze to the ground *(d.)*; bir kəsə ~ atmaq *həm müst. həm də məc.* to throw* a stone at *smb.*; ~dan tikmək to build* of stone; ~dan qayırmaq to make* of stone; ~a dönmək to harden / to turn into stone; *elm.* to petrify; *məc.* to harden; ~a basmaq to throw* stones
**daş**[2] *s* stone, stony; rocky; ~ divar / körpü və s. stone wall / bridge, *etc.*; ~ alətlər stone tools / implements; ◊ ~ kömür coal; ~ baltası stone-axe; ◊ ~ dövrü the Stone Age
**daşagirən** *i* hermit, anchorite, recluse
**daşarmudu** *i a kind of pear which is too hard to eat*
**daşatan** *i* 1. boy('s) catapult; 2. *arx.* sling
**daşbadam** *i almond which has hard shell and bitter taste*
**daşbaş** *i* easy and illegal earnings
**daşbaşçı** *i a person who earns money illegally and dishonestly*
**daşbaşçılıq** *i business of a person who earns money illegally and dishonestly*
**daşbaşlı** *s* profitable, lucrative, paying; ~ biznes profitable / paying business; ~ sənət lucrative trade; ~ ticarət lucrative traffic / trade
**daşçıxarma** *i tib.* lithotomy
**daşdırmaq** *f* to let* *(d.)* run over / to overflow; to cause *(d.)* to run over / to overflow; südü ~ to let* the milk overflow / run over, to cause the milk to overflow / to run over, to boil the milk over
**daşdöşəyən** *i* paver
**daşdöyən** *i zool.* wagtail
**daşduz** *i* rock-salt
**daşxırdalayan** *i* stone-breaker, stone-crusher



**daşıma** *fi* 1. carrying, conveying, taking; *(araba ilə)* carting; *(dənizlə)* sea shipping; *(dəmir yolu ilə)* transit by rail freightage; *(avtomobillə)* road haulage / freightage; 2. transportation, conveyance; qoşun ~ troop-carrying, troop transportation
**daşımaq** *f* to carry *(d.)*, to convey *(d.)*, to transport *(d.)*; *(araba ilə)* to cart *(d.)*; *(gəmi ilə)* to ship *(d.)*; yük ~ to carry freight; məna ~ to convey meaning; silah ~ *(gəzdirmək)* to carry guns; sərnişin ~ to transport passengers; *Biz mallarımızı bazara araba ilə daşıdıq We conveyed our goods to the market by a cart;* bir kəsin familiyasını ~ to go* under *smb.'s* name, to use *smb.'s* name; *O, ərinin familiyasını daşıyır She uses her husband's name, She goes under her husband's name.*
**daşındırmaq** *f.* fikrindən ~ to ask / to cause / force *smb.* to change *one's* mind, to make *smb.* change *one's* mind
**daşınmaq** *f* 1. to be* carried / transported / conveyed; 2. *(yeni mənzilə)* to move; yeni mənzilə ~ to move to / in a new flat, to change *one's* lodgings; fikrindən ~ to change *one's* mind *(about + -ing)*; qərarından ~ to change *one's* decision, to decide not *(+to inf.)*; *Mən ora getmək fikrindən daşınmışam I have changed my mind about going there. I've decided not to go there*
**daşırmaq** *f bax* **daşdırmaq**
**daşıtdırmaq** *f bax* **daşıtmaq**
**daşıtmaq** *f* to ask / to cause *smb.* to carry *(d.)* / to convey *(d.)* / to transport *(d.)*, to have* *(d.)* carried / conveyed / transported; *(araba ilə)* to ask / to cause *smb.* to cart *(d.)*, to have* *(d.)* carted
**daşka** *i* 1. small cart, *(two-wheeled)* cart; 2. hand-cart
**daş-kəsək** *top. i* stones and clods
**daş-kəsəkli** *s bax* **daşlı-kəsəkli**
**daş-kəsəklik** *i* hard ground with stones and clods
**daşkəsən** *i* stone-cutter, stone-dresser
**daşqalaq** *i* a kind of severe punishment; ~ etmək 1) to throw* stones *(at)*, to lynch *smb.* by throwing stones *(at)*; 2) to punish *smb.* severely / sternly
**daşqaş** *i* gem, jewel, precious stone
**daşqaşlı** *s (i.s.)* with jewels / precious stone
**daşqəlbli** *s* stony-hearted, heartless, soulless
**daşqəlblilik** *i* stony-heartedness, heartlessness
**daşqın**[1] *i* flood, inundation, overflow
**daşqın**[2] *s* turbulent, violent; ~ çaylar turbulent / violent rivers
**daşqınlıq** *i* flood, high water
**daşqıran** *i* stone-breaker, stone-crusher
**daşqovun** *i bot.* cantaloup(e)
**daşlamaq** *f* to stone *(d.)*, to throw* stones *(at)*, to fling*/ to hurl stones
**daşlanmaq** *f* to be* stoned, to be* thrown / hurled stones
**daşlaşmaq** *f* **I** to turn to stone; *elm.* to petrify; *məc.* to harden
**daşlaşmaq** *f* **II** to stone each other / one another, to throw* stones at each other / at one another
**daşlatdırmaq** *f bax* **daşlatmaq**
**daşlatmaq** *f (daşa döndərmək)* to ask / to cause *smb.* to stone *(d.)*, *(birinə daş atdırmaq)* to ask / to cause to fling stones *(at)*
**daşlı** *s* stony, rocky; ~ torpaq stony ground; ~ cığır a rocky path
**daşlıq**[1] *i* stony / rocky place
**daşlıq**[2] *s bax* **daşlı**
**daşlı-kəsəkli** *s* stony and clody; ~ yol stony and clody way / road
**daşlı-qayalı** *s* stony and rocky
**daşma** *fi (axar çay və s.)* flood, overflow
**daşmaq** *f* 1. *(süd, xörək və s.)* to boil over; *Süd daşır The milk is boiling over;* 2. *(çay, göl və s.)* to overflow*, to run* over, to flood; *Bu çay hər yaz daşır Every spring this river floods;* ◊ səbir kasası ~ to be* exasperated, to lose* *one's* temper / patience
**daşsındıran** *i* stone-breaker
**daşsız** *s* stoneless; *(i.s.)* without stones
**daşürəkli** *s* rocky-hearted; hard-hearted, heartless, stone-hearted
**daşürəklilik** *i* hard-heartedness, heartlessness, stony-hearted
**daşyonan** *i* stonemason, mason
**daşyonma** *i* masonry
**dava** *i* **I** *bax* **dərman**[1]
**dava** *i* **II** 1. fight, brawl; scuffle; ~ etmək to brawl, to make* a row, to take* part in a brawl; ~ salmaq to quarrel *(with smb. over)*, to kick up a row*; ~ çəkmək *(məhkəmə vasitəsilə)* to be* at law *(with)*; yumruq ~sı fisticuffs; ◊ ~ dağarcığı *bax* **davakar**; 2. *bax* **müharibə**
**davacıl** *i bax* **davakar**
**davacıllıq** *i bax* **davakarlıq**
**davaçı** *i* 1. *( davakar )* trouble-maker, brawler, rowdy; 2.. *(şikayətçi)* plaintiff
**dava-dalaş** *i bax* **dava-qalmaqal**
**dava-dalaşsız** *s* quiet, calm [ka:m], placid; easy-tempered; peaceful, peaceable; ~ söhbət peaceful conversation; ~ razılaşma a peaceable agreement;~ həyat a quiet life; ~ adam a calm person
**dava-dalaşsız** *z* peacefully; in harmony; ~ yaşamaq to live in harmony
**dava-dava** *z*: ~ demək to seek* ground for brawl / scandal
**dava-dərman** *top. i* drug, different medical means / remedies; ~ etmək *bax* **sağaltmaq**
**dava-dərmansız** *z* without drug, without any medical means / remedy
**davakar**[1] *i* quarreler, brawler, pugnacious fellow / man*/ woman*; ~ olmaq to like fighting, to be* ready to fight, to be* given to fighting; *O, yaman davakardır He / She is always ready to fight*
**davakar**[2] *s* pugnacious; ~ adamlar pugnacious people
**davakarcasına** *z* pugnaciously
**davakarlıq** *i* pugnacity
**dava-qalmaqal** *i* scandal, brawl; row; salmaq ~ to brawl, to make* a row; *Bu nə dava-qalmaqaldır! What a scandal!*
**davalı** *s* disputable, debatable, moot, controversial; ~ məsələ moot / controversial / vexed question

**davalıq** *i* debatableness, scandalousness

**davalı-şavalı** *s bax* **davalı**

**davam** *i* 1. steadfastness, stableness, firmness; 2. solidity, durability; 3. continuation, extension; məsələnin ~ı continuation of the question; *Davamı var To be continued*; ~ etmək to continue *(d., ger., to inf.)*, to go* on *(with + ger.)* to keep* on *(+ger.)*, to proceed *(with)*; *Mən işimi davam etdirdim I continued my work, I went on with my work*; *Onlar oxumağı davam etdirdilər They continued reading / to read*; ~ gətirmək *(dözmək)* 1) to stand* *(d.)*, to bear* *(d.)*, to tolerate, to undergo* *(d.)*, to suffer *(d.)*, to endure *(d.)*; ağrıya ~ gətirmək to suffer pain; soyuğa ~ gətirmək to endure cold; ehtiyaca ~ gətirmək to undergo* hardships *pl.*, to suffer privations *pl.*; *Mən belə ağrıya artıq davam gətirə bilmirəm I can't bear / stand such pain any longer*; ənənəni ~ etdirmək to carry on the tradition; 2) to put* up with; *Çox isti idi, lakin səyahətçilər davam gətirməli idilər It was too hot, but the travellers had to put up with it*

**davamçı** *i* continuer, successor, follower

**davametdirən** *i bax* **davamçı**

**davametdirici** *i bax* **davamçı**

**davametmə** *i* duration

**dava-mərəkə** *i bax* **dava-qalmaqal**

**dava-mərəkəli** *s* very scandalous, quarrelsome, rowdy; debatable

**davamiyyət** *i* attendance; yaxşı ~ good attendance; pis ~ poor attendance; *Məktəbə davamiyyət icbaridir Attendance at school is compulsory*

**davamlı** *s* 1. durable, solid, firm; strong, stable; hard-wearing; ~ özül stable foundation; ~ parça hard-wearing fabric, durable stuff; ~ rəng / boya fast dye / colour; 2. of great endurance; *Siz çox davamlısınız You are of great endurance, You are a great stayer*

**davamlılıq** *i* 1. durability, solidity, firmness; 2. powers of endurance, hardiness; *(mənəvi)* fortitude

**davamsız** *s* 1. not strong /solid / durable; *(tezsınan)* fragile, brittle; *məc.* delicate; ~ şüşə brittle / fragile glass; 2. flimsy; ~ parça flimsy cloth / stuff; 3. unstable, non-persistent; ~ qaz *hərb.* non-persistent gas

**davamsızlıq** *i* 1. unstableness; non-persistence; 2. lack of strength / solidity; 3. brittleness, fragility, flimsiness

**davar** *i* sheep and goats *pl.*

**davarlı** *s (i.s.)* having sheep and goats

**davarçılıq** *i* sheep and goat breeding; ~la məşğul olmaq to breed sheep and goats

**davasız** *s* I *bax* **dərmansız**

**davasız[1]** *s* II peaceful; calm, easy-tempered

**davasız[2]** *z* peacefully; calmly

**davasız-dalaşsız** *z bax* **davasız[2]**

**davasız-dərmansız** *z* without medicine, not using any medicine

**davasızlıq** *i* I *bax* **dərmansızlıq**

**davasızlıq** *i* II 1. absence of war; 2. absence of scandal / quarrel

**davasız-şavasız** *z bax* **davasız[2]**

**dava-şava** *i* brawl, uproar, row, scandal; kefli adamın ~sı drunken brawl; ~ salmaq to kick up a row / rowdy, to make* an uproar

**dava-şavalı** *s* vexed, disputable, questionable, moot; ~ məsələ a vexed question

**dava-şavasız** *z* peacefully, in harmony; ~ yaşamaq to live in harmony / peacefully

**davranış[1]** *i* 1. behaviour, conduct; yaxşı ~ good behaviour/conduct; pis ~ bad behaviour / conduct, misbehaviour; *Mənim onun davranışından xoşum gəlmir I don't like his / her behaviour*; 2. manner; 3. treatment *(of)*; nəzakətli ~ polite / courteous treatment

**davranış[2]** *s*: ~ qaydaları norms of behaviour; the rules of conduct

**davranışlı** *s* polite, kind, courteous

**davranışsız** *s* impudent, insolent, rude; *(uşaqlar və yeniyetmələr haq.)* cheeky; *d.d.* saucy; *amer.* sassy

**davranma** *fi* manner, behaviour; treatment; bir kəsə qarşı yaxşı / pis ~ good / bad treatment of *smb.*; pis ~ bad* behaviour, misbehaviour; xoşagələn ~ a pleasant manner

**davranmaq** *f* 1. to behave, to treat; pis ~ to behave / to treat badly; nəzakətlə ~ to behave politely / kindly; bir kəslə yaxşı ~ to treat *smb.* kindly; bir kəslə pis ~ to treat *smb.* badly, to illtreat *smb.*; *O, arvadı ilə pis davranır He behaves badly to his wife*; 2. to bear* *(oneself)* in a polite way; *Davranmağı öyrənin! Learn how to behave, Behave (yourself)!*

**davul** *i* drum; ~ çalmaq to beat* the drum

**davulçalan** *i* drummer, drum player

**davulçu** *i bax* **davulçalan**

**davulçuluq** *i the profession of a drummer*

**dayaq[1]** *i* 1. prop, rest, foot*; 2. *tex.* stop, bearing, log; 3. pedestal; 4. *məc.* support; 5. *(körpüdə)* pier; 6. stronghold, bulwark; sülhün dayağı stronghold of peace; 7. *fiz. həm də məc.* fulcrum *(pl.: - crums or -cra)*; bir kəsə ~ olmaq / durmaq to support / to defend *smb.*

**dayaq[2]** *s* supporting, bearing; ~ məntəqəsi *hərb.* supporting / strong point; ~ dirək bearing pile; ~ plitə base-plate; ~ nöqtəsi tapmaq *məc.* to gain a foothold

**dayaq-divar** *i arxit.* buttress, abutment, counterfort

**dayaqlamaq** *f* to supply *(d.)*, with support / bearing

**dayaglanmaq** *f* to lean* *(against, on)*, to rest *(upon)*

**dayaqlı** *s (i.s.)* having bearing / support

**dayaqlıq** *i* anything fit / suitable for support

**dayaqsız** *s (i.s.)* without bearing / support

**dayaqsızlıq** *i the state of being without bearing / support*

**dayamaq** *f* to rest *(d. against)*, to set* *(d. against)*; to put *(d. against)*, to prop, *(d. under)*, to place *(d. under)*; dirsəyini stola ~ to rest *one's* elbow on the table; dirəyi divara ~ to rest a pole against the wall; *O, velosipedini hasara dayadı He / She propped his / her bicycle against the fence*

**dayanacaq** *i* 1. stop, stopping-place, station; *(dəmir yolunda və ya avtobus marşrutunda axırıncı dayanacaq)* terminus; *(şəhərin mərkəzində avtobus dayanacağı)* terminal; 2. *bax* **dayaq[1]**

**dayandırılma** *fi* stopping, stoppage, ceasation, halting; hərbi əməlliyatın ~sı ceasation of hostilities; silahlanmanın ~sı halting of arms race; atəşin ~sı ceasefire



**dayandırılmaq** *f* to be* stopped / ceased, to be* put to an end, to be* broken off, to be* discontinued

**dayandırma** *fi* stopping, check(ing); ceasation; ceasing; stoppage, halting; hərbi əməliyyatı ~ ceasation of hostilities; atom silahının istehsalını ~ stoppage/halting of the production of atomic weapon

**dayandırmaq** *f* to stop *(d.)*, to cease *(d.)*, to discontinue *(d.)*, to put* an end (to), to make* an end (of); to break* off *(d.)*, to halt *(d.)*, to check *(d.)*, to suspend *(d.)*; *(atı və s.)* to rein / to pull up; yaradan qanaxmanı ~ to stop a wound; söhbəti ~ to cease / to stop talking; atəşi ~ to cease fire / firing; qatarı *(avtomobili və s.)* to stop a train *(car, etc.)*; işi ~ to discontinue *one's* work; danışığı ~ to break* off the conversation; küçə hərəkətini ~ to bring* traffic to a standstill

**dayanmadan** *z* 1. immediately, at once; *Biz dayanmadan qayıtdıq We returned immediately*; 2. incessantly, unceasingly, uninterruptedly, continuously, without break; *Yağış dayanmadan yağırdı It was raining incessantly / unceasingly*

**dayanmaq** *f* 1. to stop, to come* to a stop, to cease; qəflətən ~ to stop short/dead; *Qatar beş dəqiqə dayanır The train stops five minutes*; *İş dayanıb The work has come to a stop*; *Yağış dayanıb The rain has ceased/stopped*; 2. *(mehmanxanada və s.)* to put* up *(at)*, to stop *(at)*, to stay *(at)*; mehmanxanada ~ to stay / to stop at a hotel; 3. *(hərəkətsiz durmaq)* to stand*, to come* to a standstill; ayaq üstə ~ to stand* on *one's* feet; 4. *(söhbətdə, mühazirədə və s. bir məsələ üzərində)* to dwell on; məsələ üzərində ~ to dwell on the question; 5. *(israr etmək)* to stand* on / upon, 6. *(söykənmək)* to lean* *(on, upon)*, to rest *(against)*; 7. *(tab gətirmək)* to hold* out, to stand* firm; 8. *(gözləmək)* to wait; *Bircə dəqiqə dayan Wait just a minute*; ◊ bir kəsin arxasında dağ kimi ~ to defend *smb.* with might and main, to be* solidly behind *smb.*

**dayanmaz** *s* incessant, uninterrupted, persistent; ~ səs-küy persistent noise; ~ yağış incessant rain

**dayaz** *s* 1. shallow, not deep; ~ çay shallow river; ~ boşqab shallow dish; 2. *(adam)* small-minded, narrow-minded; 3. *(ötəri)* superficial; ~ bilik superficial knowledge

**dayazbilikli** *s (i.s.)* with superficial knowledge

**dayazbiliklilik** *i* small-mindedness, narrow-mindedness

**dayazca** *s* 1. quite shallow; 2. *məc.* quite superficial

**dayazfikirli** *s bax* **dayazdüşüncəli**

**dayazfikirlilik** *i bax* **dayazdüşüncəlilik**

**dayazdüşüncəli** *s* narrow-minded, small-minded

**dayazdüşüncəlilik** *i* narrow-mindedness, small - mindedness

**dayazlamaq** *f* to become* / to grow* shallow

**dayazlandırılmaq** *f* to be* made *(d.)* shallow

**dayazlandırmaq** *f* to make* shallow *(d.)*

**dayazlanma** *fi bax* **dayazlaşma**

**dayazlanmaq** *f* to become* / to get* shallow, to shallow *(d.)*

**dayazlaşma** *fi* shallowing, becoming shallow

**dayazlaşmaq** *f bax* **dayazlanmaq**

**dayazlatmaq** *f* to cause *smth.* to grow / to become shallow; to ask / to cause *smb.* to shallow *(d.)*

**dayazlıq** *i* 1. shallowness; shoal; 2. *məc.* superficiality

**dayça** *i bax* **daylaq**

**dayçalı** *s bax* **daylaqlı**

**day-day** *i d.d. bax* **dayı**

**dayə** *i* nanny, nurse, nurse-maid; *(xəstəxanada)* hospital nurse; *(müraciət)* nursey, nanny

**dayəlik** *i* nursing; ~ etmək to be* a nurse, to work as a nurse

**dayı** *i* uncle *(on the mother's side)*

**dayıarvadı** *i the wife of one's uncle, uncle's wife*

**dayıdostu** *i bax* **dayıarvadı**

**dayıqızı** *i (first)* cousin [kʌzn]; a daughter of *one's* uncle *(on the mother's side)*

**dayılı** *s (i.s.)* having an uncle; *məc.* *(i.s.)* having support

**dayılıq** *i the state of being an uncle (on the mother's side)*; ~ etmək to patronize *(d.)*, to protect *(d.)*

**dayınəvəsi** *i (oğlan)* uncle's grandson; *(qız)* uncle's grand-daughter *(on the mother's side)*

**dayıoğlu** *i (first)* cousin *(on the mother's side)*

**dayıoğluluq** *i the state of being (first) cousin (on the mother's side)*

**dayıuşağı** *i the children of one's uncle (on the mother's side)*

**dayıuşağılıq** *i the state of being the children of one's uncle (on the mother's side)*

**daylaq** *i* foal; yearling *(foal)*

**daylaqlı** *s (i.s.)* with a foal, *(i.s.)* having a foal

**daz[1]** *i* bald spot / patch, bald-head

**daz[2]** *s* bald, bald-headed

**dazbaş** *s* bald-headed; ~ adam bald-headed man *

**dazbaşlıq** *i* baldness, *the state of being bald*

**dazılamaq** *f* to walk quickly / rapidly, to go* quickly/rapidly

**dazlanma** *fi* growing / becoming bald

**dazlanmaq** *f bax* **dazlaşmaq**

**dazlaşdırmaq** *f* to cause to become* / to grow* bald *(d.)*

**dazlaşmaq** *f* to become*/to grow* bald, to get* bald

**dazlıq** *i* baldness, bald-headedness

**debet** *i müh.* debit

**debil** *i* moron, a very foolish person / child*

**debil** *s* moronic; ~ uşaq moronic child*

**debillik** *i* moronity

**debit** *i (suyun, qazın və s. miqdarı)* output, yield; qazın ~i output of gas

**debitor** *i müh.* debtor

**debüt** *i* 1. debut [ˈdeɪbu:]; 2. *şahm.* *(chess)* opening

**debütant** *i* debutant [deɪbju:ˈta:ŋ]; *(qadın)* debutante [deɪbjuˈta:nt]

**dedikcə** *z* very, too, extremely; ~ maraqlı very / too / extremely interesting

**dedi-qodu** *i* talk, rumours; gossip; ~ya səbəb olmaq to give* rise to a lot of talk; ~ya son qoymaq to put* a stop to idle talk

**dedi-qoduçu** *i* tale-teller, scandalmonger

**dedi-qoduçuluq** *i* scandal; talking scandal; ~ etmək to gossip; to talk scandal
**dedirtdirmək** *f bax* **dedirtmək**
**dedirtmək** *f* to ask / to cause *smb.* to say
**deduksiya** *i* deduction
**deduktiv** *s* deductive; ~ metod deductive method
**defis** *i* hyphen ['haɪfən]; ~lə yazmaq to hyphen *(d.)*, to hyphenate *(d.)*, to join *(d.)* with a hyphen
**defisit**[1] *i* deficit
**deficit**[2] *s* scarce; in short supply; ~ mallar commodities in short supply, scarce commodities
**defisitlik** *i the state of being deficit*
**deformasiya** *i* deformation
**degenerasiya** *i* degeneration
**degenerat** *i* morron, a very foolish person
**degenerativ** *s* moronic
**dehade** *i* speaking / talking continuously
**dehqan** *i bax* **kəndli**
**dehqanlıq** *i bax* **kəndlilik**
**dekabr**[1] *i* December
**dekabr**[2] *s* December; ~ günü a December day, a day in December
**dekada** *i* Ten-day period; Azərbaycan ədəbiyyatı və incəsənəti ~sı Azerbaijan Ten-Day Festival of Literature and Arts
**dekalitr** *i* decalitre
**dekan** *i* dean *(president of a faculty)*
**dekanat** *i* dean's office
**dekanlıq** *i* 1. *bax* **dekanat**; 2. the job of a dean; ~ etmək to be* a dean, to work as a dean
**deklamasiya** *i* recitation; declamation; ~ demək to recite *(d.)*; to declaim *(d.)*
**deklamasiyaçı** *i* reciter
**deklarasiya** *i* declaration
**dekorasiya** *i* scenery *(in theatre)*
**dekorativ** *s* decorative; ornamental; ~ sənət decorative art; ~ bitki ornamental plant
**dekorator** *i* decorator, scene-painter
**dekret**[1] *i* decree; edict; sülh haqqında ~ the Decree on Peace; torpaq haqqında ~ the Decree on land
**dekret**[2] *s*: ◊ ~ məzuniyyəti maternity leave
**deqazasiya** *i* degassing, decontamination; ~ etmək to degas *(d.)*, to decontaminate *(d.)*
**deqazator** *i* decontaminator
**deqradasiya** *i* degradation
**dequstasiya** *i* tasting
**dequstator** *i* taster
**delfin** *i zool.* dolphin
**delta** *i* I *coğ.* delta; Kür çayının ~sı the delta of the Kur
**delta** *i* II *(yunan əlifbasının 4-cü hərfi)* delta
**demaqoq**[1] *i* demagogue, demagog
**demaqoq**[2] *s* demagogic, demagogical; ~ nitq demagogic speech
**demaqoqcasına** *z* demagogically
**demaqogiya** *i* demagogy, demagogism
**demaqoqlaşmaq** *f* to become* a demagogue / a demagog
**demaqoqluq** *i* demagoguery, demagogy; ~ etmək to act as / like a demagog, to act / to behave demagogically

**demə** *əd.* *It appears that ..., It turns out, Turn out to be; Demə onlar qohum imişlər It appears that they are relatives; Demə o, mehriban adam imiş He / She turned out a very kind man*
**demək**[1] *f* 1. to say* *(d. to)*; to tell* *(about d.)*; həqiqəti ~ to tell / to say* the truth; yalan ~ to tell* a lie, to tell* lies; öz fikrini ~ to give* *one's* opinion *(of)*; *Deyirlər ki,... ...They say, It is said*; 2. to call *(d.)*, to name *(d.)*; *Bu kitaba maraqlı demək olmaz The book can't be called interesting*
**demək**[2] *ara s.* so, then; *Demək, siz heç nə görmədiniz So you saw nothing; Demək, siz gedirsiniz So / Then you are going*
**deməli** *ara s. bax* **demək**[2]
**demi** *i bax* **qəlyan**
**demokrat** *i* democrat
**demokratik** *s* democratic, democratical; ~ azadlıq democratic liberty; ~ respublika democratic republic
**demokratikcəsinə** *z* democratically, as / like a democrat
**demokratikləşdirilmə** *fi* being democratized; democratization
**demokratikləşdirilmək** *f* to be* democratized
**demokratikləşdirmə** *fi* democratizing; democratization
**demokratikləşdirmək** *f* to democratize *(d.)*
**demokratikləşmə** *fi* getting / becoming democratized, democratization
**demokratikləşmək** *f* to get* / to become* democratized
**demokratiklik** *i the state of being democratic*
**demokratiya** *i* democracy; burjua ~sı bourgeois democracy
**demokratizm** *i* democratism
**demokratlaşdırılma** *fi bax* **demokratikləşdirilmə**
**demokratlaşdırılmaq** *f bax* **demokratikləşdirilmək**
**demokratlaşdırma** *fi bax* **demokratikləşdirmə**
**demokratlaşdırmaq** *f bax* **demokratikləşdirmək**
**demokratlaşma** *fi bax* **demokratikləşmə**
**demokratlaşmaq** *f bax* **demokratikləşmək**
**demoqrafik** *s* demographic
**demoqrafiya** *i* demography
**demping** *i iqt.* dumping
**departament** *i* department
**departasiya** *i* deportation; zorla ~ edilmə deportation by force
**depo** *i* depot ['depou]; shed; yanğın ~su fire-station
**deputat** *i* deputy
**deputatlıq** *i the state of being a deputy; duty of a deputy*
**dermatin** *i* leatherette
**dermatologiya** *i* dermatology
**dermatoloq** *i* dermatologist
**desant** *i* 1. landing; 2. *(ordu)* the landing force
**desantçı** *i* paratrooper
**desert** *i* dessert
**despot** *i* despot
**despotcasına** *z* despotically
**despotçuluq** *i bax* **despotizm**
**despotik** *s* despotic, despotical
**despotizm** *i* despotism



**despotluq** *i* despotism
**deşdirilmək** *f* to be* bored, to be* drilled, to be* punched / pierced, to be* perforated
**deşdirmək** *f* to ask / to cause *smb.* to drill *(d.)* / to bore *(d.)*, to ask / to cause *smb.* to punch / to pierce *(d.)*; to have* *(d.)* drilled / bored / punched / pierced
**deşdirtmək** *f bax* **deşdirmək**
**deşik**[1] *i* hole, puncture; gap; deşiyi tutmaq to stop a gap / hole; ~ açmaq *bax* **deşmək**; dişdə ~ a hole in a tooth; siçan deşiyi a mouse's hole; burun deşiyi nostril
**deşik**[2] *s* torn, full of holes, worn through; punctured; ~ çəkmə torn boots; ~ qazan a saucepan with a hole in it; ~ şin a punctured tire
**deşikaçan**[1] *i* 1. puncher; 2. *tex.* punch; driller
**deşikaçan**[2] *s* boring, drilling; ~ dəzgah boring / drilling machine
**deşikaçma** *i* boring, drilling; perforation
**deşik-deşik** *s* holey, full of holes / gaps; ~ etmək to pierce with holes *(d.)*; *(güllə ilə)* to riddle *(d. with)*; adamı ~ etmək *(güllə ilə)* to riddle a man* with shots; ~ olmaq to be* all holes; to be* / to become riddled; *Əgər tərpənsəniz, sizi deşik-deşik edəcəm (güllə ilə)! If you move I'll riddle you with bullets!*
**deşikli** *s (i.s.)* with holes / riddles; *(i.s.)* having holes / riddles, perforated, punctured; ~ kərpic perforated bricks
**deşilmək** *f* 1. to be* riddled / perforated / punctured / drilled; to get* riddled with holes; 2. *(paltar)* to wear through; 3. *(yara)* to open
**deşmək** *f* 1. to drill *(d.)*, to bore *(d.)*, to make* to punch a hole *(in)*, to pierce a hole; *(quş)* to peck *(d.)*; *(komposterlə)* to punch *(d.)*; *(iti silah ilə)* to pierce *(d.)*; *(divarı)* to breach *(d.)*; *(təkəri)* to puncture *(d.)*; *Mıx təkəri deşdi A nail punctured the tyre*; 2. *tex.* to perforate *(d.)*; kağızı ~ to perforate the paper; 3. to gnaw [n ɔ:]; *Dərd ürəyimi deşir Grief gnaws my heart*
**detal** *i* 'detail
**detektiv**[1] *i* detective
**detektiv**[2] *s* detective; ~ roman detective novel / story
**devalvasiya** *i iqt.* devaluation, deprecation
**devirmə** *fi* overthrow; hökümətin ~si overthrow of government
**devirmək** *f* to overthrow* *(d.)*, to overturn *(d.)*; to depose *(d.)*, to dethrone *(d.)*; höküməti ~ to overthrow* the government; *Ordu dövlət başçısını devirdi The army deposed the head of the state*
**deviz** *i* motto
**devriliş** *i bax* **devirmə**
**devrilmə** *fi* deposition, dethronement, overthrow, overturn
**devrilmək** *f* to be* overthrown / deposed / dethroned
**deyə** *bağ.* in order; *İtirməsin deyə o açarı cibinə qoydu He / She put the key into his / her pocket ( in order ) not to lose it; Ora gecikməsin deyə o saat 6-da qalxdı He / She got up at 6 (in order) to be there in time*

**deyə-gülə** *z* merrily, gaily; ~ vaxt keçirmək to have* a jolly good time, to pass *one's* time merrily
**deyək** *ara s.* ~ ki, *Say that ..., Let us assume; Deyək ki, siz haqlısınız Assuming that you are right*
**deyən-gülən** *s* cheerful, joyous, buoyant, merry, jovial; ~ adam cheerful / merry / jovial man*
**deyəsən** *ara s.* seem *(to be + adj. or part.)*, look like, *It seems that ...; Deyəsən, o ağıllıdır He / She seems to be clever, He / She seems clever; Deyəsən, o razıdır He / She seems to be pleased / satisfied, It seems that he / she is pleased / satisfied; Deyəsən, yağış yağacaq It looks like rain*
**deyib-gülən** *s bax* **deyən-gülən**
**deyib-gülmək** *f* to joke, to jest, to chatter; deyib-gülməyi sevmək to be* fond of a joke
**deyici** *i* telltale, informer
**deyicilik** *i* informing; peaching, speaking behind *smb.*; ~ etmək to tell tales *(to smb. about)*, to inform *smb. (about)*; to speak* ill of *smb.*
**deyikləmək** *f* to betroth, to declare betrothed at an early age
**deyikli**[1] *i* betrothed; ~lər the betrothed
**deyikli**[2] *s* betrothed; bir kəsə ~ olmaq to be* betrothed to *smb.*
**deyiklilik** *i the state of being betrothed*
**deyil** *əd to be + not*; *Mən həkim deyiləm I am not a doctor; O, müəllim deyil He / She is not (isn't) a teacher; Biz fəhlə deyilik We are not (aren't) workers*
**deyilən** *s* called; by name, so-called; yuxarıda ~ aforesaid, aforementioned / abovementioned
**deyilmə** *fi* being said / told
**deyilmək** *f* 1. to be* said / told; 2. to be* called / named
**deyilmiş** *fs* said; yuxarıda ~ aforesaid, aforementioned, stated above
**deyindirmək** *f* to cause *smb.* to grumble
**deyingən**[1] *i* grumbler; *(arvad)* shrew
**deyingən**[2] *s* querulous, peevish; ~ qoca querulous old man*
**deyingənlik** *i* peevishness, querulousness
**deyinmək** *f* to grumble *(at)*; öz-özünə ~ to mutter to oneself; burnunun altında ~ to mutter *(into one's beard)*
**deyişdirmək** *f* 1. to ask / to cause two or more people to enter an argument, to ask / to cause two or more people to wrangle *(with)*; 2. to ask / to cause two *(or more)* ashugs *(Caucasian folk poets and singers)* to compete with in poems and singing
**deyişmə** *i* 1. quarrelling, wrangling, altercation; 2. competition between ashugs *(Caucasian folk poets and singers)*; 3. a kind of poem, composed by ashugs
**deyişmək** *f* 1. to quarrel *(with)*, to argue *(with)*; to exchange bandy words *(with)*, to wrangle *(with)*; 2. to compete in telling poems and singing *(of ashugs)*
**dezaktivasiya** *i* decontamination
**dezertir** *i* deserter
**dezertirlik** *i* desertion
**dezinfeksiya** *i* disinfection
**dezinfeksiyaçı** *i* disinfector

**dezinfeksiyaedici** *s* disinfectant; ~ vasitə disinfectant

**də** *əd phonetic variant of the particle* **da**, *used after front vowels*

**dəb** *i* fashion, vogue [voug]; ~də in fashion / vogue; ~ə düşmək to come* into fashion / into vogue, to become* fashionable; ~dən çıxmaq to go* out of fashion / vogue; ~ yaratmaq to introduce a fashion; ~ə salmaq to bring* into fashion *(d.)*; ~ə uyğun / müvafiq in the fashion, fashionably; ~ə uyğun geymək to dress fashionably; son ~də in the latest fashion; ~ salmaq to set* a fashion

**dəbbə**[1] *i* 1. boaster, braggart, show-off; 2. fault-finder

**dəbbə**[2] *s* 1. boastful, vainglorious; 2. fault-finding

**dəbbəçilik** *i bax* **dəbbəlik**

**dəbbələmək** *f* to find* fault on purpose to retract *one's* words/bargain, to go* back on *one's* bargain

**dəbbəlik** *i* 1. boastfulness, vaingloriousness, vainglory; 2. retraction; ~ etmək 1) *bax* **lovğalanmaq**; 2) *bax* **dəbbələmək**

**dəbdəbə** *i* luxury, splender, magnificence

**dəbdəbəli**[1] *s* sumptuous, splendid, magnificent; luxurious; ~ mehmanxana / ev / saray və s. luxurious / magnificent / splendid hotel / house / palace, *etc.*; ~ paltar magnificent dress; ~ həyat magnificent / splendid life, a life of luxury; ~ qonaqlıq sumptuous feast

**dəbdəbəli**[2] *z* luxuriously, sumptuously, splendidly; ~ yaşamaq to live luxuriously / sumptuously, to live in luxurious surroundings, to live in luxury; to live like a lord

**dəbdəbəlik** *i* sumptuousness, magnificence, luxury

**dəbərdilmək** *f* to be* moved/budged

**dəbərişmək** *f* to move / to budge all together

**dəbərmək** *f* to move, to budge; *Qatar dəbərdi The train moved; O, yerindən dəbərmədi He / She didn't budge*

**dəbərtmək** *f* to move *(d.)*, to budge *(d.)*; əlini ~ to move *one's* hand; *Mən daşı dəbərdə bilmədim I couldn't budge the rock*

**dəbilqə** *i* helmet, head-piece; polad ~ steel helmet; dalğıc ~si diving-helmet, diver's helmet

**dəbilqəli** *s (i.s.)* with helmet; *(i.s.)* having helmet

**dəc** *s* complete, perfect; ~ etmək to complete *(d.)*, to make* *(d.)* perfect; ~ bağlamaq to bundle up *(d.)*

**dəcəl**[1] *i* prank, mischief, prankish person

**dəcəl**[2] *s* naughty, prankish, mischievous; ~ uşaq mischievous / naughty child; *d.d.* bundle* of mischief; ~ olmaq to be* naughty; *Dəcəl olma! Don't be naughty!*

**dəcəlləşmə** *fi* becoming mischievous / naughty

**dəcəlləşmək** *f* to become* mischievous / naughty

**dəcəllik** *i* naughtiness, prankishness, mischievousness; ~ etmək to play pranks, to be* up to mischief; *Dəcəllik etmə! Don't play pranks!*

**dəcləmək** *f* 1. to put* in order carefully; 2. to pile up grain and mark

**dədə** *i d.d.* dad, daddy

**dədə-baba**[1] *i* forefathers, ancestors

**dədə-baba**[2] *s* forefather's, grandfather's; ~ adətləri old customs

**dəf** *i* 1. drum; ~ çalmaq to beat* the drum; 2. repulse, ~ etmək to repulse *(d.)*, to parry *(d.)*, to beat* off/back *(d.)*; hücumu dəf ~ etmək to beat* off / to repulse an attack; zərbəni ~ etmək to parry / to repel a blow

**dəfçalan** *i* tambourine player, drummer

**dəfçi** *i bax* **dəfçalan**

**dəfçilik** *i the profession of a tambourine player / drummer*

**dəfə** *i* time, once, occasion; bu ~ this time, for this once, on this occasion; iki ~ twice; üç ~ thrice; bir ~ once; çox ~ often, many times; birinci *(ikinci, üçüncü və s.)* ~ for the first *(second, third, etc.)* time; gələn ~ another time; bir ~ də once again, once more; axırıncı ~ for the last time; gündə bir ~ once a day; ildə iki ~ twice a year; hər ~ every time, each time; birinci və axırıncı ~ once and for all; *İki dəfə iki dörd eylər Twice two is four; Yüz dəfə ölç, bir dəfə biç at. söz.* ~ *Look before you leap; Think before you act*

**dəfələrcə** *z bax* **dəfələrlə**

**dəfələrlə** *z* repeatedly, time and again, more than once, many times, over and again

**dəfəlik** *i*: bir ~ 1) at one go, at a stretch; 2) once and for all, for ever, for ever and ever

**dəfinə** *i* treasure, buried treasure; hoard

**dəfn**[1] *i* burial, funeral

**dəfn**[2] *s* funeral; ~ bürosu funeral parlour, undertaker's office; ~ etmək to bury *(d.)*

**dəfnetmə** *i* burial

**dəfnə**[1] *i* laurel, bay (-tree)

**dəfnə**[2] *s* bay, laurel; ~ ağacı bay-tree; ~ yarpağı bay leaf; ~ çələngi laurels *pl.*, laurel wreath

**dəfnəlik** *i* laurel grove

**dəftər** *i* writing-book; *(məktəbli üçün)* exercise book, copy-book; qaralama üçün ~ rough note-book; şəkil çəkmək üçün ~ drawing book, sketch-book; not ~i music book

**dəftərçə** *i* note-book

**dəftər-kitab** *top. i* copy books and books, writing materials

**dəftər-qələm** *top. i.* copy-books and pens

**dəftərxana**[1] *i* office

**dəftərxana**[2] *s* clerk; *məc.* red-tapist

**dəftərxanaçı** *i* clerk; *məc.* red-tapist

**dəftərxanaçılıq** *i the job of a clerk*

**dəhan** *i bax* **ağız**

**dəhləmək** *f* to drive* on *(d.)*, to urge *(d.)*, to urge on *(d.)*

**dəhliz** *i* passage, entrance *(hall)*, enterroom, corridor

**dəhmərləmə** *fi* driving on, urging on

**dəhmərləmək** *f bax* **dəhləmək**

**dəhmərlənmək** *f* to be* driven, to be* urged on

**dəhnə** *i* 1. *(yüyənin atın ağzına qoyulan dəmir hissəsi)* bit; 2. *(dəyirmanda)* millpond; 3. *(arxın başlanğıcı)* weir

**dəhrə** *i* hook

**dəhrələmək** *f* to cut* with a hook *(d.)*

**dəhrələnmək** *f* to be* cut with a hook



**dəhrələtdirmək** *f bax* **dəhrələtmək**

**dəhrələtmək** *f* to ask / to cause *smb.* to cut *(d.)* with a hook

**dəhrəli** *s* with a hook, having a hook

**dəhrəsiz** *s* hookless, *(i.s.)* without hook

**dəhrəşəkilli** *s* hook-shaped

**dəhşət** *i* terror, horror; ~ə salmaq / gətirmək to terrify *(d.)*, to horrify *(d.)*, to petrify; ~dən titrəmək/əsmək to shudder with horror; ~ə gəlmək to be* horrified; *Nə dəhşətdir! How terrible / horrible!*

**dəhşətləndirmək** *f* to terrify *(d.)*, to horrify *(d.)*, to petrify *(d.)*

**dəhşətlənmək** *f* to be* frightened *(at)*, to be*terrified / horrified

**dəhşətli** *i* terrible, horrible; ~ hava terrible weather; ~ isti terrible heat; ~ müharibə terrible war; ~ külək terrible wind; ~ cinayət a horrible crime

**dəxli** *i*: ~ olmaq to concern *(d.)*; *Bunun mənə dəxli varmı? Does this concern me?*; ~ olmamaq to have* nothing to do *(with)*; not to concern; *Bunun mənə dəxli yoxdur I have nothing to do with it, It's no concern of mine, It's of no concern to me Bunun sənə dəxli yoxdur It's not your business, You have nothing to do with it, It's no concern of yours*

**dəqiq**[1] *s* exact, precise; accurate, punctual; ~ vaxt exact time; ~ tərcümə exact / accurate / faithful translation; ~ adam punctual man*; ~ elmlər exact sciences; ~ alətlər precision instruments; ~ hesablama precise / nice calculation

**dəqiq**[2] *z* exactly, precisely, punctually, sharp, accurately; ~ demək to say*/ to tell* exactly; ~ tərcümə etmək to translate exactly / accurately

**dəqiqə** *i* minute; moment; *İkiyə on dəqiqə işləyib Ten minutes past one; Üçə on dəqiqə qalıb Ten minutes to three; Bir dəqiqə gözləyin Wait a minute; Bu dəqiqə This very moment / minute, At the present moment; O dəqiqə Instantly, In no time, At once; Dəqiqədə bir bax* **dəqiqəbaşı**[2]

**dəqiqəbaşı**[1] *s* occuring every minute, at interval of a minute; continual, incessant

**dəqiqəbaşı**[2] *z (at)* every minute, *(at)* every instant; continually, incessantly

**dəqiqəbədəqiqə** *z* every minute / moment; any minute / moment

**dəqiqəlik** *s* momentary; minute's, moment's; bir ~ istirahət a moment's / minute's rest

**dəqiqləşdirilmək** *f* to be* defined more precisely / accurately

**dəqiqləşdirmək** *f* to specify *(d.)*, to make* exact *(d.)*, to be* made more exact / precise *(d.)*, to define *(d.)* more exactly / precisely, to give* a more precise definition; müqavilənin hər bir bəndini ~ to specify / to determine each point of the contract; məlumatı ~ to make* the information more exact / precise

**dəqiqləşmək** *f* to be*/ to become* more exact / precise / accurate

**dəqiqlik** *i* exactness, precision; accuracy; punctuality; tərcümənin dəqiqliyi faithfulness / fidelity / accuracy of a translation

**dəlalət** *i*: ~ etmək to show *(d.)*, to witness *(d)*, to testify *(d.)*, to give* evidence

**dəldirmək** *f bax* **deşdirmək**

**dəldirtdirmək** *f bax* **deşdirmək**

**dələ** *i zool.* squirrel

**dələduz**[1] *i* swindler, cheat, knave; *d.d.* rogue

**dələduz**[2] *s* roguish, knavish

**dələduzcasına** *z* knavishly, roguishly, like a swindler / knave

**dələduzluq** *i* roguishness, knavishness; *(oyunda)* foul; ~ etmək to swindle, to cheat

**dələmə** *i* fresh cheese, not yet tempered

**dəli**[1] *i* 1. *(kişi)* madman*, *(qadın)* madwoman*; madcap; ipləmə / zəncirli ~ violent / raving lunatic; 2. *(igid)* dare-devil, a very brave man*, man* of courage

**dəli**[2] *s* mad; ~ etmək to drive*/ to send* mad *(d.)*; to madden *(d.)*; to make* *smb.* to fly into rage; ~ olmaq to be* mad, to run*/ to go* mad; to get* mad/crazy; *(bərk hirslənmək)* to fly* into rage; bir kəsin dalınca ~ kimi qaçmaq to run* after *smb.* like mad; bir kəsi ~ etmək to drive* *smb.* mad; *Bu uşaq məni dəli edəcək This child will drive me mad / crazy*

**dəlibaş** *i* 1. madcap; *(qız)* tomboy, hoyden; 2. *(igid)* dare-devil, man of courage

**dəlibaşlıq** *i* unruliness, violence; disorderly / unruly conduct; ~ etmək to get*/ to be* violent, to behave violently

**dəlibəng** *i bot.* stramonium, thornapple

**dəlicəsinə** *z* madly, in a mad way; ~ sevmək to love madly, to be* madly in love; bir kəsi ~ sevmək to love *smb.* madly, to be* mad / crazy about *smb.*; to adore *(d.)*

**dəli-divanə** *i* mad and crazy; ~ etmək to drive* mad *(d.)*/ crazy, to madden *(d.)*; ~ olmaq to be* out of *one's* wits, to go* mad, to go* off *one's* head; bir kəsin / şeyin ~si olmaq to be* crazy about / for *smb.* /*smth.*, to go* crazy with *smb./smth.*; *Səndən ötrü dəli-divanəyəm, əzizim I am crazy about / for you, darling*

**dəlidolu**[1] *i* madcap, romp; dare-devil

**dəlidolu**[2] *s* bold, dashing, valiant, sharp

**dəlidoluluq** *i* alertness, briskness, pertness

**dəlik** *s bax* **deşik**[2]

**dəlik-deşik** *s* with holes, full of holes / gaps

**dəlik-dəlik** *s bax* **deşik-deşik**

**dəliqanlı**[1] *i* daring / bold fellow, dare-devil; *d.d.* dashing fellow

**dəliqanlı**[2] *s* dashing, valiant, mettlesome, violent, perky; full of life/mirth; ~ gənc zabit a dashing young officer

**dəliqanlılıq** *i* boldness, dashing behaviour, bravado; perkiness; ~ etmək to be* violent, to act / to behave dashingly

**dəliqudurmuş** *s* rabid, mad; furious, violent

**dəliqudurmuşluq** *i* violence, unruly / riotous conduct, fury, rage, blind fury

**dəlil** *i* argument, reason, evidence, proof; maddi ~ material evidence; ~ gətirmək to adduce / to furnish / to produce evidence; ~ göstərmək to give* / to show*

**intellekt** *i* intellect; böyük ~ sahibi a man* of mighty intellect
**intellektual** *s* intellectual; ~ qabiliyyətlər intellectual faculties; ~ adam intellectual being (person)
**intellektualizm** *i fəls.* intellectualism
**intellektuallıq** *i* intellectuality
**intensiv**[1] *s* intensive; ~ inkişaf intensive development; ~ əmək intensive labour; ~ iş intensive work
**intensiv**[2] *z* intensively; ~ işləmək work intensively
**intensivləşdirilmək** *f* to be* intensified
**intensivləşdirmə** *fi* intensification
**intensivləşdirmək** *f* to intensify *(d.)*
**intensivləşmək** *f* to get* / to become* intensified
**intensivlik** *i* intensity; əməyin intensivliyi intensity of labour; cərəyanın intensivliyi intensity of current; səsin intensivliyi intensity of sound
**intermedia** *i teatr.* interlude
**internasional**[1] *i bax* **beynəlmiləl**[1]
**internasional**[2] *s bax* **beynəlmiləl**[2]
**internasionalist** *i bax* **beynəlmiləlçi**[1]
**internasionalizm** *i bax* **beynəlmiləlçilik**
**internat** *i (məktəb)* boarding-school
**interval** *i* interval; space; qısa ~ short interval; uzun ~ long interval; *mus.* qısa ~ minor interval; uzun ~ major interval; yeməklər arasında ~ the space between meals
**interviziya** *i* intervision
**intervü** *i* interview; bir kəsə ~ vermək to give* *smb.* an interview; ~ almaq to obtain / to ask an interview; ~ verməkdən boyun qaçırmaq to refuse to give an interview
**intəha** *i* end, limit; *Hər şeyin intəhası var Everything has its end / limit*
**intəhası** *gir. s. (cümlənin əlvəlində)* however, but; *(cümlənin sonunda)* though; *İntəhası, o gəlmədi However, he didn't come. He didn't come, though*
**intəhasız** *s bax* **sonsuz**
**intəhasızlıq** *i bax* **sonsuzluq** *(1-ci mənada)*
**intibah**[1] *i tar.* Renaissance
**intibah**[2] *s*: ~ dövrü Renaissance, Renaissence
**intibahnamə** *i* leaflet; ~ yaymaq to distribute leaflets
**intihar** *i* suicide; self-murder; *hüq.* felo-de-se; ~ etmək to commit suicide
**intiqam** *i* vengeance, revenge; qan ~ı blood feud, vendetta; ~ almaq to revenge *(on)*, to take* vengeance *(on, for)*, to avenge *(d.)*; təhqirə görə ~ almaq to avenge insult; düşməndən ~ almaq to take* vengeance on *one's* enemy
**intiqamçı**[1] *i* avenger, revanchist, revenge seeker
**intiqamçı**[2] *s* vindictive, revengeful, avengeful
**intiqamçılıq** *i* vindictiveness, revengefulness
**intim** *s* intimate; ~ hisslər intimate feelings; bir kəslə ~ münasibətdə olmaq to be* on intimate terms with *smb.*; ~ dostlar intimate friends; ~ əlaqələr intimate relations; bir kəslə ~ əlaqə yaratmaq to establish intimate relations with *smb.*
**intişar** *i* dissemination; spreading, extension; ~ tapmaq to be* spreaded / used widely; təhsilin ~ı the extension of education
**intizam** *i* discipline; əmək ~ı labour discipline; məktəb ~ı school discipline; möhkəm ~ strict / firm discipline; hərbi ~ military discipline; ~a dəvət etmək to discipline *(d.)*; ~ gözləmək, ~a riayət etmək to keep* discipline
**intizamlaşdırılmaq** *f* to be* disciplined
**intizamlaşdırmaq** *f* to discipline *(d.)*
**intizamlaşmaq** *f* to get* / to become* disciplined
**intizamlı** *s* disciplined; ~ uşaq disciplined child*
**intizamlılıq** *i* discipline
**intizamsız** *s* undisciplined, undisciplinable; ~ şagird undisciplined pupil
**intizamsızlıq** *i* lack of discipline, indiscipline
**intizar** *i* anxiety, expectation, waiting anxiously; ~ çəkmək, ~da qalmaq to wait anxiously *(for a long time)*; ~dan qurtarmaq to wait till *(d.)*, to free *oneself* from some care / anxiety; bir kəsdən ~ çəkmək to be* / to feel* anxious about *smb.*
**intizarçılıq** *i bax* **intizar**
**intizarla** *z* anxiously; ~ gözləmək to wait anxiously
**intizarlı** *s* anxious; troubled; ~ baxış anxious / troubled look
**intoksikasiya** *i tib.* intoxication
**intonasiya** *i* intonation; qalxan ~ rising intonation; düşən ~ falling intonation
**intriqa** *i* intrigue; ~ aparmaq to carry on an intrigue, to intrigue *(against)*; bir kəsə qarşı ~ aparmaq to intrigue against *smb.*
**intriqaçı** *i bax* **intriqan**
**intriqaçılıq** *i* intriguing
**intriqan** *i* intrigant [-ga:nt], intriguer [-tri:gə]; *(qadın)* intrigante [-ga:nt]
**intuisiya** *i* intuition; instinct
**intuitiv** *s* intuitive; ~ bilik *(fəhm)* intuitive knowledge
**invariant**[1] *i* invariant
**invariant**[2] *s* invariant *(attr.)*
**invariantlıq** *i riyaz.* invariance
**inventar**[1] *i* stock; kənd təsərrüfatı ~ı agricultral implement; canlı *(malqara)* ~ livestock; cansız ~ equipment
**inventar**[2] *s* inventory; ~ nömrəsi inventory number
**inventarizasiya** *i* inventory making, stock-taking; inventory *(d.)*; ~ etmək *(aparmaq)* to make* an inventory, to inventory *(d.)*, to take* stock *(of)*
**inversiya** *i dilç.* inversion; tam ~ full inversion; yarımçıq / natamam ~ partial inversion
**inyeksiya** *i* injection; ~ etmək to make* an injection *(of)*, to inject *(d.)*
**inzibatçı** *i* administrator
**inzibatçılıq**[1] *i the job of an administrator*
**inzibatçılıq**[2] *s* administrative; ~ bacarığı administrative ability
**inzibati** *s* administrative; official; ~ cəza official reprimand; official scolding; ~ cəza almaq to receive an official reprimand; ~ qaydalarla by administrative means
**ion**[1] *i fiz.* ion
**ion**[2] *s fiz.* ionic; ion *(attr.)*; ~ nəzəriyyəsi ionic theory
**ionizasiya** *i fiz.* ionization; atmosferin ~sı ionization of the atmosphere
**ionlaşdırılmaq** *f* to be* ionized
**ionlaşdırmaq** *f* to ionize *(d.)*
**ionlaşma** *fi* ionization



**ionlaşmaq** *f* to get* / to become* ionized
**ionlaşmış** *fs* ionized
**ionlu** *s* ionized; *(i.s.)* with ion
**ionosfer** *i* ionosphere
**ip** *i* 1. string, twine; 2. cord; *(paltar asmaq üçün)* cloth-line; ~lə bağlamaq to cord *(d.)*, to tie up with cord *(d.)*; paltarı ~dən asmaq *(qurutmaq üçün)* to hang* *(up)* clothes on the line; 3. yarn; yun ~ woolen yarn; pambıq ~ cotton yarn; ◊ ~ə yatırtmaq to curb *(d.)*, to subdue *(d.)*; ◊ ~ə- sapa yatmamaq to yield to no persuasion, to stand *one's* ground; to get* violent / turbulent / uncontrolled; ◊ ~ini çəkmək / yığmaq to pull *smb.* up, to hold* back *(d.)*; ◊ ~i qırmaq to slip away, to get* out of hand
**ipək**[1] *i* silk; xam ~ raw silk; süni ~ artificial silk, rayon silk; ~ kimi silky, silklike, like silk; ◊ ~ kimi olmaq to be* as meek as a lamb, to be* silklike
**ipək**[2] *s* 1. silk *(attr.)*; ~ parça silk cloth; ~ don silk dress; 2. silky, silken; ◊ ~ saç silken / silky hair
**ipəkçi** *i* silkworm breeder
**ipəkçilik**[1] *i* silkworm breeding; *elm.* seri(ci)culture
**ipəkçilik**[2] *s* silkworm breeding; ~ təsərrüfatı silkworm breeding farm
**ipəkeyirən** *s* silk-weaving; ~ fabrik silk-weaving mill; ~ dəzgah silk-weaving loom
**ipəkqurdu** *i zool.* silkworm, bombyx
**ipəyatmaz** *s* stubborn, unmanageable, violent, hard-mouthed; ~ uşaq unmanageable child*
**ipəyatmazlıq** *i* stubbornness, violence
**ipəyirən**[1] *i* spinner
**ipəyirən**[2] *s* spinning; ~ maşın spinning machine
**ipəyirmə** *i* spinning; əllə ~ hand-spinning; maşınla ~ machine-spinning
**ipləmə** *s* violent, turbulent; mad
**ipləmək** *f* to rope *(d.)*, to tie up *(d.)* with a rope
**ipləməlik** *i (of people)* violent / raving lunatic, a wildly foolish person
**iplənmək** *f* to be* roped, to be* tied up with a rope
**iplik**[1] *i* cotton yarn
**iplik**[2] *s* cotton *(attr.)*; ~ parça cotton fabric
**iplikli** *s* half-cotton
**iprit** *i kim.* mustard gas, yperite [ı:pərait]
**ipsiz** *s* 1. ropeless, cordless; 2. *məc.* free-and-easy, over-free
**irad** *i*: ~ etmək to speak*, to utter; nitq ~ etmək to make* / deliver a speech; ~ tutmaq to point out a defect, to rebute *(d.)*, to find* fault *(with)*, to cavil *(at)*; *Siz mənim hər sözümə irad tutursunuz You cavil at my every word*
**iradçı** *i* caviller, faultfinder
**iradə** *i* will, volition; sərbəst / azad ~ free will; möhkəm ~ strong will; dəmir ~ iron will; öz ~si əleyhinə against *one's* own will; bir kəsin ~ sinə tabe olmaq to obey *smb.*'s will, to do* *smth.* as one wishes
**iradəli** *s* strong-willed; resolute, determined; ~ adam strong-willed person
**iradəlilik** *i the state or quality of being strong-willed*
**iradəsiz** *s* weak-willed, flabby; characterless; spineless; ~ adam weak-willed person
**iradəsizlik** *i* lack of will, weak will
**iradi** *s* volitional; *(i.s.)* of the will; ~ hərəkətlər volitional movement; ~ impuls volitional impulse
**iradsız** *s* irreproachable, impeccable; ~ davranış impeccable conduct
**iraq**[1] *s* distant, remote, far, far-away; ~ ölkələr distant / faraway countries
**iraq**[2] *z* far off, far; ~ durmaq to stand* far; ~ düşmək to be* far off, to live in a foreign country; İraq olcun! God forbid!
**iran** *s* Iranian; ~ hökuməti Iranian government
**iranlı** *i* Iranian
**irəli**[1] *s* forward, onward, advancing; ~ hərəkət forward motion, onward movement
**irəli**[2] *z* forward, ahead; ~ getmək to come* forward; İrəli! Forward; Qələbəyə doğru irəli! Onward to victory!
**irəli**[3] *qoş.* before; hamıdan ~ before all
**irəlicədən** *z* beforehand, in good time, in advance; bir şey haqqında ~ fikirləşmək / düşünmək to think* of *smth.* beforehand / in advance
**irəlidə**[1] *z* in front, in advance, ahead of; *İrəlidə nə isə görünürdü Something was seen in front*; ~ getmək to go* in advance; *(bir işdə)* to take* the lead; *Sizin bütün həyatınız irəlidədir Your whole life is before/ahead of you*
**irəlidə**[2] *qoş.* before; ahead *(of)*; ondan ~ before him / her; hamıdan ~ ahead of all
**irəlidəki** *s* the next, the following; ~ kənd the next village; ~ stansiya the following station
**irəlidən** *z* 1. at / from the front; ~ baxmaq to look at the front; 2. (əvvəldən) in advance, beforehand; ~ bilet almaq to book a ticket in advance / beforehand
**irəli-geri** *z* forward and backward, to and fro; *Müəllim sinfin qarşısında irəli-geri gəzirdi The teacher was walking to and fro in front of the class*
**irəliki** *s* 1. last; ~ il last year; 2. *(sabiq)* former; ~ prezident the former president, the ex-president
**irəlilədilmək** *f* to be* advanced; to be* pushed forward / onward
**irəliləmək** *f* to advance, to move forward / further / on; (təkidlə) forge ahead; (vuruşa-vuruşa) to fight* *one's* way forward
**irəliletdirmək** *f bax* **irəlilətmək**
**irəlilətmək** *f* 1. to advance *(d.)*, to move / to push on *(forward) (d.)*; 2. *(inkişaf etdirmək)* to develop *(d.)*; sənayeni ~ to develop the industry
**irəliləyiş** *i* 1. advancement, progress, advance; 2. (işdə, təhsildə və s.) improvement, change for the better, progress
**irəlilik** *i the state of being advanced*
**irəmə** *i bax* **irəməlik**
**irəməlik** *i* badlands, hilly place
**ireşmə** *i rope made of goat's wool*
**iri**[1] *s* large-scale, big, large; coarse; ~ sənaye large-scale industry; ~ kənd təsərrüfatı large-scale agriculture; ~ sovxoz a large state farm; ~ banklar big banks; ~ qum coarse sand
**iri**[2] *z* large; ~ kəsmək to cut* into large pieces; ~ yazmaq to write* large
**iribədən** *s* big, tall, well-grown; ~ adam a tall / well-grown man*

**iribədənli** *s bax* **iribədən**
**iribədənlilik** *i* tallness, *the state of being well-grown*
**iribloklu** *s tik.* large-block (*attr.*); ~ tikinti large-block construction
**iriburun** *s* big-nosed; (*i.s.*) having a big nose
**iriburunlu** *s bax* **iriburun**
**iridənəli** *s*: ~ qum coarse sand; ~ mirvari big pearls; ~ sünbül big grained ear
**iridiş** *s* large-toothed; (*i.s.*) with large teeth
**iridişli** *s bax* **iridiş**
**iridodaq** *s* thick-lipped, big-lipped
**iridodaqlı** *s bax* **iridodaq**
**iriformatlı** *s* large-size
**irigövdəli** *s* 1. (*adam*) tall, big, stout; 2. (*ağac*) big-trunked
**irigövdəlilik** *i* 1. (*adam*) bigness, tallness, stoutness; 2. (*ağac və s.*) the state of being large / big-trunked
**irigöz** *s* big-eyed, large-eyed; (*i.s.*) with big eyes; 2. (*aşsüzən və s.*) big-holed; (*i.s.*) with big holes
**irigözlü** *s bax* **irigöz**
**irigözlülük** *i* 1. *the state of being big-eyed;* 2. (*aşsüzən və s.*) *the quality of having big holes*
**irihəcmli** *s* capacious; voluminous; ~ qazan a capacious saucepan; ~ kitab a voluminous book
**irihəcmlilik** *i* 1. *the state of being capacious;* 2. (*kitab və s.*) *the state of being voluminous*
**iri-xırda** *s* large and little, big and small
**iri-iri** *s* big, large; big-big; ~ qarpızlar big-big watermelons; ~ daşlar big-big stones
**irikolibrli** *s* large-calibre (*attr.*); ~ *top.* large-calibre gun
**iriləmək** *f* to mill coarsely; to cut* largely
**irilənmək** *f* 1. to become* larger, to grow* larger / bigger; 2. (*böyümək*) to grow* up; to develop (*into*)
**iriləşdirilmək** *f* to cause (*d.*) to be grown larger / bigger
**irilətdirmək** *f bax* **irilətmək**
**irilətmək** *f* to cause (*d.*) to grow larger / bigger
**irili-xırdalı** *s* 1. mixed, large and small, coarse and fine; 2. big and little; ~ uşaqlar children big and little
**irilik** *i* 1. coarseness; bigness; largeness; 2. size; bu ~də şəhər a town of this size
**irin** *i* pus; *d.d.* matter
**irinaxma** *i tib.* purulent discharge
**irinlədici** *s biol.* suppurative
**irinləmə** *fi tib.* suppuration, festering, festerment
**irinləmək** *f tib.* to suppurate; (*yara, kəsik*) to fester, to discharge pus; *d.d.* to discharge matter; *Kəsik irinləməyə başladı The cut began to fester*
**irinlətmək** *f* to fester (*d.*), to let* fester (*d.*); to cause (*d.*) to fester
**irinli** *s* festering, suppurative, purulent; ~ yara festering / suppurative wound; ~ appendiks suppurative appendicitis
**irinlik** *i the state of being purulent / suppurative*
**irintörədən** *s* suppurative
**iriölçülü** *s* large-scale; large-measured
**iripanelli** *s* large-panel; ~ tikinti large-panel construction; frame-and-panel construction
**iris** *i* toffee; toffy; *amer.* taffy
**irisifət** *s* large-faced; (*i.s.*) with large face
**irisifətli** *s bax* **irisifət**
**irişdirmək** *f* to make* *smb.* grin, to cause *smb.* to bare *one's* teeth
**irişə-irişə** *z* grinning, smiling; ~ danışmaq to speak* grinning / smiling
**irişmək** *f* to grin, to make* a grin; to show* / to bare *one's* teeth; *İrişmə! Don't grin! Don't bare you teeth!*
**irq** *i* race; ağ ~ the white race; qara ~ the black race; sarı ~ the brown race; kübar ~dən of noble race
**irqçi** *i* racist
**irqçilik**[1] *i* racialism
**irqçilik**[2] *s* racialist, racist
**irqi** *s* racial, race; ~ ayrı-seçkilik racial / race discrimination; ~ münaqişə race conflict; ~ nifrət race hatred
**irland** *s* Irish; ~ dili Irish, the Irish language
**irlandca** *z* Irish; ~ danışmaq ~ to speak* Irish, to speak* the Irish language; ~ yazmaq to write* in Irish; ~ya tərcümə etmək to translate into Irish; ~dan tərcümə etmək to translate from Irish
**irlandiyalı** *i* Irishman*; (*qadın*) Irishwoman*; ~lar the Irish
**irmaq** *i arx. bax* **çay I**
**irradiasiya** *i fiz.* irradiation
**irrasional** *s riyaz.* irrational; ~ ədəd irrational (*number*); tənlik *riyaz.* irrational equation
**irrasionalizm** *fəls.* irrationalism
**irriqasiya**[1] *i k.t.* irrigation
**irriqasiya**[2] *s k.t.* irrigation(al) ~ sistemi irrigation system
**irriqator** *i* irrigator, irrigation expert
**irs** *i* 1. legacy, heritage; keçmişin ~i heritage of the past, legacy of the past; ~ qoyub getmək to leave* a legacy; ◊ mədəni ~ cultural heritage; 2. inheritance; ~dən məhrum etmək to disinherit (*d.*)
**irsən** *z* by right of succession; by heredity, by inheritance, heritably; ~ almaq (*sahib olma*) to inherit (*d.*)
**irsi** *s* heritable, hereditary, inherited; ~ xəstəlik hereditary heritable disease; keyfiyyət inherited quality
**irsilik** *i bax* **irsiyyət**
**irsiyyət** *i* heredity
**irtica** *s siya.* reaction; beynəlxalq ~ international reaction
**irticaçı** *s* reactionary; reactionist; ~ qüvvələr reactionary forces, forces of reaction
**irticaçılıq** *i* reactionary character
**irtmək** *i* 1. (*heyvanda*) scut; 2. *anat.* coccyx, coccyges
**irtməkləmək** *f* to catch* / to seize by the scut
**isbat** *i* proof, evidence; argument; ~ etmək ~ a yetirmək to prove (*d.*); təcrübədə ~ etmək to prove in practice; ~ olunmaq to be* proved
**isbatedilməz** *s* which cannot be proved, indemonstrable; ~ həqiqət indemonstrable truth
**isbatlı**[1] *s* decent, proper, becoming; seemly, decorous; ~ paltar decent dress; ~ adamlar decent people
**isbatlı**[2] *z* decently, becomingly, decorously; ~ geyinmək to dress becomingly / decently
**isbatlılıq** *i* decency, seemliness; decorum



**isbatsız**[1] *s* indecent, improper, unbecoming, indecorous, unseemly; ~ davranış indecent behaviour; ~ nitq improper speech
**isbatsız**[2] *z* indecently, improperly; özünü ~ aparmaq to behave improperly / indecently
**isbatsızlıq** *i* indecency, unseemliness
**ishal** *i tib.* diarrhoea [daıə'rıə]; qanlı ~ bloody flux
**isidici**[1] *i* hot-water bottle; (*elektriklə isidilən*) heating pad
**isidici**[2] *s*: ~ kompres hot compress
**isidilmiş** *fs* heated, warmed
**isim** *i* 1. *arx.* name; *Çsminiz nədir? What is your name?* 2. *dilç.* noun; ümumi ~ common noun; xüsusi ~ proper noun; konkret ~ concrete noun; mücərrəd ~ abstract noun
**isimləşmə** *fi dilç.* substantivization, becoming a noun
**isimləşmək** *f dilç.* to substantivize, to get* substantivized
**isimləşmiş** *fs dilç.* substantivized
**isimsiz** *z* 1. nameless; (*i.s.*) without a name; 2. nounless, (*i.s.*) without a noun
**isindirilmək** *f* to be heated / warmed
**isindirmək** *f bax* **isitmək** *(1-ci mənada)*
**isinişdirilmək** *f* to be* accustomed (*to*) / used (*to*); to be* acclimatized
**isinişdirmək** *f* to accustom (*d.*) to, to make* used to (*d.*); to bring* (*d.*) together; to acclimatize (*d.*)
**isinişmək** *f* to get* accustomed (*to*) / used (*to*); to become* friends (*with smb.*); to become* acclimatized; *Onlar bir-birinə isnişiblər They have got accustomed to each other, They have become friends with each other; Uşaq nənəsinə isnişib The child has got accustomed to his / her grandmother*
**isinmək** *f* to get* warmer; to warm *oneself*; to warm up; *Hava gündən-günə isinir The weather is getting warmer day by day; Otaq isinir The room is warming up*
**isitmə** *i tib.* fever, malaria; ~ yə düşmək to be* taken ill with malaria, to fall* ill with malaria
**isitmək** *f* 1. to warm (*d.*), to heat (*d.*); əllərini ~ to warm *one's* hands; şorbanı ~ to warm up the soup; *Ocaq otağı isidir The fire warms the room;* 2. to have* a high temperature; 3. to fall* ill with malaria; to be* taken ill with malaria
**isitməli** *s tib.* malarial; ~ xəstə malarial patient; ~ (*isitmə yayan*) ağcaqanad malarial mosquito
**iskəncəbi** *i* a drink *(made of vinegar, honey and sugar)*
**iskənə** *i* chisel [-zəl]
**iskənələmək** *f* to chisel (*d.*) (*into, out*)
**iskənələnmək** *fi* to be* chiseled out; to be* chiseled into
**iskənələtmək** *f* to ask / to cause *smb.* to chisel (*d.*) (out, into)
**isladılmaq** *f* to be soaked
**isladılmış** *fs* soaked; ~ paltar soaked clothes
**islah**[1] *i* amendment; correction; mətni ~ etmək to amend the text
**islah**[2] *s* reformatory, corrective, correctional; ~ koloniyası reformatory; *amer.* approved school
**islahat** *i* reform; pul ~ ı currency reform; torpaq ~ ı land reform; köklü ~ lar sweeping reforms
**islahatçı** *i* reformer, reformist
**islahatçılıq**[1] *i* reformism
**islahatçılıq**[2] *s* reformative, reformatory; ~ siyasəti reformative policy
**islahedici** *s* corrective, reformatory; ~ tədbirlər corrective measures
**islahedilməz** *s bax* **islaholunmaz**
**islahedilməzlik** *i bax* **islaholunmazlıq**
**islaholunmaz** *s* incorrigible, hopeless; ~ yalançı incorrigible liar; ~ səhv incorrigible mistake / error
**islaholunmazlıq** *i* incorrigibility
**islaq** *s* wet; soggy; ~ paltarlar wet clothes; ~ torpaq soggy ground; islağa qoymaq to soak (*d.*); (*kətanı*) to ret (*d.*); çirkli paltarı islağa qoymaq to leave* the dirty clothes to soak
**islam**[1] *i* Islam
**islam**[2] *s* Mohammedan, Moslem; ~ dini *bax* **islamlıq**
**islamçılıq** *i bax* **islamlıq**
**islamiyyət** *i bax* **islamlıq**
**islamlıq** *i* Mohammedanism, Islamism, Islam
**island**[1] *i bax* **islandiyalı**
**island**[2] *s* Iceland (*attr.*), Icelandic; ~ dili Icelandic, the Icelandic language
**islandca** *z* Icelandic; ~ danışmaq to speak* Icelandic, to speak* the Icelandic language; ~ yazmaq to write* in Iclandic
**islandiyalı** *i* Icelander
**islanmaq** *f* 1. to get* wet / soaked; to be* soaked; sümüyünə kimi / qədər ~ to get* wet / soaked to the skin; *Palto tamam / bütün islanıb The coat is wet through; Əzizim, siz tamam islanıbsınız My dear, you are soaked through; Biz hamımız islanmışıq We have all got soaked*
**islanmış** *fs* soaked, wetted; ~ paltar (*yağışdan və s.*) wet clothes; (*vannada*) soaked clothes
**islatdırmaq** *f* to ask / to cause *smb.* to soak (*d.*), to ask / to cause *smb.* to wet (*d.*)
**islatmaq** *f* to soak (*d.*), to wet (*d.*); paltar ~ to soak clothes; saçını ~ to wet *one's* hair; yerini ~ (*yerinə işəmək*) to wet *one's* bed; *Uşaq yenə də yerini isladıb The baby has wetted its bed again;* su ilə ~ to wet* with water
**ismarış** *i* information; ~ göndərmək to inform (*d.*), to send* information (*to*); ~ almaq to get* / to obtain information (*from*)
**ismarlamaq** *f* to send word; to send information (*to*), to ask *smb.* to do *smth.*
**ismarlanmaq** *f* to be informed, to be asked to do *smth.*; to be* sent word
**ismət** *i* 1. honour, respect; reputation; 2. (*qızlarda, qadınlarda*) chastity; ~ ini qorumaq to defend *one's* chastity; ~ inə toxunmaq to dishonour (*d.*), to disgrace (*d.*); ~ ini itirmək to lose* *one's* honour, to become* disgraceful
**ismətli** *s* 1. honest, honest-minded; blameless, faultless, upright; virtue; ~ adam an honest / blameless person; 2. chaste; ~ gözlər chaste eyes; ~ arvad a chaste wife

**ismətlilik** *i* 1. honesty, uprightness; 2. chasteness, chastity
**ismətsiz** *s* dishonest, dishonourable
**ismətsizcə** *z* dishonourably, disgracefully
**ismətsizlik** *i* dishonourableness; disgrace, dishonour
**isnad**[1] *i* reference; bir kəsə / şeyə ~ etmək to make* reference to *smb.* / *smth.*
**isnad**[2] *s* reference *(attr.)*; ~ nöqtəsi reference point
**ispan**[1] *i* Spaniard; *(qadın)* Spanish woman*
**ispan**[2] *s* Spanish; ~ dili Spanish, the Spanish language
**ispanaq**[1] *i bot.* spinach ['spɪnɪdʒ]
**ispanaq**[2] *s bot.* spinach; ~ yarpağı spinach leaf
**ispanca** *z* Spanish; ~ danışmaq to speak* Spanish, to speak* the Spanish language; ~ yazmaq to write* in Spanish; ~ demək to say* in Spanish
**ispaniyalı** *i* Spaniard, the citizen of Spain
**ispolkom** *i* executive committee
**israf** *i* expense, expenses; squander; ~ etmək to waste *(d.)*; to squander *(d.)*, to use aimlessly / in vain; pulunu ~ etmək to waste *one's* money, to squander one's money; gücünü / qüvvəsini ~ etmək to squander *one's* strength / energy
**israfçı**[1] *i* squanderer, spendthrift, waster
**israfçı**[2] *s* wasteful, spendthrift *(attr.)*, extravagant; ~ qadın extravagant woman*; ~ vərdişlər wasteful habits
**israfçılıq** *i* squandering, wastefulness, dissipation; ~ etmək to squander *(d.)*, to waste *(d.)*; to dissipate *(d.)*
**israilli** *i* Israeli [ɪz'reɪlɪ]
**israr** *i* insistence, persistence; urgency; ~ etmək to persist *(in + ger.)*, to insist *(on / upon + ger)*; öz dediyində ~ etmək to have* *one's* own way, to stand* *one's* ground
**israrla** *z* persistently, insistently, urgently
**israrlı** *s* persistent, insistent, urgent
**istedad** *i* talent *(for)*, gift *(for)*; qeyri-adi ~ extraordinary / unusual talent; böyük ~ sahibi a man of great talent; musiqiyə ~ı olmaq to have* a talent / a gift for music; dilə ~ı olmaq to have* a gift for language; öz ~ını inkişaf etdirmək to develop *one's* talent; ~ını göstərmək to display / to show* *one's* talent
**istedadlı** *s* talented, gifted ['gɪf-]; ~ aktyor / yazıçı / rəssam və s. talented actor / writer / painter, etc.; ~ adam a talented / gifted person; ~ uşaq a gifted child
**istedadlılıq** *i* giftness, gifted nature, talent
**istedadsız** *s* talentless, untalented, ungifted, *(i.s.)* without talent; ~ adam talentless person, a person without talent
**istedadsızlıq** *i* lack of talent; *the state of being without talent / gift*
**istefa** *i* resignation; retirement; ~ ya çıxmaq to resign, to retire, to go* into retirement; ~ da olmaq to be* retired; ~ da olan polkovnik retired colonel; hökumət ~ sı resignation of a government
**istehkam** *i* fortification
**istehkamçı**[1] *i* field-engineer, sapper; *amer.* combat engineer
**istehkamçı**[2] *s* field-engineer *(attr.)*; *amer.* combat engineer *(attr.)*; ~ rota field-engineer company; ~ işi field engineering
**istehkamçılıq** *i the profession of a sapper / field-engineer; amer. the profession of a combat engineer*
**istehlak**[1] *i* consumption, use
**istehlak**[2] *s* consumption *(attr.)*; use; ~ şeyləri objects of consumption; ~ malları consumer goods ~ dəyəri use value; ~ kooperativi consumer's cooperatives
**istehlakçı** *i* consumer, user; ~ ların cəmiyyəti consumer's society
**istehsal**[1] *i* production, manufacture; kütləvi ~ mass production; maşın ~ı production of machines, ayaqqabı ~ı manufacture of shoes; məişət malları ~ı production of consumer goods
**istehsal**[2] *s* production *(attr.)* industrial; productive; ~ planı production plan; ~ münasibətləri relations of production; ~ prosesi industrial process; ~ gücü productive capacity
**istehsalat**[1] *i* plant, factory, works; ~da işləmək to work at a plant / at a factory
**istehsalat**[2] *s* production, industrial; ~ iclası production conference, conference* of production; ~ stajı industrial work record
**istehsalatçı** *i* production / industrial worker, one engaged in production
**istehsalçı** *i* producer; xırda ~ small producer
**istehza** *i* 1. irony; acı ~ biting irony; ◊ taleyin ~ sı irony of fate; ~ ilə danışmaq to speak* ironically *(of)*; ~ ilə baxmaq to look ironically; 2. mockery; ~ etmək to mock *(at)*
**istehzalı** *s* ironic, ironical, quizzical; ~ baxış ironical / quizzical glance / look; ~ təbəssüm quizzical smile
**istehzasız**[1] *s (i.s.)* without irony; mockless
**istehzasız**[2] *z* without irony, without mock; ~ danışmaq to speak* without irony / mock
**istehzayana** *z* ironically, with irony, quizzically; ~ baxmaq to glance / look ironically / quizzically
**istək** *i* wish, desire; (güclü) longing; Sizin istəyinizə görə In accordance with your desire; bir kəsin istəyini yerinə yetirmək to meet* *smb.'s* wish; *Necə istəyirsiniz As you wish*
**istəkli**[1] *i* beloved, darling, dear, dearest *Tom öz istəklisi ilə getdi Tom went away with his dear*
**istəkli**[2] *s* desired, beloved, dear; ~ arvad a beloved wife; ~ ər a beloved husband; mənim ~ dostum a dear friend of mine
**istəklilik** *i the state of being beloved / dear*
**istəksiz**[1] *s* reluctant, unwilling
**istəksiz**[2] *z* reluctantly, unwillingly, with reluctance
**istəksizlik** *i* reluctance, unwillingness
**istəmədən** *z* unintentionally, involuntarily, unwillingly; by accident, accidentally
**istəmək** *f* 1. to want *(d., + to inf.)*; to like *(d., + to inf.)*; çay / çörək / su və s. ~ to want tea / bread/ water, etc.; görmək ~ to want to see; *Mən sizi görmək istəyirəm I want to see you; Demək istəyirəm I want to say; Kitab istəyirəm I want a book;* 2. to ask; kömək ~ to ask for help; bir kəsin qızını ~ to ask someone for the hand of his / her daughter; ◊ *İstəyənin bir üzü, verməyənin iki üzü qara at. söz. ≅ It's more embarrassing to refuse than to ask;* 3. to love; *Uşaq anasını çox istəyir The child loves its mother very much*



**istəməli** *s* lovable, loveable, *(i.s.)* worthy of love; desirable; ~ qadın a desirable woman*; ~ uşaq a lovable child
**istəməz**: It's not necessary, It's not needed
**istənilmək** *f* 1. to be* wanted; 2. to be* asked; 3. to be* loved
**istənilməli** *s* loveworthy, *(i.s.)* worthy of love, worth loving; *(i.s.)* deserving love
**istər** *bağ.* or; either ... or; ~ siz, ~ biz you or we; ~ bu gün, ~ sabah today or tomorrow, either today or tomorrow
**istər-istəməz** *z* willingly or unwilligly, willy-nilly, like it or not; *İstər-istəməz siz getməlisiniz You must go willy-nilly*
**istətdirmək** *f* to cause *(d.) s.o.* to want *(d.)*; to cause *(d.)* to ask *(d.)*; to love *(d.)*
**istətmək** *f* bax **istətdirmək**
**isti**[1] *i* heat; yay ~ si summer heat; ~ dən əziyyət çəkmək to suffer from the heat
**isti**[2] *s* 1. hot; ~ gün a hot day; ~ bulaq hot spring; ~ su hot water; 2. warm; ~ palto warm coat; ~ ölkələr warm countries
**istiarə** *i ədəb.* metaphor
**istibdad**[1] *i* despotism
**istibdad**[2] *s* despotic, despotical
**istibdadçı** *i* despot
**istibdadçılıq** *i* despotism
**isticə** *s* warmish, likewarm, terpid, slightly warm
**istifadə** *i* use; utilization; ~ etmək to use *(d.)*, to make* use *(of)*; to utilize *(d.)*; to enjoy *(d.)*; bacarığından ~ etmək to utilize *one's* abilities; ~ dən çıxmaq to get* / to go* out of use, to be* no longer in use, to fall* into disuse, to cease to be used; fürsətdən ~ etmək to take* an opportunity; hüquqdan ~ etmək to enjoy the rights; imtiyazdan ~ etmək to enjoy privileges
**istifadələnmək** *f* to make* use *(of)*, to profit *(by)*
**istifadəsiz** *(istifadədə olmayan) s* unused; untapped; ~ boşqablar unused plates; ~ ehtiyatlar untapped reserves; ~ mənbələr untapped resources
**istifadəsizlik** *i the state of being unused / untapped*
**istixana**[1] *i* hothouse, greenhouse
**istixana**[2] *s* hothouse *(attr.)*; ~ bitkiləri hothouse plants; ~ dirrikçiliyi hothouse market gardening
**isti-isti** *z* while it is hot; *Bəzi adamlar çayı isti-isti içməyi xoşlayırlar Some people like to drink tea while it is hot; Dəmiri isti-isti döyərlər at. söz. ≅ Strike the iron while it is hot*
**istiqamət** *i* 1. *(müxtəlif mənalarda)* direction; bütün ~ lərdə in all directions; cənub ~ ində in the direction of South; hücumun ~ i *hərb.* line of advance
**istiqamətləndirici** *s bax* **istiqamətverici**
**istiqamətləndirilmək** *f* to be* guided, to be* directed
**istiqamətləndirmək** *f* 1. to direct *(d. at, to)*, to turn *(d. to)*; 2. *(silahı)* to aim *(d. at)*, to level *(d. at)*; diqqətini ~ to direct *one's* attention *(to)*
**istiqamətlənmək** *f* 1. to be* directed / turned *(to)*; 2. *(silah)* to be aimed; 3. to make *one's* way *(to, towards)*, to direct *one's* steps *(to, towards)*, to pick one's way *(towards)*; to be* bound *(for)*; *Gəmi Bakıya istiqamətləndi The steamer was bound for Baku*
**istiqamətverici** *s* guiding, leading; *hərb.* directing; ~ qüvvə guiding / directing force
**istiqanlı** *s* 1. *zool.* warm-blooded; ~ heyvanlar warm-blooded animals; 2. pleasant, pleasing, likeable, attractive; 3. hot-tempered, quick-tempered; *d.d.* peppery; ~ adam *(çılğın)* hot-tempered / quick-tempered person
**istiqanlılıq** *i* 1. *zool.* warm-bloodness; 2. likeableness; attractiveness
**istiqbal** *i* 1. the future; parlaq ~ bright future; 2. meeting; ~ a çıxmaq to meet* solemnly, to go* to meet solemnly
**istiqbalçı** *i arx.* one who meets / who goes to meet *(d.)*
**istiqlal** *i bax* **istiqlaliyyət**
**istiqlaliyyət**[1] *i* independence; sovereignty; milli ~ national independence; ~ qazanmaq to become* independent, to enjoy independence; to win* independence
**istiqlaliyyət**[2] *s*: independent; ~ günü the day of independence, Independence day
**istiqlaliyyətçi** *i* freedom lover, one who fights for independence
**istiqraz** *i* loan; dövlət ~ ı state loan; daxili ~ internal loan; xarici ~ foreign loan
**istila** *i* conquest; aggression; ~etmək to conquer *(d.)*
**istilaçı**[1] *i* conqueror, aggressor
**istilaçı**[2] *s* aggressive, predatory
**istilaçılıq**[1] *i* 1. aggression; 2. the act of aggression
**istilaçılıq**[2] *s* aggressive; ~ siyasəti aggressive policy; ~ müharibəsi aggressive war, war of aggression
**istilah** *i bax* **termin**
**istiledici** *s* heating; hot; ~ aparat heating apparatus; ~ içki heating drink; ~ kompres hot compress
**istiləndirilmək** *f* to be* heated, to be* warmed
**istiləndirmək** *f* to heat *(d.)*, to warm *(d.)*
**istilənmək** *f* to get* / to become* warmer; to warm up
**istiləşdirmək** *f bax* **istiləndirmək**
**istiləşmək** *f* to get* / to become* warmer, to warm up; istiləşir It's getting warm (er)
**istilətmək** *f bax* **isitmək** *(1-ci mənada)*
**istilik**[1] *i* heat; warmth; 35 dərəcə ~ 35 degrees above zero; ~vermək to give* out warmth; *Soba istilik vermir The stove gives out no warmth*
**istilik**[2] *s* thermal; heat *(attr.)*; ~ mühərriki heat-engine; ~ enerjisi heat / thermal energy; ~ tutumu thermal / heat capacity
**istilikkeçirən** *s fiz.* heat-conducting
**istilikkeçirmə** *i fiz.* heat / thermal conductivity
**istiliкölçən** *i (cihaz) fiz.* calorimeter
**istilikötürmə** *i fiz.* heat transfer / transmission
**istiliksevən** *s bot., zool.* heat-loving; ~ bitkilər heat-loving plants; ~ heyvanlar heat-loving animals
**istilikvermə** *i fiz.* heat irradiation, heat emission
**istinad**[1] *i (həm məc. həm də müst.)* support; etmək to base (on)
**istinad**[2] *s*: ~ nöqtəsi foothold; ~ nöqtəsi tapmaq to gain a foothold

**istinadgah** *i* 1. shelter; ~ tapmaq to find* a shelter / *(daldanacaq)* asylum; 2. support; foothold; 3. stronghold; bulwark; sülhün ~ı stronghold / bulwark of peace

**istintaq**[1] *i* 1. interrogation, questioning; examination; ~etmək / aparmaq to interrogate *(d.)*, to question *(d.)*; to examine *(d.)*; 2. *hüq.* investigation; inquest; ilkin ~ preliminary investigation; məhkəmə ~ı judicial investigation

**istintaq**[2] *s* investigating, investigation *(attr.)*, investigatory; ~ orqanları investigating bodies / agencies

**istintaqçı** *i* investigator

**istiot** *i* pepper; qara (qabıqlı, döyülməmiş) capsicum; (qırmızı) cayenne pepper [ˌkeıen ˈpepə]

**istiotqabı** *i* pepper-box, pepper-pot

**istiotlamaq** *f* to pepper *(d.)*; əti ~ to pepper meat

**istiotlanmaq** *f* to be* peppered

**istiotlanmış** *fs* peppered; ~ ət peppered meat

**istiotlatdırmaq** *f bax* **istiotlatmaq**

**istiotlatmaq** *f* to ask / to cause *smb.* to pepper *(d.)*

**istiotlu** *s* pepper *(attr.)*, peppery; ~ xörək peppery meal

**istiotluq** *i* pepper-bed, place / bed planted with pepper

**istiotluluq** *i the quality / state of being peppery*

**istirahət**[1] *i* rest; relaxation; yay ~i summer rest; ~ etmək to rest, to have* a rest; to be* on holiday

**istirahət**[2] *s* rest; holiday; ~ günü rest-day; day of rest; day off; ~ evi rest / holiday home

**istirahətsiz** *s* restless, fidgety, uneasy; anxious; ~ uşaq restless / fidgety child, fidget

**istirahətsizlik** *i* restlessness; uneasiness

**istismar**[1] *i* 1. exploitation; 2. *(mexanizmi, müəssisəsi və s.)* operation, exploitation; ~ etmək to exploit *(d.)*; to operate *(d.)*; əməyi ~ etmək to exploit labour; kasıbları ~ etmək to exploit the poor; ~a vermək to put* into operation *(d.)*, to turn over for operation *(d.)*; dəmir yolunu ~a vermək to put* into operation a railway

**istismar**[2] *s* operation *(attr.)*, running; ~ xərcləri operation / running costs

**istismarçı**[1] *i* exploiter

**istismarçı**[2] *s* exploiter *(attr.)*; ~ siniflər the exploiter classes

**istismarçılıq** *i the act of exploitation*

**istisna** *i* exception; ~ təşkil etmək to be* an exception; ~ etmək to exclude *(d.)*; to except *(d.)*; ~ etmək yolu ilə by way of exception

**istisnalıq** *i* exceptional nature, exceptionality, exceptionalism

**istisnasız** *z* without exception

**isti-soyuq** *i* the heat and the cold; özünü ~dan qorumaq to protect *oneself* from the heat and cold

**isti-soyuqluq** *i*: ~ isti soyuqluğu olmamaq to have* nothing to do *(with)*, to have* no concern *(with)*; *Bunun mənə isti-soyuqluğu yoxdur I have nothing to do with it, I have no concern with it*

**istisu** *i* istisu *(hot water, a kind of mineral water in Azerbaijan)*

**iş**[1] *i* work, job; business; occupation; affair, matter; çətin ~ hard / difficult work; elmi ~ scientific work; ictimai ~ social work; ~ axtarmaq to look for job / for work; ◊ ~ başında at *one's* work; ~ açmaq to raise* unnecessary difficulties; ~i düşmək to apply to someone *(for help, advice, etc.)*; ~ə düşmək to get* into trouble, to meet* difficulties; birinin başına ~ açmaq to get* *smb.* into trouble; *Belə işlər keçməz This sort of things can't go / won't do!*; *Mənim işlərimə qarışma(yın), öz işinlə məşğul ol(un) Don't meddle with my business, mind your own business / affairs*

**iş**[2] *s* working; ~ günü / vaxtı / paltarı / saatları / yeri working day / time / clothes / hours / place

**işarə** *i* 1. sign [saın]; mark; bərabərlik ~si sign of equality; yol hərəkəti ~ləri road / traffic signs; nida ~si *qram.* exclamation mark; sual ~si *qram.* question mark; durğu ~ləri *qram.* punctuation marks; ~ vermək to sign, to give* a sign; to signal; ~ etmək / qoymaq to mark *(d.)*, to sign *(d.)*, to note *(d.)*; *Mən işarə verənə kimi / qədər gözləyin Wait till I give a sign*; 2. *(göz, qaş işarəsi)* hint, allusion; incə / zərif ~ gentle hint

**işarələmək** *f* to mark *(d.)*; to mark out *(d.)*, to mark off *(d.)*

**işarələnmək** *fi* to be* marked, to be* marked out

**işarələtdirmək** *f bax* **işarələtmək**

**işarələtmək** *f* to ask / to cause *smb.* to mark *(d.)*

**işarəli** *s (i.s.)* with mark / sign, *(i.s.)* having mark / sign

**işarəlilik** *i the state of being marked*

**işarəsiz** *s* markless; *(i.s.)* without a mark / a sign

**işarəsizlik** *i the state of being markless/ signless*

**işarət** *i bax* **işarə**

**işarmaq** *f* to shimmer, to glimmer, to flicker

**işartı** *i* shimmering, flicker, glimmer

**işbacaran** *s (i.s.)* capable of working, efficient

**işbaz**[1] *i* businessman*; *(qadın)* businesswoman*

**işbaz**[2] *s* efficient, business-like

**işbazlıq** *i* efficiency, business-like character

**işbilən** *s bax* **işbacaran**

**işburaxma** *i* absence *(from work)*

**işcil** *s* efficient, business-like; hard-working; ~ katib an efficient secretary

**işcillik** *i* business-like character, efficiency

**işçi** *i* worker, *(qadın)* woman-worker; ixtisaslı ~ skilled worker; rəhbər ~ person in charge

**işdək** *i* business-like, efficient

**işdənçıxarma** *i* discharge, dismissal

**işdənkənar** *s* non-working; ~ vaxt non-working time

**işgəncə** *i* torture; ~ vermək to torture *(d.)*, to put* *(d.)* to the torture; *Polis onlara işgəncə verdi The police tortured them*

**işgəncəli** *s* agonizing, poignant; ~ şübhələr agonizing doubts; ~ xatirələr poignant memories

**iş-güc** *top. i* all kinds of business / work / affairs; bir kəsi ~dən etmək to prevent *smb.* from working, to tear* *smb.* away from work; ~ü olmaq to be* busy; ~ü başdan aşmaq to be* very busy, to have* much work to do

**işgüzar** *s* 1. business *(attr.)*; ~ adam businessman*; ~ dairələr business circles; ~ söhbət talk on business matters; 2. efficient, business-like, practical; ~ katib



efficient secretary; ~ əlaqə business-like co-operation; ~ məsləhət practical advice

**işgüzarcasına** *z bax* **işgüzarlıqla**

**işgüzarlıqla** *z* efficiently, in an efficient way / manner

**işğal** *i* occupation; ~ etmək to occupy *(d.)*; ölkəni / şəhəri və s. ~ etmək to occupy a country / town, etc.

**işğalçı**[1] *i* occupier, invader

**işğalçı**[2] *s* occupation; ~ ordu occupation troop

**işğalçılıq**[1] *i the character of being aggressive*

**işğalçılıq**[2] *s* aggressive, annexationist, expansionist; ~ müharibələri wars of conquest / aggression, aggressive wars; ~ siyasəti annexationist / expansionist policy, aggressive policy

**işədüzəltmə** *i* placing in a job, provision of employment

**işəmə** *fi tab.* urination

**işəmək**[1] *i* to urine; to water, to piss *tab. O, şalvarına işəyib He's pissed his trousers*

**işəmək**[2] *f* to urinate; *d.d.* to water; yerinə ~ to wet *one's* bed

**işəmuzd** *s*: ~ əmək haqqı piece-work payment, piece-rate pay

**işəmuzdçu** *i* piece-worker

**işəmuzdçuluq** *i* piece-work

**işəyarar** *s bax* **işəyarayan**

**işəyararlıq** *i* 1. ability to work; 2. helpfulness; usefulness

**işəyarayan** *s* 1. able-bodied, *(i.s.)* capable of working, *(i.s.)* able to work; 2. helpful; useful, giving help

**işığahəssas** *s* light-sensitive; ~ kağız sensitized paper; photographic paper

**işığahəssaslıq** *i fiz.* photo-sensitivity

**işıq**[1] *i* light; gündüz işığı daylight; günəş işığı sunlight; ay işığı moonlight; ~da by the light; şam işığında by the light of a candle, by candlelight; ay işığında by moonlight; ~ salmaq to shed* / to throw* light *(on)*; bir kəsin işığını kəsmək to stand* in *smb.'s* light; *İşığımı kəsmə! Don't stand in my light!*

**işıq**[2] *s* light *(attr.)*; ~ siqnalı light signal; ~ dalğası *fiz.* light wave; ~ seli *fiz.* luminous flux

**işıqlandırılmaq** *f* to be lightened / lighted

**işıqlandırma** *fi* 1. lighting, illumination; süni ~ artificial lighting; 2. *məc.* elucidation; *(izah)* interpretation

**işıqlandırmaq** *f* 1. to lighten *(d.)*, to light up *(d.)*; to illuminate *(d.)*; otağı ~ to light the room; 2. *məc.* to elucidate *(d.)*, to throw* light *(on, upon)*

**işıqlanmaq** *f* to light up, to brighten; to be* lighted; *Səma işıqlanır The sky is brightening; İşıqlanır It is dawning, Day is breaking; İşıqlanıb It's already daylight*

**işıqlaşar-işıqlaşmaz** *z* as soon as day breaks, very early in the morning, as soon as dawn breaks

**işıqlaşmaq** *f* to brighten; to clear up; *İşıqlaşır It's dawning, Day is breaking*

**işıqlatdırmaq** *f bax* **işıqlatmaq**

**işıqlatmaq** *f* to brighten *(d.)*, to light *(d.)*

**işıqlı** *s* light; ~ otaq a light room ; ◊ ~ dünya the world

**işıqlıq** *i* lightness; otağın işıqlığı lightness of the room; işıqlığa çıxmaq to be* / to get* free, to begin to live happily; *İşıqlığa çıxasan! Be happy*

**işıqsız** *s* lightless; *(i.s.)* without light, *(i.s.)* having no light

**işıqsızlıq** *i* lightlessness, absence of light

**işıqucu** *i məc.* a slight opportunity

**işıldamaq** *f* to sparkle, to twinkle, to glitter, to glimmer

**işıldayan** *s* luminous; *(fosforlu)* phosphorescent; ~ rəng luminous paint; ~ işarələr luminous signs; 2. shining, beaming

**işıltı** *i* distant faint light; glimmer, flicker; ümüd ~sı a glimmer / a flicker of hope

**işım-işım** *z*: ~ işıldamaq to twinkle / glimmer very brightly

**işlədici** *s (dərman)* purgative; ~ imalə purgative enema

**işlədilmək** *f* to be* used, to be* in use; geniş ~ to be* in wide / common usage, to be* widely used

**işlək** *s* 1. efficient, hard working; ~ fəhlə efficient work; ~ adam a hard-working person, an industrious person; 2. everyday; ~ ifadə everyday expression

**işləmək** *f* 1. to work; ciddi / bərk / səylə ~ to work hard, to work with zeal / diligence; to work tooth and nail *idiom.*; kitab üzərində ~ to work on a book; fabrikdə ~ to work at a factory; qul kimi ~ to work like a slave; 2. *(motor və s.)* to run*, to function; *Motor rahat işləyir The engine is running smoothly; Telefon işləmir The telephone doesn't function, The telephone is out of order*; 3. *(mağaza, kitabxana və s.)* to be* open; *Kitabxana saat 9-a kimi işləyir The library is open till 9 o'clock*; 4. (cinayət) commit; cinayət ~ to commit a crime; qarnı ~ to have* diarrhoea [ˌdaıəˈrıə]; *Uşağın qarnı işləyir The child has diarrhoea*

**işlənilmək** *f bax* **işlənmək**

**işlənmək** *f* 1. to be* used; cümlədə ~ to be* used in a sentence; 2. to be* worked out; *Yeni metod işlənib A new method has been worked out*; 3. to be* trimmed; qızılla ~ to be* trimmed with gold

**işlənmiş** *fs* 1. used, second-hand; ~ maşın used / second-hand car; 2. *(bəzədilmiş)* trimmed *(with)*, embroidered *(with)*, decorated with needlework

**işlətmək** *f* 1. to use *(d.)*, to put* *(d.)* to use; qaz ~ to use gas; beynini ~ to use *one's* brains / wits; zor ~ to use force; 2. to ask / to cause *(d.)* to work; 3. to put* *(d.)* into practice; təcrübədə ~ to put* *(d.)* into practice; 4. to commit; cinayət ~ to commit a crime

**iş-peşə** *top. i bax* **iş-güc**

**işrət** *i* feast, banquet; orgy; ~lə məşğul olmaq to feast, to celebrate with feast; to drink *(wine, etc.)* and have sex *(with)*

**işrətli** *s (i.s.)* with feast / banquet; ~ həyat life with feast

**işsiz**[1] *i* 1. unemployed person; ~lər *top. i* the unemployed; 2. *(veyl)* idler

**işsiz**[2] *s* unemployed, workless, jobless; ~ olmaq to be* unemployed, to be* out of work , to be* jobless

**işsiz-gücsüz**[1] *s* idle; unemployed, jobless; ~ adam an idle man*; an unemployed person

**işsiz-gücsüz**[2] *z* idly; ~ dayanmaq to stand idly

**işsizlik** *i* 1. unemployment; 2. *(veyllik)* idleness

**işsiz-peşəsiz**[1] *s bax* **işsiz-gücsüz**[1]

**işsiz-peşəsiz**[2] *z bax* **işsiz-gücsüz**[2]

**iştaha** *i* appetite; yaxşı ~ good appetite; pis ~ poor appetite; bir kəsin ~ sını açmaq to give* *smb.* an appetite, to whet *smb.'s* appetite; ~ sını itirmək to lose* *one's* appetite; *İştahalı olasınız! Bon appetite!; İştəha diş altındadır at.söz. Appetite comes with eating*

**iştahaaçan**[1] *i* appetizer; aperitif

**iştahaaçan**[2] *s* appetizing; appetitive; ~ yemək appetizing meal

**iştahagətirən** *s bax* **iştahaaçan**[2]

**iştahalandırılmaq** *f* to be* appetized

**iştahalandırmaq** *f* to appetize *(d.)*, to whet appetite *(d.)*

**iştahalanmaq** *f* to have* good appetite; *məc.* to have* great desire / wish *(to eat)*

**iştahalı** *s* appetitive; *(i.s.)* having good appetite

**iştahalılıq** *i the state of having good appetite*

**iştahasız**[1] *s* appetiteless; *(i.s.)* having poor appetite, *(i.s.)* without appetite

**iştahasız**[2] *z* without appetite

**iştahasızlıq** *i the state of having poor appetite*

**iştahla** *z* with appetite; ~ yemək to eat* with appetite

**iştirak** *i* 1. participation; ~ etmək to participate *(in)*, to take* part *(in)*; fəal ~ active participation; bir kəsin ~ ı ilə with the participation of *smb.*; 2. presence; *Sizin iştirakınız vacibdir Your presence is important*

**iştirakçı** *i* participant, participator; *(cinayətdə)* accomplice; *(yarışda)* competitor; *(oyunda)* player; *(qurultayda və s.)* member

**iştirakçılıq** *i* participation; *(cinayətdə və s.)* complicity

**it**[1] *i* dog; ağıllı ~ a clever dog; ~ dən qorxmaq to be* afraid of dog; ov ~ i gun-dog; *(tazı)* hound; ~ kimi yaşamaq to lead* a dog's life; ~ kimi ölmək to die like a dog; ◊ ~ kimi yorulmaq to be* dog-tired; *İtə yiyəsinə / sahibinə görə hörmət edərlər at. söz. Love me, love my dog*

**it**[2] *s* dog *(attr.)*; dog's; doggish; doggy ~ xaltası dog-collar; ~ biti dog-louse; ◊ ~ *(in)* günü dog's life; ◊ günündə yaşamaq to live a dog's life, to live like a dog

**itaət** *i* obedience; ~ etmək to obey *(d.)*; qanuna ~ etmək to obey the law; bir kəsə ~ etmək to obey *smb.*; *Qulaq asın və itaət edin! Listen and obey!*

**itaətkar** *s* obedient *(to)*, humble; ~ uşaq obedient child; ~ qarabaş obedient servant; ~ olmaq to be* obedient *(to)*, to obey *(to)*

**itaətkarcasına** *z* obediently, humbly

**itaətkarlıq** *i* obedience *(to)*; ~ göstərmək to display / to show* obedience *(to)*, to obey *(to)*

**itaətlə** *z* obediently, humbly

**itaətli** *s bax* **itaətkar**

**itaətlilik** *i bax* **itaətkarlıq**

**itaətsiz** *s* disobedient, recalcitrant; rebellious; unruly; ~ uşaq disobedient child

**itaətsizlik** *i* disobedience, recalcitrance; rebelliousness, unruliness; ~ göstərmək to display / to show* disobedience, to be* unruly / disobedient

**italiyalı** *i* Italian; the citizen of Italy; ~ lar the Italians

**italyan**[1] *i bax* **italiyalı**

**italyan**[2] *s* Italian; ~ dili Italian, the Italian language; ~ dilinde danışmaq to speak* Italian, to speak* the Italian language

**italyanca** *z* Italian; ~ danışmaq to speak* Italian, to speak* the Italian language; ~ yazmaq to write* in Italian; ~ demək to say* in Italian

**itarısı** *i* wasp

**itbaz** *i* dog-lover

**itburnu** *i bot.* dog-rose; (meyvəsi) hips *pl.*

**itdamı** *i* kennel; *amer.* kennels, dog-hole, doghouse

**itdirsəyi** *i tib.* sty, stye [stai]

**itələmək** *f* to push *(d.)*; to shove *(d.)*; *(bilmədən)* to jog *(d.)*; to give* a push / shove; ◊ itələyib yerində durmaq to be* the very image (of); *O, atasını itələyib yerində durub He is the spit and image of his father*

**itələnmək** *f* to be* pushed / shoved; *(bilmədən)* to be* jogged

**itələşmək** *f* to push / to shove each other, to push / to shove one another

**itələtdirmək** *f bax* **itələtmək**

**itələtmək** *f* to ask / to cause *smb.* to push, to ask / to cause *s.o.* to shove *(d.)*

**ithaf** *i ədəb.* dedication; ~ etmək to dedicate *(to)*

**iti**[1] *s* 1. sharp, acute; keen; ~ bıçaq sharp knife; ~ göz sharp / keen eyesight; ~ dil sharp tongue; 2. rapid, swift, speedy; ~ axın rapid / swift current; ~ əllər speedy hands

**iti**[2] *z* 1. rapidly, swiftly; ~ axmaq to flow / to run* rapidly; ~ danışmaq to speak* rapidly / swiftly; 2. sharp, sharply; ~ dönmək to turn sharp; ~ baxmaq to look sharply

**itiaxan** *s* running rapidly, flowing swiftly / rapidly

**itibaxışlı** *s* sharp-eyed; ~ adam a sharp-eyed person

**itib-batmaq** *f* 1. to be* missing, to be* lost; 2. to disappear, to vanish; 3. (ölmək) to perish, to die; *harada itib-batmısınız? Where on earth have you been?*

**itibucaq** *i riyaz.* acute angle

**itibucaqlı** *s* acute angled, *(i.s.)* with acute angle; ~ üçbucaq acute-angled triangle

**itiburun** *s* sharp-nosed; pointed; ~ çəkmə shoes with pointed toes

**itiburunlu** *s bax* **itiburun**

**itibuynuz** *s* sharp-horned; ~ kələ sharp-horned bull

**itibuynuzlu** *s bax* **itibuynuz**

**itidırnaq** *s* sharp-nailed; *(i.s.)* with sharp nails

**itidırnaqlı** *s bax* **itidırnaq**

**itidil** *s* sharp-tongued; *(i.s.)* with sharp tongue.

**itidilli** *s bax* **itidil**

**itidiş** *s* sharp-toothed; *(i.s.)* with sharp teeth

**itidişli** *s bax* **itidiş**

**itigedən** *s* high-speed, fast; ~ qatar fast / high-speed train

**itigörən** *s* sharp-eyed, *(i.s.)* having sharp eyes

**itigöz** *s* sharp-eyed, *(i.s.)* with sharp eyes; lively

**itigözlü** *s bax* **itigöz**

**iti-iti** *z* too / very fast, too / very rapidly, too / very swiftly; ~ yerimək to go* too / very fast

**itiqanadlı** *s* swift-winged; *(i.s.)* with swift wings



**itiqulaq** *s* sharp-eared, *(i.s.)* with sharp ears

**itiqulaqlı** *s bax* **itiqulaq**

**itik** *i* loss, lost things; Bütün itiklər *(itən şeylər)* tapıldı All the lost things were found

**itiləmək** *f* to sharpen *(d.)*; *(bıçağı və s.)* to grind* *(d.)*; *(çarxçı daşı ilə)* to whet *(d.)*; bıçaq ~ to grind* a knife; *(daşla)* to whet a knife

**itilənmək** *f* to be* sharpened; to get* / to become sharpened; *(daşla)* to be* whetted

**itilənmiş** *fs* sharpened; whetted; ~ bıçaq sharpened knife

**itiləşmək** *f bax* **itilənmək**

**itilətdirmək** *f* to ask / to cause *smb.* to sharpen *(d.)*; *(daşla)* to ask / to cause *smb.* to whet *(d.)*; to have *(d.)* sharpened / whetted

**itilətmək** *f bax* **itilətdirmək**

**itiləyici** *s* grinding; ~ dəzgah grinding machine

**itilik** *i* 1. sharpness, acuity, acutiness; 2. *(görmə və s.)* keenness

**itilmək** *f* to be* off, to get* off / away, to clear out, to sleep away; İtil! *Be off! Clear out! İtil cəhənnəmə! Go to hell!*

**itirilmiş** *fs* lost; ~ xoşbəxtlik lost happiness

**itirmə** *fi* loss; *(vaxt, pul və s.)* waste; qan ~ loss of blood; huşunu ~ loss of consciousness

**itirmək** *f* to lose* [lu:z]; bir kəsi gözdən ~ to lose* sight of *smb.*; nüfuzunu ~ to lose* prestige; vaxt ~ to waste *one's* time; ümidini ~ to lose* *one's* hope; ◊ başını ~ to lose* *one's* head

**itirtdirmək** *f* to ask / to cause *s.o.* to remove *(d.)*, to ask / to cause to drive out *(d.)*

**itirtmək** *f bax* **itirtdirmək**

**itiuc** *s* pointed, sharp-pointed

**itiuclu** *s* sharp-pointed, *(i.s.)* with sharp point

**itiyarpaq** *s* sharp-leaved; *(i.s.)* with sharp leaves

**itiyarpaqlı** *s bax* **itiyarpaq**

**itki** *i* loss; ümumi ~ total loss; ağır ~ grievous loss; böyük ~ serious loss

**itkin**[1] *s* missing; ~ adamlar missing people

**itkin**[2] *z*: ~ düşmək to be* missing, to be* lost, to disappear; ~ salmaq to drive* out / away *(d.)*, to banish *(d.)*

**itkinlik** *i* disappearance; banishment

**itkisiz** *z* without loss / waste; məhsulu ~ yığmaq to bring* in a harvest without loss

**itkisizlik** *i the state of being without loss*

**it-qurd** *top. i* riff-raff

**itmək** *f* 1. to be* lost, to disappear, to vanish; Uşaq itdi The child was lost; gözdən ~ to disappear from view; *O, izdihamın işində itdi He vanished in the crowd*; 2. to be* wasted, to go* to waste; *Mənim bütün günüm itdi I've wasted the whole day*

**itmiş** *fs* lost; ~ vaxt lost time; ~ imkan lost opportunity

**itoynadan** *i d.d.* wag; joker, jester

**itsaxlayan** *i* dog-keeper, dog-fancier

**ittifaq** *i* union; alliance; yazıçılar ~ı writers' union; hərbi ~ military alliance

**ittiham**[1] *i* charge *(of / against)*, accusation *(of)*; bir kəsi bir şeydə ~ etmək to accuse *smb. of smth.*

**ittiham**[2] *s* accusatory; ~ hökmü *hüq.* verdict of guilty

**ittihamçı** *i* accuser; *hüq.* prosecutor; dövlət ~ sı public prosecutor

**ittihamnamə** *i* verdict of guilty

**ityatmaz** *s* a very dirty bed place

**ityeməz** *s* extremely bad / poor; ~ xörək a meal of extremely poor quality

**iy** *i* **I** smell, odour; scent; ~ bilmək to smell, to catch* / to pick up the smell *(of)*; ~ hiss etmək to catch* / to pick up the smell *(of)*, to smell; qəşəng / dəhşətli / qeyri-adi ~ a nice / horrible / unusual smell; qızılgülün ~ i the scent of roses; çiçəklərin ~ i the scent / odour of flowers; ətirin ~ i the scent / odour of perfume; zərif ~ a delicate scent / odour; zəif ~ a faint smell / odour; iyrənc ~ a nasty / disgusting smell; reek; tütün və pivə ~ i a reek of tobacco and beer; ~ gəlmək 1) to smell *(of)*; 2) *(pis)* to reek *(of)*; *Baharın iyi gəlir It smells of spring, Spring is in the air; Onun nəfəsindən (ağzından soğan iyi gəlir) His breath reeks of onions;* ◊ *Bu işdən əyrilik iyi gəlir This business reeks of dishonesty;* ◊ *Siz bilirsinizmi bundan nə iyi gəlir? d.d. Do you realize what this implies?* ◊ *Bundan xata iyi gəlir This means trouble*

**iy** *i* **II** *toxuc.* spindle

**iybilmə** *i* sense of smell; həssas *(zərif)* ~ qabiliyyətinə malik olmaq to have* a fine / an acute sense of smell; *d.d.* to have* a good nose

**iyəbənzər** *s* spindle-shaped

**iyimək** *f* to go* bad, to become* rotten

**iyimiş** *s bax* **iylənmiş**

**iyirmi** *sy* twenty; ~ bir twenty-one; ~ iki twenty-two; ~ üç və s. twenty-three, etc.

**iyirmicə** *sy* only twenty, just twenty

**iyirminci** *sy* twentieth; ~ illər the twenties; ~ illərin əvvəllərində in the early twenties; ~ illərin sonlarında in the late twenties; ~ səhifə page twenty; ~ səhifədə on page twenty; ~ otaq Room 20

**iyitmək** *f bax* **iyləndirmək**

**iyləmək** *f* to smell* *(d.)*, to sniff *(d.)*, to have* a smell; qırmızıgül ~ to smell / to sniff a rose; *Bu şərabı iyləyin, görün yaxşıdırmı? Have a smell of this wine: does it seem all right?*

**iyləndirmək** *f* to let* *(d.)* become rotten, to let* *(d.)* go* bad; əti ~ to let* the meat become rotten / bad

**iylənmək** *f* 1. *(xarab olmaq)* to go* bad, to become* rotten / tainted; *Ət iylənib The meat has become rotten / tainted;* 2. *(iy vermək)* to smell *(of)*; *(pis iy vermək)* to reek *(of)*, to stink* *(of)*; yaxşı / qəşəng / turş ~ to smell good / nice / sour; sarımsaq ~ to reek of / to stink of garlic; tər ~ to reek of sweat; *Onun nəfəsi sarımsaq iylənir His breath smells of / reeks of / stinks of garlic;* ◊ *Balıq başından iylənir at. söz. Fish begins to stink at the head*

**iylənmiş** *s* rotten, tainted, *(gone)* bad; ~ ət rotten / tainted meat; ~ yumurta rotten egg

**iyləşmək** *f* to sniff each other, to smell each other / one another

**iylətmək** *f bax* **iyləndirmək**

**iyli** *s* fragrant, odorous, aromatic; ~ çiçəklər fragrant flowers; ~ sabun aromatic soap

**iylilik** *i* odorousness, fragrancy

**iynə** *i* 1. needle; 2. (həşəratda) sting*; 3. *tib.* injection; bir kəsə ~ vurmaq to give* *smb.* injection; ◊ ~ üzərində oturmaq *d.d.* to be* on pins and needles

**iynəbatırma** *i tib.* acupuncture

**iynəqabı** *i* needle-case

**iynələmə** *fi* 1. *bax* **iynəbatırma;** 2. pricking with needle

**iynələmək** *f* to needle *(d.)*, to prick *(d.)*; *məc.* to pique [pi:k] *(d.)*, to sting* *(d.)*

**iyneli** *s* 1. pricky; *(i.s.)* covered with needles; 2. *məc.* ironical; ~ sözlər ironical words; ~ kompliment ironical compliment

**iynəşəkilli** *s bax* **iynəvarı**

**iynəvarı** *s* needle-shaped

**iynəvurma** *i* injection

**iynəyarpaq** *s* coniferous; ~ meşə coniferous forest; ~ ağaclar coniferous trees

**iynəyarpaqlı** *s bax* **iynəyarpaq**

**iynəyarpaqlılar** *top. i bot.* conifers

**iyrənc**[1] *s* disgusting, abominable, foul, repulsive; ~ iy disgusting / foul smell; ~ hava abominable / foul weather

**iyrənc**[2] *z* disgustingly, abominably

**iyrənclik** *i the state of being disgusting / foul*

**iyrəndirmək** *f* to disgust *(d.)*, to provoke / to cause disgust, to make* *smb.* feel sick, to fill *(d.)* with disgust; bir kəsdən ~ to feel* an aversion for *smb.*; *Sənin kobud hərəkətlərin məni iyrəndirir Your rude behaviour disgusts me; Mehmanxanadakı yemək məni iyrəndirdi The food at the hotel filled me with disgust*

**iyrənən** *s* fastidious, squeamish; finical; ~ adam fastidious person

**iyrənmək** *f* to be* fastidious / squeamish *(about)*; *Mən hər şeydən iyrənirəm I'm squeamish about everything*

**iysiz** *s* odourless, scentless, *(i.s.)* without smell; ~ çiçəklər scentless / odourless flowers

**iysizlik** *i* lack of odour / scent / smell

**iyşəkilli** *s bax* **iyəbənzər**

**iz** *i* track, footprint, footstep; *məc.* trace, sign [saın], vestige; təzə / yeni ~ lər fresh tracks / footprints; bir kəsi ~ ə salmaq to put* *smb.* on trail *(of)*; ~ə düşmək to come* upon the tracks, to find* traces *(of)*; *məc.* to get* on the tracks / trail *(of)*; bir kəsin ~ i ilə getmək to follow in the tracks of *smb.*; *(elm sahəsində)* to follow in *smb.*'s footsteps; ~i itirmək to lose* track *(of)*; zəhmətin ~ləri signs of labour; daha erkən mədəniyyət ~ləri vestiges of an earlier civilization

**izafət** *i dilç.* postpositional attributive group

**izafi** *s* 1. *(lazımsız)* unnecessary; ~ söhbətlər unnecessary talks; 2. *siya. iq.* surplus *(attr.)*; ~ əmək surplus labour; ~ dəyər surplus value; ~ məhsul surplus production

**izafilik** *i* surplus

**izah** *i* explanation, elucidation; ~ etmək to explain *(d. to)*; mətni ~ etmək to elucidate a text; səbəbi ~ etmək to elucidate the reason; sözün mənasını bir kəsə ~ etmək to explain the meaning of the word to *smb.*

**izahat**[1] *i* 1. explanation; yazılı ~ written explanation; bir kəsdən ~ tələb etmək to demand an explanation of / from *smb.*; to insist on an explanation from *smb.*; ~ vermək to explain *(d.)*, to elucidate *(d.)*, to give* an explanation; 2. comment; commentary; *İzahat artıqdır (lazım deyil) Comment is superfluous, No comment is needed*

**izahat**[2] *s* explanatory; ~ vərəqəsi explanatory note, note of explanation; ~ işi explanatory work

**izahatçı** *i* commentator

**izahatçılıq** *i the job of a commentator*

**izahedici** *s* explanatory, elucidatory; ~ qeyd explanatory note; ~ sözlər elucidatory words

**izahedilməz** *s* inexplicable, unaccountable; ~ səbəblər unaccountable reasons; ~ sirr inexplicable mystery

**izahedilməzlik** *i* inexplicability

**izahlı** *s* explanatory, elucidatory; ~ lüğət explanatory dictionary

**izahsız** *s (i.s.)* without explanation / elucidation; *(i.s.)* having no explanation / elucidation

**izaxtaran** *i* tracker, pathfinder

**izçi** *i* tracker, pathfinder

**izdiham** *i* 1. crowd; ~ a qarışmaq to mingle in / with the crowd; 2. procession; train; dəfn ~ i funeral procession / train

**izdihamlı** *s* crowded, busy; ~ iclas crowded meeting; ~ küçələr crowded / busy streets

**izdihamlılıq** *i the state of being crowded*

**izdivac** *i arx. s.* marriage; ~ etmək to marry, to get* married

**izhar** *i arx.* expression, revealing; ~ etmək to express *(d.)*, to tell* *(d.)*, to say* *(d.)*; dərdini kədərini ~ etmək to give* vent to *one's* sorrow and grief; hisslərini ~ etmək to give* vent to *one's* feelings

**izin** *i* permission; permit; ~ vermək to permit, to allow, to give* permission; ~ almaq to get* / to have* permission

**izincə** *z*: ~ getmək to go* after, to follow in the tracks

**izinli** *s bax* **icazəli**

**izinsiz** *s bax* **icazəsiz**

**izləmək** *f* 1. to pursue *(d.)*, to chase *(d.)*, to be* after, to go* after, to follow *(d.)*; düşməni ~ to pursue the enemy; bir kəsi daban-dabana ~ to follow *smb.* close(ly), to follow hard on smb.'s heel; 2. (xəfiyyə) to shadow *(d.)*; *Mən hiss etdim ki, məni izləyirlər, lakin arxamda heç kimi görə bilmədim I felt that I was being shadowed, but I couldn't see anyone behind me*

**izlənmək** *f* 1. to be* pursued / tracked / chased / followed; 2. (xəlvəti) to be* shadowed; *Onu hər yerdə izləyirlər He / She is shadowed everywhere*

**izlətdirmək** *f* 1. to ask / to cause *smb.* to pursue *(d.)* / to chase *(d.)*/ to trace *(d.)*; 2. *(xəlvəti)* to ask / to cause *smb.* to follow *(d.)* / to shadow *(d.)*

**izlətmək** *f bax* **izlətdirmək**

**izolə** *i*: ~ etmək to isolate ['aı-] *(d.)*, *(həm də tex.)* to insulate *(d. from, against)*; ~ olunmaq to be* isolated / insulated; (adam haq.) to isolate *oneself*; ~



edilmiş isolated, insulated; ~ edilmiş fakt isolated / insulated fact

**izoləedici** *s tex.* insulating

**izolyasiya** *i fiz. tex.* isolation; *(həm də tex.)* insulation; *(həm də tib.)* quarantine

**izolyator** *i* 1. *tex. fiz.* insulator; 2. *(xəstəxanada və s.)* isolation ward; *(həbsxanada)* punishment cell; solitary confinement cell; *(siyasi dustaqlar üçün) "izəlator" (in the former USSR)*

**izsiz**[1] *s* traceless; *(i.s.)* without leaving a trace / track / footprints;

**izsiz**[2] *z bax* **izsiz-soraqsız**

**izsiz-soraqsız** *z* without leaving a trace; ~ yoxa çıxmaq to disappear without leaving a trace; to disappear completely

**izsiz-tozsuz** *z bax* **izsiz-soraqsız**

**iztanıyan** *i bax* **izaxtaran**

**iztirab** *i* pang, torment, poignancy, agony; aclıq ~ ları pangs of hunger; qısqanclıq ~ ları pangs / torments of jealousy; ~ çəkmək to agonize, to be* in torment; ◊ bir kəsə ~ vermək to put* *smb.* to *(the)* torture, to cause *smb.* to suffer pangs / torments

**iztirabla** *z* poignantly, agonizingly

**iztirablı** *s* poignant, agonizing; ~ xatirələr agonizing / poignant memories; ~ günlər agonizing days; ~ şübhələr agonizing doubts

**iztirablılıq** *i* poignancy, *the state of being poignant / agonizing*

**iztirabsız** *s (i.s.)* without poignancy / agony, calm

**iztirabsızlıq** *i* lack of poignancy, the state of being without agony

**izzət** *i* respect, honour, esteem; ~ sahibi olmaq to be* esteemed / respected; ~ göstərmək to respect *(d.)*, to show* respect for, to respect *(d.)*

**izzətli** *s* respected / esteemed highly, *(i.s.)* worthy of respect / honour

# J, j

**J, j** [je] *the 15th letter of the Azerbaijani alphabet*
**jaket** *i* jacket
**jalə** *i* dew; dew-drop
**jandarm** *i* gendarme
**jandarmeriya** *i top. i* gendarmery
**janr** *i* genre [ˈʒaːŋr]
**janrist** *i* genre-painter, painter of genre
**jarqon** *i dilç.* jargon, slang; *(müəyyən sosial qrupa məxsus)* cant; oğru ~u thieves' cant; ~la danışmaq to cant; to speak* slang
**jelatin**[1] *i* gelatin (e)
**jelatin**[2] *s* gelatinous
**jelatinləşdirmək** *f* to gelatinize *(d.)*
**jelatinləşmək** *f* to gelatinize; to be* gelatinized
**jele** *i* jelley
**jenşen** *i bot.* ginseng
**jest** *i* gesture
**jeton** *i* 1. *(sikkə əvəzi)* counter; 2. *(nişan)* medal
**jilet** *i* waistcoat; *amer.* vest
**jiletli** *s (i.s.)* with a waistcoat; ~ kostyum costume with a waistcoat; 2. in a waistcoat, wearing a waistcoat
**jiletlik** *s* good / suitable for waistcoat; ~ parça fabric/cloth suitable for waistcoat
**jirovka** *i* endorsement; banking order
**jmıx** *i* oilcake, cotton-cake
**jmıxdoğrayan**[1] *i* oilcake grinder, cotton-cake grinder
**jmıxdoğrayan**[2] *s* oilcake grinding, cotton-cake grinding
**jokey** *i* jockey
**jonqlyor** *i* juggler
**jonqlyorluq** *i* jugglery; ~ etmək to juggle
**julik** *i* rogue, swindler; trickster *(oyunda)* cheat; *(kart oyununda)* sharper
**juliklik** *i* roguery, swindle; sharp practice; ~ etmək to swindle; *(oyunda)* to cheat
**jurnal** *i* 1. *(dövri məcmuə)* periodical; *(elmi məcmuə)* journal; *(kütləvi məcmuə)* magazine; aylıq ~ monthly *(magazine)*; həftəlik ~ weekly *(magazine)*; iki həftədən bir çıxan ~ fortnightly; 2. *(qeydəalma kitabı, dəftəri)* register; diary, journal; sinif ~ı class register; növbə ~ı *dən.* log (-book); ~da qeydə almaq / qeyd etmək to register *(d.)*
**jurnalist** *i* journalist, pressman*, a newspaper reporter
**jurnalistika** *i* journalism
**jurnalistlik**[1] *i the profession of a journalist*
**jurnalistlik**[2] *s* journalistic; ~ fəaliyyət journalistic activity
**jüri** *i (təltif üzrə)* jury; ~ üzvü judge; *(incəsənət sərgisində)* hanging committee; ~ üzvü member of the hanging committee; *(idman yarışında)* umpire; *(hakimlər hey'əti)* judges *pl.*; ~ üzvü olmaq to be* one of the judges; to be* a member of the hanging committee



# K, k

**K, k** *the 16th letter of the Azerbaijani alphabet*
**kabab** *i* kabab, kebab, cabob *(meat on skewers)*; ~ bişirmək to cook kabab; ~ çəkmək to stick meat on skewers, to spit pieces of mutton on skewers; ◊ ürəyini, ciyərini ~ etmək to make* *smb.* suffer greatly; to distress *(d.)*, to afflict *(d.)*; ~ olmaq *məc.* to scorch, to be* scorched; günün altında qızınmaq, özünü günə vermək to bask in the sun. ◊ günün altında ~ olmaq to be* fried in the sun
**kababçı** *i* kabab- / cabob-dealer
**kababçılıq** *i the job of a kabab-dealer / kabab cook*
**kababxana** *i* kababkhana, Kebab house
**kabablıq** *s (i.s.)* suitable / good for kabab; ~ ət mutton / chunks of lamb suitable for kabab
**kabardin**[1] *i* Kabardian, Kabardinian, Kabarda(man*)
**kabardin**[2] *s* Kabardinian, Kabardian; ~ dili Kabardinian, the Kabardinian language
**kabardincə**[1] *s* Kabardian, Kabardinian; ~ kitablar Kabardi(ni) an books
**kabardincə**[2] *z* Kabardian; ~ danışmaq to speak* Kabardian; ~ yazmaq to write* in Kabardian
**kabel** *i* cable; asma ~ overhead cable; yeraltı ~ underground cable; sualtı ~ submerged cable; telefon / teleqraf ~i telephone / telegraph cable
**kabinet**[1] *i* 1. *(iş otağı)* study; 2. *(həkimin qəbul otağı)* consulting-room; *(cərrahın otağı)* surgery; *(diş həkiminin otağı)* dental surgery; *(restoranda)* private room; *(massaj üçün)* massage-room; 3. *siya. (hökumət)* cabinet
**kabinet**[2] *s* cabinet; ~ alimi armchair scientist; ~ elmi book-learning; ◊ ~ portreti cabinet photograph
**kabinə** *i* booth; *(yük maşınında)* cab; *(liftdə)* lift car; pilot ~si cockpit, cabin; seçki / səsvermə ~si polling booth
**kabus** *i* ghost, spectre / specter, spook; *(qarabasma, gözəgörünmə)* phantom; apparition; ~ kimi ghostly; ~ şəkilli ghosty, ghostly
**kabusabənzər** *s* ghostlike
**kadet** *i* I cadet
**kadet** *i* II *siyas.* Constitutional-Democrat; ~ partiyası (The Party of) Constitutional-Democrats
**kadr** *i* I *(kino)* sequence; *(tək şəkil)* still
**kadr**[1] *i* II cadre; ~lar personnel *sing*; gənc ~lar young personnel sing; ~ların seçilməsi selection of personnel; ~ların hazırlanması training *(of)* specialists, training *(of)* skilled workers; ~lar hazırlamaq to train specialists, to train skilled workers
**kadr**[2] *s* personnel, staff; ~lar şöbəsi personnel / staff department
**kafe** *i* cafe; coffee-house
**kafedra** *i* 1. chair; 2. *(xitabət kürsüsü)* rostrum; 3. department
**kafel** *i* glazed / Dutch tile; dalle, stone tile
**kafelli** *s* tiled
**kafeteriya** *i* cafeteria
**kafər** *i bax* **kafir**[1]
**kafi**[1] *i (qiymət)* satisfactory, fair
**kafi**[2] *s* satisfactory; sufficient; ~ dərəcədə satisfactorily; sufficiently; ~ olmaq to be* sufficient; to be* satisfactory
**kafilik** *i* satisfactoriness; sufficiency
**kafir**[1] *i* giaour [ˈdʒauə], infidel, unbeliever; pagan
**kafir**[2] *s* 1. infidel, unfaithful, godless; *(mürtəd)* apostate, blasphemous; 2. *(zalım, insafsız)* hard-hearted, stone-hearted
**kafircəsinə** *z* hard-heartedly, cruelly
**kafirlik** *i* 1. infidelity, unfaithfulness, godlessness, blasphemy, apostasy, ungodliness; 2. *məc. (zalımlıq, insafsızlıq)* hard-heartedness, cruelty
**kaftan** *i* caftan, kaftan
**kaftar**[1] *i* 1. *zool.* hyena; 2. *məc. (çox qoca adam)* a decrepit man* / woman*; 3. *(deyingən qarı)* grimalkin; tremagant; shrew; *(söyüş məqamında)* A witch! Old hag!
**kaftar**[2] *s* very old; *(əldən düşmüş)* decrepit; senile; ~ it / at a decrepit dog / horse
**kaftarkus** *i zool. bax* **kaftar** *(1-ci mənada)*
**kaftarlaşmaq** *f* 1. *(qocalmaq)* to grow* / to become* very old; 2. *(qocalıb əldən düşmək)* to become* / to grow* senile
**kaftarlıq** *i* 1. *(qocalıq)* old age, oldness; 2. *(qoca zəifliyi)* senility
**kağız**[1] *i* 1. *(müst. məna)* paper; ağ / yazılmamış ~ blank / clean paper; qəzet ~ı *(çap üçün)* news-print; damalı ~ squared paper; divar ~ı wallpaper, paper-hangings *pl.*; məktub üçün ~ letter paper, note paper; rəngli ~ coloured paper; şirəli ~ glossy paper; xətli / cızıqlı ~ ruled paper; ~a bükmək to paper *(d.)*, to wrap up in paper *(d.)*, to fold / enclose in paper; ~a köçürmək *(fikri)* to commit to paper; ~ çəkmək *(divara)* to paper *(the wall)*; 2. *(məktub)* letter; 3. *(sənəd)* paper, document; qiymətli ~lar *(səhm, istiqraz, borc, qəbzi və s.)* securities *pl.*; ◊ ~ını almaq *(boşanmaq)* *d.d.* to get* a divorce; ◊ ~ını vermək *(boşamaq)* *d.d.* to divorce *(d.)*; dilindən ~ almaq *(bir şey üçün)* to make* *smb.* sign *(for)*, *(bir şey üçün)* to make* *smb.* pledge / commit himself *(to+inf)*; dilindən ~ vermək to give* a receipt *(for)*, to pledge / to commit himself *(to+inf)*; ~ üzərində qalmaq to remain on paper
**kağız**[2] *s* paper; ~ istehsalı paper making, paper production; ~ dəsmal paper napkins; tissue; ~ pul paper money / currency; ~ fabrikası paper-mill
**kağızbadam** *i* almond *(with thin and brittle shell)*

**kağızçılıq** *i (bürokratçılıq)* red tape *idiom.*
**kağızkəsən¹** *i poliqr. (maşın)* paper-cutter
**kağızkəsən²** *s* paper-cutting; ~ bıçaq paper-knife
**kağız-kuğuz** *i* 1. *(yazılı kağızlar)* scribbles *pl.*; 2. *(kağız qırıntıları)* scraps / bits of paper
**kağızqatlayan** *i poliqr. (işçi və maşın)* folder
**kağızlamaq** *f* to paper *(d.)*; to line *(d.)* with paper; to hang* wallpaper; divarı ~ to paper the wall, to line the wall with paper
**kağızlanmaq** *f* to be* papered, to be* lined with paper
**kağızlaşmaq** *f (məktublaşmaq, yazışmaq)* to be* in correspondence *(with)*, to correspond *(with)*
**kağızlatdırmaq** *f* 1. to have* *(d.)* papered; 2. to make* *smb.* paper *(d.)*; to ask / to cause *s.o.* to paper *(d.)*
**kağızlatmaq** *f bax* **kağızlatdırmaq**
**kağızlı** *s* 1. *(divar haq.)* papered, lined with paper; 2. *(sənədi olan) (i.s.)* having document / paper, furnished with document / paper
**kağızpaylayan** *i* 1. *(poçtalyon)* post-man; *amer.* letter-carrier; 2. *(kuryer)* messenger
**kağızsız** *s* 1. *(kağızı olmayan)* paperless; *(divar haq.)* unpapered, *(i.s.)* not lined with paper; 2. *(sənədsiz) (i.s.)* without document / paper, *(i.s.)* not furnished with documents / papers
**kaha** *i* (zağa) grotto, den; *(mağara)* cave, caverna, den
**kahal** *s* 1. *(başısoyuq)* negligent, careless, care-free, devil-may-care; öz vəzifəsinə / işinə ~ olmaq to be* negligent of *one's* duty; 2. *(ağır tərpənən, ləng)* sluggish, slow; ~ adam slowcoach, laggard
**kahallıq** *i* 1. negligence; carelessness; ~ etmək to neglect *(of)*; 2. sluggishness
**kahı** *i bot.* lettuce
**kahin** *i* 1. *(ruhani)* priest; *(qədim Romada)* augur; *(qədim Yunanıstanda)* oracle; 2. *(gələcəkdən xəbər verən adam)* augur [ˈɔːgəˈ]
**kahinlik** *i* 1. priesthood; 2. *(gələcəkdən xəbər vermək)* augury
**kainat** *i* the universe
**kakao¹** *i* 1. *(tozu, içkisi)* cocoa; 2. *(paxlası)* cacao, cocoa-beans
**kakao²** *s*: ~ toxumu cacao-seed; ~ dənəsi *(qabıqdan çıxarılmış)* cacao nibs; ~ yağı cacao - seed oil; ~ ağacı cacao (-tree)
**kaktus¹** *i bot.* cactus [ˈkæktəs]
**kaktus²** *s bot.* cactaceous [kəkˈteɪʃəs]
**kal** *s* 1. *(yetişməmiş)* unripe, green; 2. *məc.* immature; 3. *(səs haq.)* hoarse, husky, raucous [ˈrɔːkəs]; ~ səs hoarse / husky voice; ~ səslə danışmaq to speak* in a hoarse voice; 4. *məc. (gec anlayan)* hard of understanding, slow-witted; *(kütbeyin)* dull, obtuse, stupid; ~ adam slow-witted person; dullard, dunderhead; ◊ yuxudan ~ oyanmaq to awake* having / getting not enough sleep
**kalafa** *i* 1. *(xarabalıq)* ruin; 2. *(divarda iri dəlik)* hole, gap; 3. *(iri oyuq, çuxur)* pit
**kalafalıq** *i* ruins *pl.*
**kalağayı** *i bax* **kəlağayı**
**kalambur** *i* pun
**kalan** *i d.d.* 1. *(pullu, varlı)* moneyed; puldan ~ olmaq to be* rich in money, to wallow in money; ~ adam moneyed man*; man* of means; 2. *(çox, bol)* abundant, plentiful; *Burada göbələk kalandır Here mushrooms are plentiful / abundant*
**kalendar** *i bax* **təqvim**
**kaleydoskop** *i* kaleidoscope
**kaleydoskopik** *s* kaleidoscopic(al)
**kalış** *i bot.* durra
**kalışlıq** *i* durra-grove
**kalibr** *i* 1. *(silah lüləsində)* calibre; *amer.* caliber; 2. *tex.* gauge
**kalibri** *i zool.* hummingbird
**kalium** *i kim.* potassium
**kalium-karbonat** *i kim.* potash
**kaliumlu** *s kim.* potassium; potash; ~ kübrə potash fertilizer
**kalka** *i* 1. *(kağız)* tracing-paper; *(parça)* tracing-cloth; üzünü ~ya köçürmək to trace *(d.)*, to calk *(d.)*; 2. *dilç.* loan translation; ~ etmək *dilç.* to borrow as a translation loan word
**kalkulyasiya** *i* calculation; ~ etmək to calculate *(d.)*
**kalkulyator** *i* calculator; cost-clerk
**kallaşmaq** *f (səs)* to become* / to get* hoarse / raucous / husky; səsi kallaşana qədər qışqırmaq *(ağlamaq)* to shout *(cry)* oneself hoarse
**kallaşmış** *s bax* **kal** *(3-cü mənada)*
**kallıq** *i* 1. *(səsin və s. kallığı)* raucousness, hoarseness, huskiness; 2. unripeness; immaturity; 3. *məc. (kütlük, korazehinlik)* dullness, stupidity, obtuseness, slow-wittedness
**kalliqraf** *i* calligrapher, calligraphist
**kalliqrafik** *s* calligraphic; ~ xətt calligraphic hand *(writing)*; ~ xətlə yazmaq to write* calligraphically
**kalliqrafiya** *i* calligraphy
**kalmıq¹** *i* Kalmyc (Kalmuck), *(qadın)* Kalmyk woman*
**kalmıq²** *s* Kalmyk; ~ dili Kalmyk, the Kalmyk language
**kalmıqca** *z* Kalmyk, in Kalmyk; ~ danışmaq to speak* Kalmyk, to speak* the Kalmyk language; ~yazmaq to write* in Kalmyk
**kalorimetr** *i fiz.* calorimeter
**kalorimetriya** *i fiz.* calorimetry
**kaloriya** *i fiz.* calorie; böyük ~ large calorie, kilogram-calorie; kiçik ~ small calorie, gram-calorie
**kaloriyalı** *s* high-calorie; rich in calories; ~ qida food rich in calories; ~ yanacaq high-calorie fuel
**kaloriyalılıq** *i* caloric value
**kalsium** *i kim.* calcium
**kam** *i* I 1. *(arzu, istək, murad)* wish, desire; aspiration; 2. *(məqsəd, məram)* aim, purpose, object, end; 3. *(ləzzət, zövq)* delight; ~ almaq: 1) to gain / to attain *one's* object; 2) *(intiqam almaq)* to avenge *(d.)*, to take* vengeance *(on)*; 3) *(başqasının bədbəxtliyinə sevinmək)* to gloat over, to rejoice at the misfortune of others; ~a yetmək / yetişmək / çatmaq to gain / to attain *one's* object / ends; to secure *one's* object; to succeed in *one's* object; to achieve *one's* desire; ~a yetməmək / çatmamag, ~ı



gözündə qalmaq to fail in *one's* object, not to achieve *one's* desire
**kam** *i* II: ~ına çəkmək 1. *(udmaq əjdaha, ilan və s.)* to gulp down *(d.)*, to swallow *(d.)*; 2. *(məngirləmək, yiyələnmək)* to make* *smth. one's* own, to appropriate *(d.)*
**kamal** *i* 1. *(əqli yetkinlik)* mental maturity; perfection; 2. *(ağıl, zəka)* mind, intelligence, intellect, wisdom, sense, wit; ~ sahibi man of sense / wisdom; a clever / intelligent man; ~a yetirmək: 1) to perfect *(d.)* (in), to bring* to perfection *(d.)*; 2) *(tamamlamaq, başa çatdırmaq)* to complete *(d.)*; ~a yetmək / yetişmək / çatmaq to attain / to achieve perfection, to perfect *oneself* (in); to gain mental maturity
**kamallanmaq** *f* to become* wise / clever / intelligent; to become* mentally mature
**kamallı** *s* clever, wise, intelligent
**kamallılıq** *i* 1. cleverness; intellectuality; 2. mental maturity; 3. reasonableness
**kamalsız** *s* 1. not wise / clever / intelligent; 2. mentally immature
**kamalsızlıq** *i the state or quality of being not wise clever / intelligent*
**kaman** *i* I *bax* **kamança**
**kaman** *i* II bow; ~ yayı bow-string; qaşı ~ *bax* **kamanqaş**; ~ın yayını dartmaq to draw* / to bend* a bow; ~ kimi əyilmək to bend* as a bow, to stoop *(with)*; *O, qocalıqdan kaman kimi əyilir He is stooping with old age;* ~ kimi / tək əymək to stoop / to bend* down *(d.)*; ~a dönmək to bend* as a bow
**kamança** *i mus.* kamancha *(an oriental bow instrument - a kind of fiddlle or violin)*; ~ yayı fiddle-bow, fiddlestick
**kamançaçalan** *i mus.* kamancha-player
**kamançaçı** *i bax* **kamançaçalan**
**kamançaçılıq** *i the profession of a kamancha-player*
**kamandar** *i* 1. *(oxatan)* bowman; 2. *(yay-oxdaşıyan)* bow-bearer
**kamanqaş** *s* arch-browed, *(i.s.)* with arched eyebrows
**kamanqaşlı** *s bax* **kamanqaş**
**kambala** *i zool.* plaice, flounder; flat-fish
**kameliya** *i bot.* camellia
**kamera¹** *i* 1. *(xüsusi otaq)* chamber, cell; dezinfeksiya ~sı disinfection chamber; saxlama ~sı cloak-room; check-room, left-luggage room; həbsxana ~sı cell, ward; biradamlıq ~ solitary (confinement) cell, one-man cell; 2. *(topun rezin kisəsi)* bladder; *(şinin rezin borusu)* inner tube *(of a tire)*; 3. *(fotoaparat)* camera; 4. *tex.* chamber; hava ~sı air-chamber
**kamera²** *s* chamber; ~ musiqisi chamber music; ~ konserti chamber concert
**kamerton** *i mus.* tuning fork, pitchfork
**kamfora¹** *i ecz.* camphor
**kamfora²** *s*: ~ ağacı camphor tree; ~ yağı camphor-oil
**kamforalı** *s* camphorous, camphoric
**kamil** *s* 1. perfect; mature; 2. *(mahir)* capable; skilled; experienced; skilful; 3. *(bitkin)* complete
**kamilləşdirilmək** *f* to be* perfected; to be* improved
**kamilləşdirmək** *f* to perfect *(d.)*, to make* perfect *(d.)*
**kamilləşmək** *f* 1. to become* perfect *(in)*; to perfect *oneself (in)*; 2. *(müdrikləşmək)* to gain wisdom
**kamillik** *i* 1. perfection; *(mental)* maturity; 2. *(bitkinlik)* completeness
**kampaniya** *i* campaign; drive; mətbuat ~sı press campaign; seçki ~sı election campaign; səpin ~sı sowing campaign
**kamsız** *s* unhappy, unlucky, luckless
**kanal** *i* 1. *(süni arx)* canal; suvarma ~ı irrigation canal; *(dənizlər arasında boğaz)* channel; 2. *anat.* duct, canal; sidik ~ı urethra; 3. *(silah lüləsində)* bore (of the barrel); 4. *məc. (yol, vasitə)* channel; müxtəlif ~lardan istifadə etmək to use different channels
**kanalizasiya¹** *i* sewer, sewerage; ~ çəkmək to sewer *(d.)*, to supply with sewerage system *(d.)*
**kanalizasiya²** *s* sewerage; ~ sistemi sewerage system; ~ borusu sewer (-pipe); müasir ~ sistemi olan şəhər a town / city with a modern sewerage system
**kanalizasiyalı** *s* sewered, supplied with sewerage system
**kanalizasiyasız** *s* unsewered; *(i.s.)* not furnished with sewerage system, *(i.s.)* having no sewerage system
**kanat** *i* rope, cable; polad ~ steel-rope
**kandar** *i* threshold; ~a ayaq basmaq to step over the threshold, to set* foot* on *smb.*'s threshold; ◊ bir kəsin ~ını qoparmaq ≅ to pester *smb.*, to visit *(d.)* frequently
**kanifol** *i* rosin, colophony; ~ sürtmək / çəkmək to rosin *(d.)*
**kanifollatmaq** *f* to be* rosin *(d.)*, to have* *(d.)* rosined
**kanifollanmaq** *f* to be* rosined
**kanifollatdırmaq** *f* to ask / to cause *smb.* to rosin *(d.)*
**kanifollatmaq** *f bax* **kanifollatdırmaq**
**kankan** *i* well-sinker
**kankanlıq** *i* well-sinking; *the job of a well-sinker*
**kanoe** *i id.* canoe
**kansler** *i* chancellor; Almaniyanın ~i the Chancellor of Germany
**kantata** *i mus.* cantata
**kapella** *i mus. (xor)* choir [ˈkwaɪə]
**kapillyar** *i anat.* capillary blood vessel
**kapital** *i iqt.* capital; daimi ~ constant capital; dəyişən ~ variable capital; dövriyyə ~ı circulating / working capital; əmtəə ~ı commodity capital; əsas ~ fixed capital; maliyə ~ı financial capital; sənaye ~ı industrial capital; ölü / istifadəsiz ~ dead stock, unemployed capital; ticarət ~ı trade capital; ~ qoyuluşu capital investment; ~ qoymaq to invest (capital)
**kapitalist¹** *i* capitalist; financer
**kapitalist²** *s* capitalistic, capitalist; ~ istehsal üsulu capitalist way of production; ~ ölkələri capitalist countries
**kapitalizm¹** *i* capitalism; inhisarçı ~ monopolistic capitalism; sənaye ~i industrial capitalism
**kapitalizm²** *s* capitalism, capitalist; ~ quruluşu capitalism, capitalist system; ~ cəmiyyəti capitalist society, capitalism

**kapitallaşdırılmaq** *f iqt.* to be* capitalized
**kapitallaşdırmaq** *f iqt.* to capitalize *(d.)*
**kapitallaşmaq** *f iqt.* to get* capitalized
**kapitan** *i (müxt. mәna)* captain; komandanın ~ı the captain of the team
**kapot** *i* 1. *(don)* capote, house-coat; 2. *tex. (avtomobildә)* bonnet, *(tәyyarәdә)* cowl(ing)
**kapral** *i hәrb.* corporal
**kapriççio** *i mus.* capriccio
**kapron**[1] *i tox.* kapron
**kapron**[2] *s* kapron; ~ lifi kapron / synthetic fibre; ~ corab kapron stockings
**kapsul** *i* I *ecz.* capsule
**kapsul** *i* II *hәrb.* percussion cap, fulminate cap; *amer.* primer (cap); detonator ~u detonating cap
**kapsullu** *s* I capsulate, enclosed in a capsule
**kapsullu** *s* II capped, *(i.s.)* having a percussion / fulminate cap; *(i.s.)* having a detonating cap
**kapüşon** *i* hood, cowl
**kar**[1] *i* I deaf man* / woman* / girl / boy / child*; ~lar *top. i* the deaf
**kar**[2] *s* 1. deaf; tamam ~ stone-deaf; bir qulağı ~ deaf of an ear / deaf in one ear; 2. *dilç.* voiceless; ~ samit voiceless consonant; ~ etmәk *(bir kәsi)* to deafen *(d.)*; ~ olmaq to be* deaf; *O kişi kardır That man is deaf;* *(eşitmәk qabilliyyәtini itirmәk)* to become* / to grow* deaf; *O, kar olub He has become / grown deaf; Bu sәs bizi kar edәcәk This nose will deafen us*
**kar** *i* II 1. *(peşә, mәşğuliyyәt)* occupation; *O nә karın sahibidir? What is his occupation?* 2. *(iş)* dealing; bir kәslә ~ı olmaq to have* dealings with *smb.*, to have* *smth.* to do with *smb.*; *Mәnim onunla heç bir karım yoxdur I have no dealings with him / her; I have nothing to do with him / her;* 3. *(tәsir, tәsir qüvvәsi)* effect, efficacy; ◊ ~ aşmamaq: 1) *(nәticә vermәmәk)* to yield no results; to be* of no effect; 2) *(kifayәt etmәmәk)* to be* not sufficient; *Bundan kar aşmaz, bir az da әlavә et It is not sufficient, add some more;* ~ vermәk to come* in handy *(to)*, to stand* *smb.* in good stead; ~ elәmәk / salmaq to have* / to produce effect (on, upon); to take* effect; *Mәnim sözlәrim ona kar elәmәdi My words didn't have an effect on him; Dәrman kar elәmәdi / salmadı The medicine didn't take effect;* ◊ ~ görmәk to help *(d.)*, to render assitance *(to)*; ~ a gәlmәk to prove useful *(to)*, to be* of use *(to)*, to come* in handy *(to)*, to be* helpful *(to)*; *Qutunu atma, bir gün karına gәlәr Don't throw the box away, it may come in handy some time or other*
**karabin** *i* car(a)bine
**karabinçi** *i bax* **karabinyor**
**karabinyor** *i* car(a)bineer
**karagәlәn** *s* 1. *(kömәyi dәyәn)* helpful; *(i.s.)* of service / assistance; affording aid; beneficial; 2. *(gәrәkli)* good for *smth.*, useful *(to)*
**karagәlmәyәn** *s bax* **karsız**[1]
**karagәlmәz** *s bax* **karsız**[1]
**karamel**[1] *i* caramel
**karamel**[2] *s* caramel; *(i.s.)* of caramel; ~ konfeti caramel, sugarplum; ~ fabriki factory of caramel

**karandaş**[1] *i* (lead) pencil; rәngli ~ coloured pencil; *(üstü açıq)* crayon; kimyәvi ~ ink / indelible pencil; ~la with a pencil; ~la çәkilmiş drawn in pencil, pencilled; ~la çәkilmiş şәkil pencil drawing, pencilling; ~la yazmaq to write* in / with a pencil; ~la çәkmәk to draw* with a pencil
**karandaş**[2] *s* pencil; ~ qabı pencil-case
**karandaşçәrtәn** *i bax* **karandaşyonan**
**karandaşyonan** *i* pencil sharpener
**karantin** *i* quarantine; ~dә olmaq to be* in quarantine; ~ә salmaq to quarantine *(d.)*, to put* / to place in quarantine *(d.)*
**karat** *i* carat
**karbid**[1] *i kim.* carbide; carbonide
**karbid**[2] *s* carbide; ~ lampası carbide lamp
**karbohidrat** *i kim.* carbohydrate
**karbohidrogen** *i kim.* hydrocarbon
**karbol** *s* carbolic; ~ turşusu *kim.* carbolic acid
**karbon**[1] *i kim.* carbon
**karbon**[2] *s* carbon, carbonic; ~ qazı carbon dioxide gas, carbonic acid gas; ~ turşusu carbonic acid
**karbonat** *i kim.* carbonate
**karbonit** *i kim.* carbonite
**karbonlaşdırmaq** *f kim.* to carbonate *(d.)*, to carbonize *(d.)*
**karbonlaşmaq** *f kim.* to carbonate, to be* carbonized
**karbonlu** *s kim.* carbonaceous; carbonic
**karbonsuz** *s kim.* carbon free
**karbonsuzluq** *i the state or quality of being carbon free*
**karbürator** *i tex.* carburetter, carburet(t)or
**kardinal** *i* cardinal
**kardinallıq** *i* cardinalate
**kardioqraf** *i* cardiograph
**kardioqrafiya** *i* cardiography
**kardioqram** *i tib.* cardiogram
**kardiologiya** *i tib.* cardiology
**kardioloji** *s tib.* cardiologic(al)
**kardioloq** *i tib.* cardiologist
**karel**[1] *i* Karelian
**karel**[2] *s* Karelian; ~ dili Karelian, the Karelian language; ~ xalqı the Karelian people
**kareta** *i* coach
**karә**: *Nә karәsәn? What are you? What is your occupation? Nә karәdir? What is he / she? What is his / her occupation?*
**kargah** *i* 1. *(xalça, palaz hanası)* carpet-maker's loom; weaver's loom; ~ toxumaq to make* / to weave carpet; 2. *(tikmә sağanağı)* tambour; 3. *(krujeva sağanağı)* lace-frame
**kargüzar**[1] *i* clerk; ~ işlәmәk to work as a clerk; to be* a clerk
**kargüzar**[2] *s* 1. clerk's, clerical; ~ vәzifәsi clerk's office / post; 2. *(işgüzar)* business-like; ~ adam business-like man* / person; *O, çox kargüzardır He is very business-like*
**kargüzarlıq** *i* clerical work; clerk's occupation
**karxana** *i* 1. *(daş mәdәni)* quarry; qum ~sı sand-pit; әhәng daşı ~sı lime-pit, lime-stone quarry; 2.



*arx. (emalatxana, fabrik, zavod)* manufactory; factory; mill; workshop; çit ~sı textile factory
**karxanaçı** *i* manufacturer
**karxanaçılıq** *i the job of a quarry worker / manufacturer*
**karıxdırıcı** *s* 1. *(çaşdırıcı)* bewildering, confusing; 2. *(yanıldıcı)* causing to fall into error, causing to make a slip of tongue
**karıxdırmaq** *f* 1. *(çaşdırmaq, fikrini dolaşdırmaq)* to bewilder *(d.)*, to confuse *(d.)*; *Kәnddәn gәlmiş qocanı şәhәrdәki izdiham vә nәqliyyat karıxdırmışdı The old man from the country was bewildered by the crowd and the traffic in the city; Çox sual verәrәk mәni karıxdırdılar Asking many questions they confused me;* 2. *(yanıltmaq)* to make* one fall into error; to make* one slip; to put* one out; 3. *(diqqәtini, fikrini dağıtmaq)* to distract *(d.)*
**karıxmaq** *f* 1. *(çaşmaq)* to be* bewildered, to get* to be* confused; to blunder; *O qәdәr sual verdilәr ki, karıxdım They asked so many questions that I got confused;* 2. *(sәhv etmәk)* to fall* into error; 3. *(özünü itirmәk)* to be* perplexed / puzzled; to be* at a loss; to be* nonplus(s)ed
**karikatura** *i* caricature; *(siyasi mәzmunlu)* cartoon; ~sını çәkmәk / vermәk to caricature *(d.)*, to lampoon *(d.)*
**karikaturaçılıq** *i the profession of caricaturist / cartoonist*
**karikaturist** *i* caricaturist; cartoonist
**karkas** *i* frame, framework
**kar-lal**[1] *i* deaf-mute, deaf and mute
**kar-lal**[2] *s* deaf-and-dumb; ~lar(ın) әlifbası deaf-and-dumb alphabet
**karlaşdırılmaq** *f* 1. to be* deafened; 2. *dilç.* to be* devocalized / devoiced
**karlaşdırma** *fi* 1. deafening; 2. *dilç.* devocalizing, devocalization, devoicing
**karlaşdırmaq** *f* 1. to deafen *(d.)*; 2. *dilç.* to devocalize *(d.)*, to devoice *(d.)*
**karlaşmaq** *f* 1. to become* / to grow* deaf; 2. *dilç.* to become* devocalized / devoiced / voiceless
**karlı**[1] *s* 1. *(işbacaran, işgüzar)* efficient; worthy; business-like; *O, çox karlı adamdır He is a very efficient man;* 2. *(tәsirli)* effective, efficacious; *(dәrman haq.)* drastic, potent; 3. *(möhkәm, tutarlı)* effectual; ~ cәza effectual punishment; 4. *(effektiv, yaxşı nәticә verәn)* efficient; ~ metod / üsul efficient method; 5. *(gәlirli)* profitable, paying; *Karlı bir iş tapdım I got a paying / profitable job;* 6. (çox) in large quantities, plentiful, a lot *(of)*; *Onun karlı pulu var* He has a lot of money; 7. *mәc. (güclü, bәrk - yağış, qar, tufan, hücum vә s. haq.)* heavy
**karlı**[2] *z* 1. *(tәsirli)* effectively, efficiently; 2. *(bәrk, güclü)* hard, heavily
**karlıq** *i* deafness; özünü ~a vurmaq / qoymaq to pretend to be deaf; to turn a deaf ear *idiom.*
**karnaval** *i* carnival
**karniz** *i* 1. *mem.* cornice; *(pәncәrә üzәrindә çıxıntı)* ledge; *(damın kәnar çıxıntıları)* eaves *pl.*; 2. *(pәrdә asmaq üçün)* cornice
**karp** *i zool.* carp

**karsala** *s d.d.* 1. *(ağır eşidәn)* dull / hard of hearing; 2. *(әfәl, kütbeyin)* obtuse, stupid, muddle-headed, sheepish; *(key)* torpid; *(utancaq, cәsarәtsiz)* diffident; *(әmәzәk)* awkward, clumsy
**karsız**[1] *s* 1. *(vecsiz, faydasız)* worthless, good-for-nothing; useless; 2. *(tәsir etmәyәn)* ineffective, inefficacious; *(tәsir qüvvәsi olmayan)* impotent; *(dәrman haq.)* nondrastic, taking no effect; *(tutarlı olmayan)* ineffectual; ~ dәrman ineffective / non-drastic medicine / drug; ~ cәza ineffectual punishment; *(lazımi nәticә vermәyәn)* inefficient; ~ üsul inefficient method; 3. *(iş bacarmayan, işgüzar olmayan)* inefficient, not business-like, ineffectual; unable to get things done; ~ adam inefficient man* / person; 4. *(fәrsiz)* poor, bad; ~ natiq poor speaker; 5. *(küt, bacarıqsız)* obtuse
**karsız**[2] *z* ineffectively; inefficiently; ineffectually
**karsızlıq** *i* 1. *(vecsizlik)* uselessness; 2. *(tәsirsizlik)* ineffectiveness; inefficaciousness; 3. *(bacarıqsızlıq)* inefficiency
**kart** *i* (playing-) card; pasteboard; bir dәst ~ a pack of cards; ~la qumar *(oyunu)* gambling; ~ oynamaq to play cards; ~la qumar oynamaq to gamble; ~ paylamaq *(oyunda)* to deal* *(round)* the cards; ~ı kәsmәk to cut* the cards; ~da bәxti gәtirmәk to be* lucky at cards; ◊ ~ basmaq to cheat, to swindle
**kartoçka** *i (müxt. mәnada)* card; vizit ~sı visiting-card, calling card, pasteboard; kataloq ~sı index card
**kartof**[1] *i* potato; qızardılmış ~ fried potatoes; chips *pl.*; soyutma ~ boiled potatoes, potatoes boiled in their skins / jackets; közdә bişmiş ~ baked potatoes, potatoes baked in their skins / jackets; tәzә ~ new potatoes *pl.*; ~ soymaq to peel potatoes
**kartof**[2] *s* potato; ~ qabığı potato peelings, peels of potato; ~ püresi potato mash, mashed potatoes *pl.*; ~unu potato flour
**kartofçıxaran** *i bax* **kartofqazan**
**kartofçu** *i* potato grower
**kartofçuluq** *i* potato culture, potato growing
**kartofçuluq** *s* potato growing; ~ tәsәrrüfatı potato growing farm
**kartofdoğrayan**[1] *i* potato cutter
**kartofdoğrayan**[2] *s* potato-cutting
**kartofәkәn**[1] *i* potato-planter, potato grower
**kartofәkәn**[2] *s* potato-planting, potato growing
**kartofәzәn**[1] *i* potato-pulper
**kartofәzәn**[2] *s* potato-pulping
**kartofqazan**[1] *i* potato digger
**kartofqazan**[2] *s* potato-digging
**kartofsoyan**[1] *i* potato peeler
**kartofsoyan**[2] *s* potato-peeling
**kartoftәmizlәyәn** *s bax* **kartofsoyan**
**kartofyığan**[1] *i* potato lifter / picker / raiser, potato elevator
**kartofyığan**[2] *s* potato-picking; ~ kombayn potato-picking combine
**kartoqraf** *i* cartographer
**kartoqrafik** *s* cartographic(al)
**kartoqrafiya** *i* cartography
**kartoqram** *i* cartogram
**karton**[1] *i* pasteboard, cardboard

**karton²** *s* pasteboard, cardboard; ~ **qutu** pasteboard cardboard box
**kartonaj** *s* cardboard articles *pl.*; ~ **fabrikası** factory of cardboard articles; ~ **məmulatı** cardboard articles
**kartoteka¹** *i* card index, card catalogue; file
**kartoteka²** *s* card-index; ~ **qutusu** card-index box; file
**karusel** *i* merry-go-round; roundabout, whirligig
**kasa** *i* cup, bowl; ◊ **səbr ~sını daşırmaq** ≡ to make* the cup run over; **səbr ~sını doldurmaq** ≡ to fill up the cup *idiom.*; *Bizim səbr kasamız dolub Our patience is exhausted*
**kasad** *s* 1. *(bazar, ticarət haq.)* stagnant, dull, slack; ~ **bazar** stagnant / dull market; ~ **olmaq** to be* stagnant / dull; *Bu gün bazar kasaddır To-day the market is stagnant / dull; Bu həftə alver kasaddır Trade / Selling is slack / stagnant this week*; 2. *(qıt, az)* scanty, scarce, meagre, poor; in short supply; deficient; ~ **məhsul** poor crop; bad harvest; ~ **olmaq** to be* scarce / in short supply; *Bu il meyvə kasaddır* This year fruits are scarce; **bir şeydən ~ olmaq** to be* short of smth; *O, puldan kasaddır He is short of money / cash*; **ağıldan ~** mentally deficient
**kasadlaşdırmaq** *f* to impoverish *(d.)*, to make* scanty *(d.)*, to make* *(d.)* poor; **həyatı ~** to impoverish life
**kasadlaşmaq** *f* 1. *(bazar, alver haq.)* to become* stagnant / slack / dull; *Bazar kasadlaşıb The market has become stagnant / dull*; 2. *(qıtlaşmaq)* to become* scanty / scarce / deficient
**kasadlıq¹** *i* 1. *(bazarda, alverdə)* slackness of trade, bad selling; 2. *(qıtlıq)* scantiness, scarcity, deficiency, dearth, shortage, privation, short supply; *Keçən il meyvə kasadlığına quraqlıq səbəb oldu Last year the scarcity of fruits was caused by the drought*; ◊ ~ **çəkmək** to be* short *(of)*, to be* in want *(of)*
**kasadlıq²** *s*: ~ **vaxtında** / **dövründə** in time of dearth; ~ **ili** year of bad harvest; year of dearth *idiom.*
**kasaşəkilli** *s bax* **kasavarı**
**kasavarı** *s* bowl-shaped, cup-shaped
**kasayaoxşar** *s* cuplike, bowl-like
**kasıb¹** *i* poor; **~lar** the poor
**kasıb²** *s* 1. *(müxt. və məc. mənada)* poor; ~ **adam** poor man*; ~ **torpaq** poor soil; **təbii sərvətlərdən ~ ölkə** country poor in natural resources; ~ **nitq** poor speech; **ağıldan ~** feeble-minded; 2. dull; *(ehtiyacı olan)* indigent, needy; ~ **ailələr** needy families; 3. *(məzmunca, keyfiyyətcə zəif)* poor, mearge; ~ **düşmək** *bax* **kasıblaşmaq**; ~ **salmaq** *bax* **kasıblaşdırmaq**
**kasıbçılıq** *i bax* **kasiblıq**
**kasıb-kusub** *top. i d.d.* the poor, the poor people; **kənd ~ı** the village poor, the poor people in / of the village
**kasıblamaq** *f* to become* / to grow* poor; to fall* into poverty; to be* poorly off *idiom.*; *Əri öləndən bəri o, çox kasıblayıb She has been poorly off since her husband died*
**kasıblaşdırmaq** *f* to impoverish *(d.)*, to cause to become / to grow poor *(d.)*, to reduce to poverty *(d.)*
**kasıblaşmaq** *f bax* **kasıblamaq**

**kasıblıq** *i* 1. poverty, penury; indigence, frugality; ~ **içində yaşamaq** to live in poverty / penury; 2. *məc.* poorness, poverty *(of)*; **təxəyyülün kasıblığı** poorness / poverty of *one's* imagination; ~ **etmək** to earn for *one's* life; **kasıblığa düşmək** *bax* **kasıblamaq**; ◊ *Kasıblıq ayıb deyildir at. söz.* ≡ *Poverty is no sin; Poverty is not a shame, but the being ashamed of it is*
**kasıbvarı** *z bax* **kasıbyana**
**kasıbyana¹** *s* poor; modest; ~ **həyat** / **dolanışıq** modest life; ~ **paltar** / **geyim** modest dress / attire; *(yemək, qida haq.)* frugal; ~ **nahar** frugal dinner
**kasıbyana²** *z* poorly, in the manner of the poor; modestly; frugally; ~ **geyinmək** to dress modestly; ~ **yaşamaq** to live modestly; ~ **nahar etmək** to dine frugally
**kaska** *i* helmet
**kassa¹** *i* 1. *(mağazada)* cashbox; till; *(bilet satmaq üçün)* booking-office; **teatr ~sı** box-office; **yanmayan ~** safe; strong box; *(xırda pul yığmaq üçün)* money-box; 2. *(kredit müəssisəsi)*: **əmanət ~sı** savings-bank; **qarşılıqlı yardım ~sı** mutual insurance / benefit fund, mutual aid fund; 3. *poliqr. (şrift qutusu)* case
**kassa²** *s* cash; ~ **kitabı** cash-book; ~ **hesabı** cash-account
**kassasiya¹** *i hüq.* cassation
**kassasiya²** *s hüq.* cassation; ~ **şikayəti** appeal; ~ **məhkəməsi** Court of Appeal, Court of Cassation; ~ **şikayəti / ərizəsi vermək** to appeal to a Court of Cassation
**kassasiyaçı** *i one who refers to Court of Cassation*
**kasset** *i (foto və maqnitafon üçün)* cassette; *(foto lövhələri üçün)* plate-holder; *(kino lenti üçün)* film-holder; **video ~** video cassette
**kassir** *i* cashier
**kassirlik** *i* the post of a cashier
**kasta** *i* caste
**kastanet** *i* castanet
**kaş(ki)** *əd* if, if only; *Kaş o burada olaydı! If only she / he were here!*
**kaşalot** *i zool.* cachalot, sperm-whale
**kaşanə** *i* palace, mansion, mansion-house
**kaşı** *i* 1. glazed tile; glazed brick; 2. *(şirəli qab)* glazed vessel *(bowl, plate, dish, etc)*; glazed pottery
**kaşılı** *s (i.s.)* covered with glazed tiles; *(i.s.)* of glazed bricks
**kaşne** *i* muffler, scarf; comforter
**kataliz** *i kim.* catalysis
**katalizator** *i kim.* catalyst, catalyzer
**kataloq** *i* catalogue; **fənn ~u** subject catalogue; **~a daxil etmək** / **~nu tərtib etmək** to catalogue *(d.)*
**kataloqçu** *i* cataloguer
**katar** *i tib.* catarrh; **mədə ~ı** gastric catarrh
**katarakt** *i tib.* cataract
**kataraktlı** *s tib.* cataractal
**kataral** *i tib.* catarrahal
**kateqoriya** *i* 1. category; **qramatik ~** grammatic(al) category; 2. *id.* class



**kateqoriyalı** *s* 1. categoric, categorical; *(i.s.)* of a category, *(i.s.)* relating to a category; constituting a category; 2. *id. (i.s.)* of a class, *(i.s.)* relating to a class
**kater** *i dəniz.* launch; boat
**katet** *i riyaz.* cathetus
**kateter** *i tib.* catheter
**katib** *i* 1. secretary; **baş ~** secretary general; **daimi ~** permanent secretary; **şəxsi ~** personal / private secretary; **elmi ~** scientific secretary; **dövlət ~i** *(ABŞ-da)* Secretary of State; **~in müavini / köməkçisi** under-secretary; 2. *(xəttat)* scribe
**katiblik** *i* 1. *(katib vəsifəsi)* secretaryship; secretariat(e); 2. *(katiblər heyəti)* secretariat(e); ~ **etmək** to be* a secretary, to work as a secretary
**katod** *i fiz.* cathode
**katodlu** *s fiz.* cathodic
**katolik¹** *i* (Roman) Catholic
**katolik²** *s* (Roman) Catholic
**katoliklik** *i* (Roman) Catholicism
**katolikos** *i* Catholicos
**katolisizm** *i* (Roman) Catholicism
**katorqa¹** *i* penal servitude, hard labour; *(həm də məc.)* drugery; **~ya məhkum şəxs** convict; **~ya məhkum etmək** to condemn to penal servitude *(d.)*; **~ya məhkum edilmək** to be* condemned to penal servitude
**katorqa²** *s*: ~ **işi** hard labour, penal servitude; ~ **həbsxanası** convict prison
**kauçuk¹** *i (İndia)* rubber, caoutchouc; **sintetik ~** synthetic rubber
**kauçuk²** *s* rubber, caoutchouc; ~ **ağacı** caoutchouc tree
**kauçuklu** *s* rubber-bearing; ~ **bitkilər** rubber-bearing plants
**keçə¹** *i* felt, thick felt; ~ **çəkmə** felt boots, snow boots; ~ **atmaq / basmaq / təpmək** to felt, to full thick felt, to make* thick felt; **yerə ~ döşəmək** to cover the floor with felt; **üzərinə ~ çəkmək** to overlay* with felt *(d.)*
**keçə²** *s* felt; ~ **çəkmə** felt boots *pl.*; ~ **şlyapa** a felt hat
**keçəçi** *i* felter, fuller
**keçəçilik** *i* felting, fulling, profession of a felter / a fuller
**keçəxana** *i* fulling-mill, felt fulling-mill
**keçəl¹** *i* 1. *tib.* scabies; 2. bald spot / patch
**keçəl²** *s* 1. *(keçəllik xəstəliyinə tutulmuş)* scabby; 2. *(daz)* bald, bald-headed; ~ **yer** bald patch / spot
**keçəlbaş** *s* bald, bald-headed
**keçələmək** *f* to cover with (thick) felt *(d.)*; to overlay* with (thick) felt *(d.)*
**keçələnmək** *f* to be* covered with *(thick)* felt; to be* overlaid with *(thick)* felt
**keçələt** *i* ford
**keçələtdirmək** *f bax* **keçələtmək**
**keçələtmək** *f* to ask / to cause *smb.* to cover *(d.)* with *(thick)* felt, to ask / to cause *smb.* to overlay *(d.)* with *(thick)* felt
**keçəlkərkəs** *i zool.* griffon (-vulture)
**keçəlləşmək** *f* 1. to grow* bald; 2. to fall* ill with tetter / mange, to be* taken ill with tetter / mange

**keçəllik** *i* 1. *(xəstəlik)* mange, tetter; scab; 2. *(dazlıq)* baldness
**keçən¹** *i* bygone; ◊ *Keçənə güzəşt deyərlər at.söz.* ≡ Let bygones be bygones
**keçən²** *s* 1. *(keçib getmiş)* past, overpast, bygone; ◊ *Keçən gün ələ düşməz at. söz.* ≡ *Lost time is never found again; Keçən günə gün çatmaz (calasan günü günə) at. söz.* ≡ *The past time was the best time*; 2. *(ötən, əvvəlki)* previous, last; ~ **həftə** last week
**keçi¹** *i* goat; *(erkəyi)* he-goat, billy-goat; *(dişisi)* she-goat, nanny-goat; ◊ **~ni bostana buraxmaq** ≡ to set* the wolf to keep the sheep; ◊ *Keçi suyu bulandırdı* ≡ *Find quarrel in a straw*
**keçi²** *s* goat, goat's; ~ **südü** goat's milk; ~ **əti** goat's meat; ~ **dərisi** goat's skin; ~ **balası** kid
**keçici** *s* 1. *(ötüb keçən, ötəri)* transient, transitory; passing; challenge; ~ **hisslər** transient feelings; ~ **bayraq** challenge banner; ~ **kubok** *id.* challenge prize / cup; 2. *(yoluxucu)* contagious, infectious; *elm.* zymotic; ~ **xəstəlik** infectious / zymotic disease
**keçicilik** *i (yoluxuculuq)* infectiousness, contagiousness
**keçid¹** *i* 1. *(müxt. məna)* passage; transition; **istidən soyuğa ~** transition from heat to cold; **kapitalizmdən sosializmə ~** transition from capitalism to socialism; **yeddillik təhsildən ümumi onillik təhsilə ~** switch-over from 7-year education to general 10-year education; 2. *(çayda)* ford, crossing, river-crossing; 3. *(küçədə)* crosssing, passage, passage-way; 4. *(dağlarda)* pass
**keçid²** *s* transition(al); ~ **dövrü** transition(al) period
**keçilmək** *f* 1. *(məsafə)* to be* covered; *(çay, körpü, sərhəd və s.)* to be* crossed; *(maneə)* to be* surmounted (by / with); 2. *(aparılmaq: dərs, məşğələ və s.)* to be* conducted; *Dərslər bu otaqda keçilir Lessons are conducted in this room*; 3. *(tədris olunmaq)* to be* taught; *Məktəblərdə müxtəlif fənlər keçilir Various subjects are taught at schools*
**keçilməz** *s* 1. *(keçilməsi mümkün olmayan)* impassable, impenetrable; ~ **yol** impassable road / way; ~ **meşə** impenetrable forest; ~ **palçıq** impassable mud; 2. *(bağışlanılmaz)* unpardonable, inexcusable, unforgivable; ~ **günah** unpardonable sin
**keçilməzlik** *i* impassability
**keçinmək** *f* I 1. *(dolanmaq, yaşamaq)* to live somehow, to live from mouth to mouth; 2. *(yola getmək)* to get* on *(with)*, to get* along together *(with)*; 3. *(ötüşmək)* to manage *(without)*, to do* *(without)*; *Köməksiz keçinə bilərsinizmi? Can you manage / do without assitance / help?*
**keçinmək** *f* II *(ölmək)* to pass away, to decease, to die
**keçiotaran** *i* goatherd, shepherd
**keçirici¹** *i fiz.* conductor; **elektrik ~si** *bax* **naqil**
**keçirici²** *s fiz.* couductive, conducting
**keçiricilik** *i fiz.* conductivity; conductance; **maqnit (dövrəsinin) ~i** permeability, permeance
**keçirilmək** *f* 1. *(icra olunmaq, aparılmaq)* to be* held; to be* conducted; to be* carried out; *İclaslar bu zalda keçirilir Meetings are held in this hall;*

*Seçkilər hər beş ildən bir keçirilir* *Elections are held every five years;* *Bu kampaniya hər yanda keçirilir* *The campaign is conducted / carried on everywhere;* *Daha sınaqlar keçirilməyəcəkdir* *Tests will be not carried out any more;* həyata ~ to be* put into practice, to be* realized; *(qərar)* to be* implemented; 2. *(ötürülmək)* to be* passed; *(elektrik cərəyanı)* to be* conducted *(by)*

**keçirməyən** *s:* su ~ water-resistant; water-proof, water-tight; cərəyan ~ non-conductive

**keçirtmək** *f* I 1. *(addatmaq)* to take* / to lead* / to put* across *(d.)*; to convey *(d.)*; *(xəlvətcə)* to smuggle *(d.)*; *(bərə ilə)* to ferry *(d.)*; çaydan *(körpüdən, sərhəddən)* ~ to take* across the river / bridge / frontier; su ~ to be* pervious to water; to leak; su keçirməmək to be* impervious to water, to be* water-resistant; 2. *(bir şeyin içərisindən)* to run* / to pass / to put* *(d.through)*; *Məftili borunun içərisindən keçir(t)* *Pass the wire through the pipe;* əti maşından ~ to mince meat; 3. *(başqa işə, vəziyyətə, vəzifəyə və s.)* to transfer *(to)*, to move *(to)*; to switch *(d.over to)*; to shift *(to)*; *Onu başqa vəzifəyə keçirdilər* *They transfered / moved him to another post / position;* *Gəlin söhbəti başqa mövzuya keçirək* *Let's switch the conversation over to another subject;* 4. *(icra vaxtını dəyişdirmək)* to put* off / to adjourn *(d.till)*, to postpone *(d.)*; to delay *(d.)*; *İclası sabaha keçirdilər* *They put off / adjourned the meeting till tomorrow;* 5. *(icra etmək)* iclas / konfrans ~ to hold* a meeting / a conference; seçkilər ~ to hold* elections; reforma ~ to carry out a reform; müzakirə ~ to held* / to lead* a discussion; həyata ~ to put* into practice *(d.)*; to realize *(d.)*; *(qərarı)* to implement *(d.)*; kampaniya ~ to conduct / to carry on a campaign; 6. *(taxmaq, geydirmək)* to pull on *(d.)*; to put* on *(d.)*, to get* on *(d.)*; başına ~ to pull over *(d.)*; dəstəyə ~ to haft *(d.)*, to thrust into the haft; yüyəni atın başına ~ to bridle a horse, to put* the bridle on a horse; *(cərəyanı)* to conduct *(d.)*; *Rezin elektrik cərəyanını keçirmir The rubber doesn't conduct the electric current;* 7. *(vaxtı)* to spend* *(d.)*, to pass *(d.)*; vaxt ~ to pass (away) the time, to cheat time, to while the time away; vaxtı boş ~ to waste time; to pass the time idly; to loaf away *one's* time; 8. *(yaşamaq)* to live; to be*; köçəri həyat ~ to live a nomadic life; ömrünü fəhləlikdə ~ to be* a worker throughout *one's* life; uşaqlığını kənddə / şəhərdə ~ to spend* *one's* childhood in the country / in town; nəzərdən ~ to look over / through *(d.)*; ötəri nəzərdən ~ to glance / to run* over *(d.)*; qılıncdan ~ to put* to the sword *(d.)*; həyəcan ~ to be* alarmed, to get* / to be* excited; qorxu hissi ~ to feel* / to experience fear; xəstəlik ~ to have* an illness, to be* ill / sick for a time

**keçirtmək** *f* II *(söndürmək)* to put* out *(d.)*, to extinguish *(d.)*; odu / ocağı ~ to put* out / to extinguish a fire; işığı ~ to turn off / to switch off / to put* out the light; şamı ~ to put* out a candle, to blow* out a candle; qazı ~ to turn off the gas

**keçmək** *f* I 1. *(müxt. məna)* to pass; basıb üstündən ~ to run* / to move over *(d.)*; üstündən sürüb ~ to override* *(d.)*; üstündən addımlayıb ~ to overstep *(d.)*; arxasına ~ to go* behind; daxilinə ~ to pass / to penetrate into; başqa əllərə ~ to pass into other hands; başqa məsələyə ~ to go* on to the next / other question / point; əldən ələ ~ to pass through many hands, to change hands *(many times)*; bir kəsin əlinə ~ to fall* into *smb.*'s hands; yan ~ to avoid *(d.)*, to leave* out *(d.)*; məsələdən yan ~ to by-pass / to side-step the question; üstündən ~ *(nəzərə almamaq)* to overlook *(d.)*, to pass over, to disregard *(d.)*; *By məsələnin üstündən keçmək olmaz* *This problem cannot be passed over / disregarded;* 2. *(bir tərəfdən o biri tərəfə)* to cross *(d.)*, to get* across *(d.)*; sudan ~ to wade through the water; körpüdən / sərhəddən / çaydan ~ to get* across / to cross the bridge / river / frontier; düşmən(in) tərəf(in)ə ~ to desert to the enemy; bir kəsin tərəfinə ~ to come* over to *smb.*'s side; 3. *(yol, məsafə qət etmək)* to cover / to traverse *(d.)*; *O, uzun və şərəfli bir yol keçib* *He has covered / traversed a long and glorious path;* 4. *(zaman, vaxt, haq.)* to pass, to elapse, to go*, to wear* on / away; *İki saat keçdi, amma o gəlmədi* *Two hours passed but he didn't come;* *Sən oyanana qədər bir neçə saat keçdi* *Several hours elapsed before you woke up;* *Vaxt keçir* *Time is moving on;* zaman keçdikcə... by the lapse of time...; başqa işə *(peşəyə)* ~ to change *one's* work *(profession)*; sözdən işə ~ to pass from words to deeds; hücuma ~ to launch an attack, to take* / to assume the offensive; o biri sinifə ~ *(məktəbdə)* to get* *one's* remove; başqa mövzuya ~ to turn to other things; 5. *(ötmək, arxada qoymaq)* to outrun, to outdistance *(d.)*, to leave* *(d.)* behind, to pass *(d.)*; *(uçuşda)* to outfly* *(d.)*; *(cıdırda)* to forge ahead *(off)*; 6. *(olmaq, baş vermək)* to be*; *Müzakirə müvəffəqiyyətlə keçdi* *The discussion was successful;* 7. *(yoluxmaq, sirayət etmək)* to infect *(d.)*; *Xəstəlik uşağa da keçmişdi* *The disease had infected the child too;* təsiri ~ to affect *(d.)*, to influence *(d.)*, to impact *(d.)*, 8. *(sovuşmaq, qurtarmaq)* to be* over, to pass; *Onun xəstəliyi keçib* *His illness is over / has passed;* 9. *(öyrənmək)* to study *(d.)*; *Onlar iki xarici dil keçirlər* *They study two foreign languages;* təcrübə ~ to do* practical work; to practice; 10. *(təlim etmək)* to conduct *(d.)*; dərs ~ to conduct a lesson; hərbi taktiki / təlim ~ to conduct / to carry out tactical exercises; 11. *(qiymətdə güzəşt etmək)* to bate, to abate, to take* off *(d.)*, to come* down; *O, bir qəpikdən də kecməz* *He / She won't take a farthing less;* günahından *(təqsirindən, suçundan)* ~ to absolve *smb.* from sin *(guilt; blame)*; *Sənin bütün günahlarından (təqsirindən, suçundan) keçirəm* *I absolve you from all sins (blame);* *Tarix günahımızdan keçər* *History will absolve us*

**keçmək** *f* II *(sönmək)* to go* out, to be* out, to die out

**keçmiş**[1] *i* the past; old times *pl.*; antiquity; şərəfli ~ glorious past; uzaq ~ remote past; ~ də in former



times, in the old days; formerly; in the olden times / days; yaxın ~ də not long ago, in recent times

**keçmiş**[2] *s* past, former, bygone; ~ zaman *qram.* past tense; ~ zamanlarda in former times, in the old days, in bygone days, in the time now past

**keçmiş**[3] *z* after, later; bir az ~ not long after, bir neçə gün ~ a few days later; bir həftə ~ a week later; *Biz bir az keçmiş gəldik* *We arrived soon after*

**kef**[1] *i* 1. *(ovqat)* humour, mood, spirits, frame of mind; fig; ~i kök in good fig; ~i aşağı olmaq to be* in low spirits / out of humour; 2. (hal, əhval) health, state of health; *Xəstənin kefi necədir?* *How is the patient's health? In what state of health is the patient?* *(Öz) kefin necədir?* *How are you?* 3. *(həzz, nəşə)* pleasure, delight, sweet bliss; *(sərxoşluq nəşəsi)* kef, keef; 4. *(eyş-işrət məclisində əylənmə)* carouse, carousal, revel(s), racket, orgy, bacchanalia, drinking bout; *d.d.* burst; *amer.* *(jarqon.)* bat; ~ə qurşanmaq to go* on the racket, to go* on a bat; 5. *(istək, şıltaq)* whim, whimsy; sweet will; ~i qalxanda / istəyəndə when she / he is in a whimsical mood; öz ~inə at *one's* own sweet will; ~ vermək 1) *(zövq vermək)* to give* pleasure *(i)*, to delight *(d.)*; 2) *(əyləndirmək)* to amuse *(d.)*, to give* joy *(i.)*; to divert *(d.)*, to entertain *(d.)*; ~ eləmək 1) *(əylənmək)* to divert oneself; to have* lovely merry-making / floric / merriment; 2) *(kef məclisində əylənmək)* to carouse, to revel *(in)*, to spree, to go* on the spree; to have* an orgy; *d.d.* to go* on the burst; *amer.* *(həmç.)* to go* on a bat; 3) *(firavan yaşamaq)* to be* in bliss; to luxurate *(in, on)* ~də olmaq to be* on the spree, to have* a spree; *Əcəb kefdir!* *What a spree!* ~ə qurşanmaq to engage in a carousal, to go* on the spree, to go* on a bat; ~ə getmək to go* out on a spree; ~i aşağı olmaq to be* in low spirits / out of humour, to be* out of sorts *d.d.*; to be* a cup too low *idiom*; ~i açılmaq / durulmaq / kökəlmək to cheer up, to become* cheerful / merry; ~i qarışmaq: 1) to lose* *one's* good spirits; 2) to take* a turn for the worse, to become* / to grow* worse *(about smb's health)*; *Xəstənin kefi qarışıb* *The patient's health has taken a turn for the worse;* ~i istəmək to wish, to want, to desire; *Kefi istəyəndə gedə bilər* *He may go whenever he wants to;* ~i istəyən qədər to *one's* heart's content; ~ yuxarı olmaq: 1) to be* in high spirits / high-spirited / in whimsical mood; to be* in good fig; 2) *(sərxoş olmaq)* to be* ( a little) tipsy; to be* in *one's* cup *idiom.*; ~i kök / saz olmaq 1) to be* in high spirits / in whimsical mood, to be* in good fig; 2) *(güzaranı yaxşı olmaq)* to be* well-to do / prosperous / well-off; to be* well-heeled *idiom*; ~i kök olmaq to live in plenty; ~i olmamaq: 1) to be* out of humour / in low spirits; 2) *(özünü xəstə hiss etmək)* to feel* ill; ~i pozulmaq / korlanmaq to lose* *one's* good spirits, to be* dispirited / crestfallen / dejected; *Onun kefi pozuldu* *His / Her spirits drooped;* *Kefim yoxdur:* 1) *I feel ill / bad;* 2) *I have no mood (for);* *Kefin necə istəyir* *As you like / wish; It is up to you;* *Öz kefinə bax* *As you like / wish; It is up to you;* bir kəsin ~inə dəymək / toxunmaq to offend *smb.*, to hurt* / to wound *smb's* feelings; öz ~ inə at *one's* sweet will / pleasure / wish; ~inə yatmaq to like *(d.)*, to please *(d.)*; *Bu onun kefinə yatmır* *It doesn't please him / her;* ◊ ~ inə soğan doğramaq to upset* *(d.)*, to dispirit *(d.)*; ~ini açmaq: 1) *(özünün)* to amuse oneself; 2) *(başqasının)* to amuse *smb.*; to exhilarate *(d.)*; to put* *smb.* in good spirits, to keep* up *smb's* spirits; ~ini korlamaq / pozmaq to upset* *(d.)*, to dispirit *(d.)*, to deject *(d.)*, to make* *smb.* sad

**kef**[2] *s:* ~ əhli merrymaking people; ~ məclisi drunken revelry, a jovial feast, spree, wild merry making; ~ məclisi qurmaq to have* drinking-bout / an orgy / a revelry

**kefal** *i* *zool.* grey mullet

**kefcil**[1] *i* reveller, carouser

**kefcil**[2] *s:* ~ adam reveller, debaucher

**kefcillik** *i* carousal, carouse, revelry, reveling, debauchery

**kefçi** *i* *bax* **kefcil**[1]

**kef-damaq** *i* *bax* **kef** *(4-cü mənada)*

**kef-əhval** *i* *bax* **kef** *(1-ci və 2-ci mənalarda)*

**kefxana** *i* secret resort; an opium den

**kefikök**[1] *s* 1. well-doing, well-to-do, well-off; ~ adam a well-doer; 2. *(kefi yuxarı)* exhilarated

**kefikök**[2] *z* luxuriously, sumptuously; ~ yaşamaq to live luxuriously / in clover

**kefiköklük** *i* well-doing; *(xoş əhval-ruhiyyə)* exhilaration

**kefir** *i* kefir, yog(h)ourt, yog(h)urt

**kefləndirici** *s* intoxicating, heady, befudding; ~ şərab heady wine; ~ hava heady air

**kefləndirmək** *f* to intoxicate *(d.)*, to inebriate *(d.)*, to make* drunk / tipsy / dizzy *(d.)*; to befuddle *(d.)*

**keflənmə** *fi* intoxication, inebriation, inebriety; getting / growing intoxicated, getting tipsy / drunk / dizzy

**keflənmək** *f* to get* / to grow* intoxicated, to get* drunk / tipsy / inebriate; to be* drunk / tipsy *(with)*, to be* intoxicated *(with)*

**kefli**[1] *i* drunk man; *d.d.* sot

**kefli**[2] *s* intoxicated, drunk, tipsy, inebriate; tight *d.d*; ~ yerişi tipsy gait; ~ səs tipsy voice

**kefli-kefli** *z* in the state of intoxication, in the drunken state; tipsily, drunkenly, sotishly

**keflilik** *i* tipsiness, drunkenness; inebriation, sotishness

**kefsiz**[1] *s* 1. *(xəstə)* unwell, unhealthy; sick; ~ olmaq to be* / to feel* unwell; 2. *(bikef)* dejected, depressed; sad, spiritless, gloomy; ~ görünmək to look dejected; ~ olmaq to be* spiritless / morbid / sad; ~ adam a dejected person

**kefsiz**[2] *z* sorrowfully, sadly; spiritlessly, dejectedly

**kefsiz-kefsiz** *z* *bax* **kefsiz**[2]

**kefsizləmək** *f* to be* unwell / ill / ailing; to feel* ill / unwell

**kefsizlik** *i* 1. indisposition; sickness, ailment; 2. *(pərişanlıq)* dejection; slack / languid / dull mood

**keks** *i* cake

**keql** *i* I 1. *(oyun)* skittles, ninepins; 2. *(oyundakı toxmaqların hər biri)* skittle, ninepin; ~ oynamaq to play skittles / ninepins

**keql** *i* **II** *poliqr.* point; size of type; ~ **8-lik** eight pointtype ~ **10-luq** ten pointtype

**kelt**[1] *i* Celt

**kelt**[2] *s* Celt; ~ **dili** Celtic, the Celtic language

**kenquru** *i zool.* kangaroo

**kepka** *i* cap

**keramika**[1] *i* ceramics [sɪˈrænɪks]

**keramika**[2] *s* ceramic [sɪˈrænɪk]

**keramikaçı** *i* ceramist

**keşik** *i* guard, watch; ~ **çəkmək** to watch *(d.)*, to keep* watch *(over)*, to sentinel *(d.)*; **~də durmaq** to be* on guard / on watch; **keşiyində durmaq** to be* / to stand* on guard *(of)*, to stand* sentinel *(over)*; **sülhün keşiyində durmaq** to stand* on guard of peace

**keşikçi**[1] *i* watch *(man)*, guard, guardsman*; sentry, sentinel; *(qadın)* female watchman*; **gecə ~si** night watchman*; ~ **qoymaq** to post a sentry; **~ni dəyiş(dir)mək** ~ to relieve a sentry

**keşikçi**[2] *s* sentry, watch, guard; ~ **budkası** watch-box, sentry-box; ~ **dəstəsi** sentry-unit; ~ **postu** sentry post; ~ **qülləsi** watch-tower; ~ **gəmisi** patrol ship, partol vessel

**keşikçilik** *i* 1. *(vəzifə)* office / position of a watchman / a guardsman*; 2. *(keşik çəkmə)* guarding, protection

**keşikxana** *i* guard-room, guard-house

**keşiş** *i* priest, clergyman; **baş** ~ bishop

**keşişlik** *i* priesthood; an office of a priest / a bishop

**keşniş** *i bot.* coriander

**key**[1] *i* dullard, blockhead; *(əfəl)* mutt

**key**[2] *s* 1. *(donuq, hissiyyatsız)* numb; 2. *(süst)* torpid, stolid, languid, stagnant; 3. *(ləng tərpənən)* inert; sluggish; 4. *(küt)* stupid, dull; ~ **kimi olmaq** to become* / to grow* numb; *O, kontuziyadan key kimi olmuşdu* He had become numb from shell-shock; ◊ ~ *balaxanım d.d.* ≅ dullard; mutt, blockhead

**keyfiyyət** *i* quality; **aşağı** ~ inferior quality; **əla** ~ top quality; **yüksək** ~ high quality; *Siz kəmiyyətdən çox keyyfiyyəti güdməlisiniz You must aim at quality rather than quantity;* ~ **dəyişməsi** *fəls.* qualitative change; **kəmiyyətin ~ə keçməsi** transformation of quantity into quality; *Kəmiyyət keyfiyyətə keçir Quantity is transformed into quality*

**keyfiyyətcə** *z* by quality

**keyfiyyətli** *s* qualitative, *(i.s.)* of quality; **aşağı** ~ of inferior quality; *(of)* low-grade; **orta** ~ *(i.s.)* of mean quality; **yüksək** ~ *(i.s.)* of high quality / standard; **əla** ~ *(i.s.)* of top quality; **yüksək ~ mallar** goods of high quality / standard

**keyfiyyətlilik** *i* being of good quality, having good quality

**keyfiyyətsiz** *s (i.s.)* of inferior / bad quality, *(i.s.)* of low-grade

**keyfiyyətsizlik** *i* lack of quality, being of inferior / bad quality

**keyidici**[1] *i* anaesthetic; **yerli** ~ local anaesthetic; **ümumi** ~ general anaesthetic

**keyidici**[2] *s* anaesthetic; ~ **maddə** anaesthetic substance

**keyimə** *fi* 1. becoming / growing / getting numb *(with)*; *(keyidicinin təsirilə)* anaesthesia; **yerli** ~ local anaesthesia; 2. *məc. (kütləşmə)* stupefaction, torpor

**keyimək** *f* to become* / to grow* / to get* numb *(with)*; *Onun əlləri soyuqdan keyiyib His hands have become / grown numb with cold;* *(keyidicinin təsirilə)* to be* anaesthetized

**keyimiş** *fs* 1. numbed, asleep; 2. *(süstləşmiş)* apathetic; torpid; sluggish; 3. *məc. (kütləşmiş)* stupefied

**keyitmə** *fi* anesthesia

**keyitmək** *f* 1. to numb *(d.)*, to make* numb *(d.)*; 2. *(ağrısızlaşdırmaq)* to an(a)esthetize, to anesthetise *(d.)*; 3. *məc. (hissini kütləşdirmək)* to stupefy *(d.)*; to make* senseless *(d.)*; **vurub** ~ to knock senseless *(d.)*

**keyləşdirici** *s bax* **keyidici**[2]

**keyləşdirilmək** *f* 1. to be* anaesthetized; 2. *məc.* to be* stupefied

**keyləşdirmək** *f bax* **keyitmək**

**keyləşmək** *f* 1. *bax* **keyimək;** 2. to become* / to grow* stolid / torpid; to sink* into torpor; to be* stupefied

**keylik** *i* 1. *(donuqluq, hissiyyatsızlıq)* numbness; 2. *(süstlük)* languidness, torpidness, stolidity; sluggishness, apathy; 3. *məc. (kütlük)* stupidity; dullness

**kəbə** *i* 1. Kaaba, Caaba *(the shrine of Mecca enclosing a sacred black stone, toward which Mohammedans face while praying)* 2. *məc. (əziz, müqəddəs şey)* sacred / holy thing; *(əziz, müqəddəs yer)* holy / sacred place; sanctuary

**kəbin**[1] *i* marriage-contract, marriage settlement; ~ **kəsmək** to register the marriage; *(dini qaydada)* to marry *(d.)*; ~ **kəsdirmək** to register / to sign *one's* marriage; *(dini qaydada)* to get* married; **~ini vermək** *(boşamaq)* to divorce *(d.)*, to agree to divorce; ◊ *Kəbinləri göydə kəsilib Their marriage is made in heaven*

**kəbin**[2] *s* marriage; ~ **kağızı** certificate of marriage, marriage lines *pl.*; ~ **pulu** bride-money

**kəbinli** *s (kəbin kəsilmiş) (i.s.)* with marriage-contract / marriage bond; *(i.s.)* in married state; ~ **arvad** lawful / legal / rightful wife; *(ərli qadın)* married woman

**kəbinsiz**[1] *s (i.s.)* without a marriage bond / a marriage-contract, *(i.s.)* having no marriage-contract; in sin; ~ **izdivac** uncertified marriage; ~ **arvad** a wife in sin; a concubine, a woman without a marriage bond

**kəbinsiz**[2] *z* signing no marriage-contract / not signing *one's* marriage; ~ **ərə getmək** to marry signing no marriage-contract / without a marriage bond / not signing *one's* marriage; ~ **yaşamaq** to cohabit

**kəbinsizlik** *i* cohabition; *the state of being without marriage contract / bond*

**kəc**[1] *s* slanting, skew; oblique; ~ **nəzər / baxış** scowling look, sidelong glance

**kəc**[2] *z* 1. slantwise, aslant, askew; *(qaşqabaqlı)* scowlingly; ~ **baxmaq** to look aslant / askew; *(tərs-tərs baxmaq)* to look scowlingly, to scowl; 2. *(tərs, zidd)* counter *(to)*; in defiance of; ~ **danışmaq** to speak* in defiance *(of)*



**kəcavə** *i* palanquin

**kəc-kəc** *z* (çəp) aslant, askew, slantwise; *(tərs-tərs)* scowlingly

**kədər** *i* sorrow, grief, sadness; depression; melancholy, dole, dolour

**kədərləndirici** *s* distressing, grieving, saddening

**kədərləndirmək** *f* to sadden *(d.)*, to make* sad *(d.)*, to grieve *(d.)*, to distress *(d.)*

**kədərlənmək** *f* to mourn, to grieve, to sadden, to become* sad; to lament

**kədərli**[1] *s* sad, sorrowful, mournful, grievous; lamentable; gloomy; painful; doleful; ~ **sifət / üz** sad face

**kədərli**[2] *z* sorrowfully, sadly, dolefully

**kədərlilik** *i* sadness, sorrowfulness, grievousness, mournfulness, gloominess

**kədərsiz** *s (i.s.)* free of sorrow, non-grievous, *(i.s.)* without grief / sorrow

**kəf** *i* scum; **~ini almaq / yığmaq** to remove scum *(from)*; to scum / to skim *(d.)*; ◊ ~ **getmək / gəlmək** to dupe *(d.)*, to swindle *(d.)*; to cheat *(d.)*

**kəfən** *i* shroud, cerement(s); **~ə bükmək / tutmaq** to shroud *(d.)*, to wrap / to clothe *(d.)* in a shroud; ◊ **~i yırtmaq** to rise* from the dead; to revive

**kəfənləmək** *f* to shroud *(d.)*, to clothe in a shroud *(d.)*

**kəfənlənmək** *f* to be* shrouded; to be* clothed in a shroud

**kəfənlətdirmək** *f bax* **kəfənlətmək**

**kəfənlətmək** *f* to ask / to cause *smb.* to shroud *(d.)*

**kəfənli** *i* shrouded; clothed / wrapped in a shroud

**kəfənlik** *i* linen / cloth for shroud / cerement(s)

**kəfənsiz** *s* shroudless, *(i.s.)* without a shroud, cerementless

**kəfgir** *i* 1. scummer, skimmer; 2. *(saatda)* pendulum

**kəfli** *s* scummy

**kəhər**[1] *i* bay *(horse)*; *O, öz kəhərini minmişdi He was riding on his bay*

**kəhkəşan** *i* 1. *astr. (süd yolu)* Milky Way; *(qalaktika)* Galaxy; 2. *(ulduzlar aləmi)* myriad of stars

**kəhrəba** *i* amber

**kəhriz** *i* underground water-supply / -pipe

**kəkə**[1] *i* stutterer, stammerer

**kəkə**[2] *s* stuttering, stammering

**kəkələmək** *f* to stutter, to stammer

**kəkələnmə** *fi* ruffling, blustering, swaggering; mounting / riding the high horse *idiom.*

**kəkələnmək** *f* to ruffle, to bluster *(at)*; to swagger; to mount / to ride* the high horse *idiom.*

**kəkəlik** *i* stutter, stammer

**kəkil** *i* forelock, topknot, tuft *(of hair)*, *(quşda)* crest, cop, copple-crown

**kəkilli** *s (i.s.)* with / *(i.s.)* having a forelock, with having a topknot; *(heyvan haq.)* tufted, crested, copple-crowned; ~ **ördək** a tufted duck; ~ **toyuq** a copple -crowned hen, a hen with a crest / a topknot

**kəklik** *i zool. (çil)* partridge; *(ağ)* willow grouse, ptarmigan

**kəklikotu** *i bot.* thyme [taim]

**kəkotu** *i bax* **kəklikotu**

**kəkov** *s bax* **kəkə**

**kəl** *i zool.* (male) buffalo

**kəlağayı** *i* silk kerchief, silk covering for head, silky head-dress / headgear

**kəlağayılı** *s (i.s.)* wearing a silk kerchief / silky head-dress

**kəlam** *i* 1. *(söz)* word; *(hekimanə ifadə)* saying, aphorism; dictum, apophthegm, byword; 2. *(söhbət)* (speech-) talk; ◊ *əvvəl təam, sonra kəlam at. söz.* ≅ *First eating, then speaking*

**kəlbətin** *i* pincers, nippers, tongs, ~ **ilə çəkmək** *məc.* ≅ to haul *(d. away)*

**kəlçə** *i* buffalo calf, young of buffalo

**kələ** *i zool.* bull; **~yə gəlmə** rut, estrus, being on / in heat *(of animals)*; **~yə gəlmək** to rut; ◊ ~ **kimi** *(olmaq)* ~ *(to be*)* as strong as a horse, *(to be*)* as sound as a roach

**kələf** *i* skein, hank; ◊ ~ **ini dolaşdırmaq** ≅ to spoil / to ruin *smb.'s* game

**kələfaçan** *i tex.* reel

**kələfçə** *i* 1. skein, hank, 2. *tex.* bobbin, reel, spool

**kələk** *i* 1. *(hiylə, fənd)* trick, trickery, art, artifice; shuffle, craft, dodge, wile; **şeytanın kələyi** the wiles of the devil; *O kələyin daha baş tutmaz / keçməz You shall not serve that twice;* ~ **işlətmək** to use trickery, to practice tricks; 2. *(hiyləli qurğu, tələ)* stratagem, device, crafty designs, contrivance, ruse; **bir kəsə ~ qurmaq** to harbour *(crafty)* designs on / aganist *smb.*; 3. *(fırıldaq, aldatma)* fraud, deception, machination; cheat, cheating, roguery, swindle, foul play, imposture; ~ **gəlmək** *(hesabda, oyunda)* to cheat *(d.)*, to swindle *(d.)*, to defraud *(d.)*, *(qumarda)* to sharp *(d.)*; *O mənə hesabda 5 manat kələk gəldi He cheated me (out) of five manats;* ~ **işlətmək / qurmaq** to machinate; **~yə düşmək** to get* into pitfall / trouble; to be* cheated / defrauded; **~yə salmaq** to do* an ill / bad turn *(i)*; ◊ **~yini kəsmək** to perish *(d.)* / to kill *(d.)*; to keep* *smb.'s* nose to the grindstone *idiom.*

**kələkbaz**[1] *i* trickster, a crafty person; *(bic)* a sly / an arch / a cunning person; *(fırıldaqçı)* a fraud, a cheat, a cheater, a swindler, a crook, a sharper; *(uşaq haq.)* little rogue; *zaraf. (xüsus. uşaq)* rascal; *(fəndgir)* dodger, knave

**kələkbaz**[2] *s* artful, tricksy, tricky, crafty; *(bic)* cunning; *(fırıldaq işlədən)* fraudful, knavish, roguish, *(fəndgir)* dodgy

**kələkbazlıq** *i* artfulness, craftiness, fraudfulness; *(fəndgirlik)* dodgery; *(fırıldaqçılıq)* knavery, roguery; roguishness

**kələk-külək** *i d.d.* hanky-panky, ruse [ru:z]

**kələklə** *s* by trick, craftily; by fraud, fraudfully

**kələkləmək** *f* *(aldatmaq)* to cheat *(d.)*, to defraud *(d.)*, to swindle *(d.)*

**kələ-kötür** *s* rough, rugged, bumpy, uneven; ~ **yol** bumpy / rough road; ~ **dəri** rough skin; ~ **səth** rough surface; **sifət** a rugged face

**kələ-kötürləşdirmək** *f* to roughen *(d.)*, to make* rough / bumpy *(d.)*

**kələ-kötürləşmək** *f* to roughen, to become* rough bumpy

**kələ-kötürlük** *i* roughness, ruggedness, bumpiness

**kələksiz**[1] *s* trickless, craftless, artless; *(fırıldaqsız)* fraudless, ruseless, cheatless; *(sadədil adam haq.)* guileless

**kələksiz**[2] *z* fraudlessly; artlessly

**kələm**[1] *i* cabbage; baş ~ heads of cabbage.; duzlu / turşuya qoyulmuş ~ sauerkraut [ˈsauəkraut]; gül ~ cauliflower

**kələm**[2] *s* cabbage; ~ başı cabbage-head; ~ böcəyi *zool.* bug; ~ yarpağı cabbage leaf; ~ kötüyü cabbage stalk; ~ supu cabbage soup

**kələmdolması** *i* cabbage dolma *(minced meat with rice wrapped in cabbage leaves)*

**kələmkəpənəyi** *i zool.* cabbage butterfly

**kələmqurdu** *i zool.* cabbage-worm

**kələmlik** *i* cabbage field

**kələz** *i zool.* pangolin

**kəllə**[1] *i* 1. *anat.* skull, cranium (*pl.* crania); 2. *məc. d.d. (baş, beyin)* pate, poll. *zaraf.* pan *d.d.*; ◊ ~ işlətmək to use *one's* loaf, to use *one's* brains *d.d.*; *Kəlləni işlət! Use your loaf. Use your brains!*; 3. *(baş)* head; bir ~ qənd sugarloaf, a loaf of sugar; 4. *(təpə)* pate; *(heyvanda)* poll; 5. *(baş zərbəsi)* butt; ~ vurmaq to butt *(d.)*; 6. *(zirvə)* top; ağacın ~si the top of a tree; 7. *(çarpayıda, divanda və s.)* head; ◊ ~ sındırmaq to puzzle over *smth.*, to rack / to cudgel *one's* brains over *smth.*; ~- ~yə gəlmək to come* into collision *(with)*, to clash *(with)*; ◊ ~ni yastığa / yerə atmaq to go* to bed; to turn in; ◊ ~ni yerə qoymaq 1) *(yatmaq) d.d.* to sleep*, to go* to bed; 2) *(ölmək) d.d.* to perish, to die, to kick the bucket *idiom.*; gözü ~sinə çıxmaq: *(təəccüblənmək)* to be* astonished / amazed / surprised; *(gözləri bərəlmək)* to become* goggle- eyed

**kəllə**[2] *s* cranial; head; ~ qənd loaf sugar; ~ sümüyü *anat.* cranial (*pl.*-nia), skull, cranial bone; ~ şəkli *(ölüm rəmzi)* death's head

**kəlləçarx** *i* 1. *tex.* swivel *(on the top of a derrick)* 2. *d.d.* head, top; *Qızdırma qalxıb kəlləçarxa The fever has come / drawn to a head*; ~a vurmaq to overdo* it; to come* / to go* it (too) strong *idiom.*; to go* too far *d.d.*

**kəlləgöz**[1] *i (təpəgöz nəhəng)* cyclops [ˈsaɪklɔps]

**kəlləgöz**[2] *s* 1. *(təpəgöz)* one-eyed; cyclopean [saɪklɔˈpɪːən]; *(dombagöz)* ox-eyed, goggle-eyed; 2. *(at haq.)* restive, jibbing, te(t)chey; ~ at a jibb, a jibber, a jibbing / te(t)chy horse

**kəllələmək** *f* to butt *(d.)*

**kəllələnmək** *f* to be* butted

**kəlləleşmək** *f* to butt each other / one another

**kəlləli** *s d.d.* sharp, clever, brainy, quick on the uptake

**kəlləmayallaq** *z* topsy-turvy, head over heels; ~ durmaq to stand* head over heels / topsyturvy; ~ yıxılmaq to fall* head over heels

**kəlləpaça** *i* kallapatcha *(soup prepared from ram's / lamb's / sheep's head and feet, and somewhat like mock-turtle soup)*

**kəlmə** *i* word; bir ~ *(qısası)* in a / one word; in short; bir neçə ~ a couple of words, a few words; ~si ~sinə word for word; bir neçə ~ danışmaq / demək to say* / to utter a few words; ◊ ~ kəsmək to speak* / to talk *(to, with)*; ~si ağzında qalmaq to be* interrupted; ~sini ağzında qoymaq to interrupt *(d.)*; *Arifə bir kəlmə / işarə kifayətdir at. söz.* ≅ *A word is enough to the wise*

**kəlmə-kəlmə** *z* word for word

**kəltən** *i* clod, lump / chunk of earth

**kəm**[1] *i* (çatışmayan kəmiyyət, kəsir) shortage *(of)*, deficit; *(qalıq)* remnant; ~i olmaq to have* a shortage

**kəm**[2] *s* 1. *(az)* little; short; *Suyu kəmdir It has little water*; aydan üç gün ~ three days short of a month; kilodan 50 *qr.* ~ fifty grams short of a kilogram; 2. *(çatışmayan)* lacking; missing; *Nə kəmdir? What is lacking / missing?* ~ olmaq to be* short; to be* missing; to lack; *Nəyin kəmdir? What do you lack? Onun üç manatı kəmdir He /She is three manats short*; ağıldan ~ imbecile; 3. *(pis, əskik)* inferior; bir kəsdən ~ olmaq to be* inferior / second *(to, in)*; to yield *(to, in)*; *O bu cəhətdən heç kimdən kəm deyil He /She is inferior / second to none in this respect*; ◊ ~ baxmaq to look unfriendly / aslant

**kəm**[3] *z* less; ~ vermək to give* *(d.)* less

**kəmağıl** *s* half-witted, weak-minded, feeble-minded; weak-headed, feather brained, imbecile; ~ adam a half-wit; a haverel [ˈheɪvrəl]; an imbecile person

**kəmağıllıq** *i* imbecility, weak-mindedness, feeble-mindedness, weak-headedness

**kəmetiqad** *s* sceptic; *(i.s.)* of little faith

**kəmənd** *i* lasso, noose; ~ atıb tutmaq to lasso *(d.)*; ~lə tutmaq to capture with a lasso; to noose *(d.)*; ~ə düşmək / keçmək *(kəməndlə tutulmaq)* to be* lassoed; *(tora, tələyə düşmək)* to be* entrapped; to fall* into pitfall; ~ə salmaq: *(tutmaq)* to lasso *(d.)*; *(tələyə salmaq)* to entrap *(d.)*, to ensnare *(d.)*

**kəməndar** *i* lassoer

**kəməndçi** *i bax* **kəməndar**

**kəmər** *i* I 1. belt, girdle, waistband; 2. *(patrondaş)* bandolier, bandoller; 3. *tex.* *(qurşaq, çəmbər)* iron ring, girdle

**kəmər** *i* II *tex.* conduit, piping, tubing, pipeline; qaz ~i gas-pipe, gas-main; neft ~i (oil-) pipeline; su ~i water-piping, water-line, water-main

**kəmərbənd** *i* waistband

**kəmərçin** *i* dress / skirt with gathers

**kəmərləmək** *f* to belt *(d.)*, to gird *(d.)*, to girdle *(d.)*

**kəmərlənmək** *f* to be* belted, to be* girdled; to girdle *oneself (with)*

**kəmərli** *s* belted, girdled

**kəmərsiz** *s* beltless, girdleless

**kəmərsizlik** *i the state of being beltless*

**kəmfürsət** *s (amansız, insafsız)* relentless, merciless, unrelenting, inexorable, grim; *(sərt, qəddar)* fierce, ferocious, severe, truculent; ~ düşmən a relentless / merciless enemy

**kəmfürsətlik** *i (amansızlıq, insafsızlıq)* relentlessness, mercilessness; *(sərtlik, qəddarlıq, qəzəblilik)* fierceness, ferocity, grimness

**kəmhövsələ** *s* impatient; *(tez coşan, özündən çıxan)* quick-tempered, vehement

**kəmhövsələlik** *i (səbrsizlik)* impatience; *(tez çoşma, özündən çıxma)* quick temper, vehemence

**kəmiştaha** *s (i.s.)* of little appetite, *(i.s.)* having little appetite



**kəmiyyət**[1] *i* quantity; naməlum ~ unknown quantity; ölçülməz ~lər *riyaz.* incommensurable quantities; *Mən keyfiyyəti kəmiyyətdən üstün tuturam I prefer quality to quantity*; ~in keyfiyyətə keçməsi / çevrilməsi transition from quantity to quality; *Kəmiyyət keyfiyyətə çevrilir Quantity is transformed into quality*

**kəmiyyət**[2] *s* quantitative; ~ analizi quantitative analysis; ~ dəyişikliklərinin keyfiyyət dəyişikliklərinə keçməsi transition from quantitative changes to qualitative changes

**kəmiyyətcə** *z* quantitatively

**kəm-kəsir** *i* 1. shortage, lack; deficit; 2. imperfection; ~i qalmaq: 1) to have* shortages; 2) to be* (left) unfinished

**kəm-kəsirli** *s* 1. *(i.s.)* with shortages; 2. unfinished; imperfect

**kəmməhəl** *s* negligent, neglectful; careless; slack; ~ olmaq to be* negligent *(of)*, to be* slack (in); to be* careless *(of)*; *O, öz vəsifəsinə kəmməhəldir He is negligent of his duties*

**kəmməllik** *i* negligence, neglect; disregard *(for, of)*; carelessness; ~ etmək to neglect *(d.)*, to disregard *(d.)*, to be* careless; to be* slack *(in)*

**kəmsavad** *s* almost, *(i.s.)* illiterate, semiliterate, uneducated; *(i.s.)* of little education

**kəmsavadlıq** *i* being semi-literate / of little education

**kəmsər** *s* silly, stupid, foolish, doltish

**kəmsər-kəmsər** *z* foolishly, stupidly

**kəmsik** *i* a piece of rope / cord; *(it üçün)* tie, leash; itin kəmsiyini açmaq to unleash / untie dog; başına ~ salmaq / keçirmək: *(bağlamaq)* to leash *(d.)*; *məc.* *(incitmək, əzab vermək)* to torture *(d.)*

**kəmsikləmək** *f* 1. to leash *(d.)*; 2. *məc.* to hold* in leash

**kəmsikli** *s* *(it haq.)* leashed, *(i.s.)* having a leash on the neck

**kəmşirin** *s* undersweet, half sweet

**kənaf** *i bot.* cannabis sativa; hemp mallow, kenaf

**kənaflıq** *i* hemp-field

**kənar**[1] *i* 1. *(bir şeyin ğıraq qurtaracağı)* edge, brink; uçurumun ~ı edge / brink of a precipice; stolun ~ı edge of a table; *(çalanın, quyunun, qədəhin, küpənin və s.)* brim; kraterin ~ı the brim of the crater; şlyapanın ~ı brim / edge (rim) of a hat; 2. *(sahil)* bank; shore, side; dəniz ~ı seaside; seashore; çay ~ı river-bank, riverside; göl ~ı lakeside; su ~ı waterside; su ~ı ilə along the waterside; 3. *(bir şeyin yan tərəfi)* side; yolun ~ı the side of the road; səhifənin ~ı margin

**kənar**[2] *s* 1. *(yad, özgə, başqa)* outside; extraneous; strange; ~ adam an outsider, a stranger; ~ qüvvələr outside forces; ~ işlər outside matters; ~ məsələlər extraneous issues; ~ cism foreign body; 2. *(uzaq, aralı)* remote, distant; ~ rayonlar remote districts; ~ sahələr / yerlər distant plots / places, remote plots / places

**kənar**[3] *z* aback, aside, aloof, away; ~ durmaq to stand* aback *(from)*; ~ düşmək to be* / to stand* far *(from)*; ~ etmək: *(çıxarmaq, uzaqlaşdırmaq, həmç. vəzifədən, işdən)* to remove *(d.)*; *(vəzifədən müvəqqəti uzaqlaşdırmaq)* to suspend *(d.)*; özündən ~ etmək to push aside *(d.)*; ~ olmaq / gəzmək to avoid *(d.)*, to shun *(d.)*; ~a qoymaq to put* aside *(d.)*; ~a durmaq / çəkilmək to step aside; ~a sıçramaq / atlanmaq to jump aside; bir kəsi ~a çəkmək to take* *smb.* aside; yaxasını ~a çəkmək to keep* / to stand* aloof *(from)*; to keep* away / aloof *(from)*; to stand* apart *(from)*; ~a çıxmaq: *(bir yerdən, dairədən, dəstədən və s.)* to step / to go* out *(of)*, to leave* *(d.)*; *(bir məsələdən)* to go* beyond *(d.)*; mövzudan ~a çıxmaq to wonder from the subject; ~da axtarmaq to seek elsewhere *(d.)*; ~da qalmaq to remain beyond, to be* left aside; *Zarafat kənarda qalsın Joking apart*; ~da durmaq to stand* / to keep* aside; to keep* aloof; ~dan baxmaq to take* a detached view; ◊ *Kənardan baxana döyüş asan gəlir / görünür at. söz.* ≅ *Lookers on see more than players*

**kənara** *z* aside; ~ qoymaq to put* aside; ~ çıxmaq to pull off; *Atlı yoldan kənara çıxdı The horseman pulled off the road*

**kənarə** *i* 1. *(haşiyə, yelən)* border, edging; *(çərçivə)* frame; *(parçada qıraq)* list, selvage; 2. *(nəhayət, son, hüdud)* end, limit, bounds *pl.*; 3. *(səhifənin kənarında yazı)* a script on the margin

**kənarəli** *s (haşiyəli, yelənli)* bordered, *(i.s.)* with / having a border; *(parça haq.)* *(i.s.)* with / having a selvage; *(çərçivəyə alınmış)* framed, *(i.s.)* having / with a frame (around), to put* a frame, *(i.s.)* surrounded with a frame

**kənarəsiz** *s* 1. *(haşiyəsiz, yelənsiz)* borderless; *(parça haq.)* selvageless, listless; *(çərçivəsiz)* frameless, *(i.s.)* not surrounded with a frame; 2. *arx.* *(sonsuz, hüdudsuz)* endless; boundless, unlimited, *(i.s.)* having no limits

**kənarlaşdırılmaq** *f* to be* removed *(from)*; to be* debarred *(from)*; *(müvəqqəti)* to be* suspended

**kənarlaşdırmaq** *f* to remove *(d.)*; to debar *(d. from)*; *(müvəqqəti)* to suspend *(d.)*; *(özündən)* to push aside *(d.)*

**kənarlaşmaq** *f* to move away *(from)*; to keep* away / aloof *(from)*, to shun *(d.)*; cəmiyyətdən ~ to shun society

**kənd**[1] *i* village; country; countryside; şəhər və ~ town and country; ~də yaşamaq to live in the country / village

**kənd**[2] *s* village; country; rural; ~ adətləri rural customs; ~ əhalisi rural population, countryfolk; ~ əhli villager, countryman*; ~ yeri countryside; ~ yoxsulları the village poor; ~ mənzərəsi rural scenery; ~ müəllimi village teacher; ~ proletariatı rural proletariat; ~ sakini village dweller / resident; ~ soveti village Soviet; ~ təsərrüfatı agriculture, farming, husbandry, rural economy; ~ təsərrüfatı fəhləsi farmhand; ~ təssərrüfatçısı husbandman*, farmer; ~ həyatı country life; ~ cavanları village youth, young countryfolk; ~ camaatı countryfolk, countrypeople; ~ kişisi countryman*; ~ arvadı countrywoman*

**kəndarası** *s*: ~ yol country-track, country road

**kəndbəkənd** *z* from village to village

**kol-kos**[1] *top.* *i* thorns-and-shrubs; shrubbery; ~ basmaq to be* covered with shrubs, to become* shrubby

**kol-kos**[2] *s bax* **kol-koslu**

**kol-koslu** *s* shrubby, *(i.s.)* covered with shrubs; thorny, *(i.s.)* covered with thorns; ~ yer shrubby land / place; land covered with shrubs / thorns

**kol-kosluq** *i bax* **kolluq**

**kollec** *i* college

**kollegial** *s* collegiate, collegial; joint; collective; ~ rəhbərlik collective / joint leadership; ~ şəkildə collectively / jointly

**kollegiallıq** *i* collective nature; *(rəhbərlikdə)* joint leadership

**kollegiya** *i* board; nazirliyin ~sı board of Ministry; vəkillər ~sı College of barristers / lawyers

**kolleksioner** *i bax* **kolleksiyaçı**

**kolleksiya** *i* collection; gathering

**kolleksiyaçı** *i* collector

**kollektiv**[1] *i* collective; body; fəhlə ~i workers' collective; tələbə ~i student body

**kollektiv**[2] *s* collective; ~ əmək collective labour; ~ muqavilə collective agreement; *(fəhlələrlə sahibkarlar arasında)* collective bargaining; ~ təhlükəsizlik collective security; ~ təsərrüfat collective farm / farming; ~ şəkildə collectively

**kollektiv**[3] *z* collectively; ~ işləmək to work collectively

**kollektivçi** *i* collectivist

**kollektivçilik**[1] *i* collectivism

**kollektivçilik**[2] *s* collectivistic; ~ təmayülü collectivistic trend

**kollektivist** *i bax* **kollektivçi**

**kollektivizm** *i* collectivism

**kollektivləşdirilmə** *fi* being collectivized

**kollektivləşdirilmək** *f* to be* collectivized

**kollektivləşdirmə** *fi* collectivization

**kollektivləşdirmək** *f* to collectivize *(d.)*

**kollektivləşmə** *fi* collectivization, being collectivized

**kollektivləşmək** *f* to collectivize, to be* collectivized

**kollektivlik** *i* collectivity, collectivism

**kollektor** *i* 1. *(kanal)* collector; *(boru kəməri)* manifold; 2. *(kitabxanada şöbə)* book collecting department (in a library); 3. *elekt.* commutator

**kollektorlu** *s* collector; ~ suvarma sistemi / şəbəkəsi water collector network

**kolloid** *i kim.* colloid

**kolloidal** *s kim.* colloidal, colloid; ~ məhlul colloidal solution; ~ kimya colloidal chemistry

**kollu** *s* bushy, shrubby; thorny

**kolluq** *i* shrubbery, shrubby place

**kolonialist** *i bax* **müstəmləkəçi**

**kolonializm** *i bax* **müstəmləkəçilik**

**kolonist** *i* colonizer, colonialist

**koloniya** *i* 1. *bax* **müstəmləkə**[1]; 2. settlement, colony; 3. *zool.* colony; ~ halında in the form of a colony

**kolonka** *i* 1. *(vanna otağında)* geyser ['gi:zə]; 2. *(benzin dolduran)* petrol pump

**kolonna** *i* column; nümayişçilər ~sı column of demonstrators

**kolorimetr** *i* colorimeter

**kolorit** *i* colour, colouring; milli ~ national colour; yerli ~ local colour

**koloritli** *s* picturesque; vivid

**kolpan**[1] *i (alçaqboyly, sıxyarpaqlı ağac və ya kol)* scrub

**kolpan**[2] *s* 1. *(kolabənzər)* scrubby, scrub; ~ palıd scrub oak; ~ şam scrub pine; 2. *(çoxlu xırda qol-budağı olan)* branchy; luxuriant; ~ ağac a branchy tree; ~ budaq a luxuriant branch; ~ güllər luxuriant roses

**kolpanlı** *s* 1. *(i.s.)* covered with scrubs; 2. thickly branching; ~ ağac thickly branching tree

**kolpanlıq** *i* scrubby growth, undergrowth of shrubs, stunted trees; *(yer)* scrubland, land / place covered with scrubs

**kolt** *i* 1. *(tapança növü)* Colt *(revolver)*, Colt automatic pistol; 2. *(pulemyot növü)* Colt automatic machine gun

**koma** *i* I hut, cabin; shack; *amer.* wickiup / wikiup

**koma** *i* II heap; pile; huddle; daş ~sı a heap of stones; qum ~sı a heap of sand; kağız ~sı a pile of papers; kitab ~sı a pile of books; peyin ~sı a dunghill; ~ vurmaq to heap up *(d.)*, to pile *(d.)*, to huddle up *(d.)*

**komacıq** *i* hut, shack, cabin

**koma-koma**[1] *s* in heaps; in piles

**koma-koma**[2] *z* in heaps; in piles

**komalamaq** *f* to heap up *(d.)*; to pile up *(d.)*, to huddle up *(d.)*; qumu ~ to heap up the sand; *(torpağı ağacın, bitkinin dibinə)* to earth up *(d.)*, to hill up *(d.)*; *(heyvanı və s.)* to huddle up *(d.)*; qoyunları ~ to huddle up / to gather sheep

**komalanmaq** *f* to be* heaped up, to become* heaped up; to be* piled up; to be* hilled up; *(heyvan və s.)* to be* huddled up

**komalaşmaq** *f* to flock *(together)*; to cluster; to bunch; to crowd

**komanda**[1] *i* 1. *(şifahi əmr)* order, command; bir kəsin ~sı ilə at *smb.'s* command; ~ vermək to give* a command; 2. *hərb.* *(dəstə)* party, detachment, crew; *(gəmidə)* ship's crew, ship's company; yanğın söndürənlər ~sı fire-brigade; 3. *id.* team; futbol ~sı football team; *(avarçəkmədə)* crew; yığma ~ combined team; ölkənin yığma ~sı the national team; yerli ~ home team; qonaqların ~sı visitors' team

**komanda**[2] *s* 1. command; ~ məntəqəsi command post; 2. team; ~ birinciliyi team championship

**komandan** *i* commander; ordu ~ı army commander; cəbhə qoşunları ~ı army group commander; hərbi dairə ~ı Commander-in-Chief; baş ~ Commander-in-Chief; donanma ~ı Commander-in-Chief of the Fleet; Ali Baş ~ Supreme Commander-in-Chief

**komandanlıq** *i* command, headquarters; Ali Baş ~ High command, Commanding heights; baş ~ Central Headquarters

**komandir** *i* commander; *(gəmidə)* captain, commanding officer; vzvod / bölük ~i platoon leader / commander; manqa ~i section commander; squad leader *amer.*; rota ~i company commander; batalyon ~i battalion commander; polk / alay ~i regimental commander; diviziya ~i division (al) commander



**komandirlik** *i* 1. *(vəzifə)* the office of a commander; 2. *(zabitlər heyəti)* commanders *pl.*, commanding heights; key positions; ~ etmək to command *(d.)*

**kombayn** *i* 1. *k.t.* combine harvester; 2. *dağ. məd.* mining combine

**kombaynçı** *i* combine operator

**kombinasiya** *i* 1. *(müxt. məna)* combination; 2. *(qadın köynəyi)* slip; combinations *pl.*

**kombinasiyalı** *s* 1. combinative; 2. *(köynəkli) (i.s.)* in slip / combinations

**kombinat** *i* 1. group of enterprises; kömür ~ı group of mines; 2. *(tədris müəssisəsi)* training centre; məişət xidməti ~ı personal service shop

**kombinezon** *i* overalls *pl.*; təyyarəçi ~u flying suit

**kombinezonlu** *s* *(i.s.)* wearing overalls, *(i.s.)* in overalls; *(i.s.)* in flying suit; ~ qız a girl in overalls; ~ kişi *(təyyarəçi)* a man in a flying suit

**kombine** *f:* ~ etmək to combine *(d.)*

**komediant** *i bax* **komediyaçı**[3] *(3-cü mənada)*

**komedioqraf** *i bax* **komediyaçı**[1]

**komediya** *i* comedy; *məc.* farce; musiqili ~ musical comedy

**komediyaçı** *i* 1. *(yazıçı)* comedian; 2. *(aktyor)* comedian, comedy actor; *(qadın)* comedienne; 3. *(məzhəkəçi)* comedian, mummer, a droll person, jester

**komendant**[1] *i* 1. *(şəhərdə, qalada)* commandant; 2. *(binada, idarədə)* superintendent in charge of a building, official in charge of quarters; *(yataqxanada)* warden of a hostel

**komendant**[2] *s:* ~ saatı curfew; ~ saatı müəyyən / təyin etmək to impose a curfew; ~ saatını ləğv etmək / götürmək to lift the curfew

**komendantlıq** *i* 1. the office / position / post of a commandant; 2. *bax* **kommendatura**

**komendatura** *i* commandant's office

**komentariya** *i* commentary; comment (s); ~ vermək to comment (upon)

**kometa** *i astr.* comet

**komik**[1] *i* 1. *(aktyor)* comic actor; 2. *d.d.* funny / comic fellow; comic

**komik**[2] *s* comic, comical; funny; ~ aktyor comic actor; ~ aktrisa comic actress

**komintern** *i tar.* Comintern

**komissar** *i* commissar; hərbi ~ military commissar

**komissariat** *i bax* **komissarlıq**

**komissarlıq** *i* 1. commissariat; hərbi ~ military registration and enlistment office; 2. the post of a commissar

**komissiya** *i (müxt. mənada)* commission, committee; seçki ~sı election committee; münaqişə ~sı conflict committee; hərbi-tibb ~ı medical board

**komisyon** *i* 1. *bax* **komissiya;** 2. commission, brokerage; ~ mağazası commission shop

**komisyonçu** *i* broker, agent, factor

**komisyoner** *i bax* **komisyonçu**

**komitə** *i* committee; icraiyyə ~sı executive committee; Mərkəzi ~ Central Committee; partiya ~si Party Committee; Partiya nəzarəti ~sı Party Control Committee; yardım ~sı board of assistance; assitance committee

**komizm** *i* the comic element

**kommentator** *i* commentator

**kommuna** *i* commune; Paris kommunası *tar.* The Paris Commune; Bakı kommunası The Baku Commune; kənd təsərrüfatı ~sı agricultural commune

**kommunal** *s* communal; municipal; ~ təsərrüfat communal / municipal economy; ~ mülkiyyət communal / municipal property; ~ mənzil communal flat; ~ xidmət(lər) public utilities, municipal service

**kommunar** *i tar.* communard

**kommunist**[1] *i* communist; ~ olmaq to be* communist

**kommunist**[2] *s* communist; ~ partiyası Communist Party

**kommunistcəsinə** *z* as / like a communist

**kommunizm** *i* communism; ~ qurmaq to build* communism

**kommutator** *i* commutator; switchboard; telefon ~u telephone switchboard

**komod** *i* chest of drawers; locker; tallboy

**kompas** *i* compass

**kompleks**[1] *i* complex

**kompleks**[2] *s* complex, composite, combined; ~ ədədlər *riyaz.* complex numbers; ~ mexanizasiya complex / composite mechanization; all-round mechanization; ~ briqada complex / combined brigade

**komplekt** *i (dəst)* complete set; jurnallar ~i a complete set of magazines

**komplektləşdirmə** *fi* 1. *(kitabxananı və s.)* acquisition; 2. *(işçi heyətini və s.)* staffing; *hərb.* recruitment, recruiting

**komplektləşdirmək** *f* 1. to complete *(d.)*, to replenish *(d.)*; 2. *(işçi heyətini və s.)* to staff *(d.)*; *hərb.* to recruit *(d.)*, to reman *(d.)*

**kompliment** *i* compliment; ~ demək / atmaq to pay* / to make* a compliment *(i.to)*; O mənə kompliment dedi *He / She paid me a compliment, He / She made a compliment to me*

**komponent** *i* component

**kompost** *i k.t.* compost; ~ quyusu compost pit

**komposter** *i d.y.* punch

**komposterləmək** *f d.y.* to punch *(d.)*

**komposterlənmək** *f d.y.* to be* punched

**komposterlətdirmək** *f bax* **komposterlətmək**

**komposterlətmək** *f* to ask / to cause *s. o.* to punch *(d.)*

**kompot** *i* stewed fruit, compote

**kompozisiya** *i (müxt. məna)* composition

**kompres** *i tib.* compress; ~ qoymaq to make* a compress

**kompressor** *i tex.* compressor

**kompressorçu** *i* compressor operator, operator of a compressor

**kompressorlu** *s (i.s.)* with / having a compressor, *(i.s.)* equipped with a compressor

**kompromis** *i* compromise; ~ə girmək to compromise; to make* a compromise

**komsomol**[1] *i* Komsomol, Young Communist League

**komsomol²** *s* komsomol; ~ **təşkilatı** Komsomol organization; ~ **bileti** Komsomol membership card
**komsomolçu** *i* member of the Komsomol, member of the Young Communist League
**kondensator** *i fiz.* condenser, capacitor
**konduktor** *i* conductor; *d.y.* guard
**konduktorluq** *i* 1. *the work / the job of a conductor / a guard*; 2. *the post of a conductor / guard*
**konduktorsuz** *s (i.s.)* without a conductor / a guard
**konduktorsuzluq** *i the state of having no conductor*
**konfedarasiya** *i* confederation, confederacy
**konfederativ** *s* confederative
**konferansye** *i* master of ceremonies; compere['kɔmpeə]
**konfet¹** *i* sweet, bon-bon, sweetmeats *pl.*; *amer.* candy
**konfet²** *s* sweet; ~ **qutusu** sweet box; ~ **kağızı** sweet wrapper
**konfetçi** *i (konditer)* confectioner
**konfrans** *i* conference; **sülh** ~**ı** peace conference
**konki** *i* skates; **diyirçəkli** ~ roller skates; ~ **sürmək** to skate, to go* skating
**konkisürən** *i* skater
**konkisürmə** *i id.* skating; **fiqurlu** ~ figure skating
**konkret¹** *s* concrete; specific; ~ **təklif** concrete proposal; ~ **məqsəd** specific aim
**konkret²** *z* concrete(ly); definitely; ~ **ifadə etmək** to express concretely / definitely
**konkretləşdirilmək** *f* to be* concretized; to be* defined concretely
**konkretləşdirmək** *f* to concretize *(d.)*; to render concrete *(d.)*; to give* concrete expression *(to)*
**konkretləşmək** *f* to become* concrete / definite
**konkretlik** *i* concreteness
**konkurs** *i bax* **müsabiqə¹**
**konsentrat** *i* 1. concentrated product; **qida** ~**ları** food concentrates; 2. *k.t.* concentrate
**konsentrik** *s* concentric; ~ **çevrələr** *riyaz.* concentric circles
**konsentriklik** *i* concentricity
**konsepsiya** *i* conception, idea
**konsern** *i iqt.* concern
**konsert¹** *i* 1. concert; ~ **vermək** to give* a concert; 2. *(musiqi əsəri)* concerto
**konsert²** *s* concert; ~ **zalı** concert hall
**konsertmeystr** *i* leader *(of an orchestra)*
**konserv¹** *i* tinned / canned / potted food; **ət** ~**i** tinned / canned meat; **balıq** ~**i** canned fish; **meyvə** ~**i** canned fruit
**konserv²** *s* canning; ~ **sənayesi** canning industry; ~ **bankası** tin, can; ~ **zavodu** cannery
**konservaçan** *i* tin-opener; *amer.* can opener
**konservatoriya** *i* conservatory, conservatorie [-twa:]
**konservləşdirici** *s* canning
**konservləşdirilmək** *f (dəmir qabda)* to be* tinned / canned; *(şüşədə)* to be* bottled; *(çini, saxsı və s. qabda)* to be* potted
**konservləşdirilmiş** *s* tinned, canned, potted; ~ **ət** tinned / canned / potted meat; ~ **meyvə** *(şüşədə)* bottled fruit; *(dəmir qabda)* canned fruit
**konservləşdirmək** *f* to preserve *(d.)*; *(dəmir qabda)* to tin *(d.)*, to can *(d.)*; *(şüşədə)* to bottle *(d.)*; *(çini, saxsı və s. qabda)* to pot *(d.)*
**konsessiya¹** *i iqt.* concession; ~**ya vermək** to grant concession
**konsessiya²** *s* concessive; ~ **müqaviləsi** concessive agreement; ~ **siyasəti** the policy of granting concessions
**konsessiyaçı** *i iqt.* concessionaire
**konsilium** *i tib.* consultation
**konslager** *i* concentration camp
**konsorsum** *i iqt.* consortium
**konspirasiya** *i* conspiracy
**konspirativ** *s* secret; conspiratoral; ~ **şəkildə** / **surətdə** in conspiratoral manner; ~ **yolla** secretly
**konspirativlik** *i* secretness
**konspirator** *i* conspirer, conspirator
**konstitusiya** *i* constitution
**konstitusiyaçı** *i* constitution(al)ist, adherent of constitution
**konstitusiyaçılıq** *i* constitutionalism
**konstitusiyalı** *s* constitutional; ~ **monarxiya** / **mütləqiyyət** constitutional monarchy
**konstruksiya** *i* construction; design
**konstruktiv** *s* constructive; ~ **siyasət** constructive policy; ~ **təklif** constructive proposal
**konstruktivist** *i mem.* constructivist, constructionist, adherent of constructivism / contructionism
**konstruktivizm** *i mem.* constructivism, construcionism
**konstruktor¹** *i* designer; constructor
**konstruktor²** *s* design; ~ **bürosu** design office
**konustruktorluq** *i the profession of a designer / constructor*
**konsul** *i* consul; **baş** ~ consul general
**konsulxana** *i* consulate; **baş** ~ consulate-general
**kosulluq** *i* 1. post of a consul; 2. *bax* **konsulxana**
**konsultasiya** *i* 1. *bax* **məsləhət**; 2. *(müşavirə)* consultation
**kontakt** *i (müxt. mənada.)* contact; **bir kəslə** ~**da olmaq** to be* / to keep* in touch with *s.o.*; **bir kəslə sıx** ~ **saxlamaq** to maintain a close contact with *s.o.*
**kontekst** *i* context
**konteyner** *i* container
**kontinent** *i* continent, mainland
**kontinental** *s* continental; ~ **iqlim** continental climate
**kontingent** *i* contingent
**kontor** *i* office, bureau; **natariat** ~**u** notary office
**kontroband(a)** *i* contraband, smuggling; ~ **ilə məşğul olmaq** to smuggle, to be* a smuggler; ~ **yolu ilə** on the sly
**kontrobandaçı** *i* contrabandist, smuggler
**kontrabas** *i mus.* double-bass, contrabass, accoustic bass
**kontrabasçalan** *i bax* **kontrabasçı**
**kontrabasçı** *i mus.* contrabassist, contrabass player
**kontr-admiral** *i* rear admiral
**kontrakt** *i* contract; agreement; ~ **bağlamaq** to make* a contract
**kontribusiya** *i* contribution, (war) indemnity; ~ **qoymaq** to lay* under contribution *(d.)*, to impose an indemnity *(on)*; ~ **tələb etmək** to require an indemnity *(from)*



**kontrol** *i* control; ~**da** / ~ **altında** under the control *(of)*; ~**a götürmək** to take* the control *(of)*, to take* under *one's* control *(d.)*
**kontrolçu** *i bax* **kontrolyor**
**kontrolluq** *i* control; controlling; ~ **etmək** to control *(d.)*, to check *(d.)*
**kontrolsuz** *s* uncontrolled, unchecked
**kontrolsuzluq** *i the state of being without control / uncontrolled*
**kontrolyor** *i* controller, inspector; *(dəmiryolunda, teatrda)* ticket-collector
**kontur¹** *i* 1. counter, outline; ~**unu çəkmək** to outline *(d.)*; 2. *el.* circuit
**kontur²** *s* counter, outline; ~ **xəritə** outline map
**kontuziya** *i* contusion; *(mərmi partlayışından)* shell-shock; *(sarsıntı)* concussion [kən'kʌʃən]; ~ **etmək** to contuse *(d.)*; *(partlayış nəticəsində)* to shell-shock *(d.)*
**kontuziyalı** *s* contused, *(partlayışda)* shell-shocked
**konus** *i* cone
**konusşəkilli** *s* cone-shaped, conical, conoid
**konusvarı** *s bax* **konusşəkilli**
**kooperasiya** *i* 1. *(əməkdaşlıq)* co-operation; 2. *(cəmiyyət)* co-operation societies *pl.*; co-operative system; **əmək** ~**sı** labour co-operation; **istehlak** ~**sı** consumers' co-operative societies *pl.*; **kənd təsərrüfat** ~**sı** agricultural co-operative societies *pl.*
**kooperativ** *i* 1. *bax* **kooperasiya;** 2. co-operative
**kooperativçi** *i* co-operator
**kooperativləşdirmək** *f* to organize in a co-operative *(d.)*
**kooperativləşmə** *fi* co-operation
**kooperativləşmək** *f* to co-operate; to be* co-operated
**koordinasiya** *i* co-ordination
**koordinat** *i* co-ordinate; ~ **oxları** co-ordinates
**koppuş** *s (kök)* plump; *(üz)* chubby; *(qısa yoğun)* pudgy
**kopuşlanmaq** *f bax* **kopuşlaşmaq**
**koppuşlaşmaq** *f* to plump, to become* / to get* plump; *(üz)* to become* / to get* chubby; *(barmaq və s.)* to become* / to get* pudgy
**kor¹** *i* a blind, a blind person; ◊ *Kor kora kor deməsə bağrı partlayar at. söz.* ≅ *The pot calls the kettle black; Kor koru tapar, su da çuxuru at. söz.* ≅ *Birds of a feather flock together*
**kor²** *s* 1. *(gözü görməyən)* blind; **bir gözü** ~ blind in one eye; **tamam** ~ stone-blind; bat-blind; ~ **adam** a blind man* / person; ~ **yapalaq** brown owl, bran-owl; ~ **etmək**: 1) to blind *(d.)*; *(güclü işıqla)* to dazzle *(d.)*; 2. *bax* **korlamaq;** ~ **olmaq** to become* / to get* blind; **bir gözü (ndən)** ~ **olmaq** to become* / to get* blind in one eye; to lose* the sight of one eye; 2. *məc. (yalnız bir çıxışı olan)* blind; ~ **küçə** blind street; ~ **cığır** blind path; ~ **xiyaban** blind alley; ~ **quyu** blind ditch; ~ **bucaq** *riyaz.* obtuse angle; ◊ ~ **qoymaq** *(dağıtmaq, uçurmaq)* to destroy *(d.)*, to ruin *(d.)*, to demolish *(d.)*; *(ziyan vurmaq)* to shatter damage *(d.)*; ~ **bəxt** / tale rough luck, ill-fate
**korafəhm** *i bax* **korazehin**
**korafəhimlik** *i bax* **korazehinlik**
**koramal** *i zool.* grass-snake
**korazehin** *s* slow-witted, thick-headed, obtuse, dull, stupid; dull of apprehension; ~ **adam** a slow-witted man* / person, a slow-coach, a dolt, a dullard, a blockhead, a dunce [dʌns]
**korazehinlik** *i* slow-wittedness, dullness, stupidity, obtuseness
**korbucaq** *i riyaz.* obtuse-angle
**korbucaqlı** *s riyaz.* obtuse-angled; ~ **üçbucaq** obtuse-angled triangle
**Koreya** *s* Korean; ~ **dili** Korean, the Korean language
**koreyaca** *z* in Korean, in the Korean language; ~ **danışmaq** to speak* Korean, to speak* the Korean language
**koreyalı** *s* Korean
**koridor** *i* corridor, passage; **geniş** ~ a wide corridor; **dar** ~ a narrow corridor
**korifey** *i* coryphaeus, leading figure
**kor-korana** *z* blindly, blindfold; recklessly, without foresight; ~ **getmək** *(bir kəsin ardınca)* to follow *(d.)* blindfold
**korlamaq** *f* 1. *(xarab etmək)* to spoil* *(d.)*; to mar *(d.)*; *(əxlaqı, mənəviyyatı)* to corrupt *(d.)*, to pervert *(d.)*, to spoil* *(d.)*; *(mətni və s. təhrif etmək)* to mangle *(d.)*; **iştahanı** ~ to spoil* *one's* appetite; to dull the edge of appetite *idiom.*; **uşağın beynini** ~ to pervert the child's mind; **kefini** ~ to spoil* / to mar *smb's* pleasure / fun; to upset* *(d.)*, to put* out *(d.)*; **öz əsəblərini** ~ to take* on; *Əsəblərini korlama Don't take it to heart; Don't fret;* **mədəni** ~ to upset* the stomach, to cause indigestion; *Heç bir şey bizim xoşbəxtliyimizi korlaya bilməz Nothing can mar our happiness;* 2. *(puç etmək, sərfəsiz xərcləmək)* to squander *(d.)*, to dissipate *(d.)*, to waste *(d.)*; *Pulunu korlama Don't squander / dissipate / waste your money;* 3. *(pisləşdirmək)* to deteriorate *(d.)*, to worsen *(d.)*; 4. *(bir işi dolaşdırmaq)* to blunder *(d.)*
**korlanmaq** *f* 1. *(xarab olmaq)* to spoil*, to be* spoiled; to be* marred; *(əxlaqca)* to become* corrupt / demoralized; *(diş)* to decay; **istidən korlanmamaq** to resist heat, to be* heatproof; **nəmişlikdən korlanmamaq** to resist moisture, to be* moisture-proof; 2. *(pisləşmək)* to deteriorate; to go* bad, to take* a turn for the worse; *Keyfiyyət korlanıb The quality has deteriorated; Hava korlanıb The weather is taking a turn for the worse;* 3. *(pis icra olunmaq, dolaşdırılmaq)* to be* blundered
**korlaşmaq** *f* to become* / to get* blind
**korluq** *i* I blindness
**korluq** *i* II 1. *(ehtiyac)* need, want; *(qıtlıq)* famine; **su korluğu** water famine; 2. *(narahatlıq, əziyyət)* trouble; 3. *(ziyan)* damage, harm; ~ **vermək**: 1) *(pis təchiz etmək)* to stint *smb.* in *smth*; 2) *(narahat etmək)* to trouble *(d.)*; 3) *(ziyan vurmaq)* to damage *(d.)*; to harm *(d.)*; *Özünə korluq vermə Don't stint yourself Uşaqlara yeməkdən korluq vermə Never stint the children in food; Qoyma uşaqlar qonşulara korluq versinlər Don't let the children trouble your neighbours; Bu böcəklər bitkilərə çox*

korluq verirlər These insects damage / harm the plants very much; ~ çəkmək to be* in need (of), to be* hard-up; puldan ~ çəkmək to be* in need of money

**kor-peşman** z in distress; in grief / chagrin; ~ geri qayıtmaq to come* back in distress; ~ olmaq to be* sorry (about), to regret (d.)

**korpus** i 1. (bina) building; 2. hərb. corps; atıcı ~u army corps; tank qoşunları ~u armoured corps; 3. tex. (gövdə) body; (qutu) case; (sağanaq) frame; saatın ~u watch-case; tank / gəmi ~u hull; 4. poliqr. long primer; 5. kadet ~u tar.: military school; diplomatik ~ diplomatic corps

**korrektor** i proof-reader, corrector of the press

**korrektorluq** i the profession of a proof-reader

**korrektura**[1] i 1. (hərəkət) proof-reading; 2. (basılmış səhifə) proof-sheet, (printer's) proof

**korrektura**[2] s ~ işarələri proof-reader's marks

**korroziya** i geol., kim. corrosion

**korset** i stays pl., corset; ortopedik ~ orthop(a)edic corset

**korsetli** s corseted; (i.s.) with corset

**kort** i id. court; play-ground

**kortəbii**[1] s spontaneous; elemental; primordial; ~ qüvvə elemental / primordial force; ~ hərəkət spontaneous movement; ~ şəkildə spontaneously

**kortəbii**[2] z spontaneously

**kortəbiilik** i spontaneity

**korş** s blunt, not sharp; ~ bıçaq a blunt knife

**korşalmaq** f 1. to become* / to get* blunt / edgeless; 2. məc. to lose* sharpness / keenness / acuteness

**korşaltmaq** f 1. to blunt (d.), to make* (d.) blunt; to dull the edge / point (of); to rebate (d.); bıcağın ağzını ~ to turn the edge of the knife; 2. məc. to make* less keen / acute

**koruş**[1] i d.d. a blind (man / person); a short-sighted man / person

**koruş**[2] s d.d. 1. blind; short-sighted; 2. məc. (küt) blunt, obtuse, edgeless; ~ bıçaq a blunt knife

**koruşluq** i d.d. 1. blindness; short-sightedness; 2. məc. (kütlük) bluntness

**kos** i bax top I

**kosa**[1] i a beardless man*; a thin-bearded man*

**kosa**[2] s beardless; (i.s.) with thin beard, thin-bearded

**kosalaşdırmaq** f to cause to become / to grow beardless

**kosalaşmaq** f to become* / to get* beardless; to become* / to get* thin-bearded

**kosalıq** i beardlessness; thin-beardedness

**kosasaqqal** s thin-bearded; ~ kişi a thin bearded man*

**kos-kos** i bax top-top

**kosmetik** s cosmetic; ~ sumka a cosmetic bag; ~ kabinet beauty salon / parlour

**kosmetika** i 1. (tədbir) beauty treatment; 2. (kosmetik maddələr) cosmetics pl.

**kosmik** s cosmic; space; ~ uçuş space flight; ~ gəmi spaceship, spacecraft, space vehicle; ~ fəza (cosmic / outer) space; ~ şüalar cosmic rays; ~ şüalanma cosmic radiation

**kosmodrom** i cosmodrome, space drome

**kosmoqonik** s cosmogonical

**kosmoqoniya** i cosmogony

**kosmoqrafiya** i cosmography

**kosmologiya** i cosmology

**kosmoloji** i cosmological

**kosmonavt** i cosmonaut, spaceman; astronaut; (qadın) woman* astronaut, cosmonette

**kosmonavtika** i cosmonautics; astronautics

**kosmopolit**[1] i cosmopolitan, cosmopolite

**kosmopolit**[2] s cosmopolitical

**kosmopolitik** s cosmopolitical

**kosmopolitizm** i cosmopolit(an)ism

**kosmos** i cosmos, (outer) space; ~un tədqiqi space exploration

**kostyum** i costume, dress; (kişi üçün) suit

**kostuyumçu** i teatr. costumer

**kostyumluq**[1] i cloth / fabric for suit / costume; Mən gözəl kostyumluq almışam I have bought a nice cloth for a suit

**kostyumluq**[2] s (yararlı, münasib) good for a suit / a costume; (kifayət qədər) enough for a suit / a costume; ~ parça fabric / cloth good for a suit / a costume; Bu parça iki kostyumluqdur This cloth is enough for two suits / costumes

**kotan** i plough, plow

**kotançı** i ploughman*, plough-boy

**kotançılıq** i the job of a ploughman

**kotangens** i riyaz. cotangent [kou'tændʒənt]

**kotanlamaq** f to plough (d.)

**kotlet** i cutlet, (əzmə ətdən) chop; (qiymədən) rissole; ət ~i meat rissoles of meat; balıq ~i fish cakes; ~ üçün ət cutlet / chop meat; kartof ~ potato cakes

**kotletlik** i good for cutlet / chop; ~ ət cutlet / chop meat

**kottec** i cottage

**köbə** i border (of lace, etc.), edging; ~ vermək bax göbələmək; paltara ipəkdən ~ vermək to border a dress with silk

**köbələmək** f to border (d.with), to edge (d.with)

**köbələnmək** f to be* bordered (with) / edged (with)

**köbələtdirmək** f to ask / to cause smb. to border (d.)

**köbələtmək** f bax köbələtdirmək

**köç** i 1. a company of removing migrants / nomads; 2. a camp of nomads / migrants; qaraçı ~ü Gipsy camp; ~ düşmək to encamp; 3. herd of sheep roaming / moving to new pastures; 4. one's belongings / household things packed for removal

**köçəköç** i general / universal migration; universal removal

**köçərgi** s bax köçəri[2]

**köçəri**[1] i nomad; migrant

**köçəri**[2] s nomad, nomadic; (quş) migratory, migrant; ~ qəbilələr nomadic tribes; ~ quşlar migratory / migrant birds; ~ həyat (tərzi) nomad(ic) life; (quş) migratory / migrational way of life; ~ həyat keçirmək / sürmək to live / to lead* a nomad's life, to nomadize; (quş) to migrate

**köçərilik** i nomadic life, nomadism; (quşlarda) migrational / migratory life

**köçhaköç** i bax köçəköç



**köçmə** fi 1. (başqa mənzilə, şəhərə) move, removal; 2. (başqa diyara, ölkəyə) migration, emigration; transmigration

**köçmək** f 1. (başqa mənzilə, şəhərə, yerə) to move (to), to remove (to); evə ~ to move in; evdən ~ to move out; yeni mənzilə ~ to move / remove to a new flat / place of residence; Onlar Bakıdan Moskvaya köçürlər They are removing from Baku to Moscow; 2. (başqa diyara, ölkəyə) to migrate; Bu quşlar yazda cənubdan şimala köçürlər In spring these birds migrate from the South to the North; 3. məc. (ərə getmək) to marry; 4. məc. (ölmək) to pass away, to die; ◊ bu dünyadan ~ to pass away

**köçürdülmək** f bax köçürülmək

**köçürmə** fi deportation; zorla ~ deportation by force

**köçürmək** f 1. (bir yerdən, evdən və s.) to move (d. from); (inzibati qaydada) to evict (d. from); 2. (başqa yerə, evə və s.) to move (d. to), to remove (d. to); ev ~ to move house; O, evini şəhərə köçürdü He moved his house to town; poçta ilə pul ~to remit money (to), to send* money through the bank (i.); 3. (üzünü, surətini çıxarmaq) to copy (d.); (bir mənbədən) to copy (d.out of / from); (başqasından yazmaq) to copy off (d.from), to crib (d. from); (qaralamadan ağlamaya) to make* a fair copy (of); (yenidən yazmaq) to recopy (d.); (makinada) to retype (d.); 4. (ərə vermək) to marry (d.) off; 5. (hesabdan hesaba) to transfer (d.)

**köçürülmək** f 1. (bir yerdən, evdən və s.) to be* moved / removed (from); (inzibati qaydada) to be* evicted (from); 2. (başqa yerə, evə və s.) to be* moved / removed (to); to be* transfered (to); (pul haq.) to be* remitted (to); 3. (üzü, surəti çıxarılmaq) to be* copied; (bir mənbədən) to be* copied (out of, from); (yenidən yazılmaq) to be* recopied; (makinada) to be* retyped; 4. (ərə verilmək) to be* married off, to be* given in marriage to smb.; 5. (hesabdan hesaba) to be* transfered

**köhlən**[1] i (at) courser ['kɔ:sə'], steed

**köhlən**[2] s (harın bəslənmiş) well-stalled, well-groomed, well-kept, well-tended; (tünd və qaçağan) fleet and spirited; ~ at well-groomed / well-stalled horse; courser

**köhnə** s 1. old; (nimdaş) worn-out, threadbare, shabby; frayed; ~ paltarlar old / threadbare / shabby clothes; ~ çəkmələr worn-out / old shoes; ~ palto worn-out coat; ~ şlyapa shabby hat; ~ kitab frayed book; 2. (istifadə olunmuş mebel, kitab və s. haq.) second-hand; ~ mebel second-hand furniture; ~ kitablar second-hand books; 3. (boyat) stale, not fresh; ~ çörək / pivə və s. stale bread / beer, etc.; ~ xəbər stale news; ~ zarafat stale joke; 4. (istifadədən çıxmış) obsolete; ~ sözlər obsolete words; ~ avtomobillər obsolete automobiles; 5. (qədim) old, old-time, age-old, time-honoured, antique; ~ abidələr old monuments; ~ adamlar men of old; ~ adətlər old / age-old / time-honoured customs; 6. (əski, vaxtı keçmiş) old, out-of-date, outdated, fogy, antiquated; (dəbdən düşmüş) old-fashioned, out of fashion; ~ quruluş old regime; ~ ənənələr antiquated / old-fashioned traditions; ~ üsul old method; ~ fikirli adam antiquated person; a fogy; a person having old-fashioned / fogy ideas; ~ ideyalar out-of-date / fogy ideas; 7. (çoxdankı) old; ~ dost old friend; ~ sakin old resident, amer. old-timer; ~ şərab old wine; ◊ hər şeyin təzəsi, dostun köhnəsi (yaxşıdır) at. söz., ≅ Old friends and old wine are best; 8. (keçmiş, əvvəlki) old, former; ~ qayda üzrə / ilə in / after old way / manner; ~ direktor former director; ◊ Köhnə hamam, köhnə taz zərb. məs. ≅ No changes; Nothing has changed; The things are the same as they were before

**köhnədən** z from old, since old times / days; Bu köhnədən belədir It has been so from old / since old times; ~ qalma: 1) old; 2) stale; Bu, köhnədən qalma adətdir It is an old custom; Pivə köhnədən qalmadır The beer is stale

**köhnə-küruş**[1] i d.d. rags pl., raggery; old clothes

**köhnə-küruş**[2] s d.d. worn-out, shabby; ~ paltarlar worn-out / shabby clothes

**köhnəldilmək** f to be* made / rendered old; to be* rendered shabby / threadbare

**köhnəlik** i 1. (nimdaşlıq) oldness, the state of being old / worn-out; shabbiness; (kitabda) being frayed; frayedness; 2. (əskilik) old-fashionedness; obsoleteness, obsolescence; outmodedness; fustiness; 3. (qədimlik) antiquity; 4. (boyatılıq) staleness

**köhnəlmək** f 1. (nimdaşlaşmaq) to become* / to get* old; to be* worn-out, to wear* out; to get* / to become* shabby / threadbare; (kitab) to be* frayed; (uçmaq, dağılmaq üzrə olmaq) to become* dilapidated / decrepit; Onun paltosu köhnəlib His coat has become shabby / is worn-out; Kitab köhnəlib The book is frayed; Saat köhnəlib The clock is worn-out; Ev köhnəlib The house has become dilapidated / decrepit; köhnəlib yırtılmaq to wear* into holes; Corablarım köhnəlib yırtılıb My socks have worn into holes; 2. (bayatlaşmaq) to stale, to become* / to get* stale; Pivə köhnəlib The beer has staled / become stale; 3. (əskiləşmək) to become* out-of-date / outdated / antiquated / fogy / fusty; (dəbdən düşmək) to become* / to grow* obsolete; to become* / to grow* old-fashioned; to be* out of fashion / outmoded; Bu üsullar köhnəlib These methods have become out-of-date / antiquated; Bu sözlər köhnəlib These words have become obsolete; Bu moda köhnəlib This fashion is outmoded

**köhnəlmiş** s 1. (nimdaş) worn-out; (kitab) frayed; 2. (boyat) stale, staled; 3. (əski) outdated, out-of-date, antiquated; (istifadədən çıxmış, dəbdən düşmüş) obsolete; outmoded; ~ sözlər obsolete words; ~ üslub outmoded style

**köhnəltmək** f 1. (nimdaşlaşdırmaq) to wear* out (d.), to make* old (d.); (kitabı) to fray (d.); 2. (boyatlaşdırmaq) to make* stale (d.); 3. (əskiləşdirmək) to make* antiquated (d.), to make* obsolete (d.)

**köhnəpərəst**[1] i fogy, fogey, old fogy, conservative

**köhnəpərəst**[2] s fogyish, conservative

**köhnəpərəstlik** i fogyism; conservatism

**köhnəsayaq**[1] s old-looking; old-fashioned

**köhnəsayaq**[2] z in an old manner / way

**köhül** *i* cave

**kök**[1] *i* I 1. *(müxt. mənada)* root; **bitkinin ~ü** the root of a plant; **dilin** *(dişin, saçın, dırnağın və s.)* **~ü** the root of the tongue *(tooth, hair, finger-nail etc.)*; **məsələnin ~ü** the root of the problem; **mübarizənin sinfi ~ləri** the class roots of the struggle; ***Bütün bəd əməllərin kökü puldur*** *Money is the root of all evils;* **ana ~** *bot.* rhizome; **~ (ün) telləri** *bot.* root hair; **cücərtinin ~ü** radicle; **~ atmaq / buraxmaq** to root, to take* / to strike* roots, to send* out roots; **~ salmaq** *məc.* 1) to be* deeply rooted, to strike* roots; 2) *(yurd salmaq)* to put* down new roots, to settle (in); **~ü kəsilmək** to be* eradicated / extirpated / uprooted / abolished; **xəstəliyin / cinayətin ~ünü kəsmək** to eradicate disease / crime; **~ündən qoparmaq / çıxarmaq** to uproot *(d.)*, to pull up by / with the roots *(d.)*; ***Tufan bir neçə ağacı kökündən çıxarmışdı*** *The gale had uprooted several treex;* **~ündən dəyişdirmək/ dəyişmək** to change radically *(d.)*, to change root and branch *(of)* *idiom.*; **~ündən səhv olmaq** to be* an utter fallacy; **~ünü axtarmaq** to get* at / to the root *(of)*; ***Biz cinayətin kökünü axtarmalıyıq*** *We must get at / to the root of the crime;* **~ünü kəsmək** to uproot *(d.)*, to eradicate *(d.)*, to extirpate *(d.)*; to root out *(d.)*; ◊ ***Ot kökü üstə bitər*** *at. söz.* ≅ *Like father, like son. As the tree, so the fruit;* 2. *(ilk mənbə, mənşə)* rootstock; 3. *(yerkökü)* carrot; 4. *riyaz.* root; **kvadrat ~** square / second root; **kub ~** cube / third root; **~ almaq** *riyaz.* to extract / to find* the root; 5. *dilç.* root, base form; **sözün ~ü** the root of the word

**kök**[2] *s* root; **~ sözlər** *dilç.* root words; **~ telləri** *bot.* root hair

**kök** *i* II *(iri müvəqqəti tikiş)* tacking, basting; **~ atmaq** *bax* **kökləmək II**

**kök** *i* III *mus.* tune; **~dən düşmək** to become* / to get* out of tune; **~dən salmaq** to put* out of tune *(d.)*, to untune *(d.)*

**kök**[1] *i* IV *(usually used in combinations)*: **~ə düşmək** to be* reduced *(to)*; **dilənçi ~ünə düşmək** to be* reduced to begging; **~ salmaq** to reduce *(d.to)*; **dilənçi ~ünə salmag** to reduce *smb.* to begging

**kök**[2] *s* fat; stout, corpulent, plump; *(tosqun)* gross; **~ qız / qadın** stout / fat / plump girl / woman; **~ kişi** fat / stout / corpulent man; **~ oğlan** fat boy; *(piyli)* fatty

**kökalma** *i riyaz.* extraction of root *(from)*, evolution

**kökayaqlı**[1] *i zool.* rhizopod

**kökayaqlı**[2] *s zool.* rhizopodous, rhizopodan

**kökcük** *i* rootlet

**kökə** *i* (small) flat cake; cooky, cookie, cookey; *(qarğıdalı unundan)* corn-dodger

**kökəbənzər** *s* rootlike; *bot.* rhizoid

**kökəbənzərlik** *i the state of being root-like / bot. rhizoid*

**kökəldilmək** *f* to be* fattened

**kökəldilmiş** *fs* fattened, fat; *(adam)* well-fed

**kökəlmə** *fi* fattening; putting on flesh / weight, gaining weight; growing plumper

**kökəlmək** *f* *(piylənmək)* to fatten; *(ətlənmək)* to put* on flesh / weight, to gain weight; to grow* plumper / stout

**kökəltmək** *f* to fatten *(d.)*

**kökləmək** *f* I 1. *mus.* to tune *(d.)*, to attune *(d.)*; *(orkestri)* to tune up; ***Orkestr alətləri kökləyir*** *The orchestra is tuning up;* 2. *(sazlamaq)* to put* right* *(d.)*, to adjust *(d.)*

**kökləmək** *f* II *(tikmək)* to tack *(d.)*, to baste *(d.)*

**köklənmək** *f* I 1. *mus.* to be* tuned up; 2. *(sazlanmaq)* to be* adjusted, to be* put right

**köklənmək** *f* II *(tikilmək)* to be* tacked, to be* basted

**köklənmiş** *fs* I *mus.* tuned up

**köklənmiş** *fs* II *(tikilmiş)* tacked, basted

**köklü** *s* I 1. *(kökü olan)* rooty, *(i.s.)* having roots; 2. *(möhkəm kök buraxmış)* rooted; 3. *(qohum-əqrabalı)* *(i.s.)* with / having many kinsmen / relatives

**köklü** *s* II *(əsaslı)* radical, fundamental, basic; **~ dəyişiklik** radical / fundamental change; **~ dönüş** radical turn; **~ şəkildə / surətdə** radically, fundamentally

**köklü-budaqlı**[1] *s (iri)* big, branchy; **~ ağac** a big tree, branchy tree

**köklü-budaqlı**[2] *z* by / with the roots; **~ qoparmaq / çıxarmaq** to pull up by / with the roots

**köklük** *i* fatness; stoutness; plumpness; corpulence

**köklü-kömecli**[1] *s bax* **köklü-budaqlı**[1]

**köklü-kömecli**[2] *z* 1. *bax* **köklü-budaqlı**[2]; 2. *(bütün əqrəbası ilə)* *(together)* with all *one's* relatives

**köklülük** *i* rootiness

**köks** *i* breast, chest; bosom; **~ qəfəsi** chest; *anat.* thorax; **~ü dolusu nəfəs almaq** to breathe deeply; **~ünə basmaq / sıxmaq** to cuddle *smb.* (*smth.* ) to *one's* breast; **~ (ünü) gərmək** to stand* up staunchly *(for)*, to defend / to champion with might and main *(d.)*; **~ (ünü) ötürmək** to sigh

**köksüz** *s* I rootless

**köksüz** *s* II *mus.* tuneless; **~ piano** tuneless piano

**kökümsov** *s bot.* rhizomatous, rootlike; **~ gövdə** rootlike stem; rootstock

**kökündən** *z* radically, fundamentally; **~ dəyişdirmək** to change radically, to change root and branch *idiom.*

**kölə**[1] *i* slave; **~ kimi** like a slave, as a slave; slavishly; **~ olmaq** to be* a slave

**kölə**[2] *s* slave, slavish; **~ bazarı** slave auction; **~ ticarəti** slave-trade; **~ alverçisi / taciri** slave-trader, slaver; **~ etmək / halına salmaq** to enslave *(d.)*, to slave *(d.)*

**köləcəsinə** *z* slavishly, like / as a slave

**köləlik**[1] *i* slavery, servitude, servility; **köləliyin ləğvi** abolishment of slavery; **bir kəsin köləliyində olmaq** to be* held in servitude by *smb.*

**köləlik**[2] *s* slavish; slave-holding; **~ həyatı** slavish life; **~ quruluşu** slave-holding system

**kölgə**[1] *i* shade; shadow; **işıq və ~** light and shade; **ağac(ın) ~si** the shadow of a tree; **~ axtarmaq** to look for the shade / a shady place; **~də oturmaq** to sit* in the shade; **ağacın ~sində uzanmaq** to lie* in the shadow of the tree; **~də qalmaq** 1) to stay in the shade; 2) *məc.* to remain in the shadow, to keep* in the background; to take* a back seat; **~ vermək** *(rəsmə)* to shade *(d.)*; **~ salmaq** to cast* a shadow; **~yə çəkilmək** *məc.* to efface oneself; **~ kimi izləmək** to shadow *(d.)*, to follow / to accompany like a shadow *(d.)*; **~ kimi çəkilib getmək** to shade away / off; **öz ~sindən qorxmaq / hürkmək** to be* afraid of *one's* own shadow; ***Kölgə düşür*** *Shadow falls;* ◊ **bir kəsin ~sində** under *smb's* care, due to *smb's* care, with *smb's* help; ***Kölgən qalın olsun!*** ≅ *You are so generous!* ***Köpək qaya kölgəsində yatıb, elə bilir ki, öz kölgəsidir*** *at. söz.* ≅ *One mustn't consider the blessing granted to him to be the result of his own efforts;* 2. *(aydın görünməyən şey, qaraltı)* shadow; ***Qaranlıqda bir kölgə evə tərəf yaxınlaşırdı*** *In the dark a shadow was approaching the house*

**kölgə**[2] *s* shady; shadowy; **~ yer** shady place; **~ teatrı** shadowy pantomime, galanty show

**kölgələmək** *f* 1. *(rəsmi)* to shade / to shadow *(d.)*; 2. *məc.* *(ört-basdır etmək)* to (over) shade *(d.)*

**kölgələndirilmək** *f* to be* shaded / shadowed

**kölgələndirmək** *f* to shade *(d.)*, to shadow *(d.)*

**kölgələnmək** *f* 1. to become* shady / shadowy; 2. *(gölgədə daldalanmaq)* to hide* in the shade; to rest in the shade; 3. *məc.* *(qüssələnmək)* to become* sad / sorrowful; ***Onun gözləri birdən kölgələndi*** *His eyes suddenly became sad / sorrowful*

**kölgəli** *s* shady; shadowy; **~ yer** shade, shady place; **~ tərəf**: 1) shady side; 2) *məc.* the seamy / dark side; **~ ağac** shadowy tree; **şəklin ~ yerləri** darks / shadows of the picture; ◊ **şəhər həyatının ~ tərəfi** the seamy side of the city life

**kölgəlik** *i* 1. shade, shady place; 2. *(kölgəli daldalanacaq)* awning, shelter, shed

**kölgəsiz** *s* 1. shadeless; shadowless; **~ yer** shadeless place; **~ ağac** shadowless tree; 2. *məc.* unresponsive; unsympathetic

**kölgəsizlik** *i* 1. *the state of being shadeless;* 2. *məc. the state of being unresponsive / unsympathetic*

**kömbə** *i* ash-cake; *round loaf of bread baked in ashes*

**kömək** *i* 1. help; assistance; aid; support(ing); **qarşılıqlı ~** mutual assistance; **maddi ~** support, pecuniary aid; **~ etmək** to help *(d.)*, to assist *(d.)*; *(maddi)* to support *(d.)*, to aid *(d.)*; *(dərman və s.)* to relieve, to do good; ***Dərman mənə çox kömək elədi*** *The medicine has done me a lot of good;* **~ vermək / göstərmək** to help *(d.)*, to give* help *(i.)*, to render assistance *(i.)*; **~ durmaq** to support *(d.)*, to stand* *(for)*; **~ əli uzatmaq** to give* / to lend* a helping hand *(i.)*, to lend* a hand *(i.)*; **~ istəmək / diləmək** to ask for help / aid; **bir şeyə ~ olmaq** to be* in aid of *smth.* ; **~ görmək** *(bir kəsdən)* to enjoy *smb's* help / aid; to be* aided *(by)*, to be* supported *(by)*; **bir kəsin ~yinə gəlmək** to come* to *smb's* help, to help *smb.*; ***Köməyə gəlin! Kömək edin!*** *Help!* **~yi ilə** *(bir kəsin)* with the help *(of)*; *(bir şeyin)* by means *(of)*; **~yi dəymək** to help *(d.)*; *(maddi)* to support *(d.)*, to aid *(d.with)*; ***Onun ailəyə maddi köməyi dəyirmi / olurmu?*** *Does he aid the family with money?* 2. *məc.* *(himayəçi, havadar, arxa)* support; ***O, ailənin yeganə köməyidir*** *He is the only support of the family*

**köməkçi**[1] *i* assistant, helper, helpmate, help; **rejissor ~si** assistant producer; **direktor** *(müdir)* **~si** assistant director (manager); **maşinist ~si** engine driver's assistant / mate; **usta ~si** master's helpmate; **sürücü ~si** driver's assistant / mate; ***Uşaq anasının köməkçisidir*** *A child is his / her mother's help / helper*

**köməkçi**[2] *s* 1. auxiliary; **~ dəstələr** auxiliary detachments; **~ fel** *qram.* auxiliary (verb); **~ nitq hissələri** structural parts of speech, function words; 2. *(əlavə, yardımcı)* subsidiary; **~ elektrik stansiyası** subsidiary power station

**köməkdarlıq** *i bax* **kömək** *(1-ci mənada)*

**köməkkeşlik** *i* 1. mutual support / help; 2. conjoint action; joint efforts, taking joint actions

**köməkkeşliklə** *z* conjointly; with joint efforts / forces

**köməkləşmək** *f* to (con) join efforts *(in)*; ***Ata və oğul köməkləşərək ağacı dartıb çıxardılar*** *The father and the son joining their efforts pulled out the tree*

**köməkli**[1] *s* aided; assisted; supported; many-handed; *(i.s.)* having many helping hands; ◊ ***Köməkli iş asan olar*** *at. söz.* ≅ Many hands make light work

**köməkli**[2] *z* by joint / unanimous efforts; conjointly, unanimously

**köməklik** *i bax* **kömək** *(1-ci mənada)*

**köməksiz**[1] *s* 1. helpless, aidless; unassisted; *(i.s.)* without helping hands, single-handed; *(i.s.)* without helper / help / aid; **~ uşaq** a helpless child; 2. *(baxımsız, kimsəsiz)* forlorn; supportless; uncared for

**köməksiz**[2] *z* unassistedly; single-handedly; without helping hands

**köməksizlik** *s* 1. helplessness; 2. forlornness

**kömür**[1] *i* coal; **ağac ~ü** charcoal; **daş ~** coal, pit coal; **ağ ~** white coal; **közərmiş ~** live coals; **~ kimi** *(qara)* coal-black, pitch-black, coaly; **~ basmaq / yandırmaq** to make* charcoal, to char; to burn* wood into charcoal; **~ kimi qaralmaq** to become* / to get* coal-black; **yandırıb ~ eləmək** to char *(d.)*, to convert int charcoal *(d.)*

**kömür**[2] *s* coal; charcoal; **~ qətranı** coal-tar; **~ istehsalı** coal output; **~ yatağı / süxuru** coal-bed, coal-seam; **~ sənayesi** coal-industry, coal-mining; **~ dəmi** fumes of charcoal; **~ qazı** coal gas; **~ kisəsi** coal sack; **~ mədəni** coal-mine, colliery, **~ şaxtası** coal pit; **~ hövzəsi** coal basin, coal field(s); **~ qabı / səbəti / vedrəsi** coal scuttle, container for coal / charcoal; **~ dükanı** charcoal dealer's shop; **~ xəkəsi** coal-dust; **~ çalası** coal-bunker; charcoal pit / kiln; a pit for making charcoal

**kömürbasan** *i bax* **kömürçü** *(1-ci mənada)*

**kömürboşaldan**[1] *i* *(maşın, həmç. fəhlə)* coal-whipper

**kömürboşaldan**[2] *s* coal-whipping

**kömürçıxaran**[1] *i* (coal-) miner, collier

**kömürçıxaran**[2] *s* coal-extracting

**kömürçıxarma** *i* coal extraction

**kömürçü** *i* 1. charcoal-dealer; 2. *bax* **kömürçıxaran**; 3. *(kömür dükanı)* charcoal-dealer's (shop)

**mürəkkəblik** *i* complication, complicacy, complexity
**mürəttib** *i* compositor, type-setter
**mürəttibxana** *i bax* **mətbəə**
**mürəttiblik** *i* profession of a compositor / type-setter
**mürgü** *i* drowsiness, half sleep [ha:...]; light slumber, somnolence; ~ **döymək** / **-yə getmək** *bax* **mürgüləmək**
**mürgüləmək** *f* to doze, to slumber, to get* drowsy, to fall* into a light slumber
**mürid** *i din.* adherent, follower
**müridizm** *i* muridism *(one of the reactionary currents in Islam)*
**mürtəce** *s* reactionary; ~ **baxışlar** reactionary character of the views
**mürtəcelik** *i* reactionary character
**mürtəd** *s* renegade, turncoat
**mürtədlik** *i* desertion ['-zə:]-; apostasy, recreancy
**müsabiqə**[1] *i* contest, competition; ~ **elan etmək** *(vəzifəni tutmaq üçün)* to announce / to advertise a vacancy; *(ədəbi əsərlər üçün)* to announce a competition; ~ **dən kənar** hors concours [hɔ:'kɔŋ ku:ə]
**müsabiqə**[2] *s:* ~ **imtahanları** competitive examinations
**müsabiqəçi** *i* competitor
**müsadirə** *i* confiscation, expropriation; **mülkədar torpaqlarının** ~ **edilməsi** confiscation of landlord's estates; ~ **etmək** to confiscate *(d.)*, to expropriate *(d.)*, to dispossess [-zes] *(d.)*; ~ **olunmaq** to be* confiscated
**müsafir** *i* 1. traveller; 2. guest; 3. passenger
**müsahib** *i* *(kişi)* interlocutor; *(qadın)* interlocutress, interlocutrix; *O, yaxşı / pis müsahibdir He / She is a good / a bad company* [...'kʌm-]
**müsahibçi** *i bax* **müsahib**
**müsahibə** *i* interview, conversation, interlocution; ~ **almaq** to ask / to request an interview; **bir kəsə** ~ **vermək** to give an interview to *smb.*; ~ **verməkdən imtina etmək** to refuse to give an interview
**müsaidə** *i* permission, permit, leave
**müsamirə** *i bax* **konsert**
**müsavat** *i* Musavat *(a political party in Azerbaijan)*
**müsavi** *s bax* **bərabər**[2]
**müsayidənizlə** *z* with your permission; *d.d.* by your leave
**müsbət**[1] *s* 1. positive [-zɪ-]; *(xasiyyətcə)* sedate, staid; 2. affirmative; ~ **cavab** affirmative answer / reply, *(xoş)* favourable reply; **məsələnin** ~ **həlli** positive / favourable solution of the problem; ~ **qəhrəman** positive character; ~ **elektrik yükü** *fiz.* positive electric charge
**müsbət**[2] *z* positively, affirmatively, favourably; *O, müsbət cavab verdi He / She answered "yes"; (razılaşdı) He / She agreed; (icazə verdi) He / She gave permission;* ~ **yanaşmaq** to take* a positive / favourable view *(of)*, to look favourably *(upon)*, to be* friendly *(towards)*, to have* a positive attitude *(towards)*, to have* a positive view; ~ **cavab vermək** to answer affirmatively / positively / in the affirmative
**müsəhhih** *i* proof-reader, corrector of the press
**müsəhhihlik** *i the profession of proof-reader / corrector*
**müsəlləh** *s* armed *(with)*, possessed *(of)* arms, in possession of arms; ~ **əsgər** armed soldier
**müsəlman** *i* Mussulman, Moslem ['mɔz-] *(qadın)* Moslem-woman*
**müsəlmançılıq** *i* Mohammedanism, Islam [ɪsla:m]
**müsibət** *i* misfortune [-tʃən], trouble [trʌ-], calamity, disaster; sorrow; **təbii** ~ natural calamity; ~ **də olmaq** to be* in trouble; *Müsibət! It is a bad job! Müsibət onda deyil ki... The trouble is not that... Elə müsibət də ondadır ki... That is just the trouble...* ~**ə düçar olmaq** to get* into trouble, to come* to grief; *Bu nə müsibətdir! What a disaster it is!*
**müsibətli** *s* calamitous, disastrous, sorrowful, grievous; ~ **vəziyyət** grievous / disastrous situation, distress; *O, müsibət haldadır He / She is in great distress*
**müstəbid**[1] *i* despot
**müstəbid**[2] *s* despotic
**müstəbidcəsinə** *z* despotically
**müstəqil**[1] *s* independent, self-dependent; ~ **tədqiqat** independent / original research; ~ **dövlət** independent / sovereign state; ~ **olmaq** to be* independent
**müstəqil**[2] *z* independently; *(köməksiz)* without assistance; ~ **işləmək** to work without assistance, to work on *one's* own
**müstəqillik** *i* independence, self-dependence, self-dependency; *(dövlət haq.)* sovereignty ['sovrentɪ]
**müstəmləkə**[1] *i* colony
**müstəmləkə**[2] *s* colonial; ~ **ağalığı** colonial possessions [pə'ze...]; ~ **xalqları** peoples of the colonies [pi:plz...]; ~ **zülmü** colonial oppression; ~ **ordusu** colonial troops; ~ **siyasəti** colonial policy, policy in the colonies; ~ **problemi** / **məsələsi** colonial question / problem, question / problem of colonies
**müstəmləkəçi** *i* colonizer, colonialist
**müstəmləkəçilik** *i* colonization, colonialism
**müstəmləkələşdirmə** *i* colonization [-naɪ-]
**müstəmləkələşdirmək** *f* to colonize *(d.)*
**müstəntiq** *i* inspector, investigator; *(istintaq aparan)* interrogator
**müstəntiqlik** *i* post (job) of interrogator / inspector
**müstəsna**[1] *i* 1. exception; 2. unusual; ~ **olaraq** an exception to the rule; by way of *(an)* exception; ~ **olmaqla** with the exception *(of)*
**müstəsna** *s* exceptional; ~ **hal** exceptional case; ~ **şəkil** picture of exceptional beauty; ~ **əhəmiyyətli iş** a case of exceptional importance
**müstəsnalıq** *i* exception
**müstəvi** *i* flatness, plane
**müstəvilik** *i bax* **müstəvi**
**müşahidə**[1] *i* 1. observation; 2. *(nəzarət)* supervision, control; ~ **altında olmaq** to be* under observation *(by)*; ~ **altına almaq** to put* under observation *(d.)*; ~ **etmək** 1) to observe *(d.)*; *d.d.* to keep* *one's* eye on; 2) *(nəzarət mənasında)* to supervise *(d.)*, to control *(d.)*
**müşahidə**[2] *s:* ~ **məntəqəsi** observation post
**müşahidəçi**[1] *i* observer [-zə:-]
**müşahidəçi**[2] *s* observant; ~ **oğlan** an observant boy
**müşahidəçilik**[1] *i* observation; power / keenness of observation
**müşahidəçilik**[2] *s:* ~ **qabiliyyəti** observation skill / ability
**müşavir** *i* 1. adviser, counsellor, consultant; 2. *(vəzifə)* councillor; **səfarətxana** ~**i** counsellor of the Embassy; **texniki** ~ technical adviser



**müşavirə** *i* conference, meeting; *(müzakirə)* deliberation; consultation; debate; **tibbi** ~ medical advice / consultation, doctor's consultation; **istehsalat** ~**si** production meeting; conference on production; ~ **keçirmək** to deliberate *(on)*, to consult *(on, about)*, to hold* consultation *(on)*, to take* counsel *(with)*, to consult together on various questions
**müşayiət** *i* accompaniment; escort, convoy; ~ **etmək** to accompany *(d.)*; to escort *(d.)*, to convoy *(d.)*; ~ **olunmaq** to be* accompanied *(by)*; *(həm də mus.)* to be* escorted *(by)*; ~ **i ilə** to the accompaniment *(of)*; ~ **i ilə oxumaq** to sing* to the accompaniment *(of)*
**müşəmbə** *i* oil-cloth; **nazik** ~ oilskin; *(kağız)* wax-paper [wæks-]
**müşərrəf** *s* honoured; ~ **etmək** to honour *(with)*; ~ **olmaq** to be* honoured [...ɔnəd] *(with)*
**müşgül** *s bax* **çətin**[1]
**müşk** *i* musk
**müştərək**[1] *s* common, collective, joint, combined, coalition; ~ **səylə** by a joint effort; by the joint effect *(of)*; ~ **bəyanat** joint statement / declaration; ~ **iş** common-cause, team-work; ~ **təhsil** co-education; ~ **qüvvə ilə** with joint forces; by joint hands; ~ **gəlir** aggregate income *(of peasants, etc.)*; ~ **kapital qoyuluşu** aggregate investments *pl.*; ~ **əkin sahəsi** total / overall crop area [...eərɪə]
**müştərək**[2] *z* collectively, in common, jointly; ~ **sahib olmaq** to possess jointly
**müştəri** *i* buyer [baɪə], purchaser; *(daimi)* customer, client; ~ **çıxmaq** to be* / to become* buyer / customer
**müştük** *i* 1. *(papiros üçün)* cigarette-holder; *(siqar üçün)* cigar-holder; 2. *(nəfəsli çalğı aləti üçün)* mouthpiece
**mütabiq** *s* corresponding *(to)*, comfortable *(to)*, suitable
**mütaliə** *i* reading; ~ **etmək** to read*; **gündəlik qəzetləri** ~ **etmək** to read* daily newspapers
**mütaliəçi** *i* reader *(who likes to read much)*
**mütəəssir** *s* sorrowful, sad, mournful; wistful; ~ **olmaq** to be* sad / grieved / touched
**mütəəssirlənmək** *f* to be* sorrowful / sad / mournful
**mütəfəkkir**[1] *i* thinker; ~ **olmaq** to be* a thinker
**mütəfəkkir**[2] *s* thoughtful, thinking
**mütəhərrik** *s* lively, active, agile
**mütəxəssis** *i* specialist *(in)*, expert *(in)*; ~ **olmaq** to be* a specialist
**mütəxəssislik** *i the state of being a specialist, the state of having a profession*
**mütəkkə** *i* mutakka *(long and round pillow for leaning to rest)*
**mütəmadi** *s* constant, permanent; continuous, unbroken, uninterrupted; ~ **qayğı göstərmək** to display unceasing concern; ~ **olaraq** constantly, permanently, continuously
**mütənasib** *s* proportionate, commensurate, balanced, symmetric(al)
**mütənasiblik** *i* proportionality, proportionateness, proportion, symmetry
**mütərcim** *i* 1. translator, *(şifahi)* interpreter; 2. dragoman *(pl.-mans, -men)*
**mütərcimlik** *i profession of a translator / interpreter*
**mütərəddid** *s* 1. irresolute, undecided, indecisive; 2. uncertain, hesitant, hesitating; 3. inconstant; ~ **ton** hesitating tone
**mütərəddidlik** *i* indecision, inconstancy
**mütərəqqi** *s* progressive; advanced; *(alim, yazıçı və s. haq.)* progressive-minded; ~ **ideyalar** progressive ideas; ~ **baxışlar** progressive views [vju:z]
**mütəşəkkil** *s* organized; ~ **insan qrupu** an organized body
**mütəşəkkilləşmək** *f* to get* / to become* organized
**mütəşəkkillik** *i* organization; *(adamlarda)* self-discipline
**müti** *s* submissive *(to)*, obedient *(to)*, dutiful
**mütiləşmək** *f* to be* / to get* submissive / obedient dutiful / humble / sheepish
**mütilik** *i* submissiveness *(to)*, obedience [ɪbi:-] *(to)*, dutifulness
**mütləq** *s* 1. absolute; 2. undoubted, categorical; ~ **sıfır** *fiz.* absolute zero; ~ **çempion** all-round champion; supreme champion; ~ **monarxiya** absolute monarchy; ~ **çoxluq** absolute majority
**mütləqiyyət** *i* absolutism, autocracy; **çar** ~**i** the tsarist autocracy / monarchy
**mütləqiyyətçi** *i bax* **mütləqiyyətpərəst**
**mütləqiyyətpərəst** *i* monarchist
**mütrüb** *i arx.* dancing boy *(in woman's dress)*
**müttəfiq**[1] *i* ally; ~ **olmaq** to enter into alliance *(with)*
**müttəfiq**[2] *s* allied, union; ~ **dövlətlər** allied powers; ~ **respublikalar** union republics
**müttəfiqlik** *i* alliance, union
**müttəhim** *i* the accused; defendant, prisoner at the bar
**müvafiq** *s* 1. corresponding *(to)*, conformable *(to)*, proportionate, commensurate; 2. suitable, proper, appropriate, opportune; according; **nümunəyə** ~ **olmayan** untrue to type; ~ **hərəkət etmək** to act accordingly; ~ an right moment; ~ **işçi** person suitable for the work; *d.d.* the right man* for the job; ~ **olaraq** according to, in accordance *(with)*
**müvafiqlik** *i* proportionality, accordance, conformity, compliance
**müvazi** *s* parallel; equilibrium, balance, equipoise; ~ **xətlər** parallel lines
**müvazilik** *i* balance, parallelism; **möhkəm** ~ stable equilibrium
**müvazinət** *i* balance, equilibrium; equipoise; **ruhi** ~ mental equilibrium; **mütəhərrik** ~ unsteady / noble equilibrium; **siyasi** ~ balance of power; ~**i itirmək** to lose* *one's* balance; ~**i bərpa etmək** to restore the equilibrium / balance; ~**i pozmaq** to disturb the equilibrium *(of)*, to upset* the balance *(of)*; *(adam haqqında)* to upset* *one's* equanimity; ~**ini saxlamaq** to keep* *one's* balance
**müvazinətli** *s* steady, even tempered
**müvazinətlik** *i* steadiness, even-temper
**müvazinətsiz** *s* unsteady, unbalanced; ~ **yeriş** an unsteady walk
**müvazinətsizlik** *i* unbalance
**müvəffəq** *s:* ~ **olmaq** to achieve success; **daha yüksək məhsuldarlığa** ~ **olmaq** to strive* for higher productivity; **məhsuldarlığı artırmağa** ~ **olmaq** to succed in increasing the productivity; to achieve higher productivity

**müvəffəqiyyət** *i* success, *(good)* luck; ~ arzu etmək to wish success; *Sənə müvəffəqiyyətlər arzu edirəm! I wish you every success; d.d. I wish good luck to you!* ~ qazanmaq to make* progress *(in)*, to advance *(in)*; *O, böyük müvəffəqiyyətlər qazanır He / She is making great / good progress; He / She scores big successes*; həyatda böyük ~ qazanmaq to have* great success in life; ~ə malik olmaq to make* a success; *Bu pyes böyük müvəffəqiyyət qazandı This play was a great success; The play was a great hit. idiom.*

**müvəffəqiyyətli** *s* successful; ~ cəhd successful attempt; ~ tərcümə good / felicitous translation

**müvəffəqiyyətlilik** *i* success, successfulness

**müvəffəqiyyətsiz** *s* unsuccessful, unlucky, unfortunate

**müvəffəqiyyətsizlik** *i* failure, fail; ~ yə uğramaq to fail, to miscarry

**müvəkkil** *i* commissioner, authorized agent, representative, attorney

**müvəkkillik** *i* authority, power, plenary powers [pli:...] *pl.*

**müvəqqəti** *s* temporary; *(tədbirlər)* provisional; *(vəzifə)* acting ~ hökumət provisional government; ~ komitə interim committee; ~ əvəzedən acting; ~ vəsiqə interim certificate

**müyəssər** *s* 1. reachable, accessible; achievable, attainable; 2. possible, feasible, realizable; ~ olmaq 1) to turn out well, to work well, to be* a success; ~ olmamaq to be* a failure, to turn out badly; *Həmişə müyəssər olmur It does not always work;* 2) to succeed, to manage; *Onu tapmaq ona müyəssər oldu He / She succeeded in finding it; He / She managed to find it*

**müzakirə** *i* discussion, debate; ~yə vermək to bring* up / to propose for discussion *(d.)* / for consideration *(d)*; ~ mövzusu point at issue; *(mübahisə)* moot point; ~ *etmək* to discuss *(d.)*; to talk over *(d.) d.d.*; vəziyyəti ~ etmək to review the situation; məsələni / təklifi hərtərəfli ~ etmək to give careful consideration to a problem / proposal; to thrash the matter out *(d.)*; qanun layihəsini ~ etmək to debate a bill; ~ ni açmaq to open the debate

**müzəffər** *s* victorious, triumphal, triumphant; victor *(attr.)*: ~ himn triumphal hymn; ~ ordu victorious army; ~ qılınc victor sword

**müzmin** *s tib.* chronic; ~ xəstəlik chronic disease [...zi:z]

**müzür** *s* harmful, bad, noxious, injurious, deleterious, unhealthy; pernicious; ~ adət bad / pernicious habit; ~ qaz *kim.* noxious gas; ~ iglim unhealthy climate; ~ heyvan harmful animal; ~ element harmful element

**müzürlülük** *i* harm, harmfulness, injuriousness, noxiousness



# N, n

**N, n** [en] *the 20[th] letter of the Azerbaijani alphabet*

**nabat** fruit-drop, sugar candy [ʃu-...] *d.d.* lollipop; *(girdə)* sugar-plum [ʃu-]

**nabələd**[1] *i* stranger; ~ olmaq to be* a stranger

**nabələd**[2] *s* strange, uninitiated [ˈʌnɪˈnɪʃɪeɪtɪd]; unfamiliar *(to)*; ~ olmaq to be* strange; *O, bu işə nabələddir He / She is strange to the job;* ~ səs a strange noise; ~ adam a stranger; ~ oxucu uninitiated reader

**nabələdlik** *i* strangeness; non-acquaintance *(with)*; ignorance *(of)*; ~dən through ignorance

**nacins** *s* ignoble, base; dishonourable; ~ adam an ignoble man*

**nacinslik** *i the quality of being ignominy / dishonest;* ~ etmək to behave / act dishonourably

**naçar** *s* hopeless, desperate; ~ vəziyyət desperate state; ~ qalmaq to be* enforced, to be* in a desperate situation; ~ olmaq to be* hopeless *(about / of)*

**naçarlıq** *i* hopelessness, desperateness

**nadan**[1] *i* ignoramus, an ignorant person

**nadan**[2] *s* impolite, rude; ignorant; ~ adam an ignorant person; ~ cavab ignorant reply / answer

**nadanlıq** *i* ignorance; ~ üzündən through *(one's)* ignorance; ~ etmək to act ignorantly

**nadinc**[1] *i* playful / frolicsome fellow; *(oğlan)* naughty / mischievous boy; *(qız)* playful / frolicsome girl

**nadinc**[2] *s* naughty; mischievous, prankish; playful, frolicsome; merry; ~ uşaq a naughty child; hərdən ~ olmaq to be* mischievous at times

**nadinclik** *i* prank; mischief, naughtiness; ~ etmək to play pranks *(on)*; *Nadinclik etmə! Don't be naughty / mischievous! Don't play pranks!*

**nadir**[1] *s* 1. rare; uncommon; ~ hadisə a rare event; ~ kitab a rare book; ~ gözəllik uncommon beauty; 2. occasional; *Biz bura nadir halda gəlirik We get the occasional visit here*

**nadir**[2] *z* seldom, rarely, not often; occasionally

**nadirən** *z bax* **nadir**[2]

**nadirlik** rarity, rareness; *the state of being rare*

**nadürüst**[1] *i* mountebank, quack, charlatan, scoundrel, rogue

**nadürüst**[2] *s* sly, roguish; *(biç.)* cunning; ~ təbəssüm roguish smile

**nadürüstləşmək** *f* to become*/ to get* roguish

**nadürüstlük** *i* slyness; roguery, dishonesty; ~ etmək to act / behave dishonestly

**naəlac** *s bax* **əlacsız**

**naəlacıq** *i bax* **əlacsıslıq**

**naftalin** *i* naphthalene, naphtaline, flake camphor; *(kürəcik formasında)* moth-balls *pl.*, camphor balls *pl.*

**nagah** *z* unexpectedly, suddenly; all of a sudden, by accident

**nagahan** *z bax* **nagah**

**nagahani** *s* sudden, unexpected, accidental; chance; ~ görüş chance encounter; ~ sakitlik sudden hush; ~ leysan sudden shower; ~ xəbər unexpected news; ~ atəş *hərb.* accidental discharge

**nagüman** *s* hopeless; bir şey haqqında ~ olmaq to be* hopeless about / of *smth.*

**nagümanlıq** *i* hopelessness

**nağara** *i* drum; ~ çalmaq to drum, to play the drum

**nağaraçalan** *i* drummer, drum player

**nağaraçı** *bax* **nağaraçalan**

**nağaraçılıq** *i the profession of a drummer;* ~ etmək to be* a drummer

**nağd**[1] *i* amount on hand; *(pul)* cash; ~ vermək to pay* in cash; to pay*

**nağd**[2] *s* available, on hand; ~ pul cash, ready money; ~ pulla ödəniş payment in cash

**nağdı** *s bax* **nağd**[2]

**nağıl** *i* tale, story; sehrli ~ fairy-tale; xalq ~ı popular tale; ~ danışmaq to tell* tales / stories; ~ etmək to tell* *(d.)*, to narrate *(d.i.)*, to recount *(d.i)*; *Nağıl edirlər ki... The story goes that...; (Mənə) nağıl danışma Don't tell me tales!*

**nağılbaz** *i* talebearer, taleteller; *one who likes to tell tales*

**nağılçı** *i bax* **nağıldeyən**

**nağıldeyən** *i* taleteller

**nahaq** *s* 1. vain, useless; ~ ümid vain hope; ~ cəhd vain / useless effort; 2. wrongful, unjust; false; ~ ittiham wrongful accusation

**nahaqdan** *z* 1. in vain, for nothing; ~ getmək to go* for nothing / in vain; 2. wrongfully, unjustly, falsely; ~ ittiham olunmaq to be* wrongfully accused *(of)*

**nahamar** *s* uneven, not smooth, rough [rʌf]; ~ xətt uneven hand *(writing)*; ~ yer rough country

**nahamarlaşdırmaq** *f* to make* uneven / rough

**nahamarlaşmaq** *f* to become* / to get* uneven / rough

**nahamarlıq** *i* unevenness; roughness [rʌf-]; yerin nahamarlığı roughness of the ground

**nahar**[1] *i* dinner; dadlı ~ good* dinner; bir kəsi ~a dəvət etmək to invite / to ask *smb.* to dinner; ~dan sonra after dinner; ~dan əvvəl before dinner; ~da at dinner; ~ etmək to have* dinner, to dine; bir kəsin şərəfinə ~ vermək to give* a dinner in honour of *smb.*

**nahar**[2] *s* dinner; ~ vaxtı dinner-time; ~ stolu dinner table; ~ saatı dinner-hour; ~ fasiləsi dinner break

**naharlıq** *i smth.* for dinner

**naharsız** *z* without having dinner

**nahiyə** *i* 1. area, region,district; 2. *tib.* region; **ürək ~sində yara** wound in the region of the heart

**naxələf**[1] *i* ignoble / dishonourable son, mean / unkind child; ignoble / mean person

**naxələf**[2] *s* 1. ignoble, dishonourable, mean; 2. unkind, ungrateful; thankless

**naxələflik** *i* 1. meanness, ungratefulness; 2. *the quality of lacking nobility / kindness*

**naxır** *i* herd; cattle

**naxırçı** *i* herdsman*; *amer.* cow-boy

**naxırçılıq** *i* *the job of a herdsman* / *amer. a cowboy*; **~ etmək** to be* a herdsman* / *amer.* a cow-boy

**naxış** *i* pattern, design [-zaın], tracery [treı-]; ornament; decorative pattern / design; embroidery; **~ açmaq** to pattern *(on, upon)*, to make* a pattern *(on, upon)*; **(ağacda, daşda və s.)** to carve *(d.)*; ◊ **~ı tutmaq / gətirmək** to be* in luck, to be* lucky, to have* good luck; **~ çəkmək** *bax* **naxışlamaq**

**naxışaçan** *i* designer, **(daşda, ağacda və s.)** carver

**naxışbənd** *i bax* **naxışaçan**

**naxışçı** *i bax* **naxışaçan**

**naxışçılıq** *i the profession of a designer / a carver*

**naxışlamaq** *f* to pattern *(d.)*; to decorate *(d.)*; **(daşı, ağacı və s.)** to carve *(d.)*

**naxışlanmaq** *f* to be* patterned / to decorated; **(daş, ağac)** to be* carved

**naxışlatdırmaq** *f bax* **naxışlatmaq**

**naxışlatmaq** *f* to ask / to cause *s.o.* to pattern *(d.)*; **(daşı, ağacı və s.)** to ask / to cause *s.o.* to carve *(d.)*

**naxışlı** *s* patterned, figured; **(daş, ağac və s.)** carved; embroidered, decorated with designs [-zaınz]

**naxış-naxış** *s bax* **naxışlı**

**naxışsız** *s (i.s.)* without designs / patterns; **(daş, ağac və s.)** *(i.s.)* without carving

**naxoş**[1] *i* a sick person

**naxoş**[2] *s* sick, ill; **~ kişi** a sickman*; **~ qadın** a sickwoman*; **~ uşaq** a sickchild*; **~ olmaq** to be* ill

**naxoşlamaq** *f* to get* ill, to be* ill, to fall* ill

**naxoşlatdırmaq** *f bax* **naxoşlatmaq**

**naxoşlatmaq** *f* to cause *s.o.* to get / to be / to fall ill

**naxoşluq** *i* sickness; illness

**nail:** **~ olmaq** to achieve *(d.)*, to attain *(d.)*, to strive *(for+to inf.)* *(d.)*; to try / to strive to get *(d.)*, to seek* *(d.)*; **bir kəslə görüşməyə ~ olmaq** to seek* out *smb.*, to try to meet *smb.*; **şərəfə ~ olmaq** to attain fame; ***O, həmişə istədiyinə nail olur*** *She / He always gets what he / she wants;* **öz məqsədinə ~ olmaq** to achieve / to gain / to attain *one's* object / goal, to secure *one's* object

**nailiyyət** *i* achievement; attainment; **elmi və texniki ~** scientific and technical achievement; **elmi və texniki ~lər** achievements of science and engineering; **yüksək ~** acme [ˈækmı]; high-water mark *idiom.*

**nainsaf** *s bax* **insafsız**

**nainsaflıq** *i bax* **insafsızlıq**

**nakam**[1] *s* unfortunate, ill-fated, luckless; **~ qız** a luckless / ill-fated girl

**nakam**[2] *z:* **~ ölmək** to die untimely

**nakəs**[1] *i* a dishonest person, a man of mean birth

**nakəs**[2] *s* mean; ungenerous; unkind, despicable

**nakəslik** *i the quality of being mean / unkind / despicable*

**nakişi** *i* a man* of mean birth, a dishonest person

**nakişilik** *i* dishonesty, *the quality of being disloyal / unfaithful*

**naqabil** *s* 1. unworthy *(of)*, worthless, mean; **~ hərəkət** mean action; 2. incapable *(of)*, dull, slow [slou], clumsy [ˈklʌmzı], unskilful; 3. indecent, unseemly; **~ zarafat** indecent joke; **~ ifadələr** unseemly expressions

**naqafil**[1] *s* unexpected, sudden; surprise; **~ hücum** surprise attack; **~ zərbə** surprise blow; **~ xəstəlik** a sudden illness; **~ xəbər** unexpected news

**naqafil**[2] *z* suddenly, all of a sudden, unexpectedly; **~ gəlmək** to come* all of a sudden / unexpectedly / suddenly

**naqan** *i* Nagan revolver

**naqqa** *i zool. bax* **naqqabalıq**

**naqqabalığ** *i zool.* sheat-fish

**naqqal**[1] *i* talker, chatterer, gas-bag, windbag; chatter-box

**naqqal**[2] *s* garrulous, talkative; **(sirr saxlaya bilməyən)** indiscreet; *d.d.* blabbing; **~ adam** a garrulous / talkative person

**naqqallamaq** *f* to twaddle, to prate, to prate *(about)*

**naqqalxana** *i* talking-shop

**naqqallıq** *i* garrulousness, prate, idle talk, twaddle; talkativeness; **~ etmək** *bax* **naqqallamaq**

**naqqaş** *i* painter, artist

**naqqaşkarlıq** *i* painting

**naqqaşlıq** *i* painting, *the profession of a painter / an artist*

**naqil** *i fiz.* conductor

**naqis** *s* defective, imperfect; **~ fellər** *qram.* defective verbs; **~ olmaq** to have* some defects, to be* imperfect; **~ şer** imperfect verse

**naqislik** *i* defectiveness, imperfection; **naqisliyi aşkar etmək** to reveal imperfection

**nal** *i* 1. horseshoe; **~ vurmaq** *bax* **nallamaq**; **dörd ~a çapmaq** to gallop at full speed; 2. **(ayaqqabıda)** iron tip, heel on a boot; ◊ **gah ~a gah mıxa vurmaq** ≅ to please both parties / sides

**nalan** *i* moaning, lamenting; **~ salmaq** to moan, to lament

**nalayiq**[1] *s* unworthy; unsuitable; improper, unbecoming, indecent **~ təklif** an improper suggestion, indecent proposal; **~ adam** unworthy person

**nalayiq**[2] *z* indecently, improperly; lewdly; **~ danışmaq** to speak* indecently

**nalayiqlik** *i* lewdness, indecency, impropriety

**nalbənd** *i* farrier [ˈfærıə], shoeing-smith, horse-doctor

**nalbəndlik** *i the profession of a farrier;* **~ etmək** to work as a farrier, to be* a farrier

**nalə** *i* maon, groan; (loud) cry, wail; **~ etmək** to wail *(with)*; **dərddən ~ etmək** to wail with sorrow / grief

**nallamaq** *f* to shoe *(d.)*; **atı ~** to shoe a horse

**nallanmaq** *f* to be* shoed / shod

**nallatdırmaq** *f* to ask / to cause *s.o.* to shoe *(d.)*, to have* *(d.)* shoed / shod

**nallatmaq** *f bax* **nallatdırmaq**

**nallı** *s* shoed, shod; *(i.s.)* with / having shoes

**nalsız** *s (i.s.)* without shoes, shoeless

**naltökən** *i* stony / rocky road

**nalvari** *s* horseshoe-shaped



**namaz** *i* ritual worship; prayer; **~ qılmaq** to perform the ritual prays of Islam

**namdar** *s* famous, popular, celebrated

**naməhriban** *s* unkind; cruel, impolite

**namə** *i* letter, love-letter; **~ yazmaq** to write* a letter / a love-letter

**naməhrəm**[1] *i* stranger [streı-]

**naməhrəm**[2] *s* strange [streı-]; alien; **~ adam** a stranger; **~ əllər** strange hands

**naməhrəmlik** *i* strangeness

**naməlum** *s* unknown; unfamiliar; mysterious; **~ rəssam** unknown painter; **~ ada** unknown island; **~ adam** an unknown man* / person; **~ şeylər** unknown things; **~ sifət** an unfamiliar face **~ dil** unfamiliar language

**naməlumluq** *i* uncertainty; obscurity; indefiniteness

**namərd**[1] *i* traitor; betrayer; a man* of mean birth; **(qadın)** traitress

**namərd**[2] *s* mean, treacherous; base, insidious; low perfidious; **~ hərəkət** mean / low trick

**namərdcə** *z bax* **namərdliklə**

**namərdcəsinə** *z bax* **namərdliklə**

**namərdlik** *i* insidiousness, perfidy, perfidiousness, treachery, disloyalty; **~ etmək** to act / to behave meanly / perfidiously

**namərdliklə** *z* meanly, treacherously, disloyally, perfidiously

**namizəd** *i* 1. candidate; applicant; **deputatlığa ~** candidate, nominee; **~ irəli sürmək** to put* forward a candidate, to propose a candidate; **elmlər ~i** candidate of science

**namizədlik** *i* candidature; candidacy; *amer.* nomination; **bir kəsin namizədliyini irəli sürmək** to nominate *smb.* for election, to put* forward *smb.'s* candidature; **namizədliyini geri götürmək** to withdraw *one's* candidature

**namöhkəm** *s* not durable / solid; flimsy; **~ bina** flimsy-constructed building, jerry-built house

**namöhkəmlik** *i* lack of strength / solidity

**namus** *i* honour, good name; rectitude, honesty; **~una toxunmaq / sataşmaq** 1) to affect *one's* honour, to hurt* *one's* pride; to dishonour *(d.)*, to digrace *(d.)*, to bring* dishonour; 2) **(zorlamaq)** to rape *(d.)*, to violate *(d.)*, to ravish *(d.)*

**namus-qeyrət** *i bax* **namus**

**namusla** *z* honestly; fairly; honourably; **~ cavab vermək** to answer honestly

**namuslu** *s* honourable, honest, upright, honest-minded; **~ adam** honourable man, honest person / man*, **~ adamlar** honest-minded people; **~ qadın** an honest woman; **~ xidmət** honourable service; **~ vətəndaş** an upright citizen

**namusluluq** *i* honesty, uprightness, honourableness

**namussuz** *s* honourless; *(i.s.)* without honour, dishonest, dishonourable; **~ adam** honourless man* / person; **~ qadın** dishonest woman*

**namussuzca** *z bax* **namussuzcasına**

**namussuzcasına** *z* disgracefully, dishonestly

**namussuzluq** *i* dishonourableness; disgrace, dishonour, dishonesty; ***Mən namussuzluğu bağışlaya bilmərəm*** *I can't forgive dishonesty*

**namüəyyən** *s bax* **qeyri-müəyyən**[1]

**namüəyyənlik** *i bax* **qeyri-müəyyənlik**

**namümkün** *s bax* **qeyri-mümkün**

**namümkünlük** *i bax* **qeyri-mümkünlük**

**namütənahi** *s bax* **sonsuz**

**namütənahilik** *i bax* **sonsuzluq**

**namünasib** *s* not corresponding *(with)*, incongruous *(with)*; not suitable, not fit

**namünasiblik** *i* discrepancy, disparity, lack of correspondence, incongruousness

**namüvafiq** *s* not corresponding *(with)*, incongruous *(with)*

**namüvafiqlik** *i* discrepancy, disparity, lack of correspondence, incongruousness

**nan** *i bax* **çörək**[1]

**nanay**[1] *i* Nanaian

**nanay**[2] *s* Nanaian; **~ dili** Nanaian, the Nanaian language

**nanayca** *z:* **~ danışmaq** to speak* Nanaian / the Nanaian language

**nanə** *i bot.* mint

**nanəcib**[1] *i* an ignoble / dishonourable man*

**nanəcib**[2] *s* dishonourable, ignoble, base, ignominious; **~ iş** dishonourable / ignoble deed; **~ davranış** ignominious behaviour

**nanəcibcəsinə** *z* ignobly, ignominiously, dishonourably

**nanəciblik** *i* ignominy, dishonesty, meanness

**nanəli** *s* with mint

**nanəlik** *i* mint-bed, *the place where mint is cultivated*

**nanıx** *s* 1. weak, feeble; 2. absent-minded

**nanıxlıq** *i* 1. weakness, feebleness; 2. absent-mindedness

**nankor**[1] *i* an ignoble / dishonourable man*

**nankor**[2] *s* ungrateful, dishonourable, ignoble, base

**nankorcasına** *z* ungratefully, dishonourably, dishonestly

**nankorluq** *i* ingratitude, ungratefulness

**napak** *s* unclean; foul; dirty

**napaklıq** *i* uncleanness; impurity

**nar**[1] *i* pomegranate

**nar**[2] *s* pomegranate; **(rəng)** cherry-coloured; **~ ağacı** pomegranate (tree)

**narahat** *s* 1. uneasy [-zı], worried, anxious; troubled; 2. restive, restless; 3. uncomfortable; **~ stul** an uncomfortable chair; **~ adam** restless person; **~ olmaq** 1) to worry *(about)*, to be* anxious / uneasy *(about)*; to become* anxious *(about)*; 2) to worry *oneself*, to trouble, to bother; ***Narahat olma!*** *Don't be anxious / worried / uneasy;* **~ etmək** to worry *(d.)*, to disquiet *(d.)*; to make* anxious / uneasy *(d.)*; **(mane olmaq)** to disturb *(d.)*, to trouble *(d.)*; to bother *(d.)*, to put* to inconvenience *(d.)*; to make* uneasy *(d.)*

**narahatçılıq** *i bax* **narahatlıq**

**narahatlıq** *i* anxiety, uneasiness; nervousness; trouble; **~ vermək** to trouble *(d.)*, to give* trouble *(i.)*; to cause inconvenience *(to)*, to put* to inconvenience, to cause anxiety

**narahatlıqla** *z* uneasily, restlessly, anxiously, worriedly

**narazı** *s* dissatisfied; discontented; displeased; **~ olmaq / qalmaq** to be* displeased / dissatisfied; **özündən ~ olmaq** to be* dissatisfied with oneself

**narazılıq** *i* dissatisfaction; discontent, displeasure; resentment; ~ **etmək** to express *one's* dissatisfaction / displeasure; to murmur; to grumble *(at, about)*

**narın** *s* fine, small; ~ **qum** fine sand; ~ **yağış** fine drizzling rain; ~ **döymək** *(əzmək)* to grind* *(d.)* fine / small, to pound *(d.)*, to powder *(d.)*

**narınc** *i* bitter / wild orange

**narıncı** *s* orange; ~ **lent** orange ribbon; ~ **rəng** orange colour; *amer.* color

**narıngi[1]** *i bot.* tangerine, mandarine

**narıngi[2]** *s* tangerine; ~ **ağacı** tangerine-tree

**narınlamaq** *f* to pound *(d.)*, to grind* *(d.)* small / fine; to make* small *(d.)*; to pulverize *(d.)*

**narınlanmaq** *f* to become* / to get* fine, to get* ground small

**narınlaşmaq** *f bax* **narınlanmaq**

**narınlatdırmaq** *f bax* **narınlatmaq**

**narınlatmaq** *f* to ask / to cause *s.o.* to grind* *(d.)*; to have* *(d.)* ground / pounded

**narınlıq** *i the quality of being fine / small*

**narın-narın** *z* finely; ~ **doğranmış / kəsilmiş tərəvəz** finely cut vegetables; ~ **döyülmüş qənd** finely-powdered sugar; ~ **döymək** to powder *(d.)*, to grind* *(d.)* fine / small, to pound *(d.)*

**narkotik** *i* narcotic; *d.d.* dope; ~ **olmaq** to be* a drug / dope addict

**narkotik** *s* narcotic; ~ **maddə qəbul etmək** to use narcotics

**narkoz** *i* narcosis, anaesthesia; anaesthetic drug; ~ **vermək** to narcotize *(d.)*

**narlıq** *i* pomegranate grove

**naryad** *i* warrant

**nas** *i* chewing-tobacco

**nasaz** *s* 1. unhealthy, sickly; ~ **olmaq** to be* unwell / unhealthy; to be* ill; 2. discordant, disordered; not in order; *(mus. aləti)* out-of-tune; *Royal nasazdır The piano is out-of-tune*

**nasazlamaq** *f d.d.* to be* unwell, not to feel* quite well

**nasazlaşmaq** *f* to become* / to get* unwell, not to feel* quite well

**nasazlıq** *i* 1. indisposition, lethargy, sickliness; ~ **hiss etmək** to be* indisposed, not to feel* quite well; 2. disorder; unfitness, uselessness

**nasir** *i* prose-writer, prosaist

**nasirlik** *i the activity of a prose-writer*

**nasos[1]** *i* pump; **hava ~u** air-pump; **şini ~la doldurmaq** to pump up a tyre

**nasos[2]** *s* pumping; ~ **stansiyası** pumping station

**nasosxana** *i* pumping station

**nasoslamaq** *f* to pump *(d.)*, to fill by pumping *(d.)*

**nasoslanmaq** *f* to be* pumped / filled by pumping

**nasoslatdırmaq** *f bax* **nasoslatmaq**

**nasoslatmaq** *f* to ask / to cause *s.o.* to pump *(d.)*

**naşatır[1]** *i kim.* sal-ammoniac, ammonium chloride

**naşatır[2]** *s kim.*: ~ **spirti** liquid ammonia

**naşı** *s* inexperienced, unpractised; unconversant *(with)*; **bir işdə ~ olmaq** to be* unconversant with a question

**naşılaşmaq** *f* to become* / to get* inexperienced; to get* / to become* unconversant

**naşılıq** *i* inexperience; ignorance, lack of knowledge; **~dan** through ignorance

**naşir** *i* publisher

**naşirlik** *i the profession of a publisher*

**naşükür** *s* ungrateful, thankless; ~ **olmaq** to show* oneself ungrateful, to be* ungrateful

**naşükürlük** *i* ungratefulness, ingratitude; ~ **etmək** to show* oneself ungrateful *(to smb.)*

**natamam** *s* incomplete, imperfect, unfinished; ~ **bilik** imperfect knowledge; ~ **müvəffəqiyyət** incomplete success; ~ **orta məktəb** incomplete secondary school

**natamamca** *z* incompletely, imperfectly

**natamamcasına** *z bax* **natamamca**

**natamamlıq** *i* incompleteness, imperfection

**nataraz** *s* 1. clumsy, awkward; 2. *(yekəpər)* huge, gigantic; ~ **adam** a huge man*, a giant; ~ **qadın** a huge woman*

**natarazcasına** *z* 1. clumsily; 2. hugely

**natarazlıq** *i* 1. clumsiness; 2. hugeness

**natavan** *s bax* **gücsüz**

**natəmiz[1]** *s* 1. dirty, unclean; soiled; 2. dishonourable; unscrupulous; ~ **vicdan** soiled conscience; ~ **əl** dirty hand; ~ **olmaq** to be* dirty; to be* dishonourable; ◊ *Onun əli natəmizdir ~ He's a bit of a thief*

**natəmiz[2]** *z* dirtily; untidily

**natəmizlik** *i* untidiness, slovenliness; *məc.* unscrupulousness

**natiq** *i* orator, *(public)* speaker; **istedadlı ~** talented orator; **görkəmli ~** distinguished orator; ~ **olmaq** to be* an orator / a public speaker; **əvvəlki ~** the previous / last speaker

**natiqcəsinə** *z* oratorically; ~ **danışmaq** to speak* oratorically

**natiqlik[1]** *i* oratory

**natiqlik[2]** *s* oratorical, oratorial; ~ **istedadı / bacarığı** oratorical gift / skill; ~ **sənəti** oratory, the art of public-speaking

**natrium** *i kim.* sodium, natrium; ~ **xlor** sodium chloride

**natura** *n* nature

**natural** *s* natural; ~ **təsərrüfat** natural economy

**naturalist** *i* naturalist

**naturalistcəsinə** *z* naturalistically

**naturalistlik** *s* naturalistic

**naturalizm** *i fəls.* naturalism

**naturallaşdırılmaq** *f* to be* naturalized

**naturallaşdırmaq** *f* to naturalize *(d.)*

**naturallaşmaq** *f* to become*/ to get* naturalized

**natürmort** *i in.* still life

**naümid** *s* hopeless; desperate; ~ **vəziyyət** desperate / hopeless condition; ~ **xəstə** hopeless case, dying man*; ~ **etmək**: to make* hopeless; ~ **olmaq** to lose* hope, to be*unhopeful

**naümidcəsinə** *z* hopelessly; despairingly

**naümidlik** *i* hopelessness; despair

**navaxt** *z* untimely, not suitable for the time

**navala** *i* mash, forage; fodder

**navalça** *i bax* **nov**

**navar** *i* saddle for camel

**naviqasiya** *i* navigation; **çay ~sı** inland navigation

**nay[1]** *i* jovial fellow / girl

**nay[2]** *s* jovial, joyous, buoyant, merry; ~ **qız** a jovial girl

**naycasına** *z* jovially, joyously, merrily



**naylıq** *i* jovialness, merriness, joyousness, joviality

**naz** *i* 1. flirt, coquetry, coyness, whim; airs and graces *pl.*; 2. caprice [-i:s]; ~ **satmaq** to show coyness, to flirt *(with)*; **~ı ilə oynamaq** to tend *(d.)*, to cherish *(d.)*; ~ **etmək** to flirt, to mince; *Naz satma! None of your airs and graces! Naz etmə Don't put on airs*

**nazbalış** *i* large and soft pillow

**nazənin[1]** *i* coquette, a beautiful coquettish woman*, a wondrous beauty

**nazənin[2]** *s* coquettish, flirtatious, graceful, nice, delicate

**nazənin-nazənin** *z* coquettishly; gracefully; flirtatiously

**nazik[1]** *s* thin; fine; delicate; *(əndam)* slender, slim; ~ **qat** thin layer; ~ **ipək** thin / delicate silk; ~ **sap** thin / fine thread; ~ **ağ / mələfə** fine linen; ~ **toxunmuş parça** delicate / fine-spun fabric; ~ **barmaq** slender / delicate finger; ~ **bədən** slim / slender figure; ~ *(qəşəng)* **qıçlar** slim / slender legs; *(arıq)* thin / skinny legs; ~ **səs** thin voice; ~ **bağırsaq** *anat.* small intestines; ~ **kağız** thin paper; ~ **kitab** slim volume

**nazik[2]** *z* fine, thinly; ~ **kəsilmiş çörək** thinly sliced bread; *Yağı nazik yax! Spread the butter thinly! Tərəvəzi nazik doğra Cut up the vegetable fine*

**nazikbel** *s* slender; *(i.s.)* with a slender / slim waist

**nazikbelli** *s bax* **nazikbel**

**nazikbədənli** *s* slender; *(i.s.)* with a slender figure, *(i.s.)* having a slender figure

**nazikcə** *z* thinly, very / too thin; finest

**nazikdivar** *s* thin-walled

**nazikdivarlı** *s bax* **nazikdivar**

**nazikqabıq** *s* thin-skinned; *(qoz, yumurta və s.)* thin-shelled

**nazikqabıqlı** *s bax* **nazikqabıq**

**nazikqabıqlılıq** *i the quality of being thin-skinned / (qoz, yumurta və s.) thin-shelled*

**nazikqəlb** *s* soft-hearted, kind-hearted, soft-souled

**nazikqəlbli** *s bax* **nazikqəlb**

**nazikqəlblilik** *i* soft-heartedness, kind-heartedness

**naziklәmәk** *f bax* **naziklənmək**

**naziklənmək** *f* to become* thinner / slender / finer

**nazikləşdirilmək** *f* 1. to be* made thinner / finer; 2. to cause *s.o.* to lose weight

**nazikləşdirmək** *f bax* **nazikləşmək**

**nazikləşmək** *f* to become*/ to get* thinner; to lose* weight; to become*/ to get* slender

**nazikləşdirmək** *f bax* **naziklətmək**

**naziklətmək** *f* to cause to become / to get thinner; to cause *(d.)* to become slender / finer

**naziklik** *i* 1. thinness; *(bədən)* slenderness, slimness; 2. delicacy

**nazikürək** *s bax* **nazikqəlb**

**nazikürəkli** *s bax* **nazikqəlbli**

**nazikürəklilik** *i bax* **nazikqəlblilik**

**nazilmək** *f* 1. to become*/ to get* thinner; 2. to lose* weight; to become*/ to get* slender

**naziltmək** *f* 1. to thin *(d.)*, to make* thinner *(d.)*; 2. *məc.* to cause to get / to become thinner / finer / more delicate

**nazim** *i* regulator

**nazimçarx** *i* fly-wheel

**nazir[1]** *i* minister; *(ABŞ-da)* secretary; **Baş ~** Prime Minister; **xarici işlər ~i** Minister for Foreign / External Affairs; *(İngiltərədə)* Foreign Secretary; *(ABŞ-da)* Secretary of State; **daxili işlər ~i** Minister for Internal-Home Affairs; *(İngiltərədə)* Home Secretary; *(ABŞ-da)* Secretary of the Interior; **maliyyə ~i** Minister for Finance; *(İngiltərədə)* Chancellor of the Exchequer; **müdafiə ~i** *(İngiltərədə)* Defence Minister; Secretary of State for Defence; *(ABŞ-da)* Secretary of Defence; ◊ **Portfelsiz ~** Minister without portfolio

**nazir[2]** *s* ministerial; ~ **funksiyası** ministerial function; ~ **vəzifəsi** ministerial duty

**nazirlik** *i* ministry; board; office; *amer.* department; **Ticarət Nazirliyi** Ministry of Trade; *(İngiltərədə)* Board of Trade; **Xarici Ticarət Nazirliyi** Ministry of Foreign Trade; **Daxili İşlər Nazirliyi** Ministry of Internal Affairs; *(İngiltərədə)* Home Office; *(Amerikada)* Department of the Interior; **Səhiyyə Nazirliyi** Ministry of Public Health; *(İngiltərədə və ABŞ-da)* Department of Health; **Xarici İşlər Nazirliyi** Ministry of Foreign Affairs; *(İngiltərədə)* Foreign Office; *(Amerikada)* State Department; **Maarif / Təhsil Nazirliyi** Ministry of Education; *(ABŞ-da)* Department of Education; **Rabitə Nazirliyi** Ministry of Communications; **Kənd Təsərrüfatı Nazirliyi** Ministry of Agriculture; **Maliyyə Nazirliyi** Ministry of Finance; Exchequer, Treasury *(İngiltərədə və ABŞ-da)*; **Ədliyyə Nazirliyi** Ministry of Justice; **Müdafiə nazirliyi** Ministry of Defence; **Dəmiryol Nazirliyi** Ministry of Railways; **İctimai Təminat Nazirliyi** Ministry of Social Welfare

**naz-qəmzə** *i bax* **naz**

**nazlamaq** *f* to caress *(d.)*, to fondle *(d.)*, to pet *(d.)*; to give* a treat *(i)*; to pamper *(d.)*; to treat too kindly; **bir kəsi ~** to caress *smb.*

**nazlana-nazlana** *z* fondly; coquettishly, coyly; ~ **baxmaq** to look at *smb.* coquettishly; to gaze fondly at *smb.*; *O, köhnə dostlarını nazlana-nazlana salamladı She greeted her old friends fondly*

**nazlandırmaq** *f bax* **nazlamaq**

**nazlanmaq** *f* to mince, to give* airs, to put* on airs; to behave coquettishly; to behave in an affected manner; to be* coy

**nazlı** *s* coy, flirty; capricious, coquettish; flirtatious; ~ **qız** a flirtatious girl

**nazlı-duzlu** *s bax* **nazlı**

**nazlılıq** *i* flirtatiousness, coyness, coquetry

**nazlı-nazlı** *z bax* **nazlana-nazlana**

**naz-nemət** *i* all the pleasures, everything that pleases one

**nazsatan[1]** *i* coquette, poseur, a coquettish girl / woman

**nazsatan[2]** *s bax* **nazlı**

**necə** *z* 1. how; *İşlərin necədir? How are you getting on? Necəsiniz? How are you? Bu necə baş verdi? How did it happen?* 2. *(a particle denoting surprise, wonder, etc.) What! Necə! O gedib?! What! He has gone?! Necə olursa, olsun at all events, at all costs;* 3. *(nida sözü) how! Necə də istidir! How hot it is! Çay necə də dərindir! How deep the river is!*

**neçə** *s* how many, how much; *Sizin neçə qardaşınız var? How many brothers have you got? Bunun qiyməti neçədir? How much does it cost?How much is it? Vaxt (saat) neçədir? What time is it? What is the time? Mən sizə neçə dəfə demişəm... How many times have I told you*

**təbəqələşmə** *fi* stratification; *mec.* differentiation
**təbəqələşmək** *f* to be* stratified; *mec.* to be* differentiated
**təbəqələşmiş** *s* stratified; ~ cəmiyyət a stratified society
**təbəssüm** *i* smile; saxta ~ forced smile; güclə sezilən ~ a scarcely perceptible smile
**təbəssümlü** *s* smiling; *(i.s.)* with smile
**təbib** *i bax* **həkim**
**təbiblik** *i bax* **həkimlik**
**təbiət** *i* 1. nature; ~in qanunu law of nature; ~in qoynunda / qucağında / ağuşunda in nature's lap; şeylərin ~i nature of things; ~in sirri the secret of nature; 2. landscape, scenery; nature life; şimalın ~i the nature of the North, northern scenery; 3. *(xasiyyət)* nature, character; insan ~i human nature
**təbiətcə** *z* by nature; naturally; ~ şən naturally cheerful; gay by nature; ~ nəzakətli polite by nature; ~ tənbəl olmaq to be* lazy by nature
**təbiətən** *s bax* **təbiətcə**
**təbiətpərəst** *i* naturalist
**təbiətşünas** *i* naturalist, scientist
**təbiətşünaslıq** *i* nature study, science
**təbii**[1] *s* 1. natural; spontaneous; elemental; ~ qaz natural gas; ~ şərait natural condition; ~ ehtiyat natural resources; ~ nitq natural speech; spontaneous speech; ~ seçmə *biol.* natural selection; ~ fəlakət natural disaster / calamity; ~ qüvvə elemental force; 2. native; *(metal)* virgin; ~ qızıl native / virgin gold; ~ mis native / vergin copper
**təbii**[2] *z* naturally; spontaneously; ~ danışmaq to speak* naturally
**təbiiləşdirilmiş** *s* naturalized
**təbiiləşdirmə** *fi* naturalization
**təbiiləşdirmək** *f* to naturalize *(d.)*
**təbiiləşmək** *f* to become* / to get* naturalized
**təbiilik** *i* naturalness; simplicity
**təbil**[1] *i* drum; ~ çalmaq to beat* / to play the drum
**təbil**[2] *s* drum; ~ səsi drum-beat
**təbilçalan** *i* drummer
**təbilçi** *i bax* **təbilçalan**
**təbir** *i* expression
**təbirincə** *z* according to: Marksın ~ according to Marx
**təbiyyat** *i* 1. *(natural)* science, nature study; 2. *(tədris fənni)* science; 3. *(tarixi)* natural history
**təbiyyatçı** *i bax* **təbiətşünas**
**təbliğ** *i:* ~ etmək to propagate, to propagandize *(d.)*, to advocate *(d.)*; to popularize *(d.)*
**təbliğat**[1] *i* propaganda; publicity; popularization; müharibə ~ı war propaganda; ~ aparmaq to propagandize; to publicize; to popularize; partiya ~ı party propaganda
**təbliğat**[2] *s* propagandistic; propaganda; ~ vasitələri publicity media; ~ işi propaganda work
**təbliğatçı** *i* propagandist; publicist
**təbliğatçılıq** *i the job of a propagandist*
**təbliğat-təşviqat** *i* propaganda and agitation
**təbliğçi** *i bax* **təbliğatçı**
**təbliğçilik** *i bax* **təbliğatçılıq**
**təbrik**[1] *i* congratulation; ~ etmək to congratulate *(d. on, upon)*; bir kəsi ad günü münasibəti ilə ~ etmək to congratulate *smb.* on his birthday; bir kəsi yeni il münasibəti ilə ~ etmək to wish *smb.* a happy New Year; *Mən sizi ad gününüz münasibəti ilə təbrik edirəm I wish you many happy returns of the day*
**təbrik**[2] *s* congratulatory; salutatory; ~ nitqi salutatory address, speech of welcome; ~ teleqramı telegram of greeting, greeting telegram
**təbrikləmək** *f* to congratulate *(d. on, upon)*
**təbriklənmək** *f* to be* congratulated
**təbriknamə** *i* a letter of congratulation
**təcavüz** *i* aggression; encroachment *(on, upon)*; ~ etmək to encroach *(on, upon)*, to infringe *(on, upon)*, to make* an encroachment *(on, upon)*; bir kəsin hüququna ~ etmək to encroach / to infringe upon *smb.'s* rights; azadlığa ~ infringement of liberty
**təcavüzkar**[1] *i* aggressor; violater; ~ olmaq to be* an aggressor; potensial ~ potential aggressor
**təcavüzkar**[2] *s* aggressive; ~ adam an aggressive man*; ~ siyasət aggressive policy
**təcavüzkaranə** *z* aggressively, in an aggressive way
**təcavüzkarcasına** *z bax* **təvacüzkaranə**
**təcavüzkarlıq**[1] *i* aggression, aggressiveness
**təcavüzkarlıq**[2] *s* aggressive; ~ müharibəsi aggressive war, war of aggression
**təcəssüm** *i* embodiment, personification; incarnation; cəsarət / mərdlik ~ü embodiment / personification of courage; ~ etdirmək to personify *(d.)*, to embody *(d.)*: bir şeyi özündə ~ etdirmək to personify smth., to be* the personification / embodiment of *smth.*; ~ olunmaq to be* embodied *(in)*, to be* incarnated *(in)*
**təchiz** *i* supply, provision; ~ etmək to supply *(d.with)*, to furnish *(d.with)*, to provide *(d.with)*; to equip *(d.)*; ərzaqla ~ etmək to victual ['vɪtl] *(d.)*; yeni texnika ilə ~ etmək to supply with new-type machinery
**təchizat** *i* equipment, supply, provision; hərbi ~ war supplies *pl.*; ərzaq ~ı food-supply, victual ['vɪtl]
**təcil** *i* acceleration
**təcili**[1] *s* pressing, urgent, rush, express; ~ iş urgent matter; ~ sifariş pressing / rush order; ~ teleqram urgent / express telegram; ~ yardım first aid
**təcili**[2] *z* urgently, hastily, in a hurry; ~ tərk etmək to leave* in a hurry / hastily
**təcililik** *i* urgency
**təcrid** *i* 1. isolation; *tex.* insulation; *tib.* quarantine; ~ etmək to isolate *(d.)*; *tex.* to insulate *(d.)*; *tib.* to quarantine *(d.)*; ~ olunmaq to be* isolated; to isolate oneself; 2. abstraction
**təcridedilmiş** *fs* 1. isolated; separate; ~ otaq separate room; 2. *tex.* insulated
**təcridetmə** *i* isolation, isolating
**təcrübə**[1] *i* 1. experiment; test; probation; ~ qoymaq / aparmaq to experimentalize, to experiment; to take* / to carry out / perform an experiment; elmi ~ a scientific experiment; ~ keçmək to pass a probation; ~də olmaq to be* on probation; 2. experience; həyat ~si knowledge of life; müharibə ~si experience of war; döyüş ~si battle experience; ~dən bilmək to know* by experience



**təcrübə**[2] *s* experiment, experimental; ~ stansiyası experiment station; ~ təsərrüfatı an experimental farm
**təcrübəçi** 1. *(təcrübə keçən)* probationer; 2. *(təcrübə aparan)* experimenter
**təcrübələnmək** *f* to gain experience *(in)*, to become* experienced
**təcrübəli** *s (adam)* experienced; proficient; ~ həkim experienced doctor; ~ səyahətçi an experienced traveller; ~ pianoçu proficient pianist
**təcrübəlilik** *i the state of being experienced;* proficiency
**təcrübəsiz** *s* inexperienced, unpractised; *(xam)* novice; bir şeydə ~ olmaq to be* inexperienced in *smth.*; ~ adam inexperienced person; ~ üzgüçü a novice swimmer
**təcrübəsizlik** *i* inexperience; the state of being inexperienced / novice
**təcrübi**[1] *s* 1. practical; ~ fəaliyyət practical activity; ~ məşğələ practical training; ~ iş practical work; 2. experimental; 3. empiric(al); ~ bilik empirical knowledge; ~ nəticə empirical conclusion
**təcrübi**[2] *z* 1. practically; dili ~ bilmək to know* the language practically; 2. experimentally
**tədarük**[1] *i* 1. laying in, stocking up; *(dövlət)* State purchasing / purveyance; dövlət taxıl ~ü State grain purchase / procurements *pl.*; yem ~ü laying-in of fodder; ~ etmək *(taxıl, odun və s.)* to lay* in *(d.)*, to store up *(d.)*; to stock *(d.)*; qışa odun ~ etmək to lay* in firewood for the winter
**tədarük**[2] *s:* ~ məntəqəsi purveying centre, procurement station; ~ təşkilatı official body in charge of *(state)* purchases; ~ qiyməti *siy. iqt.* State purchase price, procurement price
**tədarükcül** *s bax* **tədarüklü**
**tədarükçü** *i* government purveyor, official in charge of (State) purchases
**tədarüklü** *s* provident, *(i.s.)* of farsighted; ~ adam a man* of farsight
**tədavül** *i mali.* turnover; pul ~ü money turnover
**tədbir** *i* 1. measure; təsirli / qəti ~ drastic measure; cəza / intizam ~i disciplinary measure; ~ görmək to take* measure; müvəqqəti ~ temporary measure; ağıllı / müdrik ~lər wise measures; təcili ~ görmək to take* prompt action; bütün ~ləri görmək to take* every measure; 2. *(inzibati)* legislative enactment
**tədbirçi** *i* counsellor
**tədbirli** *s* foreseeing; provident; reasonable, sober-minded, prudent
**tədbirlilik** *i* foresight; prudence; reasonableness
**tədbirsiz** *s* improvident, careless
**tədbirsizcəsinə** *z* improvidently; carelessly
**tədbirsizlik** *i* improvidence; carelessness
**tədiyə** *i* payment; paying
**tədiyəçi** *i* payer
**tədqiq** *i* investigation; research; exploration; ~ etmək to investigate *(d.)*; to explore *(d.)*; Arktikanın ~i exploration of the Arctic Region; kosmik fəzanın ~i exploration of (outer) space
**tədqiqat**[1] *i* investigation *(of)*; research *(into)*; exploration *(of)*; elmi ~ scientific research; ~ aparmaq to investigate, to research; to explore *(d.)*
**tədqiqat**[2] *s* research; ~ işi research work; elmi ~ institutu scientific research institute
**tədqiqatçı** *i* investigator; *(ölkə tədqiq edən)* explorer; ~ olmaq to be* an investigator; to be* an explorer
**tədqiqatçılıq** *i the business of an investigator; the profession of an explorer*
**tədricən** *z* gradually, little by little, bit by bit
**tədrici**[1] *s* gradual; ~ dəyişiklik gradual change / transition
**tədrici**[2] *z bax* **tədricən**
**tədricilik** *i* graduality
**tədris**[1] *i* teaching, training
**tədris**[2] *s* educational; school; training; ~ müəssisəsi educational institution / establishment; ~ vəsaiti training appliance; school supplies; educational equipment; ~ ili academic year; *(məktəbdə)* school-year; ~ vaxtı *(məktəbdə)* school-hours pl.; *(ali məktəbdə)* study-hours *pl.*; ~ planı curriculum *(pl.-la)*; ~ fənni subject; ~ etmək to teach* *(i.d.)*; xarici dili ~ etmək to teach* a foreign language; kimyanı ~ etmək to teach* chemistry
**təəccüb** *i* surprise, wonder, wonderment, amazement; ~ etmək / qalmaq to be* surprised *(at)*, to be* amazed *(at)*, to get* surprised *(at)*
**təəccüblə** *z* surprisingly, wonderfully; amazingly
**təəccüblədirilmək** *f* to be* caused to get surprised / amazed *(at)*
**təəccübləndirmək** *f* to surprise *(d.)*, to amaze *(d.)*
**təəccüblənmək** *f* to be* / to get* surprised / amazed *(at)*
**təəccüblü** *s* surprising; amazing; *Təəccüblüdür ki,... It is surprising that...; Təəccüblü deyil ki, ... No wonder that...*
**təəhhüd** *i* commitment; obligation, engagement; qarşılıqlı ~ mutual commitment; ~ü yerinə yetirmək to meet* *one's* commitment / engagement, to carry out one's obligation; *(öz)* üzərinə ~ götürmək to undertake* an engagement; siyasi ~ political commitment
**təəhhüdlü** *s (i.s.)* with commitment
**təəhhüdnamə** *i* a letter of commitment
**təəhhüdsüz** *s (i.s.)* without commitment / engagement
**təəssüb** *i* 1. fanaticism; 2. partiality *(to, for)*, bias *(towards)*
**təəssübçü** *i bax* **təəssübkeş**
**təəssübçülük** *i bax* **təəssübkeşlik**
**təəssübkeş** *i* fanatic
**təəssübkeşlik** *i* fanaticism
**təəssüf** *i* regret; grief; ~ünü bildirmək / ifadə etmək to express *one's* regret; ~ hissi feeling of regret; ~ etmək to regret, to be* sorry *(about)*; bir kəsin ölümünə ~ etmək to regret *smb.'s* death; *Çox təəssüf ki, mən sizi tərk etməliyəm Much to my regret, I must leave you*
**təəssüflə** *z* regretfully
**təəssüflənmək** *f* to regret; to be* sorry about *(a sad factor / event)*; Bir kəsin ölümünə ~ to regret *someone's* death; *Mən çox təəssüf edirəm I do regret*
**təəssüflü** *s* regretful, sorry

**təəssür** *i* emotion

**təəssürat** *i* impression, effect; feeling; **dərin ~** deep impression

**təəssüratlı** *s* impressionable, sensitive

**təəssüratsız** *s* *(i.s.)* without impression, impressionless

**təfavüt** *i bax* **fərq**

**təfəkkür** *i* thinking; thought, mentality; **~ün varlığa münasibəti** the relation of thinking to being

**təfərrüat** *i* detail; **~a varmaq** to go* into detail (s); **~ı ilə** in every detail; **ən xırda ~ına qədər** to the smallest detail

**təfriqə** *i* 1. disunity, split, dissent; **dostlar arasında ~** a split among friends; **partiyada ~** a split in the party; 2. *din.* schism [ˈsɪzəm, ˈskɪzəm], dissidence;

**təfriqəçi** *i* 1. dissident, dissenter; **siyasi ~** political dissident; 2. *din.* schismatic [sɪzˈmætɪk, skɪz´-]

**təfriqəçilik**[1] *i bax* **təfriqə**

**təfriqəçilik**[2] *s* splitting, breakaway; **~ siyasəti** breakaway policy; **~ fəaliyyəti** splitting activities

**təfsilat** *i* detail; **~a varmaq** to go* into detail(s); **~ı ilə** in every detail, in detail; **əhvalatı ~ı ilə danışmaq** to detail the story

**təfsilatla** *z* in detail, thoroughly, in every detail

**təfsilatlı** *s* detailed; minute, thorough; **~ təsvir** detailed / minute description

**təfsir** *i* interpretation, commentary

**təfsirçi** *i* interpreter; commentator, *(qadın)* interpretress

**təftiş** *i* 1. inspection; 2. revision; **~ etmək** to inspect *(d.)*; to revise *(d.)*

**təftişçi** *i* revisionist; inspector

**təftişçilik**[1] *i* revisionism

**təftişçilik**[2] *s:* **~ siyasəti** the policy of revisionism

**təğyir** *i bax* **dəyişiklik**

**təhdid** *i* threat, menace; **~ etmək** to threaten *(d. with)*, to menace *(d. with)*

**təhdidamiz** *s* threatening, menacing; **~ vəziyyət** precarious situation; **~ ton** menacing tone

**təhdidamizcəsinə** *z* threateningly, menacingly

**təhdidedici** *s bax* **təhdidamiz**

**təhər** *i* 1. mode, manner; way, method; **bu ~lə** in this way; **başqa ~lə** in a different way; **Nə təhər?**; How **Heç bir ~lə** By no means; 2. possibility, opportunity; **~i olmamaq** to have* no possibility / opportunity; **~ə düşmək** to become* normal; **~ə salmaq** to put* in order *(d.)*, to arrange *(d.)*, to put* right *(d.)*, to adjust *(d.)*

**təhərli**[1] *s* proportionate, commensurate, commensurable, fitting, suitable

**təhərli**[2] *z* proportionately, fittingly

**təhərlilik** *i* suitableness, suitability, fitness

**təhərsiz** *s* 1. disproportionate, deformed, featureless, lacking in imagery; 2. ugly

**təhərsizlik** *i* 1. disproportion; 2. ugliness

**təhkim** *i* attachment; **~ etmək** to attach *(d. to)*; **geri qalan şagirdi qabaqcıla ~ etmək** to attach a backward pupil to a more advanced; **~ olunmaq** to be* attached *(to)*

**təhkimçi** *i* 1. a person attached to some work; 2. landlord advocating serfdom / serf-ownership

**təhkimçilik**[1] *i* serfdom, serfage, serf-ownership

**təhkimçilik**[2] *s:* **~ hüququ** serfdom, serfage

**təhkimli**[1] *i* serf

**təhkimli**[2] *s* serf; **~ əməyi** serf labour; **~ kəndli** serf

**təhqiq** *i* investigation, examination; *hüq.* inquest, inquiry; **~ etmək** to investigate *(d.)*, to look *(into)*, to hold* an inquiry; **~ edilmək** to be* investigated looked into

**təhqiqat** *i* 1. examination; investigation; *hüq.* trial, inquest, inquiry; **məhkəmə ~ı** court examination; **~ aparmaq** to hold* an inquiry *(into)*;to investigate *(d.)*, to look into; 2. questioning, interrogation

**təhqiqatçı** *i* investigator, inspector; interrogator

**təhqir** *i* insult; *(kobud)* outrage; humiliation; **~ etmək** to insult *(d.)*; *(kobudcasına)* to outrage *(d.)*, to humiliate *(d.)*; **~ə məruz qalmaq** to bear* insult; **~ olunmaq** to be* insulted; *(kobudcasına)* to be* outraged / humiliated; to take* offence, to feel* insulted

**təhqiramiz** *s* insulting, abusive; humiliating; **~ məktub** an abusive letter; **~ nitq** insulting speech; **~ vəziyyət** a humiliating situation

**təhqiranə** *z* abusively, with an insulting manner / way

**təhqiredici** *s bax* **təhqiramiz**

**təhqirli** *s bax* **təhqiramiz**

**təhlil** *i* analysis *(pl. -ses)*; *(qram.)* parsing; analysis; **~ etmək** 1) *qram. (nitq hissələrinə görə)* to parse *(d.)*; *(cümlə üzvlərinə görə)* to analyse *(d.)*; 2) to look *(into)*, to investigate *(d.)*, to examine *(d.)*

**təhlili** *s* analytic(al); **~ həndəsə** analytic geometry

**təhlükə** *i* 1. danger; jeopardy; **~də** in danger, in jeopardy; **papiros çəkməyin ~si** the danger of smoking; **~də olmaq** to be* in danger / in jeopardy; **~dən uzaq olmaq** to be* out of danger; 2. threat, menace; **müharibə ~si** the threat of war, menace of war; **~ altında olmaq** to be* under the threat; **~ altına almaq** to threaten *(d.)*, to jeopardize *(d.)*

**təhlükəli**[1] *s* dangerous, risky, riskful, perilous; **~ adam** a dangerous person; **~ yer** a dangerous place; **~ xəstəlik** a dangerous illness; **~ iş** a risky job; **~ yoxuş** perilous ascent; **~ oyun** risky game

**təhlükəli**[2] *z* dangerously, riskily, perilously; **~ sürmək** *(maşını)* to drive* dangerously

**təhlükəlilik** *i* riskiness, perilousness

**təhlükəsiz**[1] *s* out of danger, not dangerous; safe, safety; **~ yer** safe place; **~ ülgüc** safety razor

**təhlükəsiz**[2] *z* safely; **~ gəlmək** to come* safely

**təhlükəsizləşdirilmək** *f* to be* made safe

**təhlükəsizləşdirmək** *f* to make* safe

**təhlükəsizləşmək** *f* to become* safe

**təhlükəsizlik**[1] *i* safety; *(ictimai)* security; **~də** in safety, out of danger; **dövlət təhlükəsizliyi** State security; **şəxsi ~** personal security

**təhlükəsizlik**[2] *s* security; safety; **~ orqanları** security services; **~ tədbirləri** security measures; **~ sistemi** security system, system of collective security; **~ texnikası** industrial safety measures / provisions; **Dövlət ~ Komitəsi** State Security Committee; **~ kəməri** safety belt, seat belt; **~ Şurası** Security Council

**təhrif** *i* distortion, perversion; misrepresentation; **~ etmək** to pervert *(d.)*, to distort *(d.)*, to misrepresent *(d.)*, to misinterpret *(d.)*; **həqiqəti ~ etmək** to distort the truth; **bir kəsin sözünü ~ etmək** to pervert / to distort smb.'s word; **faktı ~ etmək** to pervert / to misrepresent the fact; **~ olunmaq** to be* / to get* distorted



**təhrifçi** *i one who distorts / misrepresents*

**təhrifçilik** *i the act of distorting / misrepresenting*

**təhrifedici** *s* distorting, perverting

**təhrifedilmiş** distorted, perverted; misrepresented

**təhrik** *i* instigation, incitement, setting-on; inspiration; **~ etmək** to incite *(d.to)*, to instigate *(d.to)*, to set* on *(d.)*; **bir kəsi cinayətə ~etmək** to instigate *smb.* to a crime, to incite *smb.* to crime

**təhrikçi** *i* instigator; *d.d.* fire-brand

**təhrikedici** *s* instigating, inciting, encouraging

**təhriri** *s* written; **~ formada** in written form, in writing

**təhsil**[1] *i* education; **ibtidai ~** primary / elementary education; **orta ~** secondary education; **ali ~** higher education, university education; **ümumi icbari orta ~** universal compulsory secondary education; **~ vermək** to educate *(d.)*, to give* an education *(d.)*; **~ almaq** 1) to be* educated; 2) *bax* **oxumaq** *(3-cü mənada)*

**təhsil**[2] *s* educational; education; **~ müəssisəsi** educational establishment / institution; **~ hüququ** right to education; **~ mərkəzi** education center

**təhsilli** *s* educated; **~ adam** educated person, person / man* of education

**təhsillilik** *i the state of being educated;* erudition

**təhsilsiz** *s* uneducated, unlearned; ignorant

**təhsilsizlik** *i* lack of education; ignorance

**təhvil** *i* 1. *(şəhəri və s.)* surrender; 2. handing *(to)*, delivery *(of to)*; **~ almaq** to take* over *(d. from)*; **bir kəsdən işi ~ almaq** to take* over *smb.*'s duties, to take* over duties from *smb.*; **~ vermək** to turn over; *(şəhəri, qalanı və s.)* to surrender *(d.)*, to leave* *(d. in)*, to return *(d.)*; **işi ~ vermək** to turn over *one's* duties

**təxəllüs** *i* pseudonym; **ədəbi ~** pen-name; *(aktyor)* stage-name

**təxəyyül** *i* imagination

**təxir** *i* postponement, delay; **~ə salmaq** to defer *(d.)*, to postpone *(d.)*; to put* off *(d.)*; to cancel *(d.)*; to adjourn [əˈdʒəːn] *(d.)*, to delay *(d.)*, to put* / to set* aside *(d.)*, to lay* aside *(d.)*; **borcu ödəməyi ~ə salmaq** to defer payment of debts; **danışığı ~ə salmaq** to adjourn the talks; **~ə düşmək** to be* postponed / delayed

**təxirəsalınmaz** *s* pressing, urgent; **~ iş** urgent matter; **~ kömək** first aid

**təxirəsalınmazlıq** *i* urgency

**təxirsiz** *z* urgently, immediately

**təxmin** *i* supposition, conjecture, surmise; guess-work; **~ etmək** to guess *(d.)*, to surmise *(d.)*, to conjecture *(d.)*

**təxminən** *z* approximately, nearly, roughly

**təxmini**[1] *s* approximate, hypothetical, conjectural, presumable

**təxmini**[2] *z* approximately, presumably, hypothetically

**təxminilik** *i* approximateness

**təxribat** *i* diversion [daɪ-]; sabotage [-taːʒ], subversive activity

**təxribatçı** *i* saboteur [-təː], wrecker

**təxribatçılıq** *i* subversiveness, the act of sabotage; **~ etmək** to commit sabotage

**təxsisat** *i* loan, advance-money

**tək**[1] *s* 1. odd **~ rəqəmlər** odd numbers; *1.3.5.7. və s. tək rəqəmlərdir 1.3.5.7 etc., are odd numbers;* **həftənin ~ günləri** odd days of the week; 2. lonely, lone, solitary, desolate **~ həyat** a lonely life; **~ atlı** a solitary / lone horseman*; **~ ağac** a solitary / lone tree; **~ məzar** a solitary / lone grave; **~ dağ kəndi** a lonely mountain village; 3. *(ailəsiz)* single, unmarried; **~ kişi** *(arvadsız)* a single / unmarried man*; **~ arvad** *(ərsiz)* single / unmarried woman*; **~ analar** single / unmarried mothers; 4. *(bircə)* only; **~ uşaq / ağac / kitab və s.** an only child / tree / book, etc.

**tək**[2] *z* 1. alone, only, solitarily; **~ yaşamaq / işləmək / oturmaq** to live / to work / to sit alone; **~ buraxmaq** to leave / to let alone; *O tək yaşayır He / She lives alone; Tək çörəklə yaşamaq olmaz You can't live on bread alone / only* ; 2. as, like; **bül-bül ~ oxumaq** to sing* like a nightingale; *Onlar bir adam tək ayağa qalxdılar They rose together as / like one man**

**tək**[3] *bağ* as soon as; scarcely... when, hardly...when, no sooner... than; *Müəllim gələn tək dərs başladı The lesson began as soon as the teacher came; Mən vağzala çatan tək qatar gəldi Hardly had I reached the station, when the train arrived; Yağış kəsən tək biz yola düşdük Scarcely had the rain stopped, when we started; Biz otağa girən tək telefon zəng çaldı No sooner had we entered the room, than the telephone rang*

**tək**[4] *qoş* **uşaq / arvad ~** as / like a child */ a woman*

**təkallahlı** *s fəls.* monotheistic

**təkallahlıq** *i* monotheism

**təkaltı** *i* sweat-cloth

**təkamül**[1] *i* evolution [iːvə-]

**təkamül**[2] *s* evolutional, evolutionary; **~ nəzəriyyəsi** theory of evolution, doctrine of development; **~ etmək** to evolve

**təkamülçü** *i* evolutionist

**təkamülçülük** *i* evolutionism

**təkan** *i* push; *(qatar)* jolt, bump, jerk; *(zəlzələdə)* shock, (earth) tremour; *məc.* incitement, stimulus *(pl.-li)*; **~ vermək** to give* a push *(d.)*, *məc.* to stimulate *(d.)*, to grant *(d.)*; **zəif ~** a slight push

**təkatlı** *s* one-horse

**təkavarlı** *s* one-oared

**təkayaqlı** *s* one-legged

**təkbarmaq** *i (əlçək)* mitten

**təkbaşına** *z* independently, without assistance, on *one's* own; **~ işləmək** to work without assistance, to work on *one's* own

**təkbətək** *z (mübarizədə)* face to face *(with)*; *(söhbətdə)* privately, in private; **~ mübarizə aparmaq** to fight* face to face

**təkbir** *z* sometimes; seldom, at times, from time to time; now and then

**təkcə**[1] *s* only, sole

**təkcə**[2] *z* only; solely, merely, just; *O təkcə bilmək istəyir He / She only / merely / just wants to know*

**təkcə-təkcə** *z bax* **tək-tək**

**təkcinsli** *s bot.* unisexual

**təkcinslilik** *i bot. the state of being unisexual*

**təkdəbir** *s bax* **təkbir**

**təkdənbir** *z bax* **təkbir**
**təkdırnaqlı** *s zool.* solidungulate, solid-hoofed, soliped
**təkə** *i* he-goat, billy goat *(older than two years)*
**təkəbbür** *i* haughtiness, loftiness, arrogance, superciliousness; ~ satmaq *bax* **təkəbbürlənmək**
**təkəbbürlə** *z* haughtily, superciliously
**təkəbbürlənmək** *f* to swagger, to boast
**təkəbbürlü**[1] *s* haughty, arrogant, lofty, supercilious; overweening; *d.d.* high and mighty; ~ təbəssüm a lofty smile
**təkəbbürlü**[2] *z bax* **təkəbbürlə**
**təkəlli**[1] *i* a large basin *(made of copper)*
**təkəlli**[2] *z* with one hand only, with the help of one hand
**təkəmseyrək** *z* here and there, sometimes, from time to time, very seldom
**təkər** *i* wheel; ehtiyat ~ spare wheel; yağlanmış ~ oiled wheel ◊ taleyin ~i Fortune's wheel, wheel of fortune
**təkərcik** *i bax* **təkərək**
**təkərçi** *i* wheel-wright
**təkərçilik** *i profession / job of a wheel-wright*
**təkərək** *i* little wheel
**təkərli** *s* wheeled
**təkərsiz** *s (i.s.)* without a wheel, wheelless
**təkərvarı** *s* wheel-shaped, wheellike
**təkəsaqqal** *s (i.s.)* with / having long and thin beard *(as of a billy-goat's)*
**təkəsaqqallı** *s bax* **təkəsaqqal**
**təkətək** *z bax* **təkbətək**
**təkgöz** *s* one-eyed, single-eyed; *elm.* monocular
**təkgözlü** *s bax* **təkgöz**
**təkhakimiyyətli** *s* autocratic
**təkhakimiyyətlilik** *i* autocracy, absolute rule
**təkhecalı** *s* monosyllabic; ~ sözlər monosyllabic words
**təkhecalılıq** *i the quality of being monosyllabic*
**təkhədli** *s riyaz.* simple
**təkhədlilik** *i riyaz. the quality of being simple*
**təkhüceyrəli** *s biol.* unicellular, single cell
**təkhüceyrəlilik** *i the quality of being single-cell*
**təki** *əd* 1. *bax* **kimi**; 2. if only; *Təki o burada olaydı If only he were here*
**təkid** *i* insistence; persistence; onun ~i ilə at his urgent request; ~ etmək to insist *(on, upon + ger)*; to persist *(in + ger.)*; öz dediyində ~ etmək to get* *one's* way
**təkidlə** *z* insistently, persistently, urgently
**təkidli** *s* persistent, insistent; ~ cəhdlər persistent attempts; ~ məktub an insistent message / letter
**təkidlilik** *i* insistence, persistence
**təkin** *əd d.d. bax* **təki**
**təkqanad** *s* one-winged
**təkqanadlı** *s bax* **təkqanad**
**təkqat** *s* one folded
**təkqatlı** *s bax* **təkqat**
**təkqol** *s* one-armed
**təkqollu** *s bax* **təkqol**
**təkqulp** *i* one-handle
**təkqulplu** *s (i.s.)* with one handle
**təkləmək** *f* to isolate *(d.)*

**təklənmək** *f* to be* isolated, to get* / to become* isolated
**təkləşdirmək** *f bax* **təkləmək**
**təkləşmək** *f* to get* / to become* isolated
**təklətmək** *f* to cause *s.o.* to isolate *(d.)*
**təklif** *i* 1. offer, suggestion; *(evlənmək haq.)* proposal; ~ etmək to make* an offer; *(evlənmək üçün)* to propose *(to)*; ~i qəbul etmək to accept an offer; *(evlənmək barədə)* to accept a proposal; sülhsevər ~ peaceful proposal; 2. *(iclasda)* proposal; motion; ~ irəli sürmək to propose / to move a motion; ~i müzakirə etmək to discuss a proposal; ~i rədd etmək to reject / to turn down a proposal; ~ə tərəfdar çıxmaq to support the motion; tələb və ~ demand and supply; *Tələb təklifdən artıqdır Demand exceeds supply*
**təklifsiz** *s* unceremonious, (too) familiar
**təklifsizcə** *z* unceremoniously; impudently
**təklik** *i* 1. loneliness, seclusion; 2. one, unity; 3. one-manat note; 4. solitude, retirement; ~də qalmaq to find* *oneself* isolated / in isolation
**təklikdə** *z* alone, solitarily; ~ yaşamaq to live in solitarily / alone, to live in solitariness; ~ oturmaq to sit alone; tamamı ilə ~ all / quite alone; ~ qalmaq to be* alone, to be* left alone, to find* *oneself* in isolation
**təklülə** *s* single-barrelled; ~ silah single-barrelled gun
**təklüləli** *s bax* **təklülə**
**təkmənalı** *s bax* **birmənalı**
**təkmənalıq** *i bax* **birmənalıq**
**təkmil** *i* 1. completion; 2. perfection; 3. all, the whole of; ~ etmək to complete *(d.)*; to conclude *(d. with)*, to finish *(d.)*, to improve *(d.)*
**təkmilləşdirilmək** *f* to become* / to get* perfected; to cause to become / to get improved
**təkmilləşdirmə** *fi* perfection; additional training; ixtisası ~ kursu course for improving *one's* qualification, extension course
**təkmilləşdirmək** *f* to perfect *(d.)*, to improve *(d.)*; öz biliyini ~ to improve *one's* knowledge; modeli ~ to perfect the model
**təkmilləşmək** *f* to improve oneself, to be* / to become* improved
**təknə** *i* trough [trɔf]
**təknəcik** *i* little / small trough
**təknəçi** *i* trough-maker
**təknəvarı** *s* trough-shaped, troughlike
**təkrar**[1] *i* repetition; *(çox dəfə)* reiteration; ~ etmək to repeat *(d.)*; *(çox dəfə)* to reiterate *(d.)*; sözü ~ etmək to repeat the word; səhvi ~ etmək to repeat the mistake / error; *"Çıxın gedin! Çıxın gedin!" deyə o təkrar etdi "Go away!" "Go away!" he / she reiterated*
**təkrar**[2] *z* repeatedly, more than once, again and again
**təkraredilməz** *s* unique; inimitable; ~ gözəllik unique beauty
**təkrarən** *z* repeatedly; again and again; ~ demək to say* repeatedly / again and again
**təkrarlama** *fi* repetition; reiteration



**təkrarlamaq** *f* to repeat *(d.)*; to reiterate *(d.)*; dərsi ~ to repeat the lesson
**təkrarlanmaq** *f* to be* repeated; *(çox dəfə)* to be* reiterated
**təkrarlatdırmaq** *i bax* **təkrarlatmaq**
**təkrarlatmaq** *f* to cause *smb.* to repeat *(d.)*; to cause *smb.* to reiterate *(d.)*
**təkrarolunmaz** *s bax* **təkraredilməz**
**təkrar-təkrar** *z bax* **təkrar**[2]
**təksəsli** *s* one-voiced
**tək-tək** *z* 1. one by one; 2. *bax* **gec-tez**
**tək-təkinə** *z bax* **təkcə**[2]
**tək-tənha** *z bax* **yalqız**[2]
**təktərkibli** *s qram.* one-member; ~ cümlə a one-member sentence
**təktəsərrüfatçı** *i* individual peasant
**tək-tük** *z bax* **təkbir**
**təkzib** *i* refutation, disproof, denial; bəyanatın ~i refutation of a statement; ~ etmək to refute *(d.)*, to disprove [-u:v] *(d.)*
**təkzibedilməz** *s* irrefutable; undeniable, indisputable, incontestable; ~ sübut incontrovertible evidence; ~ arqument an irrefutable argument; ~ sübut irrefutable proof
**təkzibedilməzlik** *i the state or quality of being irrefutable / incontestable*
**təkzibolunmaz** *s bax* **təkzibedilməz**
**təkzibolunmazlıq** *i bax* **təkzibedilməzlik**
**təqaüd**[1] *i* 1. grant; *(adlı təqaüd)* scholarship; *(aspirantlar üçün təqaüd)* research grant; ~ almaq to get* a grant; ~ vermək to give* a grant; 2. pension; qocalığa görə ~ old age pension; şikəstliyə görə ~ disability pension; ~də olmaq to be* on a pension; ~ təyin etmək to grant a pension; ~ə çıxmaq to retire on a pension, to be* pensioned off
**təqaüd**[2] *s* pension; pensionable; ~ kitabı pension-book; ~ yaşı pension age, pensionable age
**təqaüdçü** *i* 1. pensioner; 2. *(tələbə)* grant-aided student; grant-holder
**təqdim** *i* assignment, allotment; placing at *smb.'s* disposal; ~ etmək to present *(d. i; with d.)*; *(tanış etmək)* to introduce *(d. to)*; *İcazə verin özümü təqdim edim Allow me to introduce myself*
**təqdimat** *i* presentation; representation
**təqdir** *i* estimation; appraisal; appreciation; ~ etmək to estimate *(d.)*, to appraise *(d.)*; to approve *(d.)*
**təqdirəlayiq** *s* estimable; *(i.s.)* worth of esteem; ~ davranış an estimable behaviour
**təqdis** *i* 1. respect, honouring, esteem; 2. worship, reverence; ~ etmək 1) to honour *(d.)*, to respect *(d.)*, to esteem *(d.)*; 2) *(müqəddəs kimi)* to revere *(d.)*, to sanctify *(d.)*
**təqib** *i* 1. pursuit; chase; 2. *(sıxışdırma)* persecution, victimization; 3. *hüq.* prosecution; ~ etmək 1. *(arxasınca qaçmaq)* to pursue *(d.)*, to chase *(d.)*, to be* after; *məc.* to haunt *(d.)*; *Bu fikir məni təqib edir This thought haunts me;* 2. *(sıxışdırmaq)* to persecute *(d.)*; to victimize *(d.)*; 3. *(məhkəmə yolu ilə)* to prosecute *(d.)*

**təqibçi** *i* persecutor
**təqlid** *i* imitation; ~ etmək to imitate *(d.)*
**təqlidçi** *i* imitator
**təqlidçilik** *i the act of imitation*
**təqribən** *z* approximately; roughly
**təqribi** *s* approximate; rough; ~ rəqəm approximate figure; ~ miqdar / say approximate number
**təqsim** *i bax* **bölmə**
**təqsir** *i* fault, guilt; bir kəsin ~i üzündən / ucundan through *smb.'s* fault; ~ini boynuna almaq / götürmək to admit / acknowledge *one's* guilt; *hüq.* to plead guilty; ~ini boynuna almamaq to deny *one's* guilt; *hüq.* to plead not guilty; ~i öz üzərinə götürmək to take* the blame upon *oneself*; *Bu sizin təqsirinizdir It is your fault*
**təqsirkar** *i* the accused; culprit; *hüq.* defendant, bir kəsin qarşısında ~ olmaq to be* guilty towards *smb.*; *Mən təqsirkar deyiləm It is not my fault, I am not guilty; Heç kim təqsirkar deyil It's nobody's fault, No one is to blame; Onun təqsiri nədir? What is his fault?* ◊ təntənənin ~ı hero of the festivities, hero of the day
**təqsirkarlıq** *i* guiltiness, culpability
**təqsirləndirən** *i* accuser; *hüq.* prosecutor
**təqsirləndirilmək** *f* to be* accused *(of)*, to be* charged *(with)*; *hüq.* to be* prosecuted *(for)*
**təqsirləndirmək** *f* 1. to accuse *(d. of)*, to blame *(d.)*, to charge *(d. with)*, to blame *(d. for)*; 2. *hüq.* to prosecute *(d.)*, to indict [in'dait] *(d.)*
**təqsirlənmək** *f* 1. to be* blamed / accused / charged; 2. *hüq.* to be* prosecuted / indicted
**təqsirli** *i bax* **təqsirkar**
**təqsirlilik** *i bax* **təqsirkarlıq**
**təqsirnamə** *i* verdict of "guilty", *(bill of)* indictment; accusatory documents
**təqsirsiz**[1] *s* innocent, guiltless, blameless
**təqsirsiz**[2] *z* innocently, guiltlessly, blamelessly
**təqsirsizlik** *i* innocence, guiltlessness, blamelessness
**təqvim**[1] *i* calendar; hadisələrin ~i calendar of events
**təqvim**[2] *s* calendar; ~ planı calendar plan; ~ ayı calendar month
**təlaş** *i* agitation, anxiety, alarm; emotion; fuss, confusion; ~ keçirmək to be* agitated, to be* in agitation; to be* disturbed / worried / alarmed; to get* excited
**təlaşla** *z* anxiously, worriedly, emotionally, with alarm
**təlaşlı** *s* perturbed, anxious, agitated; ~ görkəm troubled / perturbed look
**təlaşlılıq** *i the state of being anxious / worried / agitated*
**təlaşsız** *s* cool, imperturbable, unruffled, calm, not agitated
**təlaşsızlıq** *i the state of being cool / imperturbable / unruffled*
**təlatüm** *i* 1. alarm; emotion; *(dənizdə)* choppiness; roughness; *Dənizdə təlatüm var The sea is rough / choppy;* 2. *məc.* commotion, perturbation; ~ə gətirmək to perturb *(d.)*, to cause to worry greatly
**təlatümlü** *s* 1. choppy, rough; *Dəniz təlatümlüdür The sea is choppy / agitated;* 2. *bax* **həyəcanlı**[1]
**tələ** *i* trap; pitfall; snare; siçan ~si mouse-trap; bir kəsə ~ qurmaq to set* *smb.* a trap; ~yə düşmək to

fall* into a trap, to be* trapped, to be* caught in a trap; bir kəsi ~yə salmaq to trap *smb.*

**tələb** *i* demand [-ma:nd]; request; claim; requirement; bir kəsin ~i üzrə at *smb.'s* request, by *smb.'s* order; qəti ~ urgent request; məhkəmənin ~i əsasında by order of the court; bir kəsin ~ini yerinə yetirmək to satisfy *smb.'s* demand, to meet* *smb.'s* demand; ~ irəli sürmək to make* demands, to put* in claims; ~dən əl çəkmək to give* up *one's* claim, to abandon / surrender *one's* claim; bir kəsin ~i ilə razılaşmaq to agree with *smb.'s* demands; ~ ə cavab vermək to meet* the requirements; bir kəsin qarşısına ~ qoymaq to make* demands of *smb.*; zamanın ~ləri demands of the time

**tələbat** *i* want, necessity, need; requirement; təbii ~ physical necessity; həyati ~lar vital requirements; artan ~ rising requirement; xalqın maddi və mənəvi ~ları material and cultural needs of the people; bir kəsin ~ını ödəmək to meet* *smb.'s* need

**tələbə**[1] *i* student; tibb institutunun ~si medical student; hüquq fakültəsinin ~si law student; tarix fakültəsinin ~si history student; tələbələr *top. i* the students

**tələbə**[2] *s* student, student's; ~ yataqxanası student's hostel; *amer.* dormitory; ~ kollektivi student body

**tələbəlik**[1] *i* studentship

**tələbəlik**[2] *s* ~ illəri *one's* student years, *one's* time at the university; mənim ~ illərimdə in my college days

**tələbkar**[1] *i* pretender *(to)*, claimant *(to)*

**tələbkar**[2] *s* 1. exacting, exigent; O, tələbkardır *He / She is exigent* 2. strict, stern; ~ müəllim stern / strict teacher; ~ olmaq to be* strict / stern

**tələbkarlıq** *i* exactingness, insistence; demand, exigency, exigence

**tələbnamə** *i* requisition; order

**tələf** *i*: ~ olmaq to perish; to be* killed; to be* lost; vuruşmada ~ olmaq to fall* in battle, to be* killed in battle; ~ etmək to ruin *(d.)*, to destroy *(d.)*; to spoil *(d.)*; to kill *(d.)*

**tələfat** *i* losses; waste; məhsul ~ı *(yığım vaxtı)* harvesting losses; harvesting waste; ~ı azaltmaq to cut* out waste; insan qüvvəsinin ~ı losses in manpower; ciddi / böyük ~ serious losses; böyük ~a məruz qalmaq to suffer great losses

**tələffüz** *i* pronunciation; articulation; ~ etmək to pronounce *(d.)*, to articulate *(d.)*

**tələfxərc** *i* squanderer, spendthrift; ~ olmaq to be* a squanderer / spendthrift

**tələfxərclik** *i the quality of being a squanderer / a spendthrift;* ~ etmək to squander

**tələquran**[1] *i d.d* pettifogger

**tələquran**[2] *s* pettifogging; ~ vəkil pettifogging lawyer

**tələm-tələsik** *z bax* **tələsik**[2]

**tələsdirilmək** *f* to cause / to force *smb.* to hurry / to be in a hurry

**tələsdirmək** *f* to hurry *(d.)*, to press *(d. for)*, to hasten *(d.)*; bir kəsi ~ to hurry *smb.* *(+ inf.)*; cavab almaq üçün bir kəsi ~ to press *smb.* for a reply; *Məni tələsdirməyin Don't hurry me!*

**tələsən** *s* hasty, hurried, in a hurry; ~ adam a man* *(who is always)* in a hurry; *Tələsən təndirə düşər at. söz.* ≅ *Hasty climbers have sudden falls*

**tələsə-tələsə** *z bax* **tələsik**[2]

**tələsik**[1] *s* hasty, hurried; ~ qərar hasty decision; ~ iş hurried work

**tələsik**[2] *z* hastily, hurriedly; in haste, in a hurry, in *one's* hurry

**tələsiklik** *i* hastiness, hurry, haste, quick activity

**tələsmədən** *z* slowly, without haste / hurry

**tələsmək** *f* to hurry, to be* in a hurry, to hasten [heɪsn]; to make* haste; işə ~ to hurry to work; qatara ~ to hurry to catch a train; *Siz tələsməlisiniz You must hurry. You must make haste; Tələsin! Make haste! Hurry up! Get a move on! Tələsməyin! Don't hurry! Take your time! Siz hara tələsirsiniz? Where are you hurrying to?*

**təlx** *i*: ovqatı ~ olmaq to feel* upset *(over)*, to be* put out *(over)*; to be* disappointed *(at)*; to be* in low / bad spirits, to be* low-spirited

**təlxək** *i* fool, jester; clown, buffoon

**təlxəklik** *i* foolery, jest; buffoonery, clownishness; ~ etmək to jest with; to joke; to play the fool / the buffoon; *Təlxəklik etmə! Don't play the fool / the buffoon!*

**təliqə** *i* (official) letter, memorandum *(pl.-da)*; ~ göndərmək to send* a memorandum

**təlim** *i* 1. training; instruction; education; savad ~i instruction in reading and writing; birgə ~ co-education; fərdi ~ individual training; istehsalat ~i industrial training; ~ etmək / vermək to teach* *(d.)*, to instruct *(d.)*; to train *(d.in)*; 2. *(nəzəriyyə)* teaching, doctrine

**təlimat** *i* directions pl., instructions pl.; ~a əsasən in accordance with instructions

**təlimatçı** *i* instructor; ~ olmaq to be* an instructor

**təlimatçılıq** *i the job of an instructor*

**təlimatlandırılmaq** *f* to be* instructed; to be* given instructions

**təlimatlandırmaq** *f* to instruct *(d.)*, to give* instructions *(d.)*

**təlimçi** *i bax* **təlimatçı**

**təlimləndirmək** *f* to instruct *(d.)*, to give* instructions *(d.)*

**təlimli** *s* instructed

**təlim-tərbiyə** *i* instructive and educational; ~ işi instructive and educational work

**təlqin** *i* 1. suggestion; 2. *(hipnoz)* hypnosis [hɪp'-]; ~lə müalicə etmək to treat by suggestion / hypnotism *(d.)*; ~ etmək to suggest *(d. i.)*, to inspire *(with d.)*; to fill *(with d)*; fikir ~ etmək 1) to suggest a thought; 2) to bring* home *(d. to)*, to impress *(d. on)*

**təlqinedici** *s* imposing; impressive, hypnotic; striking, inspiring

**təltif** *i* rewarding; *(ordenlə)* decorating; ~ etmək to reward *(d.with)*, to award *(d.to)*, to confer *(d.on)*, to confer a decoration *(upon)* bir kəsi ordenlə ~ etmək to confer an order on *smb.*

**təmas** *i* 1. touch, contact; ~ nöqtəsi point of contact; 2. intercourse; ~da olmaq to associate *(with)*;to contact *(d.)*; *d.d.* to rub shoulders *(with)*

**təmayül** *i* 1. tendency *(to, towards)*; *(mənfi mənada)* obtrusive purpose; əsas ~ basic tendency; 2. inclination *(baş xətdən kənara çıxma)* rake; 3. bias; deviation; sağa / sola ~ right-wing / left-wing deviation; elmi ~ scientific bias



**təmayülçü** *i* one who always tends *(to)*

**təmayülçülük** *i* tendentiousness

**təmayüllü**[1] *s* tendentious; bias(s)ed; texniki ~ məktəb school with a technical bias

**təmayüllü**[2] *z* tendentiously

**təməl** *i* 1. foundation; basis; base; bir şeyə ~ olmaq to be* the basis *smth.*; ~ qoymaq to lay* down the foundations; 2. principles; fundamentals *pl.*; Leninizmin ~i the principles / foundations of Leninism

**təməlsiz** *s* baseless; *(i.s.)* without foundations / principles

**təmənna** *i* request *(for)*, wish *(for)*, desire *(for)*; ~sı olmaq to wish *(d.)*, to desire *(d.)*, to want *(d.)*; *Sizin təmənnanız nədir? What do you want? What do you wish to have?*

**təmənnalı** *s* mercenary; ~ məqsədlə for mercenary motives; ~ evlənmə mercenary marriage

**təmənnasız**[1] *s* disinterested; ~ kömək disinterested help / aid

**təmənnasız**[2] *z* disinterestedly

**təmənnasızlıq** *i* disinterestedness

**təmərküz** *i* concentration; istehsalın ~ ü concentration of production

**təmərküzləşdirilmək** *f* to be* concentrated

**təmərküzləşdirmək** *f* to concentrate *(d.)*

**təmərküzləşmə** *fi* concentration; kapitalın ~si concentration of capital; sənayenin ~si concentration of industry

**təmərküzləşmək** *f* to become* / to get* concentrated

**təmin** *i* guarantee, guaranty; security; ~ etmək to secure *(d.)*, to ensure *(d.)*; bütün dünyada sülhü ~ etmək to ensure world peace; müvəffəqiyyəti ~ etmək to ensure the way for success; yol hərəkətinin təhlükəsizlini ~ etmək to ensure road safety; iqtisadiyyatın gələcək yüksəlişini ~ etmək to ensure further economic progress; bir kəsin azadlığını ~ etmək to secure the liberty of *smb.*; 2. *(maddi cəhətdən)* to provide *(d. with)*; bir kəsi pulla ~ etmək to provide smb. with money; 3. provide *(for)*; ailəni ~etmək to provide for a family; ~ olunmaq to be* provided *(with)*; *Mən lazım olan hər şeylə təmin olunmuşam I am provided with everything I need*

**təminat** *i* 1. guarantee, guaranty; 2. maintenance, security; ictimai ~ social maintenance; ~ vermək to vouch for, to guarantee *(d.)*; to answer *(for)*; *Mən buna həyatımla təminat verirəm I'll vouch / answer for it with my life*

**təminatlı** *s* guaranteed; ~ əmək haqqı guaranteed wages; ~ sülh guaranteed peace

**təminatlılıq** *i the state of being guaranteed*

**təminatsız** *s* *(i.s.)* without guarantee

**təminatsızlıq** *i the state of being without guarantee*

**təmir**[1] *i* repair(s); *amer.* maintenance; əsaslı ~ thorough / capital repairs *pl.*; cari ~ ordinary / routine / current repairs *pl.*; profilaktik ~ preventive maintenance; ~də olmaq to be* under repair; ~ə ehtiyacı olmaq to be* in need / want of repair; ~ etmək to repair *(d.)*; sınmış saatı ~ etmək to repair a broken watch; yol ~ etmək to repair a road; to maintain *(d.)*; ev / maşın və s. ~ etmək to maintain a house / a car, etc.; *(evi rəngləmək və s.)* to decorate *(d.)*

**təmir**[2] *s* repair; ~ emalatxanası repair shop

**təmirçi** *i* repairer, repairman*

**təmirçilik** *i the job of a repairman**

**təmirxana** *i* repair shop

**təmiz**[1] *s* 1. clean; ~ səma clean sky; ~ əl clean hand; ~ səhifə clean / fresh page; ~ boyunluq clean collar; ~ yol clean road; ~ şərab clean wine; ~ qələbə clean victory; 2. *(qarışdırılmamış)* pure, neat; ~ otaq a neat room; ~ qızıl pure gold; ~ gümüş pure silver; ~ yun *(qarışıqsız)* pure wool; ~ su pure water; ~ hava pure / clear air; ~ spirt pure alcohol; *d.d.* neat spirits *pl.*; *Pişiklər təmiz heyvandır Cats are neat animals* 3. *(səs, tələffüz)* clear; 4. *(çəki, gəlir, qazanc)* net, clear; ~ çəki net weight; ~ gəlir / qazanc net profit; *d.d.* clear profit; 5. *(adam)* high-minded, honest; ~ söhbət honest talk

**təmiz**[2] *z* clear, clearly; neat, neatly; ~ danışmaq to speak* clear / clearly; ~ adam honest man*; ~ qırxılmış clean-shaved; ~ yuyulmuş clean-washed; *O, mənzilini təmiz saxlayır He / She keeps his / her flat neat*

**təmizcə** *z* quite / completely clean / neat

**təmizkar** *s* neat, tidy; cleanly; ~ adam a cleanly man*

**təmizkarca** *z bax* **təmizkarcasına**

**təmizkarcasına** *z* neatly, tidily, cleanly

**təmizkarlıq** *i* tidiness, cleanliness, neatness

**təmizqanlı** *s* pure-blooded, purebred, thoroughbred; ~ at a thoroughbred horse

**təmizqanlılıq** *i the quality of being pure-blooded / thoroughbred*

**təmizqəlbli** *s* open-hearted, sincere, frank, candid; ~ dost a sincere frank / friend

**təmizqəlblilik** *i* open-heartedness, frankness, sincerity

**təmizləmə** *fi* cleaning; kimyəvi ~ dry cleaning

**təmizləmək** *f* 1. to clean *(d.)*; to clean off *(d.)*; to clear *(d.)*; to clear off *(d.)*; dırnaqlarını ~ to clean *one's* nails; yolu qardan ~ to clear the road from the snow; stolu ~ *(yığışdırmaq)* to clear off the table; 2. *(qazıyıb təmizləmək: qazanı və s.)* to scour *(d.)*; to scour out *(d.)*; qazanı ~ to scour out a pan; 3. *(şotka ilə)* to brush *(d.)*, to brush off *(d.)*; paltarı ~ *(şotka ilə)* to brush clothes; dişini *(özünün)* ~ to brush / to clean one's teeth; 4. *(meyvə və tərəvəzi)* to skin *(d.)*, to peel *(d.)*; *(qozu və s.)* to shell *(d.)*; kartof ~ to peel potatoes; pomidor ~ to skin tomatoes; 5. *tex. kim.* to refine *(d.)*, to purify *(d.)*; spirti ~ to refine / to purify spirit(s); nefti ~ to refine oil; 6. *(mədəni, bağırsağı)* to evacuate *(d.)*, to purge *(d.)*; mədəni ~ to evacuate / to purge the stomach; bağırsaqları ~ to evacuate / to open the bowels

**təmizlənmək** *f* 1. to be* cleaned / cleared; 2. *tex. kim.* to be* refined; 3. *(qabıqdan)* to be* peeled / skinned; 4. *(paltar; şotka ilə)* to be* brushed; 5. *(mədə və s.)* to be* evacuated / purged; 6. *(qazınmaqla)* to be* scoured

**təmizlətdirmək** *f bax* **təmizlətmək**

**təmizlətmək** *f* 1. to ask / to cause *smb.* to clean *(d.)* to clear *(d.)*; to have* *(d.)* cleaned / cleared; 2. *(paltarı və s. şotka ilə)* to ask / to cause *smb.* to brush *(d.)*; to have* *(d.)* brushed *(d.)*; 3. *(mədəni və s.)* to ask / to cause *smb.* to evacuate *(d.)*; to have* *(d.)* evacuated

**uyuşqanlıq** *i* 1. viscidity, viscosity; miriness, ooziness; 2. *tex.* toughness, tenacity

**uyuşma** *fi* combination; rənglərin ~ sı colour combination

**uyuşmaq** *f* I to combine, to go* *(with)*, to match, to suit; to harmonize *(with)*, to be* combined; *tex.* to be* matched, to conform *(to)*

**uyuşmaq** *f* II *(keyimək)* to numb; soyuqdan ~ to numb with cold

**uyuşmaz** *s* incompatible, irreconcilable

**uyuşmazlıq** *i* incompatibility, irreconcilability

**uyuşmuş** *s* numbed; soyuqdan ~ barmaqlar fingers numbed with cold

**uyuşuq** *s* *(soyuq və s.)* numb, benumbed *(with cold)*

**uyutmaq** *f* to send* *(d.)* to bed, to let* *(d.)* sleep

**uyğun**[1] *s* 1. *(ölçü)* fitting; *(xüsusən rənginə və xarici görünüşünə görə)* matching, matchable; agreeable; suitable, proper, appropriate; harmonious; ~ söz a proper word; ~ alət a proper tool; 2. harmonic; ~ an a right moment; ~ işçi, iş üçün ~ adam person suitable for the work, the right man* for the job; ~ gəlmək / olmaq 1) to do* *(for)*; *(ölçüyə görə)* to fit *(d.)*; *(yaraşmaq)* to suit *(d.)*, to become* *(d.)*, to match up; *(həmahəng olmaq)* to be* a good match; to go* very well *(with)*; to match well; 2) to correspond *(to, with)*, to conform *(to)*; to be* in keeping / life *(with)*; 3) to harmonize *(with)*, to be* in keeping *(with)*, *(həmahəng)* to go* *(with)*; 4) to favour *(d.)*, to be* favourable *(to)*; fakta ~ gəlmək / olmaq to correspond to the facts, to be* true; şəraitə ~ olmaq to meet* / to fit the situation; bir şeyə ~ olaraq in accordance / conformity / compliance with *smth.*; *Şərait / mühit mənə uyğundur The situation favours me, The situation is favourable to me; Xalça ilə divar kağızı yaxşı uyğun gəlir The carpet and wall-paper match well*

**uyğun**[2] *z* suitably; fittingly; ~ cavab vermək to answer suitably; ~ geyinmək to be* suitably dressed

**uyğunlaşdırılmaq** *f* to be* co-ordinated, to be* agreed; to be* fitted, to be* adapted

**uyğunlaşdırmaq** *f* to combine *(d. with)*; to co-ordinate *(d. with)*; to fit *(d. to)*, to adapt *(d. to)*, to accommodate *(d. to)*, to adjust *(d. to)*; to conform *(d. to)*; to bring* to conformity *(d. with)*, to bring* in correspondence *(d. to)*, to bring* into line *(d. with)*; nəzəriyyəni praktika ilə ~ to bring* theory into concord with practice; işi təhsil ilə ~ to combine work with study; məxarici / məsarifi gəlirlə ~ to conform expenditure to income

**uyğunlaşma** *fi* adaptation, accommodation; *(mühitə)* acclimatization

**uyğunlaşmaq** *f* 1. to adjust / to adapt / to accommodate *oneself (to)*; to be* tied / adapted; to harmonize *(with)*, to go* *(with)*; to conform *(to)*; *(rəng, əşya haq.)* to match *(d.)*; şəraitə ~ to conform to circumstances; *Biri digəri ilə uyğunlaşmır One does not go with the other*; 2. *(mühitə)* to be* acclimatized

**uyğunluq** *i* accordance, conformity, conformability, compliance, correspondence; coordination; combination; proportionality, harmony, concord; səs və fonetik işarə arasındakı ~ *dilç.* correspondence between sound and phonetic symbol

**uyğunsuz**[1] *s* unsuitable; inappropriate; not corresponding *(with)*, incongrous *(with)*, incompatible *(with)*; ~ rənglər incongruous colours

**uyğunsuz**[2] *z* inappropriately, unsuitably; incongruously; ~ görünmək to look incongruous

**uyğunsuzluq** *i* discrepancy, disparity, lack of correspondence; incongruity, incongruousness, absurdity; incompatibility; xasiyyətlərin uyğuncuzluğu incompatibility of temperaments

**uyğur**[1] *i* Uigur [ˈwi:gur]

**uyğur**[2] *s* Uigur [ˈwi:gur], Uigurian [wiˈguəriən], Uiguric [wiˈguərik]; ~ dili Uigur, the Uigur language; ~ dilində in the Uigur language

**uyğurca** *z* Uigur; ~ danışmaq to speak* Uigur; ~ yazmaq to write* in Uigur

**uzadaraq** *z* *bax* **uzada-uzada**

**uzada-uzada** *z* in a drawing manner; *(səsini)* ~ danışmaq to drawl; əllərini ~ danışmaq to speak* with *(one's)* arms outstretched / holding *(one's)* hands out

**uzadılmaq** *f* to be* stretched; to be* prolonged, to be* extended; to be* lengthened , to be* made longer

**uzadılı** *s* outstretched; ~ əl the outstretched hand; əli ~ with *(one's)* arms outstretched

**uzağa** *z* far*; ~ *(uzaqlara)* baxmaq to look into the distance

**uzağı** *z* 1.: lap ~ farthest; most distant; 2. not later than; not more than; *Uzağı iki gündən sonra gələrəm I shall come not more than in two days; Biz ən uzağı dörd gün gözləyə bilərik. We can wait only four days at (the) longest*

**uzaq**[1] *s* distant, remote, *(yol və s.)* long, far*, faraway; ~ yol a long way; ~ ölkələr distant lands; ~ ölkə a far country; uzaq keçmiş / gələcək remote past / future, distant past / future; ~ keçmişdə far back in the past; həqiqətdən / məqsəddən ~ wide of the truth / mark; ~ rayon remote district; çox ~ far-away, very distant; çox ~ yerlər far-away places; ~ məsafə long distance; ~ *səfər (yol)* long / distant journey; *(dənizlə)* long / distant voyage; ~ məsafəli aviasiya long-range aircraft; ~ məsafə qət edən qatar long-distance train; ~ qohum distant relative; ~ Şərq the Far East; ~ sahələr distant / remote plots; *Uzaqdır It is far; It is a long way*

**uzaq**[2] *z* far*, far* off; a long way off; ~ getmək to go* far; uzağa baxmaq to look* into the distance; ~ başı at the worst, as a last resort; *d.d.* at a pinch; ~ dolanmaq / gəzmək to avoid *(d.)*, to shun *(d.)*; to keep* / to stand* / to hold* aloof

**uzaqda** *z* farther on / away; in the distance, far off; bir şeydən ~ far from *smth.*, a long way from *smth.*; removed from *smth.*; bir kəsdən ~ away from *smb.*, far from smb.

**uzaqdan** *z* from far away, from far, from afar, from a distance; ~ gəlmək to come* from afar place / from

**uzaqgörən**[1] *i* sagacious / far-sighted person

**uzaqgörən**[2] *s* 1. *(həm də məc.)* far-sighted, far seeing, long-sighted, sagacious, prescient; ~ adam a far-sighted / prescient / sagacious person; 2. *(gözüaçıq)* sagacious, perspicacious



**uzaqgörənlik** *i* 1. *(həm də məc.)* farsight, prescience; 2. sagacity, perspicacity, insight

**uzaqgörücü** *s* *bax* **uzaqgörən**

**uzaqgörücülük** *i* *bax* **uzaqgörənlik**

**uzaqlaşdırma** *fi* removal; *(məc.)* estrangement; *(məsafə)* distance; moving off / away; *(bir kəsi)* sending away; pushing aside; vəzifədən ~ removal from office

**uzaqlaşdırmaq** *f* 1. to remove *(d.)*; to estrange *(d.)*; to move off / away *(d.)*; to send* away *(d.)*; 2. to separate *(d.)*, to part *(d.)*, to disjoin *(d.)*; müharibə təhlükəsini ~ to remove the threat of war

**uzaqlaşmaq** *f* 1. to move off / away *(from)*; to keep* *(from)*; *məc.* to shun *(d.)*; sahildən ~ to move off / away from the shore; mövzudan ~ to wander from the subject; cəmiyyətdən ~ to withdraw* / to retire from society; 2. to take* *oneself* off, to retire, *(getmək)* to withdraw*; *(ayrılmaq)* to be* estranged

**uzaqlıq** *i* distance, a long way, *(hərəkət, uçuş haq.)* range; məsafə uzaqlığı (long) distance; *(müxtəlif mən.)* remoteness

**uzaqlıqölçən** *i* 1. *(aparat)* range-finger; 2. *(mütəxəssis)* range-taker

**uzaq-uzaq** *s* very far; ~ ölkələr very far countries

**uzaqvuran** *s* long-range; ~ top long-range gun; ~ raket long-range rocket

**uzandırmaq** *f* to ask / to cause to put / to lay down; *Həkim məni uzandırdı The doctor got / had me laid down*

**uzanıqlı** *s* lying, reclining; ~ vəziyyətdə in a reclining position; ~ vəziyyətdə olmaq to be* in a reclining position

**uzanışmaq** *f* to lie* down (all together); *Onlar uzanışıblar They are lying*

**uzanmaq** *f* 1. to lie* (down); *(adam haq.)* to stretch *oneself*, *(tirləşmək)* to sprawl; böyrü üstə ~ to lie* on *one's* side; yataqda ~ *(xəstəliyə və s. görə)* to lie* up; divanda ~ to lie* on the sofa; *(bitki haq.; yerə yatmaq)* to lie* flat; *Meşə bir neçə mil uzanır The forest stretches / extends for miles*; 2. *(vaxt)* to last, to linger, to draw* out, to crawl, to wear* on, to hang* heavy; to expand; yüz metrəcən ~ to stretch for a hundred metres; *bir şeyin boyunca* ~ to skirt smth, to lie* along *smth.*; *(xəstəlik və s.)* to drag on; *(söhbət)* to last; *(müddət)* to become* longer, to lengthen; to become* prolonged; *Martda günlər uzanır The days lengthen in March*

**uzatmaq** *f* 1. to lengthen *(d.)*, to make* longer *(d.)*; to stretch *(d.)*; xətti / yol ~ to lengthen / to prolong / to extend a line / a road; tumanı ~ to lengthen a skirt; ömrü ~ to lengthen life; to prolong *one's* life; boğazını ~ to stretch *one's* neck; 2. *(dartıb uzatmaq)* to elongate *(d.)*; 3. *(əli)* to reach / to hold* / to stretch out, to extend *(d.)*; bir şey üçün əlini ~ to hold* / to stretch / to reach out *one's* hand for *smth.*; *(əllə görüşmək üçün)* to reach out / to extend *one's* hand; kömək əlini ~ to give* / to lend* a hand; ayaqlarını ~ *d.d.* to turn up *one's* toes; *Ayağını yorğanına görə uzat at. sözü ≅ Cut the coat according to the cloth, Put your hand no further than your sleeve will reach*; 4. *(səs)* to draw* *(d.)*; *(çıxış, söhbət və s.)* to drawl *(d.)*, to drag out *(d.)*; hekayəni ~ to lengthen out a story; *(uzunçuluq etmək)* to dwadle, to waste *one's* time, to mess about; *d.d.* *(ətraflı danışmaq)* to enlarge *(on)*, to expatiate *(on)*, to dilate *(d. on)*; sözü ~ to drawl; *Uzatma! Quick! Hurry up!*; 5. *(ləngitmək)* to drag out *(d.)*, to protract *(d.)*; *(müddət)* to postpone *(d.)*; to prolong *(d.)*; müddəti ~ to prolong / to extend a term; 6. *(saqqal, saç)* to grow* *(d.)*; saçını ~ to grow* *one's* hair long; saqqal ~ to grow* a beard

**uzlaşdırılmaq** *f* to be* agreed / conformed

**uzlaşdırmaq** *f* 1. to co-ordinate *(d. with)*; 2. *qram.* to make* *(d.)* agree *(with)*; to govern *(d.)*

**uzlaşma** *fi* 1. co-ordination; agreement; 2. *qram.* concord, agreement; qrammatik ~ grammatical agreement; zamanların ~sı *qram.* sequence of tenses

**uzlaşmaq** *f* *qram.* *(idarə əlaqəsinə görə)* to agree *(with)*; to conform *(to)*; to be* governed

**uzun**[1] *s* long; *(çıxış və s.)* prolonged; lengthy; *(boy)* tall; *(nitq və s.)* drawling; ~ sait long vowel; ~ saç / burun long hair / nose; ~ *dalğalar (radio)* long waves; ~ ömür long life; ~ yol long way; ~ müddətdən sonra long after; ~ çay a long river; ~ səyahət a long journey; ~ illər / əsrlər for years / centuries, long years to come; ~ illərdən sonra after long years; ◊ *Onun dili uzundur He has a long tongue*

**uzun**[2] *z* long, *(for)* a long time; ~ danışmaq to enlarge *(on)*, to dilate *(on)*; ~ çəkmək / sürmək: to be* delayed, to be* dragged out; to draw* in length; to last long *Uzun danışma! Don't keep on about it!; Söhbət uzun çəkdi The conversation took long; Onun nitqi uzun çəkdi His / Her speech was long*

**uzunasına**[1] *s* longitudinal; lengthwise; ~ kəsik *(çertyoj)* longitudinal section

**uzunasına**[2] *z* lengthways, lengthwise, longitudinally

**uzunasına**[3] *qoş* along; sahil *(dəniz)* ~ along the coast; *(çay)* along the bank

**uzunayaq**[1] *i zool.* ~lılar *(quşlar)* long-legs, *(həşəratlar)* daddy-long-legs

**uzunayaq**[2] *s* 1. long-legged; ~ adam a long-legged person; 2. *məc.* restless

**uzunbaldır** *s* *d.d.* long-legged

**uzunbaldırlı** *s* *bax* **uzunbaldır**

**uzunbığ** *s* long-moustached; ~ kişi a long-moustached man*

**uzunbığlı** *s* *bax* **uzunbığ**

**uzunboğaz** *s* long-necked; ~ dəvə a long-necked camel; ~ çəkmə (high) boot; *(dizdən yuxarı)* jackboot

**uzunboğazlı** *s* *bax* **uzunboğaz**

**uzunboy** *s* *bax* **uzunboylu**

**uzunboylu** *s* tall; of large stature; *(zarafat)* long; ~ adam a tall person

**uzunboyun** *s* long-necked

**uzunboyunlu** *s* *bax* **uzunboyun**

**uzunburun** *s* long-nosed; ~ balıq long-nosed fish

**uzunburunlu** *s* *bax* **uzunburun**

**uzunbuynuz** *s* *k.m.* long-horn, long-horned

**uzunbuynuzlu** *s* *bax* **uzunbuynuz**

**uzunçəkən** *s* long, protracted, prolonged; *(nitq və i.a.)* drawling; long-drawn-out; ~ inilti / fəryad long-drawn-out moan / wail
**uzunçu**[1] *i* talker, chatterer, chatterbox, dawdler
**uzunçu**[2] *s* 1. talkative, loquacious, garrulous; long-winded; ~ adam talker; garrulous / long-winded person; 2. prolix, long-winded; ~ yazıçı prolix writer
**uzunçuluq** *i* chatter, jabber, jabbering; loquacity, verbosity; *(boşboğazlıq)* garrulity; long-windedness; ~ etmək to talk without a stop; *d.d.* to dawdle, to mess about
**uzundalğa** *s bax* **uzundalğalı**
**uzundalğalı** *s* long-waved
**uzundanışan**[1] *i* talker, chatterer, chatterbox, dawdler
**uzundanışan**[2] *s* talkative, *(təbiətçə)* garrulous, loquacious; chatty; long-winded; ~ adam a talkative man*, chatterbox
**uzundimdik** *s* long-beaked; ~ quşlar long-beaked birds
**uzundimdiklik** *s the state of having long-beak*
**uzundraz**[1] *i (kişi)* lanky fellow; *(qadın)* lanky woman*; *d.d.* hulking fellow / girl
**uzundraz**[2] *s* hulking, lanky; ~ adam / oğlan a lanky man* / boy
**uzundrazlıq** *i* lankiness
**uzunətək** *s* long-skirted, long-lapped; ~ qadın a long-skirted woman*; ~ tuman long-lapped skirt
**uzunətəkli** *s bax* **uzunətək**
**uzungövdə** *s (ağac.)* long-trunked, long-boled
**uzungövdəli** *s bax* **uzungövdə**
**uzunqıç** *s bax* **uzunqılça**
**uzunqılça** *s* long-legged
**uzunqılçalı** *s bax* **uzunqılça**
**uzunqol** *s* long-armed; long-sleeved; ~ köynək a long-sleeved shirt
**uzunqollu** *s bax* **uzunqol**
**uzunqulaq**[1] *i* 1. ass, donkey; 2. *məc. d.d.* ass, block-head, dullard
**uzunqulaq**[2] *s* long-eared; ~ eşşək long-eared ass / donkey
**uzunqulaqlı** *s bax* **uzunqulaq**[2]
**uzunquyruq** *s* long-tailed; ~ it a long-tailed dog
**uzunquyruqlu** *s bax* **uzunquyruq**
**uzunlaşmaq** *f* to lengthen; to become* longer; *(dartılmaqla)* to become* elongated
**uzunlatdırmaq** *f bax* **uzunlatmaq**
**uzunlatmaq** *f* to lengthen *(d.)*, to make* *(d.)* longer; xətti ~ to prolong a line; bir şeyi ~ to give* *smth.* a stretch
**uzunlifli** *s k.m.* long-staple; ~ pambıq long-staple cotton
**uzunlifliIik** *i the state or quality of being long-stapled*
**uzunluq** *i* length; extent, stretch; ~ dairəsi *coğ.* longitude; səsin uzunluğu length of a sound; yolun / ipin / ağacın uzunluğu the length of a road / of a rope / of a stick; siyahının uzunluğu the length of a list; cəbhənin uzunluğu the extent of front; *Bu çayın uzunluğu nə qədərdir? How long is this river?*
**uzunlülə** *s (silah)* long-barrelled; long-tubed; ~ minomyot a long-tubed gun; ~ silah a long-barrelled gun
**uzunlüləli** *s bax* **uzunlülə**
**uzunmüddətli** *s (i.s)* of long duration, lasting; *hərb.* permanent; long-term; long-dated; long-time; ~ veksel *(borc. sənədi)* promissory note; long bill; ~ məlumat *(hava haqqında)* long-time / long-range forecast; ~ sülh lasting peace; ~ təsərrüfat planları long-term economic plans
**uzunömürlü** *s* long-lived; *(i.s)* of many years, *(i.s)* of many (several) years standing; *bot.* perennial; longeval; durable; ~ xoşbəxtlik long-lived happiness; ~ dostluq long-standing friendship; ~ otlar perennial herbs
**uzunömürlülük** *i* longevity; durability
**uzunpaça** *s* long-legged
**uzunpaçalı** *s bax* **uzunpaça**
**uzunsaç** *s* long-haired; *(i.s)* with long hair; *(i.s)* with long plaits; ~ qız a girl with long hair, a long-haired girl, a girl with long plaits
**uzunsaçlı** *s bax* **uzunsaç**
**uzunsaqqal** *s* long-bearded, bearded; *(quş)* long-wattled; ~ kişi a long-bearded man*
**uzunsaqqallı** *s bax* **uzunsaqqal**
**uzunsap** *s bax* **uzunsaplı**
**uzunsaplı** *s* long-poled, *(bıçaq)* long-staffed; *(bayraq)* long-hafted; *(balta)* long-helved; *(çəkic)* long-shafted; *(zənbil)* long-gripped; ~ bel long-handled spade; ~ balta a long-helved axe; ~ bıçaq / oraq long-hafted / handled knife / sickle
**uzunsov** *s* longish; oblongated, oblong; ~ beyin *anat.* medulla, oblongated marrow; ~ sifət / sifətli long-faced
**uzunsovluq** *i the state or quality of being longish*
**uzunsünbül** *s* long-eared; ~ buğda long-eared wheat
**uzunsünbüllü** *s bax* **uzunsünbül**
**uzunsürən** *s* long, protracted, prolonged; *(xəstəlik və i.a.)* lingering; chronic; ~ xəstəlik chronic disease; ~ həyat *(ömür)* long life; ~ alqışlar prolonged applauses; ~ danışıqlar / müharibə / müdafiə protracted negotiations / war/ defence; ~ baxış lingering look
**uzuntəhər** *s* longsome; oblong; longish
**uzuntuman** *s* long-skirted; ~ qız long-skirted girl
**uzuntumanlı** *s bax* **uzuntuman**
**uzuntük** *s* long-haired
**uzuntüklü** *s bax* **uzuntük**
**uzunu** *qoş.* along, during, for, throughout; yay ~ during the summer, throughout the summer; qış ~ all winter long; il ~ during / throughout the year; yol ~ along the road, all the way long; illər ~ for years
**uzununa** *z* lengthways, lengthwise, longwise; tam ~ at full length
**uzun-uzadı**[1] *s* long; lengthy; ~ nitq lengthy speech
**uzun-uzadı**[2] *z (too)* long, long-windedly, *(for)* a long time; loftily; ~ danışmaq to speak* lengthily; *Uzun-uzadı danışma, kəs səsini! Don't jabber, shut up!*
**uzun-uzun** *s* very long; very tall
**uzunyal** *s* long-maned; ~ at a long-maned horse
**uzunyallı** *s bax* **uzunyal**
**uzunyun** *s k.m.* long-haired; long-woolled; ~ quzu a long-woolled lamb; ~ dəvə a long-haired camel
**uzunyunlu** *s bax* **uzunyun**



# Ü, ü

**Ü,ü** [ü] *the 29*[th] *letter of the Azerbaijani alphabet*
**üç** *sy* three; iyirmi ~ twenty-three; otuz ~ thirty-three
**üçayaq**[1] *i* tripod
**üçayaq**[2] *s* three-legged; ~ kətil / taburet three-legged stool
**üçayaqlı** *s bax* **üçayaq**[2]
**üçaylıq** *s* 1. *(vaxt) (i.s.)* of three months; three-month; 2. *(yaş)* three-month-old; ~ uşaq three-month-old baby
**üçbarmaq** *s* three-fingered; *elm. zool.* tridactylous
**üçbarmaqlı** *s bax* **üçbarmaq**
**üçbarmaqlılıq** *i the state of being three -fingered*
**üçbir** *z* in three
**üçbir-üçbir** *z bax* **üçbir**
**üçbucaq** *i riyaz.* triangle
**üçbucaq** *s riyaz.* triangular; threecorner(ed)
**üçbucaqlı** *s bax* **üçbucaq**
**üçcə** *sy* only three, just three
**üçcildli** *s* three-volume; ~ lüğət three-volume dictionary
**üçcildlilik** *i the state of being three-volume*
**üççarxlı** *s* three-wheeled; ~ araba three -wheeled cart
**üççarxlılıq** *i the state of being three-wheeled*
**üçdəbir** *sy* one third
**üçdilli** *s* trilingual; *(lüğət və s.)* triglot; ~ katib *(üç dildə danışa bilən)* trilingual secretary
**üçdillilik** *i the state of being trilingual / triglot*
**üçdorlu** *s* three-masted; ~ gəmi threemaster
**üçəsaslı** *s kim.* tribasic [traɪ'beɪsɪk]
**üçfaizli** *s* three-per-cent *(attr.)*
**üçfazalı** *s* three-phase; ~elektrik cərəyanı three-phase current
**üçfazalılıq** *i the state of having three-phase*
**üçgöz** *s* 1. *(şkaf, qapı və s.)* three-leaved; ~ şkaf three-leaved wardrobe; 2. *(mənzil) bax* **üçotaqlı**
**üçgözlü** *s bax* **üçgöz**
**üçguşə** *s bax* **üçbucaq**
**üçguşəli** *s bax* **üçbucaq**
**üçgünlük** *s* three-day; *(i.s.)* of three days; ~ müddət ərzində in / within three days; ~ iş work of three days
**üçhecalı** *i qram.* trisyllabic; ~ söz trisyllable
**üçhecalılıq** *i qram. the state or quality of being trisyllabic*
**üçhədli** *s riyaz.* trinomial; ~ tənlik trinomial equation
**üçhədlilik** *i riyaz. the state of being trinomial*
**üçhəftəlik** *i (vaxta dair) (i.s.)* of three weeks; three-week; *(yaşa aid)* three-week-old; ~ uşaq three-week-old baby, baby of three weeks
**üçhissəli** *s* three-part, *(i.s.)* of three parts
**üçxətli** *s* three-line, three-lined
**üçxətlilik** *i the state of being three-lined*
**üçillik** *s (i.s.)* of three-years, three-year; triennial; ~ bitki triennial
**üçkünc** *s bax* **üçbucaq**
**üçkünclü** *s* three-cornered; ~ şlyapa three-cornered hat
**üçqat** *s* 1. threefold, triple; ~ qayda *riyaz.* the rule of three; ~ ölçüdə threefold, treble; ~ cərgə triple row; ~ kanat *(kəndir)* three-ply rope; 2. *(qatlama, qoğal, taxta və s.)* three-layered; ~ faner three-ply (three-ply wood); ~ etmək to fold in three *(d.)*
**üçqatlı** *s bax* **üçqat**
**üçlük** *i* 1. *(a group consisting of three men)* tripartite; *mus.* trio; fortepiano üçlüyü pianoforte trio; simli alətlər üçlüyü string trio; 2. *(pul)* three-manat note
**üçlükdə** *z* three of; *Onlar üçlükdə işlədilər Three of them worked together*
**üçlülə** *s bax* **üçlüləli**
**üçlüləli** *s (silah və s.)* three-barrelled
**üçmanatlıq** *i* three-manat note
**üçməchullu** *s* three unknown quantities
**üçmərtəbə** *s bax* **üçmərtəbəli**
**üçmərtəbəli** *s* three-storeyed; ~ bina three-storeyed building
**üçmotorlu** *s (təyyarə)* three-engined
**üçnövbəli** *s* three-shift; ~ iş three-shift work
**üçox** *s bax* **üçoxlu**
**üçoxlu** *s* triaxial; ~ avtomaşın sixwheel motor vehicle, six-wheeler
**üçotaqlı** *s* three-room; ~ mənzil three-room flat
**üçölçülü** *s* three-dimensional
**üçpərdəli** *s teatr.* three-act; ~ pyes three-act play
**üçrəqəmli** *s* three-digit, three-figure *(attr.)*
**üçrəngli** *s* three-coloured; *(i.s.)* of three colour; *(bayraq və s.)* tricolour(ed); Azərbaycanın ~ bayrağı the Azerbaijani tricolour *(the national flag of Azerbaijan)*; *(şəkil haqda)* trichromatic [traɪ-]
**üçrənglilik** *i the state or quality of being three-coloured / tricolour(ed)*
**üçsaatlıq** *s (i.s.)* of three hours; three-hour; ~ iş three-hour work, work of three hours
**üçsəsli** *s mus.* three-part *(attr.)*
**üçsəslilik** *i the state of being three-part*
**üçsıralı** *s k.m.* three-row
**üçsıralılıq** *i the state of being three-row*
**üçsimli** *s mus.* three-stringed
**üçsimlilik** *i the state of being three-stringed*
**üçtarlalı** *s k.m.* three-field (system), three-field; ~ sistemli kənd təsərrüfatı three-field system of agriculture
**üçtarlalılıq** *i the state of being three-field system*
**üçtaylı** *s bax* **üçgöz** *(1-ci mənada)*
**üçtaylılıq** *i the state of being three-leaved*

**üçtelli** *s bax* **üçsimli**

**üçtellilik** *i bax* **üçsimlilik**

**üçtəkərli** *s* three-wheeled; ~ velosiped tricycle [traı-]; ~ motosikl motor tricycle

**üçtəkərlilik** *i the state of being three-wheeled*

**üçtərəfli** *s* 1. three-sided; *riyaz.* trilateral; 2. tripartite [tr(a)ı'pa:tait], triangular; ~ müqavilə tripartite treaty; ~ razılıq triangular agreement

**üçtərəflilik** *i the state of being three-sided*

**üçtonluq** *s* three-ton; ~ yük maşını three-ton lorry / truck

**üç-üç** *sy* in threes

**üçüncü** *sy* (the) third; ~ cərgə the third row

**üçüzlü** *s* 1. three-edged; *riyaz.* trihedral; ~ paz / çiv three-edged blade; 2. *bot.* *(gövdə haqda)* triquetrous

**üçüzlülük** *i the state of being three-edged*

**üçvalentli** *i kim.* trivalent [traı-]

**üçvalentlilik** *i kim. the state of being trivalent*

**üçvəznli** *s* three-dimensional

**üçyarpaq**[1] *i bot.* shamrock

**üçyarpaq**[2] *s* three-leaved; trifoliate

**üçyaruslu** *s* three-circled

**üçyaşar** *s bax* **üçyaşlı**

**üçyaşlı** *s* three-year; three-year-old; *(i.s.)* of three years; ~ uşaq three-year-old child*, child* of three (years)

**üçyerli** *s* three-seater *(attr.)*

**üdüləmək** *f* to blurt out *(d.)*, to speak* obscurely

**üdüləyib-tökmək** *f bax* **üdüləmək**

**üdüyüb-tökmək** *f bax* **üdüləmək**

**üfləmək** *f* 1. to blow*; tozu ~ to blow* the dust; 2. *(söndürmək)* to put* out *(d.)*, to extinguish *(d.)*; şamı ~ to put* out a candle

**üflənmək** *f* 1.: to be* blown; 2. *(söndürülmək)* to become* extinguished / put out; to be* blown / puffed out

**üfunət** *i* stink, stench

**üfunətli** *s* fetid, stinking; *(heyvan və bitkidə)* putrid; ~ iy *(ağızdan gələn)* fetid breath

**üfüq** *i* horizon *(həm də məc.)*; skyline, firmament; həqiqi ~ true / celestial / rational horizon; görünən ~ apparent / sensible / visible horizon

**üfüqi** *s* horizontal; ~ xətt horizontal *(line)*; ~ tir, turnik; *idm.* horizontal bar

**üfürmək** *f* 1. to blow* *(d.)*; xörəyini ~ to blow* one's food; 2. *(söndürmək üçün)* to put* out, to blow* out; şamı ~ to put* out / to blow* out a candle

**üfürtdürmək** *f bax* **üfürtmək**

**üfürtmək** *f* 1. to ask / to cause *s.o.* to blow* *(d.)*; 2. *(söndürtmək üçün)* to ask / to cause *s.o* to put* out *(d.)* / to blow* out *(d.)*

**üfürülmək** *f bax* **üflənmək**

**üləma** *i arx. bax* **alim**[1]

**ülfət** *i* 1. friendly terms / relations; friendship, intimacy; attachment *(to, for)*; affection *(towards, for)*; ~ bağlamaq / etmək to have* friendly relations *(with)*, to be* on good* / friendly terms *(with)*; bir kəslə ~ bağlamaq to be* on good / friendly terms with *smb.*; 2. love, affection

**ülgü** *i* pattern; ~ götürmək to cut* out a pattern; kağız ~ paper pattern; paltarın ~sünü götürmək to take* a pattern of a dress

**ülgüc** *i* razor, təhlükəsiz ~ safety razor

**ülgüçü** *i* cutter

**ülkər** *i astr.* the constellation of the Great Bear, Ursa Major

**ülvi** *s* 1. high, lofty, elevated; ~ məqsəd high / lofty / exalted aim; ~ ideyalılıq high-principled character; 2. *məc.* transcendental; beyond the cloud; celestial, heavenly; divine; ~ aləm celestial sphere

**ülviləşdirilmək** *f* to be* sanctified

**ülviləşdirmək** *f* to sanctify *(d.)*, to make* holy *(d.)*

**ülvilik** *i* holiness [hou-]; sanctity; həyatın ülviliyi the sanctity of life; andın ülviliyi the sanctity of oath; evlənməyin ~ the sanctity of marriage

**ülviyyət** *i bax* **ülvilik**

**ümdə** *s* 1. main, chief, above all; principal; ən ~ si above all; ~ məsələ main / chief / principal question

**ümid** *i* hope; ~ etmək to hope *(for; +to inf.)*; ~ bəsləmək / bağlamaq to cherish *(for)*, to be* in hopes; ~ vermək to promise; ~i doğrultmaq to justify hopes; bütün ~lərlə vidalaşmaq to say* good-bye to all hopes; ~ olmaq to hope *(for, +to inf.)*; to trust *(d.)*, to rely *(on)*; ~i boşa çıxmaq to be* disappointed *(in)*, to be* disappointed *(with)*; ~ini kəsmək to lose* hope, to be* unhopeful, zəif / dumanlı ~lər vague hopes; müvəffəqiyyətə ~ hopes of success; kiməsə ~ bəsləmək to pin *one's* hopes on *smb.*; nəyinsə ~ ilə yaşamaq to live in hope of smth; *Mən möhkəm ümid bəsləyirəm ki, o tezliklə yaxşılaşacaq I have good / strong hopes that he will soon be well*

**ümidli** *s* hopeful; reliable, trustworthy, trusty

**ümidlilik** *i* hopefulness; trustworthiness, reliability

**ümidsiz** *s* 1. hopeless; ~ xəstə hopeless case; *Xəstə ümidsizdir The patient's condition is hopeless*; ~ vəziyyət hopeless situation; nəyinsə barəsində ~ olmaq to be* hopeless about / of *smth.*; gələcək üçün ~ olmaq to be* hopeless for the future; 2. unreliable, not strong enough; 3. untrustworthy; ~ adam untrustworthy person

**ümidsizlik** *i* hopelessness; despair; ümidsizliyə düçar etmək to drive*/ to reduce *(d.)* to despair; ümidsizliyə qapılmaq to give* way to despair, to give* *oneself* up to despair

**ümidvar** *s*: ~ olmaq to hope *(for; +to inf.)*; nəyəsə ~ olmaq to hope for smth; *Mən ümidvaram ki, sizi bu gün görəcəyəm I hope to see you to-day*

**ümidvarlıq** *i* hopefulness

**ümidverən** *s* hopeful; ~ şagird hopeful / promising pupil; ~ gənc rəssam a hopeful art student; ~ perspektiv hopeful prospect

**ımidverici** *s bax* **ümidverən**

**ümidvericilik** *i* hopefulness

**ümman** *i bax* **okean**

**ümmət** *i* 1. followers; fellow-fighters; Məhəmməd ~i followers of Mahammad; İsa ~i followers of Christ; 2. nation, people

**ümumbəşər** *s bax* **ümumxalq**



**ümumdövlət** *s* State; nation-wide, national; ~ fondu State fund; ~ mənafeyi interests of the whole country

**ümumdünya** *s* world-wide, universal; world; ~ konqresi world congress; sülh tərəfdarlarının ~ konqresi the World Congress of the Defenders of Peace; ~ Sülh Şurası the World Peace Council; demokrat gənclərin ~ federasiyası the World Federation of Democratic Youth; ~ şöhrəti world-wide fame; həmkarlar təşkilatlarının ~ federasiyası the World Federation of Trade Unions *(qısa for.: W.F.T.U.)*; ~ səyahəti universal travel

**ümumən** *z* in general, generally, altogether, on the whole; always; *O, ümumən belədir He is always like that*; ~ *Ümumən desək... Generally speaking*, *Ümumən nə vaxt durursunuz? What time do you generally get up? Ümumən mən istirahət günləri teatra gedirəm Generally I go to the threatre on Sundays; Ümumən mən heyfsilənmirəm ki, evdə qaldım Altogether, I am not sorry I stayed at home*

**ümumxalq** *s* national; public; general; ~ malı public property, the people's property; ~ işi common task of / for the entire people

**ümumi** *s* 1. general; common; aggregate, total; ~ iclas general meeting; ~ razılıq common consent; ~ düşmən common enemy; ~ yaşayış sahəsi aggregate floor space; *Bu bizim ümumi işimizdir It is a matter of our common concern, It is common cause of ours*; 2. *qram.* common; ~ isim common noun

**ümumiləşdirilmək** *f* to be* generalized / socialized / collectivized

**ümumiləşdirilmiş** *fi* generalized, socialized, collectivized; kənd təsərrüfatının ~ bölməsi collectivized sector of agriculture

**ümumiləşdirmə** *fi* generalization; tələsik ~ hasty generalization

**ümumiləşdirmək** *f* to generalize *(d.)*, to summarize *(d.)*; təcrübəni ~ to generalize experience

**ümumiləşmə** *fi* becoming generalized

**ümumiləşmək** *f* to become* generalized / summarized

**ümumilik** *i* community; mənafe ümumiliyi community of interests; dil ümumiliyi community of languages; fikir ümumiliyi community of opinions; fikir və hissiyyat ümumiliyi community of thoughts and feelings

**ümumittifaq** *s* All-Union; ~ qurultayı All-Union Congress

**ümumiyyətcə** *z bax* **ümumən**

**ümumiyyətlə** *z bax* **ümumən**

**ümummilli** *s* national; ~ problemlər national problems; ~ vəzifələr tasks involving the whole nation

**ümumşəhər** *s* city-wide, town-wide; ~ mitinqi city-wide meeting

**ümumtəhsil** *s (i.s.)* of general education; ~ məktəbi school providing general education

**ümumtürk** *s* ~ all-Turkish; ~ qurultayı all-Turkish Congress

**ümumzavod** *s* for the whole factory; all factory

**ün** *i bax* **səs**[1]

**ünləmək** *f bax* **səsləmək**

**ünsiyyət** *i* 1. sociability; 2. intercourse; relations, link; şəxsi ~ personal contact; dil ~ vasitəsi kimi language as a means of intercourse; dostlarla ~ tapmaq to have* intercourse with friends; kiminləsə ~ də olmaq to hold* to keep* up to continue an active intercourse with *smb.*

**ünsiyyətli** *s* sociable, amiable; ~ adam a good mixer, sociable person

**ünsiyyətsiz** *s* unsociable, unamiable

**ünsiyyətsizlik** *i* absence of intercourse / communication, lack of intercourse / communication

**ünsür** *i (müx. mənada)* element; riyaziyyat ~ü element of mathematics; qalvanik ~ *el.* galvanic pile; cinayətkar ~ criminal element

**ünvan** *i* address; məktubu doğru ~a çatdırmaq to deliver a letter at the right address; ~ını dəyişmək to change *one's* address ~a göndərmək to address *(d., to)*

**ünvanlı** *s (i.s.)* with an address, *(i.s.)* having an address

**ünvanlılıq** *i the state of having an address*

**ünvansız** *s (i.s.)* without an address, *(i.s.)* having no address

**ünvansızlıq** *i the state of having no address / without an address*

**ünyetməz** *s* very / too far

**ürəfa** *i arx. bax* **arif**[1]

**ürək**[1] *i* heart; ◊ ~ vermək to hearten *(d.)*, to give* courage *(d.)*, to cheer up *(d.)*; ◊ ~ etmək to dare, to venture; ürəyə dəymək to offend *(d.)*; to hurt*/ to wound *smb.'s* feelings; ürəyə yatmaq to like *(d.)*; to be* likeable *(of person)*; *Bu kitab sizin ürəyinizə yatırmı? Do you like this book?* ◊ ürəyi gəlmək to decide *(+to inf.)*, to bring* *oneself (+to inf.)*; ◊ ürəyini bulandırmaq to make* *smb.* sick, to turn *smb.'s* stomach; ◊ ürəyi getmək to faint *(away)*; to lose* consciousness; ◊ ürəyi götürməmək to sicken *(d.)*; *Ürəyim bunu götürmür It sickens me*; ◊ ürəyindən keçmək to want *(d.)*; to feel* a desire to have *(d.)*; ürəyindən xəbər vermək to foretell* *(d.)*, to divine *smb.'s* intentions; ◊ ürəyinə dağ çəkmək to hurt* *smb.* heavily / violently; ◊ ürəyinə dammaq to have* a presentiment *(of, about)*, to have* a foreboding *(of, about)*; ◊ ürəyinə salmaq to take* *smth.* to heart; ◊ ürəyini açmaq 1) to display / to discover *one's* secret; 2) to cheer up *(d.)*, to brighten *(d.)*; ◊ ürəyini yemək to grieve; to be* anxious; ◊ ürəyini yumşaltmaq to move to pity, to stir the pity *(of)*; ürəyi atmaq / döyünmək 1) to beat*, to thump, to throb; 2) to long for *(d.)*; *Onun ürəyi döyünür His / Her heart is thumping / beating / throbbing*; ◊ ürəyi ağzına gəlmək to feel* strong disgust / aversion; ◊ ürəyi açıq olmaq to be* frank / open-hearted; ◊ ürəyi bulanmaq / qalxmaq to feel* sick; ürəyi qısılmaq, sıxılmaq to feel* heaviness in the heart; ◊ ürəyi qopmaq / düşmək to get* strongly / deadly frightened; ◊ ürəyi dolmaq 1) to be* ready to cry / to weep; 2) to have* much to say; ürəyi əsmək 1) to tremble, to thrill; 2) to long for, to desire *(d.)*; ürəyi istəmək to desire *(d.)*, to long for *(d.)*; ◊ ürəyi

yanmaq 1) *(susuz olmaq)* to be* very thirsty; 2) to feel* sorry *(for)*, to pity *(d.)*, to grieve *(about, for, over)*; ürəyi xarab olmaq to feel* bad*, to faint *(away)*; ~ döyüntüsü ilə with beating heart; ◊ kimisə ürəyinə basmaq to press *smb.* to *one's* heart; ◊ daş ~ a heart of flint / stone; ◊ sınıq ~ broken heart; ürəyin dərinliklərində in the bottom of *one's* heart; at heart, in *one's* heart (of hearts); ürəyin dərinliklərindən from the bottom of *one's* heart; tam ~lə with all *one's* heart; ◊ kiməsə ürəyini açmaq to open / to pour out *one's* heart to *smb.*; kiminsə ürəyinə toxunmaq to move / to stir / to touch *smb.'s* heart; *Onun ürəyindən qara qanlar axır His / Her heart bleeds;* ◊ ürəyini kiməsə vermək to give *one's* heart to *smb.*; kiminsə ürəyinə hakim olmaq to obtain / to gain *smb.'s* heart

**ürək[2]** *s* heart *(attr.)*; *elm.* cardiac; ~ tutması heart attack; ~ xəstəliyi heart disease; ~ əzələsi heart muscle; ~ həkimi heart specialist; ~ dərmanı *elm.* cardiac

**ürəkaçan** *s* heartwarming; ~ hadisə / əhvalat heartwarming event

**ürəkağrısı** *i* heart-ache; *(xəstəlik)* heart-disease; *(ürək tutması)* heart attack

**ürəkbir** *s* at one *(with)*, agree *(with, in / about)*; kiminləsə ~ olmaq to be* at one with *smb.*

**ürəkbulandıran** *s* sickening, nauseating; *həm də məc.* loathsome

**ürəkbulandırıcı** *s bax* **ürəkbulandıran**

**ürəkbulanması** *i* sickness, nausea [-sıə]; ~ hiss etmək to feel* sick

**ürəkcik** *i* heartlet

**ürəkdən** *z* heartily; with *one's* heart, from the bottom of *one's* heart; işə ~ girişmək to get* to work heartily; ~ yemək to eat* heartily

**ürəkdən-ürəyə** *s* from heart to heart

**ürək-dirək** *i:* ~ vermək to cheer up *(d.)*, to encourage *(d.)*

**ürəkdolusu** *z* with all *one's* heart and soul

**ürəkdöyünmə(si)** *i* 1. palpitation; *tib.* tachycardia; 2. heartbeat, heart-quake

**ürəkkeçmə** *i bax* **ürəkkeçməsi**

**ürəkkeçməsi** *i* fainting fit, swoon; *tib.* syncope; fit; attack; *(çoxgüclü)* paroxysm; əsəb ~si fit / attack of nerves, nervous fit; psixi ~ fit of madness; quduzluq ~si paroxysm of rage

**ürəklə** *z* heartily; boldly; bravely, fearlessly; *Mən ürəklə deyə bilərəm* I may say with confidence, I can safely say, I dare *(to)* say; işə ~ başlamaq to set* to work heartily

**ürəkləndirici** *s bax* **ürəkverici**

**ürəkləndirilmək** *f* to be* heartened, to be* encouraged, to be* filled with enthusiasm, to be* inspired

**ürəkləndirmək** *f* to hearten *(d.)*, to encourage *(d.)*, to cheer up *(d.)* to inspire *(d.)*

**ürəklənmək** *f* to take* heart, to hearten up, to dare; to become* encouraged / heartened

**ürəkli** *s* bold, courageous, daring, audacious, brave

**ürəklilik** *i* boldness, courage, audacity, courageousness

**ürəksıxan** *s* tiresome, annoying, boring, dreary; sad, melancholy; dull; ~ həyat dreary life; ~ hava dreary / dull weather; ~ iş dreary work

**ürəksıxıcı** *s bax* **ürəksıxan**

**ürəksındıran[1]** *i* offender; heart breaker

**ürəksındıran[2]** *s* heart-breaking

**ürəksiz[1]** *s* cowardly, faint-hearted, craven, poor-spirited; ~ adam coward / cowardly man*, faint-hearted / chicken -hearted follow

**ürəksiz[2]** *z* unwillingly, with reluctance, reluctantly

**ürəksizlik** *i* cowardice, cowardliness; ~ göstərmək to display cowardice; ◊ to show* the white feather *idiom.*

**ürəkvarı** *s* heart-shaped, heartlike

**ürəkverən[1]** *i* comforter, consoler

**ürəkverən[2]** *s* cheering, encouraging; consolatory

**ürəkverici** *s* consolatory, consoling, comforting; ~ sözlər consolatory words

**ürəkyandıran** *s* heart-burning; heartrending, heart-breaking

**ürəkyandırıcı** *s bax* **ürəkyandıran**

**ürəyəyatan** *s* 1. corresponding to *one's* taste; 2. pleasant, welcome; ~ xəbər welcome news

**ürəyəyatmaz** *s* 1. not corresponding to *one's* taste; 2. unpleasant, disagreeable; ~ iy disagreeable odour

**ürəyiaçıq** *s* kind-hearted, openhearted; ~ adam a kind-hearted person

**ürəyiaçıqlıq** *i* kind-heartedness, open-heartedness

**ürəyiaçıqlıqla** *z* kind-heartedly, open-heartedly

**ürəyibərk** *s bax* **ürəyidaş**

**ürəyidağlı** *s* broken-hearted, wounded-hearted

**ürəyidağlılıq** *i the state of being broken-hearted / wounded-hearted*

**ürəyidaş** *s* stony-hearted, hard-hearted

**ürəyidaşlıq** *i the state of being stony-hearted / hard-hearted*

**ürəyigeniş** *s* magnanimous, generous; ~ adam a man* of magnanimous soul

**ürəyigenişlik** *i* magnanimity, generosity

**ürəyincə** *z* to *one's* heart's content

**ürəyiqurdlu** *s* 1. envious; başqasının xöşbəxtliyinə qarşı ~ olmaq to be* envious of another's good fortune; 2. *(xəsis)* greedy, stingy, niggardly; *O, bir qədər/bir az ürəyiqurdludur* He / She is a bit stingy

**ürəyinazik** *s bax* **ürəyiyumşaq**

**ürəyinaziklik** *i bax* **ürəyiyumşaqlıq**

**ürəyisınıq** *s* disappointed, disillusioned, depressed, dispirited, hapless, ill-starred

**ürəyisınıqlıq** *i the state of being disappointed / depressed*

**ürəyisözlü** *s* pained; offended

**ürəyisözlülük** *i the state of being pained / offended*

**ürəyitəmiz** *s* well-wishing, open-hearted, frank, candid

**ürəyitəmizlilik** *i* open-heartedness, frankness, candour

**ürəyiyuxa** *s bax* **ürəyiyumşaq**

**ürəyiyumşaq** *s* soft-hearted, tender-hearted, kind

**ürəyiyumşaqlıq** *i* soft-heartedness, tender-heartedness, kindness; sensitiveness

**ürfan** *i arx.* knowledge, wisdom; education

**ürkək** *s* fearful, easily frightened / scared *(həm də at haq.)* shy

**ürkəklik** *i* fearfulness, timidity, shyness



**ürkmək** *f* to be* frightened / startled *(with)*; *(at)* to shy, to take* fright *(of)*; *O, hər şeydən ürkür He / She is afraid of everything*

**ürkmüş** *fs* frightened; shied; ~ at shied horse

**ürküdülmək** *f* to be* / to get* frightened / startled *(with)*; *(at)* to be* shy, to take* fright *(of)*

**ürküşdürmək** *f* to cause / to force animals to get frightened / scared

**ürküşmək** *f* to get* frightened, to get* a fright

**ürkütmək** *f* to frighten *(d.)*, to scare *(d.)*, to give* a fright

**ürpənmək** *f* to bristle *(up, with)*; *Acığından onun tükləri ürpəndi His / Her hair bristled up with anger*

**ürpərmək** *f* to bristle up; *Kirpi kimi ürpərmə Don't bristle up like a hedgehog*

**ürpərtmək** *f* to cause *(d.)* to bristle

**ürpəşmək** *f bax* **ürpənmək**

**üryan** *s* naked; nude; bare; ~ bədən naked body; ~ ağac bare / naked tree; ~ qılınc naked sabre

**üskük** *i* thimble

**üslub[1]** *i* style; yüksək ~ elevated style; *Onun gözəl üslubu var He / She has a good style*

**üslub[2]** *s* stylistic; ~ vasitəsi stylistic device

**üslubi** *s bax* **üslub[2]**

**üst[1]** *i* top, head; *(üst hissə)* surface

**üst[2]** *s* 1. upper; ~ mərtəbə upper storey; 2. outside; right side; ~ geyimləri outdoor clothes *pl.*; ~ü açılmaq to be* revealed / uncovered, to light; to be* discovered; ~ünü açmaq 1) to lay* bare *(d.)*, to uncover *(d.)*; 2) to expose *(d.)*; *(cinayətin və s.)* to convict *(d. to)*; to prove guilty *(d. of)*; bir kəsin yalanının ~ünü açmaq to expose *smb.* as a liar; ~ünü örtmək 1) to cover *(d. with)*, *(damın)* to roof *(d.)*; *(rənglə)* to paint *(d. with)*, to overlay *(d. with)*, *(lakla)* to varnish *(d.)*, to laquer *(d.)*; 2) *məc.* to conceal *(d.)*; to shield *(d.)*, to hush up *(d.)*; to keep* a secret *(d.)*; ~ünü almaq 1) *(toz)* to settle *(on)*, to cover *(d.)*; 2) to attack *(d.)* all of a sudden; ~ünü malalamaq 1) to plaster *(d.)*, to parget *(d.)*; 2) *məc.* to conceal *(d.)*, to keep* to *oneself (d.)*

**üst-baş** *i* clothes pl.; garment(s.), attire; ~ı olmamaq to have* no clothes / garments; ~dan çıxmaq to wear* out *one's* clothes

**üstdə** *z* above; *(yuxarı mərtəbə)* upstairs; *Baş / Göz üstə All right, OK.*

**üstdən** *z* from above, from (the) top; *İşıq üstdən düşür The light falls from above;* ~ beşinci sətir *(xətt)* the fifth line from the top; ~ üçüncü mərtəbə the third storey from the top

**üstdən-aşağı** *z* from top to bottom, downwards

**üstəgəlmə** *i* 1. *riyaz.* plus; 2. addition

**üstələmək** *f* to take*/ to gain* the upper hand *(over)*, to prevail *(over)*; to excel *(d. in)*; to exceed *(d.)*, sayca ~ to outnumber *(d.)*; öz müəllimini ~ to excel *one's* teacher

**üstəlik** *z* in addition *(to)*, *d.d.* besides; moreover

**üstqurum** *i fəls.* superstructure; bazis və ~ basis and superstructure

**üstüaçıq[1]** *s* open, overt, uncovered; roofless

**üstüaçıq[2]** *z* plainly, frankly, overtly; ~ danışmaq to speak* plainly / frankly, to speak* in plain terms

**üstün** *s* superior; ~ qüvvə *hərb.* superior forces numbers; *Sən bacarıqda məndən üstünsən You are my superior in ability; Hazırcavablıqda ondan üstün yoxdur* She / He has no superior in wit; ~ gəlmək *bax* **üstələmək;** ~ olmaq to exceed *(d.)*, to excel *(d. in)*; miqdarca ~ olmaq to outnumber *(d.)*; ~ tutmaq to prefer *(d. to; +to inf.)*; birini digərindən ~ tutmaq to prefer one to another, to favour one over another

**üstündə** **qoş** 1. because of; on account of; sənin üstündə because of you; 2. above, over, on; buludların ~ above the clouds; başımın ~ over my head; stolun ~ on the table

**üstündən** *z* over; over the top; paltarın ~ over the dress; *O, donunun üstündən palto geymişdi* She wore a coat over her dress; eynəyin ~ baxmaq to look over the top of *one's* spectacles *pl.*

**üstünə** **qoş** 1. on; *Kitabı stolun üstünə qoy Put the book on the table;* 2. to the address; *Onun üstünə məktub gəlib A letter came to his / her address;* ~ atmaq 1) to fling* *(d. at)*, to hurl *(d. at)*; 2) to lay* *(d.)*; to put* *(d.)*; günahı başqasının ~ atmaq to lay* / to put* the blame on *smb.*; ~ düşmək 1) to find* by chance; 2) to find* fault *(with)*, to cavil *(at)*; not to leave alone; ~ gəlmək to add *(d.)*; to increase; to plus; *Üç üstünə gəl altı bərabərdir doqquza Three plus six is nine;* ~ tökülmək to attack *(d.)* all together, to assault *(d.)*; ~ çıxmaq 1) to get* on *(d.)*; 2) *məc.* to come* across *(d.)*, to encounter *(d.)*

**üstünlük** *i* 1. superiority, hava qüvvələrinin üstünlüyü air superiority; atəş üstünlüyü fire superiority; 2. *qram.* superlative; ~ dərəcəsi superlative degree

**üstüörtülü[1]** *s* 1. closed, covered; ~ tennis kortu closed / covered tennis court; ~ bazar closed / covered bazar

**üstüörtülü[2]** *z:* ~ danışmaq to beat* about the bush *idiom*; *amer.* to beat* around the bush *idiom.*

**üst-üstə** *z* 1. in sum, in all; *(as a)* whole, wholly; 2. in succession, running; on beş il ~ fifteen years in succession, fifteen years running; 3. one on another

**üsul** *i* way, mode, method, rule; bu ~la in this way; müxtəlif ~larla in different ways; ifadə ~u manner of expressing *oneself*; istifadə etmə ~u directions for use; müalicə ~u the method / way / mode of treatment

**üsuli-din** *i* basis of religion

**üsuli-idarə** *i* regime, government; çar ~si tsarist regime / government

**üsullu[1]** *s* methodical, orderly

**üsullu[2]** *z* 1. methodically, 2. carefully, cautiously, guardedly

**üsulluluq** *i the state or quality of being methodical / orderly*

**üsulsuz** *s* unmethodical; careless

**üsulsuzluq** *i the state or quality of being unmethodical*

**üşümək** *f* to be* cold, to feel* cold, to suffer from cold; to shiver, to freeze; soyuqdan ~ to feel* cold, to shiver with cold

**zoqquldamaq** *f* to shoot, to throb, to lancinate; to twingle; **Barmağım zoqquldayır** *My finger throbs; I have twings / shooting / pains in my finger*

**zoqqultu** *i* shooting / throbbing / lancinating pain; twing; **diş ağrısının ~su** a twing of toothache

**zoqqultulu** *s* shooting, throbbing, lancinating; **~ ağrı** *bax* **zoqqultu**

**zol** *i* 1. *(zolaq)* strip, stripe; 2. *(çubuq, qayış zərbəsinin izi)* wale, weal; **~ çıxarmaq / çəkmək**: 1) to cut* into strips; 2) *(döymək)* to wale *(d.)*

**zola** *i* pole, perch

**zolaq** *i* 1. strip; slip; **kağız zolağı** a strip / a slip of paper; **meşə zolağı** a strip of forest; **uçuş zolağı** *av.* airstrip; **enmə zolağı** landing strip; 2. *(enli xətt)* stripe; **parçanın ~ları** stripes; 3. *(hərbi geyimdə, poqonda və s.)* stripe; **Serjantın poqonunda üç zolaq var** *There are three stripes on the shoulder of a sergeant*

**zolaqlı** *s* stripy; striped; **~ qalstuk** a stripy tie

**zolaq-zolaq** *s* striped, *(i.s.)* having stripes; *(i.s.)* cut into stripes

**zollamaq** *f* 1. *(zol-zol kəsmək)* to cut* *(d.)* into strips, to slash *(d.)*; 2. *d.d.* *(bir şeylə vurmaq)* to strike* with *smth.*

**zollanmaq** *f* 1. *(zol-zol kəsilmək)* to be* cut into strips; to be* slashed; 2. *(yerə uzanmaq, sərilmək)* to sprawl *(on)*, to go* sprawling *(in)*, to stretch *oneself (on)*; to measure *one's* length *idiom.*; **Oğlan divana zollandı** *The boy sprawled on the sofa*

**zollatmaq** *f (zol-zol kəsdirmək)* to have* *(d.)* cut into strips / slashed; to make* *smb.* cut *(d.)* into strips; **Dərini zollatmaq istəyirəm** *I want to have the skin cut into strips*

**zol-zol** *s* striped; **~ etmək**: 1) to cut* into strips; 2) *(döyməklə)* to wale *(d.)* *(with)*, to slash *(d.)* *(with)*

**zona** *i* zone; **müharibə ~sı** a war zone; **təhlükə ~sı** a danger zone

**zonal** *s* zone *(attr.)*, zonal; **~ finalı** *id.* zonal final

**zond** *i* 1. *(müxt. mənada)* probe, sound; 2. *(balon)* sound-balloon; *(atmosferə)* **~ buraxmaq** to send* a sound-balloon

**zondlamaq** *f* to probe *(d.)*, to examine with a probe *(d.)*; *(müst. və məc.)* to sound *(d.)*

**zont** *i* sunshade parasol; **çimərlik ~u** beach umbrella

**zontik** *i* umbrella

**zoobaytar** *i* veterinary (surgeon); *d.d.* vet

**zoobaytarlıq** *i* veterinary science / medicine

**zoologiya** *i* zoology

**zooloji** *s* zoological; *d.d.* zoo

**zooloq** *i* zoologist

**zoomaqazin** *i* pet-shop

**zoopark** *i* zoological gardens *pl.*; *d.d* Zoo

**zootexnik** *i* animal technician, live-stock expert / specialist

**zootexnika** *i* zootechnics, animal science

**zootexniki** *s* zootechnical; animal-research; **~ institut** animal-research institute

**zopa** *i d.d.* club, bludgeon, cudgel; **polis ~sı** baton, truncheon

**zopalamaq** *f* to club *(d.)*, to bludgeon *(d.)*, to cudgel *(d.)*, *(polis zopası ilə)* to baton *(d.)*

**zopalanmaq** *f* to be* clubbed / bludgeoned; *(polis zopası ilə)* to be* batoned

**zopu** *i* zopu / zoppo *(an ancient folk dance)*; **~ya getmək / çıxmaq** to dance zopoo / zopu

**zor**[1] *i* force, vigor; violence; might, strength; **~ ilə**: 1) *(güc vasitəsilə)* by force, by means of force; 2) *(var qüvvəsi ilə)* with all *one's* might / strength; **~ vermək**: *(güc vermək)* to exert all *one's* strength energy; to put* forth *one's* strength; to strain *oneself*; to make* an intense effort; **~ eləmək** *(məcbur etmək)* to force *(d.)*, to constrain *(d.)*; to enforce *(d.)*, to coerce *(d.)*; **Ona zor eləməyə çalışmayın, getməyəcək** *Don't try to force / to coerce him / her, he / she won't go*; **~ işlətmək / göstərmək**: 1) *(güc tətbiq etmək)* to force *(d.)*, to use (physical) force *(+to inf)*; 2) *(zorakılıq etmək)* to use violence / brute force; **~ işlətmədən** without use of / using force; **~ gəlmək** to overpower *(d.)*, to overcome* *(d.)*; **~ a salmaq** to overstrain *(d.)*; **özünü ~a salmaq** to overstrain *oneself*, to exert *oneself* to the utmost; to overtax *one's* strength; to knock *oneself* up *idiom.*; **səsini / boğazını ~a salmaq** to overstrain *one's* voice; **~u çatmaq** to cope *(with)*, to manage *(d.)*; **Mənim buna zorum çatmaz** *I won't cope with it*

**zor**[2] *s* 1. *(güclü, qüvvətli)* forceful, powerful; vigorous, strong; *(yağış, külək və s.)* heavy, hard; *(isti)* fierce, violent; *(iradə)* strong; *(əsər, tamaşa, pyes)* powerful, impressive, *(maşın, mühərrik)* powerful; *(qəzəb, kin və s.)* violent / towering; **Onun zor həvəsi var** *He has violent passion*; *(hiss)* intense; *(təsir)* potent; *(şaxta)* hard; 2. *(çox böyük, iri)* very big; 3. *(ağır, çətin)* hard; **~ iş** hard work; 4. *(əla) d.d.* super, excellent

**zorakı** *s* forcible, forced; violent; coercive; **~ adam** a violater, violator; **~ idarəetmə** government by force; **~ metod / üsul** forcible / coercive method; **~ çevriliş** forcible upheaval

**zorakılıq**[1] *i* violence, act of violence; coercion; **~ etmək / işlətmək** to use force

**zorakılıq**[2] *s* forcible, violent; **~ vasitəsi** violent means, means of violence; **~ üsulu / metodu** method of violence; **~ vasitələrinə əl atmaq** to resort to coercive / forcible methods

**zorakılıqla** *z* forcibly, forcefully, with violence; *(məcburiyyətlə)* coercively; **~ qarət etmək / çapıb-talamaq** to rob / plunder with violence; **~ idarə etmək** to govern / to rule *(d.)* by force / with violence

**zorba** *s* 1. *(yekəpər, cantaraq)* stalwart, hefty; well-grown; **~ adam** a stalwart person, a stalwart; **~ oğlan** a hefty / wellgrown fellow / chap; *(tosqun)* gross; **~ qadın** a gross woman*; 2. *(çox iri)* very big; **~ ağac** a very big tree

**zorbalaşmaq** *f* 1. *(yekəpərləşmək)* to grow* / to become* stalwart / hefty; 2. *(tosqunlaşmaq)* to become* gross; 3. *(çox böyümək)* to grow* to become* very big / enormous, to get* bigger; 4. *(qüvvətlənmək)* to grow* / to become* / to get* stronger

**zorbalıq** *i* 1. *(yekəpərlik)* stalwartness; *(tosqunluq)* grossness; 2. *(çox yekəlik, irilik)* bigness; enormousness



**zorla** *z* 1. by force, forcibly, with violence; *(məcburiyyətlə)* coercively, under constraint / compulsion; 2. *(çətinliklə)* with difficulty; hardly; **~ almaq / tutmaq** to take* by force *(d.)*; **~ ələ keçirmək** to lay* violent hands *(on)*; **~ yedirtmək** to feed* coercively; **~ (istəmədən) yemək** to force *oneself* to eat; *(məcburiyyət altında)* to eat* under constraint; **~ yerimək** to be* hardly able to walk, to go* along with difficulty; **yerindən ~ qalxmaq / durmaq** to struggle up *idiom.* **yerdən ~ ayağa qalxmaq** to struggle to *one's* feet *idiom.*

**zorlama** *z* forcibly, forcefully, by force, forcedly; coercively

**zorlamaq** *f* 1. to force *(d.)*, to coerce *(d.)*; 2. *(qızı, qadını)* to rape *(d.)*, to commit rape, to ravish *(d.)*; *(qanunu)* to violate *(d.)*; **öz qəlbini ~** to force *one's* heart; **öz hisslərini ~** *(boğmaq)* to do* violence to *one's* feelings

**zorlu** *s bax* **güclü**

**zorluluq** *i bax* **güclülük**

**zöhrə** *i* 1. *astr.* Venus; 2. *məc.* *(məhəbbət ilahəsi)* Venus

**zöhrəvi** *s tib.* venereal; **~ xəstə** venereal patient; **~ xəstəlik** venereal disease

**zökəm** *i* a head cold, cold in the head; snuffles / sniffles pl.; *elm.* coryza; **~ olmaq** to catch* a cold (in the head)

**zövc** *i* husband

**zövcə** *i* wife

**zövq** *i* 1. *(estetik duyğu)* taste; **bədii ~** artistic taste; **incə ~** exquisite taste; **musiqi ~ü** a taste for music; **~ə görə** to the taste; **öz ~ünə görə / uyğun, öz ~üncə** to *one's (own)* taste; **Hər bir kəs öz zövqünə görə geyinir** *Everybody dresses to his (own) taste*; **~ ilə** tastefully; **~ ilə geyinmək** to dress tastefully; **yaxşı (pis) ~ü olmaq** to show* good *(bad)* taste; **Onun çox yaxşı bədii zövqü var** *He / She shows a very good artistic taste*; **bir kəsin ~üncə olmaq** to be* to *one's* taste; **Bu mənim zövqümə uyğun deyil** *It is not to my taste*; 2. *(həzz, ləzzət, nəşə)* delight, pleasure, enjoyment; 3. *(məmnunluq hissi)* bliss, felicity; **~ almaq** to take* delight / pleasure *(in)*, to get* pleasure *(out of)*, to feel* / to experience pleasure *(in)*, to enjoy *(d.)*; **~ vermək** to delight *(d.)*, to give* pleasure; **Gözəl təbiət mənzərələri bizə xüsusilə zövq verirdi** *The beautiful landscapes delighted us particularly*

**zövqlə** *z* tastefully, blissfully; **~ geyinmək** to dress tastefully

**zövqlü** *s:* tasteful, blissful; showing good taste; **~ adam** a tasteful man; a man of taste

**zövq-səfa** *i* pleasure, delight; enjoyment

**zövqsüz** *s (i.s.)* showing bad taste; tasteless

**zövqsüzlük** *i* tastelessness; lack / want of taste; bad taste, blissfulness

**zubr** *i zool.* aurochs

**zummer** *i tex.* 1. *(cihaz)* buzzer; 2. *(telefonda)* buzz

**zurna** *i* zourna *(a sort of flute)*, pipe; *(oyuncaq)* kazoo; ◊ **~ bağlamaq** *(bir kəsə) idiom.* ≅ to asperse *(d.)*, to back-bite *(d.)*, to bespatter *(d.)*, to say* evil thing about *smb.*; **~ çalmaq** 1) to play* the zourna / the pipe; 2) *məc.* *(şayiə yaymaq)* to set* a rumour abroad / afloat

**zurnaçı** *i* zourna player

**zurnaçılıq** *i* *the profession of a zourna player*

**zühur** *i* appearance; *(kabus və s.)* apparition; **~ etmək** to appear; **~ olmaq** to appear, to make* *one's* appearance; **~a çıxmaq** to appear, to emerge, to come* into sight; to become* evident

**zülal** *i biol., kim.* albumen, protein

**zülali** *s biol., kim.* albuminous

**zülf** *i (saç)* hair; *(bir qom)* lock; *(qıvrım)* curl, ringlet

**zülm** *i* oppression, tyranny; *(əsarət)* yoke; *(haqsızlıq)* injustice; **~ ilə** by force, forcibly; **~ altında yaşamaq** to live under tyranny; **~ altında inləmək** to pine under the yoke *(of)*; **~ etmək** to oppress *(d.)*, to keep* down *(d.)*; **Mülkədarlar kəndlilərə zülm edirdilər** *The landlords oppressed the peasants*; **~ olmaq** to suffer injustice; **Ona yamanca zülm oldu** *He / She suffered injustice heavily*; **~ çəkmək** to be* oppressed; to suffer

**zülmət**[1] *i* 1. dark, darkness; gloom; **gecənin ~ ində** under the cover of night; 2. *məc.* *(cəhalət)* ignorance

**zülmət**[2] *s* dark; gloomy; **~ gecə** a very dark / a pitch night; **~ gecədə** in the dark night

**zülmətli** *s* dark; gloomy; **~ gecə** a very dark night

**zülmkar**[1] *i* oppressor, tyrant, tyrannizer, despot

**zülmkar**[2] *s* oppressive, tyrannic(al), despotic(al)

**zülmkarcasına** *z* oppressively, tyrannically, despotically

**zülmkarlıq** *i* oppressiveness, tyranny, despotism; **~ etmək** to oppress *(d.)*, to tyrannize *(d.)*

**zülüm-zülüm** *z:* **~ ağlamaq** to cry / to weep* bitterly

**zümrə** *i* group, class; company; **kübarlar ~si** class of aristocrats; **məmurlar ~si** group of officials

**zümrüd**[1] *i* emerald

**zümrüd**[2] *s* 1. emerald; *(i.s.)* made of emerald; 2. *(i.s.)* of emerald colour, brightly / richly green; ◊ **~ quşu** *əs.* Phoenix

**zümrüdü** *s* emerald, emerald green

**zümzümə** *i* croon, hum; *(axar suda)* babble, lullaby; **axınların ~ si** babble of streams; **~ etmək** to croon / to hum / to sing* gently / in a low voice

**zümzüməli** *s* crooning; *(axar su)* babbling

**zürafə** *i zool.* giraffe

**zürriyyət** *i* children, (child), issue, off-spring, descendant(s); **oğul ~ i** male issue; **qız ~ i** female issue

**zürriyyətsiz** *s* *(i.s.)* without issue / off-spring(s) / children; childless

**züy** *i* **I** backing for a piper, vamping a piper, taking the second part on a pipe, accompaniment to the pipe; **~ tutmaq**: 1) to accompany / to vamp a piper (on a wind-instrument), to take* the second part on a pipe; 2) *məc.* to second / to back up *smb.*

**züy** *i* **II** 1. *(sürüşmək üçün buz meydançası)* slide; 2. *(buz üzərində sürüşmə)* sliding; **~ getmək** to have* a slide on the ice

**züytutan** *i* 1. an accompanist of a piper, the one accompanying the piper on a wind-instrument; 2. *məc.* backer, companion

**züyüldəmək** *f* *(sürüşmək)* to slide, to slip

**züyültü** *i* *(sürüşmə)* slide, (act of) sliding

## AZƏRBAYCAN COĞRAFİ ADLARI

Abşeron Absheron
Abşeron yarımadası the Absheron Peninsula
Ağcabədi Aghjabadi
Ağdam Aghdam
Ağdaş Aghdash
Ağstafa Aghstafa
Ağsu Aghsu
Araz *i* the Araz
Astara Astara
Azərbaycan Azerbaijan
Bakı Baki
Balakən Balakan
Beyləqan Beylagan
Bərdə Barda
Bibiheybət Bibiheibat
Biləsuvar Bilasuvar
Biləcəri Bilajari
Bilgəh Bilgah
Binəqədi Binagadi
Boz dağ Boz Dagh *(Grey Mountain)*
Cəbrayıl Jabrail
Cəlilabad Jalilabad
Culfa Julfa
Daşkəsən Dashkasan
Dəvəçi Davachi
Əli Bayramlı Ali Bairamly
Əlincə (qala) Alinja *(fortress)*
Füzuli Fuzuli
Gədəbəy Gadabay
Gəncə Ganja
Goranboy Goranboy
GöyGöl Goy Gol
Göyçay Goychay
Hacıqabul Hajigabul
Xaçmaz Khachmaz
Xankəndi Khankandi
Xanlar Khanlar
Xəzər dənizi the Caspian Sea
Xızı Khyzy
Xocalı Khojaly
Xocavənd Khojavand
İmişli Imishli
İsmayıllı Ismailly
İstisu Istisu
Kəlbəcər Kalbajar
Kəpəz dağı Kapaz Daghy *(Kapaz Mountain)*
Kür *i* the Kur
Kürdəmir Kurdamir
Qax Gakh
Qarabağ Garabagh
Qaradağ Garadagh
Qazax Gazakh
Qəbələ Gabala
Qız qalası Maiden Tower
Qobustan Gobustan
Qoşqar dağı Goshgar Dagh *(Goshgar Mountain)*
Quba Guba
Qubadlı Gubadly
Qusar Gusar
Laçın Lachyn
Lerik Lerik
Lənkəran Lankaran
Masallı Masally
Mingəçevir Mingachevir
Naftalan Naftalan
Naxçıvan Nakhchivan
Neftçala Neftchala
Oğuz Oghuz
Ordubad Ordubad
Saatlı Saatly
Sabirabad Sabirabad
Sabunçu Sabunchu
Salyan Salyan
Samux Samukh
Samur-Dəvəçi kanalı the Samur-Davachi Canal
Səbail Sabail
Sədərək Sadarak
Siyəzən Siyazan
Sumqayıt Sumgait
Suraxanı Surakhany
Şamaxı Shamakhy
Şəki Shaki
Şəmkir Shamkir
Şərur Sharur
Şuşa Shusha
Şüvəlan Shuvalan
Tərtər Tartar
Tovuz Tovuz
Ucar Ujar
Yardımlı Yardymly
Yasamal Yasamal
Yevlax Yevlakh
Zaqatala Zagatala
Zəngilan Zangilan
Zərdab Zardab

## COĞRAFİ ADLAR

Abxaziya Abkhazia
Adriatik dənizi the Adriatic Sea
Afina *ş* Athens
Afrika Africa
Ağ dəniz the White Sea
Avropa Europe
Avstraliya Australia
Avstriya Austria
Azərbaycan Azerbaijan
Azov dənizi the Sea of Azov *(Asof)*
Akkra *ş* Accra
Albaniya Albania
Alma-Ata *ş* Alma-Aty
Alp dağları the Alps
Alyaska Alaska
Amazonka *ç* the Amazon
Amerika America
Amerika Birləşmiş Ştatları the United States of America
Amman *ş* Amman
Amsterdam *ş* Amsterdam
Amudərya *ç* the Amu Darya
Amur *ç* the Amur
Anqola Angola
Ankara *ş* Ankara
Antarktida the Antarctic Continent, Antarctica
Aral dənizi the Aral Sea
Argentina Argentina, the Argentine
Arxangelsk *ş* Arkhangelsk
Arktika the Arctic
Asiya Asia
Aşqabat *ş* Ashgabat
Atlantik okeanı the Atlantic (Ocean)
Babil-Məndəb boğazı Bab-El-Mandeb
Bağdad *ş* Bag(h)dad
Balxaş *g* Balkhash
Balkan dağları the Balkan Mountains, the Balkans
Balkan yarımadası the Balkan Peninsula
Baltik dənizi the Baltic Sea
Baltimor *ş* Baltimore
Banqkok *ş* Bangkok
Banqladeş Bangladesh
Barbados Barbados
Barens dənizi the Barents Sea
Barselona *ş* Barselona
Batumi *ş* Batumi
Bəhreyn *ş* Bahrein, Bahrain
Beyrut *ş* Beirut, Beyrouth
Belarus Belarus
Belfast *ş* Belfast
Belçika Belgium
Belqrad *ş* Belgrade
Benin Benin
Benqal boğazı the Bay of Bengal
Berinq dənizi the Bering Sea
Berlin *ş* Berlin
Bermud adaları the Bermudas, the Bermuda Islands
Bern *ş* Bern(e)
Birma Birma(h)
Birminhem *ş* Birmingham
Bisau Bissau
Bişkek *ş* Bishkek
Boliviya Bolivia
Bolqarıstan Bulgaria
Bombey *ş* Bombay
Bonn *ş* Bonn
Bosfor the Bosporus
Boston *ş* Boston
Botsvana Botswana
Böyük Britaniya Great Britain
Böyük Səhra the Sahara
Bratislava *ş* Bratislava
Braziliya Brazil
Britaniya adaları the British Isles
Brüssel *ş* Brussels
Budapeşt *ş* Budapest
Buenos-Ayres *ş* Buenos Aires
Buxara *ş* Bukhara
Buxarest *ş* Bucharest
Burkino Faso Burkina Faso
Buryat Buryat
Çad Chad
Çikaqo Chicago
Çili Chile
Çin China
Çukot dənizi the Chukotsk Sea, the Chukchee Sea
Cənubi Amerika South America
Cənubi Afrika respublikası the Republic of South Africa
Dağıstan Daghestan
Danimarka Denmark
Dardanel the Dardanelles
Daşkənd *ş* Tashkent, Tashkend
Dehli *ş* Delhi
Detroyt *ş* Detroit
Dnepr *ç* the Dnieper
Dnestr *ç* the Dniester
Don *ç* the Don

Drezden ş Dresden
Dublin ş Dublin
Dunay ç the Danube
Düşənbə ş Dyushambe, Dushanbe
Egey dənizi the Aegean (Sea)
Ekvador Ecuador
Elbrus Elbrus
Ermənistan Armenia
Estoniya Estonia
Ədən ş Aden
Əfqanıstan Afghanistan
Əlcəzair 1. Algeria *(ölkə)*; 2. Algiers *(şəhər)*
Fələstin Palestine
Filadelfiya ş Philadelphia
Filippin the Philippines
Finlandiya Finland
Florensiya ş Florence
Fransa France
Gürcüstan Georgia
Haaqa the Hague
Haiti Haiti
Hamburq ş Hamburg
Hanoy ş Hanoi
Havana ş Havana
Helsinki ş Helsinki
Həbəşistan Ethiopia (Abyssinia)
Hindistan India
Hind okeanı the Indian Ocean
İndoneziya Indonesia
İngiltərə England
İordan ç the Jordan
İordaniya Jordan
İrak Iraq, Irak
İran Iran
İrlandiya Ireland
İrtış ç the Irtish
İsveç Sweden
İsveçrə Switzerland
İslamabad ş Islamabad
İslandiya Iceland
İspaniya Spain
İsfahan ş Isfahan
İstanbul ş Istanbul
İtaliya Italy
İzmir ş Izmir
Kabul ş Kabul
Kamboca Cambodia
Kamerun Cameroon, Cameroun
Kanada Canada
Kanberra ş Canberra
Karakas ş Caracas
Kaunas ş Kaunas
Kazbek Kazbek
Kembric ş Cambridge
Keniya Kenya
Keyptaun ş Cape Town, Capetown
Keraçi ş Karachi
Kipr Cyprus
Kislovodsk ş Kislovodsk
Kişinyov ş Kishinev
Kiyev ş Kiev
Klapeyda ş Klaipeda
Kolumbiya Colombia
Konqo 1. *(dövlət)* Congo; 2. *(çay)* the Congo
Kopenhagen ş Copenhagen
Koreya Korea
Kosta-Rika Costa Rica
Krım the Crimea
Kuba Cuba
Kuril adaları the Kuril Islands, the Kuril(e)s
Küveyt Kuwait
Qafqaz the Caucasus, Caucasia
Qahirə ş Cairo
Qazaxıstan Kazakhstan
Qırğızıstan Kyrgyzstan
Qırmızı dəniz the Red Sea
Qlazqo ş Glasgow
Qrenada Grenada
Qrenlandiya Greenland
Qrinviç ş Greenwich
Qvatemala Guatemala
Qvineya Guinea
La-Manş the English Channel
Lankaşir ş Lancashire
Laos Laos
La-Pas La Pas
Latın Amerikası Latin America
Latviya Latvia
Lena ç the Lena
Lesoto Lesotho
Leypsiq ş Leipzig
Liberiya Liberia
Lixtenşteyn Liechtenstein
Lis(s)abon ş Lisbon
Litva Lithuania
Livan the Lebanon
Liverpul ş Liverpool
Liviya Libia, Libya
London ş London
Lüksemburq Luxemburg
Lvov ş Lvov
Macarıstan Hungary
Madaqaskar Madagascar
Madrid ş Madrid
Malayziya Malaysia
Malta Malta
Mançestr ş Manchester
Mavritaniya Mauritania
Mexiko ş Mexico City
Meksika Mexico
Melburn ş Melbourne
Mədinə ş Medina, Madina
Mədrəs ş Madras
Məkkə ş Mecca, Macca
Miçiqan ş Michigan
Milan ş Milan
Minsk ş Minsk
Misir ş Egypt
Missisipi ç the Mississippi
Missuri ç the Missouri
Moldaviya Moldavia
Monako Monaco
Monqolustan Mongolia
Monreal ş Montreal
Monte-Karlo ş Monte Carlo
Montevideo ş Montevideo
Moskva ş Moscow
Mozambik Mozambique
Murmansk ş Murmansk
Münxen ş Munich
Naqasaki ş Nagasaki
Namibiya Namibia
Nayrobi Nairobi
Neapol ş Naples
Nepal Nepal
Neva ç the Neva
Nigeriya Nigeria
Nikaraqua Nicaragua
Nil ç the Nile
Norveç Norway
Nürnberq ş Nuremberg
Nyu-York New York
Oder ç the Oder
Odessa ş Odessa
Oxot dənizi the Sea of Okhotsk
Oka ç the Oka
Oksford ş Oxford
Oman Oman
Ontario g Lake Ontario
Oslo ş Oslo
Ottava ş Ottawa
Özbəkistan Uzbekistan
Pa-De-Kale the Straits of Dover
Pakistan Pakistan
Pamir the Pamirs
Panama Panama
Paraqvay Paraguay
Paris ş Paris
Peçora ç the Pechora
Pekin ş Peking
Peru Peru
Pxenyan ş Pyongyang
Polineziya Polynesia
Polşa Poland
Port-Səid ş Port-Said
Portuqaliya Portugal
Potsdam ş Potsdam
Praqa ş Prague
Puerto-Riko Puerto Rico
Reyn ç the Rhine
Riqa ş Riga
Rio-de-Janeyro ş Rio de Janeiro
Roma ş Rome
Rotterdam ş Rotterdam
Ruminiya Rumania, Roumania
Rusiya Russia
Sakit okean the Pacific (Ocean)
Saloniki ş Saloniki, Salonika
Salvador Salvador
San-Fransisko ş San Fransisco
Sarı dəniz the Yellow Sea
Sena ç the Seine
Seneqal Senegal
Seylon Ceylon
Seul ş Seoul
Sibir Siberia
Sidney ş Sydney
Sinqapur Singapore
Slovakiya Slovakia
Sofiya ş Sofia
Somali Somalia
Stokholm ş Stockholm
Sudan the Sudan
Surinam Surinam
Sırdərya ç the Syr Daria
Süveyş kanalı the Suez Canal
Şimal Buzlu okeanı the Arctic Ocean
Şimal dənizi the North Sea
Şotlandiya Scotland
Şri-Lanka Sri Lanka
Tacikistan Tajikistan
Tailand ş Thailand
Tallinn ş Tallinn
Tanzaniya Tanzania
Tbilisi ş Tbilisi
Tehran ş Tehran, Teheran
Təl-Əviv ş Tel Aviv
Tibet Tibet
Tirana ş Tirana
Temza ç the Thames
Tokio ş Tokyo
Tunis 1. *(ölkə)* Tunisia; 2. *(şəhər)* Tunis
Türkiyə Turkey
Türkmənistan Turkmanistan
Uels Wales
Ukrayna Ukraine
Uqanda Uganda
Ulan-Bator ş Ulan-Bator
Ural the Urals
Uruqvay Uruguay
Varşava ş Warsaw
Vaşinqton ş Washington
Vatikan Vatican City State
Vena ş Vienna
Venesiya ş Venice
Venesuella Venezuela
Versal ş Versailles
Vilnüs ş Vilnius
Visla ç the Vistula
Volqa ç the Volga
Volqoqrad ş Volgograd
Vyetnam Viet-Nam
Yamayka Jamaica
Yapon dənizi the Sea of Japan
Yaponiya Japan
Yenisey ç the Jenisei
Yerevan ş Yerevan
Yəmən (the) Yemen
Zair Zaire
Zambiya Zambia
Zimbabve Zimbabwe

## AZƏRBAYCAN DİLİNDƏ İŞLƏNƏN ƏSAS İXTİSARLAR

## SOME COMMONLY USED ABBREVIATIONS IN AZERBAIJANI

**ABƏŞ** - Azərbaycan Beynəlxalq Əməliyyat Şirkəti - Azerbaijan International Operating Company
**ABŞ** - Amerika Birləşmiş Ştatları - The United States of America (USA)
**ADBTİ** - Azərbaycan Dövlət Bədən Tərbiyəsi İnstitutu - Azerbaijan State Institute of Physical Culture
**ADDİ** - Azərbaycan Dövlət Dillər İnstitutu - Azerbaijan State Institute of Languages
**ADİİ** - Azərbaycan Dövlət İqtisadiyyat İnstitutu - Azerbaijan State Economy Institute
**ADMA** - Azərbaycan Dövlət Musiqi Akademiyası - Azerbaijan State Academy of Music
**ADMİU** - Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universiteti - Azerbaijan State University of Culture and Art
**ADNA** - Azərbaycan Dövlət Neft Akademiyası - Azerbaijan State Oil Academy
**AFFA** - Azərbaycan Futbol Federasiyaları Assosiyasiyası - Azerbaijan Football Federations Association
**Aİ** - Avropa İttifaqı - The European Union
**AİMU** - Azərbaycan İnşaat Mühəndisləri Universiteti - Azerbaijan Civil Engineering University
**AKTA** - Azərbaycan Kənd Təsərrüfatı Akademiyası - Azerbaijan Agricultural Academy
**ANS** - Azərbaycan Xəbərlər Xidməti - Azerbaijan News Service
**APRDƏİ** - Azərbaycan Pedaqoji Rus Dili və Ədəbiyyatı İnstitutu - Azerbaijan Pedagogical Institute of Russian Language and Literature
**APU** - Azərbaycan Pedaqoji Universiteti - Azerbaijan Pedagogical University
**AR** - Azərbaycan Respublikası - The Azerbaijan Republic
**ARDNŞ** - Azərbaycan Respublikası Dövlət Neft Şirkəti - The State Oil Company of the Azerbaijan Republic (SOCAR)
**AŞ** - Avropa Şurası - The Council of Europe
**ATƏT** - Avropada Təhlükəsizlik və Əməkdaşlıq Təşkilatı - The Organization for Security and Cooperation in Europe (OSCE)
**ATİ** - Azərbaycan Texnologiya İnstitutu - Azerbaijan Technological Institute
**ATU** - Azərbaycan Tibb Universiteti - Azerbaijan Medical University
**AVA** - Azərbaycan Verilişlər Agentliyi - Azerbaijan Broadcasting Agency (ABA)
**BDU** - Bakı Dövlət Universiteti - Baki State University
**BK** - Birləşmiş Krallıq - The United Kingdom
**BMT** - Birləşmiş Millətlər Təşkilatı - The United Nations Organization
**BOK** - Beynəlxalq Olimpiya Komitəsi - International Olympic Committee
**BP** - Britiş Petrolium - The British Petroleum
**FİFA** - Beynəlxalq Futbol Assosiyasiyaları Federasiyası - Federation of International Football Associations
**MDB** - Müstəqil Dövlətlər Birliyi - The Commonwealth of Independent States (CIS)
**MM** - Milli Məclis - Milli Majlis (The National Parliament)
**MOK** - Milli Olimpiya Komitəsi - National Olympic Committee
**NATO** - Şimali Atlantika Müqavilə Təşkilatı - The North Atlantic Treaty Organization
**NDU** - Naxçıvan Dövlət Universiteti - Nakhchivan State University
**NK** - Nazirlər Kabineti - Cabinet of Ministers
**RF** - Rusiya Federasiyası - Russian Federation
**TŞ** - Təhlükəsizlik Şurası - The Security Council
**UEFA** - Avropa Futbol Federasiyaları İttifaqı - The Union of European Football Associations
**YUNESKO** - BMT-nin Təhsil, Elm və Mədəniyyət Təşkilatı - United Nations Educational, Scientific and Cultural Organization (UNESCO)
**YUNİSEF** - BMT-nin Uşaqlara Beynəlxalq Yardım Fondu - United Nations International Children's Emergency Fund (UNICEF)

## MÜASİR İNGİLİS DİLİNDƏ QRAMMATİK QAYDALARA TABE OLMAYAN SÖZLƏR

### İsimlər

brother [ˊbrʌ-] 1. *(silahdaş) pl.* brethren; 2. *(qohum; bir atanın uşaqları)* brothers
calf [ka:f] buzov; *pl.* calves [ka:vz] buzovlar
child [ʧaıld] uşaq; *pl.* children [ˊʧildrən] uşaqlar
deer [dıə] maral; *pl.* deer [dıə] marallar
elf [elf] elf; *(Almaniya və Skandinaviya əsatirində pəri); pl.* elves
foot [fut] ayaq; *pl.* feet [fı:t] ayaqlar
goose [gu:s] qaz; *pl.* geese [gı:s] qazlar
half [ha:f] yarı, yarım; *pl.* halves [ha:vz]
house [-s] ev; *pl.* houses [-zız] evlər
knife [naıf] bıçaq; *pl.* knives [naıvz] bıçaqlar
lath [la:θ] çiləkən *(nazik, ensiz taxtalar); pl.* laths [-ðz] çiləkənlər
leaf [lı:f] yarpaq; *pl.* leaves [lı:vz] yarpaqlar
loaf [louf] kömbə, bulka; *pl.* loaves [louvz] kömbələr, bulkalar
louse [laus] bit; *pl.* lice [laıs] bitlər
man [mæn] kişi, adam; *pl.* men [men] kişilər, adamlar
mouse [maus] siçan; *pl.* mice [maıs] siçanlar
mouth [mauθ] ağız; *pl.* mouths [-ðz] ağızlar
oath [ouθ] and; *pl.* oaths [-ðz] andlar
ox [ɔks] öküz; *pl.* oxen [ˊɔksən] öküzlər
path [pa:θ] cığır; *pl.* paths [-ðz] cığırlar
scaf [ska:f] şərf; *pl.* scarves [ˊska:vz] / scarfs [ska:fs] şərflər
sheaf [ʃı:f] dərz; *pl.* sheaves [ʃı:vz] dərzlər
sheath [ʃı:ð] futlyar *(qab, qutu, qlaf); pl. sheaths* [-ðz] futlyarlar
sheep [ʃı:p] qoyun; *pl.* sheep qoyunlar
swine [swaın] donuz; *pl.* swine donuzlar
thief [θı:f] oğru; *pl.* thieves [θı:vz] oğrular
tooth [tu:θ] diş; *pl.* teeth [tı:θ] dişlər
wharf [wɔ:f] körpü *(gəminin yan alması üçün) pl.* wharves [wɔ:vz] / wharfs [wɔ:fs]
wife [waıf] arvad; *pl.* wives [waıvz] arvadlar
wolf [wulf] canavar; *pl.* wolves [wulvz] canavarlar
wreath [rı:θ] əklil, çələng; *pl.* wreaths [rı:ðz] əklillər, çələnglər
youth [ju:θ] gənc; *pl.* youths [ju: ðz] gənclər

### Sifətlər və zərflər

bad [bæd] pis; *müq. dərəc.* worse; *üst. dərəc.* worst
eastern [ˊı:stən] şərqi; *müq. dərəc.* more eastern; *üst. dərəc.* easternmost
elder [ˊeldə] böyük; *üst. dərəc.* eldest
evil [ˊı:vl] pis, xarab, bəd; *müq. dərəc.* worse; *üst. dərəc.* worst
far [fa:] uzaq; *müq. dərəc.* farther [ ˊfa: ðə] / further;[ˊfə: ðə] *üst. dərəc.* farthest / furthest
good [gud] yaxşı; *müq. dərəc.* better; *üst. dərəc.* best
hind [haınd] dal; *müq. dərəc.* hinder; *üst. dərəc.* hindmost
ill [ıl] pis; xəstə; *üst. dərəc.* worse; *üst. dərəc.* worst
inner [ˊınə] daxili, içəri; *üst. dərəc.* inmost / innermost
little [ˊlıtl] balaca, kiçik; *müq. dərəc.* less, lesser; *üst. dərəc.* least
lower [ˊlouə] alt, aşağı; *üst. dərəc.* lowermost
many çox *(sayıla bilən isimlərlə işlənir); müq. dərəc.* more; *üst. dərəc.* most
northern [ˊnɔ: ðən] şimal; *üst. dərəc.* northernmost [nɔ: ðənmoust]
outer [ ˊautə] xarici; zahiri; *üst. dərəc.* outermost [ˊautəmoust]
rear [rıə] dal, daldakı, arxa; *üst. dərəc.* rearmost
southern [ ˊsʌðən] cənubi; *müq. dərəc.* more southern; *üst. dərəc.* southernmost
top [tɔp] yuxarı, üst; yuxarıdakı; *üst. dərəc.* topmost
upper [ˊʌpə] yuxarı; *üst. dərəc.* uppermost / upmost
well yaxşı *(zərf); müq. dərəc.* better; *üst. dərəc.* best
western qarbi; *müq. dərəc.* more western; *üst. dərəc.* most western

# The Table of the Irregular Verbs

| I Form | II Form | III Form | IV Form |
|---|---|---|---|
| 1. to arise [ə'raɪz] - qalxmaq | arose [ə'rouz] | arisen [ə'rɪzn] | arising [ə'raɪzɪŋ] |
| 2. to be [bi:] - olmaq | was [wɔz]; were [wə:] | been [bi:n] | being bi:ɪŋ] |
| 3. to bear [beə] - doğmaq, dözmək | bore [bɔ:] | born [bɔ:n] | bearing ['beərɪŋ] |
| 4. to become [bɪ'kʌm] - olmaq | became [bɪ'keɪm] | become [bɪ'kʌm] | becoming [bɪ'kʌmɪŋ] |
| 5. to begin [bɪ'gɪn] - başlamaq | began [bɪ'gæn] | begun [bɪ'gʌn] | beginning [bɪ'gɪnɪŋ] |
| 6. to bend [bend] - əymək | bent [bent] | bent [bent] | bending ['bendɪŋ] |
| 7. to bind [baɪnd] - bağlamaq | bound [baund] | bound [baund] | binding ['baɪndɪŋ] |
| 8. to bite [baɪt] - dişləmək | bit [bɪt] | bit [bɪt]; bitten [bɪtn] | biting ['baɪtɪŋ] |
| 9. to bleed [bli:d] - qanamaq | bled [bled] | bled [bled] | bleeding [bli:dɪŋ] |
| 10. to blow [blou] - üfürmək; əsmək | blew [blu:] | blown [bloun] | blowing ['blouɪŋ] |
| 11. to break [breɪk] - sındırmaq | broke [brouk] | broken ['broukən] | breaking ['breɪkɪŋ] |
| 12. to bring [brɪŋ] - gətirmək | brought [brɔ:t] | brought [brɔ:t] | bringing ['brɪŋɪŋ] |
| 13. to build [bɪld] - tikmək | built [bɪlt] | built [bɪlt] | building ['bɪldɪŋ] |
| 14. to burn [bə:n] - yandırmaq, yanmaq | burnt [bə:nt] | burnt [bə:nt] | burning ['bə:nɪŋ] |
| 15. to buy [baɪ] - almaq | bought bɔ:t] | bought [bɔ:t] | buying ['baɪŋ] |
| 16. to catch [kætʃ] - tutmaq | caught [kɔ:t] | caught [kɔ:t] | catching ['kætʃɪŋ] |
| 17. to choose [tʃu:z] - seçmək | chose [tʃouz] | chosen ['tʃouzn] | choosing ['tʃu:zɪŋ] |
| 18. to come [kʌm] - gəlmək | came [keɪm] | come [kʌm] | coming ['kʌmɪŋ] |
| 19. to cost [kɔst] - qiyməti / dəyəri olmaq | cost [kɔst] | cost [kɔst] | costing ['kɔstɪŋ] |
| 20. to cut [kʌt] - kəsmək | cut [kʌt] | cut [kʌt] | cutting ['kʌtɪŋ] |
| 21. to dig [dɪg] - qazmaq | dug [dʌg] | dug [dʌg] | digging ['dɪgɪŋ] |
| 22. to do [du:] - etmək | did [dɪd] | done [dʌn] | doing ['du:ɪŋ] |
| 23. to draw [drɔ:] - çəkmək | drew [dru:] | drawn [drɔ:n] | drawing ['drɔ:ɪŋ] |
| 24. to dream [dri:m] - arzulamaq | dreamt [dremt]; dreamed [dri:md] | dreamt [dremt] | dreaming ['dri:mɪŋ] |
| 25. to drink [drɪŋk] - içmək | drank [dræŋk] | drunk [drʌŋk] | drinking ['drɪŋkɪŋ] |
| 26. to drive [draɪv] - sürmək, qovmaq | drove [drouv] | driven ['drɪvn] | driving ['draɪvɪŋ] |
| 27. to eat [i:t] - yemək | ate [et] | eaten ['i:tn] | eating ['i:tɪŋ] |
| 28. to fall [fɔ:l] - düşmək | fell [fel] | fallen ['fɔ:ln] | falling [fɔ:lɪŋ] |
| 29. to feed [fi:d] - yedirtmək | fed [fed] | fed [fed] | feeding ['fi:dɪŋ] |
| 30. to feel [fi:l] hiss etmək | felt [felt] | felt [felt] | feeling ['fi:lɪŋ] |
| 31. to find [faɪnd] tapmaq | found [faund] | found [faund] | finding ['faɪndɪŋ] |
| 32. to fight [faɪt] - vuruşmaq | fought [fɔ:t] | fought [fɔ:t] | fighting ['faɪtɪŋ] |
| 33. to fly [flaɪ] - uçmaq | flew [flu:] | flown [floun] | flying ['flaɪŋ] |
| 34. to forget [fə'get] - unutmaq | forgot [fə'gɔt] | forgotten [fə'gɔtn] | forgetting [fə'getɪŋ] |
| 35. to get [get] - əldə etmək | got [gɔt] | got [gɔt] | getting ['getɪŋ] |
| 36. to give [gɪv] vermək | gave [geɪv] | given ['gɪvn] | giving [gɪvɪŋ] |
| 37. to go [gou] - getmək | went [went] | gone [gɔn] | going ['gouɪŋ] |
| 38. to grow [grou] - böyümək | grew [gru:] | grown [groun] | growing ['grouɪŋ] |
| 39. to hang [hæŋ] - asmaq | hung [hʌŋ] | hung [hʌŋ] | hanging [hæŋɪŋ] |
| 40. to have [hæv] - malik olmaq | had [hæd] | had [hæd] | having ['hævɪŋ] |
| 41. to hear [hɪə] - eşitmək | heard [hə:d] | heard [hə:d] | hearing ['hɪərɪŋ] |
| 42. to hide [haɪd] - gizlətmək | hid [hɪd] | hidden ['hɪdn] | hiding ['haɪdɪŋ] |
| 43. to hold [hould] tutmaq | held [held] | held [held] | holding ['houldɪŋ] |
| 44. to keep [ki:p] - saxlamaq | kept [kept] | kept [kept] | keeping ['ki:pɪŋ] |
| 45. to know [nou] - bilmək | knew [nju:] | known [noun] | knowing ['nouɪŋ] |
| 46. to lead [li:d] - rəhbərlik etmək | led [led] | led [led] | leading ['li:dɪŋ] |
| 47. to learn [lə:n] - öyrənmək | learnt [lə:nt] | learnt [lə:nt]; learned [lə:nt] | learning ['lə:nɪŋ] |
| 48. to leave [li:v] - tərk etmək | left [left] | left [left] | leaving ['li:vɪŋ] |
| 49. to lend [lend] - borc vermək | lent [lent] | lent [lent] | lending ['lendɪŋ] |
| 50. to let [let] - icazə vermək | let [let] | let [let] | letting [letɪŋ] |
| 51. to light [laɪt] - yandırmaq | lit [lɪt] | lit [lɪt] | lighting ['laɪtɪŋ] |
| 52. to lose [lu:z] - itirmək | lost [lɔst] | lost [lɔst] | losing ['lu:zɪŋ] |
| 53. to make [meɪk] etmək | made [meɪd] | made [meɪd] | making ['meɪkɪŋ] |
| 54. to mean [mi:n] məna daşımaq | meant [ment] | meant [ment] | meaning ['mi:nɪŋ] |
| 55. to meet [mi:t] - rast gəlmək | met [met] | met [met] | meeting ['mi:tɪŋ] |
| 56. to put [put] qoymaq | put [put] | put [put] | putting ['putɪŋ] |
| 57. to read [ri:d] - oxumaq | read [red] | read [red] | reading ['ri:dɪŋ] |
| 58. to ride [raɪd] - atla getmək | rode [roud] | ridden ['rɪdn] | riding ['raɪdɪŋ] |
| 59. to rise [raɪz] - qalxmaq | rose [rouz] | risen ['rɪzn] | rising ['raɪzɪŋ] |
| 60. to run [rʌn] - qaçmaq, yüyürmək | ran [ræn] | run [rʌn] | running ['rʌnɪŋ] |
| 61. to say [seɪ] - demək | said [sed] | said [sed] | saying ['seɪŋ] |
| 62. to see [si:] - görmək | saw [sɔ:] | seen [si:n] | seeing ['si:ɪŋ] |

| | | | |
|---|---|---|---|
| 63. to sell [sel] - satmaq | sold [sould] | sold [sould] | selling ['seliŋ] |
| 64. to send [send] - göndərmək | sent [sent] | sent [sent] | sending ['sendiŋ] |
| 65. to set [set] - batmaq (günəş) | set [set] | set [set] | setting ['setiŋ] |
| 66. to shake [ʃeik] - silkələmək | shook [ʃuk] | shaken ['ʃeikn] | shaking ['ʃeikiŋ] |
| 67. to shine [ʃain] - parlamaq | shone [ʃɔn] | shone [ʃɔn] | shining ['ʃainiŋ] |
| 68. to shoot [ʃu:t] - (tüfəng) atmaq | shot [ʃɔt] | shot [ʃɔt] | shooting ['ʃu:tiŋ] |
| 69. to shut [ʃʌt] - örtmək | shut [ʃʌt] | shut [ʃʌt] | shutting ['ʃʌtiŋ] |
| 70. to sing [siŋ] - nəğmə oxumaq | sang [sæŋ] | sung [sʌŋ] | singing ['siŋiŋ] |
| 71. to sink [siŋk] - batmaq | sank [sæŋk] | sunk [sʌŋk] | sinking ['siŋkiŋ] |
| 72. to sit [sit] - oturmaq | sat [sæt] | sat [sæt] | sitting ['sitiŋ] |
| 73. to sleep [sli:p] - yatmaq | slept [slept] | slept [slept] | sleeping ['sli:piŋ] |
| 74. to smell [smel] - iyləmək, iylənmək | smelt [smelt] | smelt [smelt] | smelling ['smeliŋ] |
| 75. to speak [spi:k] - danışmaq | spoke [spouk] | spoken ['spoukən] | speaking ['spi:kiŋ] |
| 76. to spend [spend] - xərcləmək | spent [spent] | spent [spent] | spending ['spendiŋ] |
| 77. to spoil [spɔil] - xarab etmək | spoilt [spɔilt] | spoilt [spɔilt] | spoiling ['spɔiliŋ] |
| 78. to stand [stænd] durmaq | stood [stud] | stood [stud] | standing ['stændiŋ] |
| 79. to steal [sti:l] oğurlamaq | stole [stoul] | stolen ['stoulən] | stealing ['sti:liŋ] |
| 80. to strike [straik] - vurmaq | struck [strʌk] | 1)stricken ['strikən] 2) struck [strʌk] | striking ['straikiŋ] |
| 81. to swear [swɛə] - and içmək | swore [swɔ:] | sworn [swɔ:n] | swearing ['swɛəriŋ] |
| 82. to swim [swim] - üzmək | swam [swæm] | swum [swʌm] | swimming ['swimiŋ] |
| 83. to take [teik] - götürmək | took [tuk] | taken ['teikn] | taking ['teikiŋ] |
| 84. to teach [ti:tʃ] öyrətmək | taught [tɔ:t] | taugh [tɔ:t] | teaching ['ti:tʃiŋ] |
| 85. to tear [tɛə] - cırmaq | tore [tɔ:] | torn [tɔ:n] | tearing ['tɛəriŋ] |
| 86. to tell [tel] demək | told [tould] | told [tould] | telling ['teliŋ] |
| 87. to think [θiŋk] fikirləşmək | thought [θɔ:t] | thought [θɔ:t] | thinking ['θiŋkiŋ] |
| 88. to throw [θrou] atmaq, tullamaq | threw [θru:] | thrown [θroun] | throwing ['θrouiŋ] |
| 89. to understand [ʌndə'stænd] - başa düşmək | understood [ʌndə'stud] | understood [ʌndə'stud] | understanding [ʌndə'stændiŋ] |
| 90. to wear [wɛə] - geyinmək | wore [wɔ:] | worn [wɔ:n] | wearing ['wɛəriŋ] |
| 91. to weep [wi:p] - ağlamaq | wept [wept] | wept [wept] | weeping ['wi:piŋ] |
| 92. to win [win] - qalib gəlmək | won [wʌn] | won [wʌn] | winning ['winiŋ] |
| 93. to write [rait] - yazmaq | wrote [rout] | written ['ritn] | writing ['raitiŋ] |

# MÜNDƏRİCAT — CONTENTS